*Bu kitab* ***"Səməd Vurğun.*** *Əsərləri. Altı clddə. V-VI cildlər***"**
(*Bakı, Elm, 1972*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtibçilər: **Safurə Quliyeva**
**Aslan Salmansoy**

Redaktor: **Aybəniz Vurğunqızı**

**894.361 - dc 21**
**AZE**
**Səməd Vurğun. Seçilmiş əsərləri.** Beş cilddə. V cild. Bakı, "Şərq-Qərb", 2005, 384 səh.

Azərbaycan ədəbiyyatı tarixində dövrün böyük poeziyasını yaradanlar sırasında adı sonsuz ehtiramla çəkilən xalq şairi Səməd Vurğun Vətənin və poeziyanın yaddaşında eyni zamanda elm və sənət təşkilatçısı, ədəbiyyatımızın böyük təşkilatçısı kimi yaşayır.

Azərbaycan və dünya ədəbiyyatı klassikləri haqqında, bədii yaradıcılıq, ictimai-siyasi və mədəniyyət məsələlərinə həsr olunmuş elmi, ədəbi-tənqidi və publisistik məqalələr müəllifi olan mütəfəkkir şair bu yazılarında mühüm problemlər qaldırır və onların həlli yollarını göstərirdi. Özünün möhtəşəm nəzəri-estetik irsində və poeziyasında ədəbiyyatın, dünya və Şərq şerinin problemlərinə ardıcıl münasibət bildirdiyinə görə də bütün keçmiş sovet məkanında poetik fikrin axtarışı, hərəkəti və perspektivi haqda manifesti – II Qurultayda hesabat məruzəsini – məhz ona etibar eləmişdilər.

"Seçilmiş əsərləri"nin bu cildində görkəmli sənətkarın 1930-1955-ci illər dövrü yaradıcılığını əhatə edən məqalələri, məruzələri, nitqləri və oçerkləri toplanmışdır.

Ədəbiyyatımızın zəngin keçmişi, məzmunu, forma və janr rəngarəngliyinin vüsətli panoramını yaradan, dövrün ədəbi tənqidinin, ideya-estetik tarixinin, elmi-nəzəri inkişafının aydın mənzərəsini canlandıran bu materiallar bir daha göstərir ki, klassik ədəbiyyatı və onun nəzəriyyəsi ilə yanaşı, çağdaş ədəbiyyatı və onun məsələlərini dərindən bilən Səməd Vurğun ədəbi prosesin inkişafına yaxından kömək etmiş, ona həmişə düzgün istiqamət vermişdir.

**ISBN 9952-418-48-2**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## ŞEİRDƏ SƏMİMİYYƏT

Gənc proletar ədəbiyyatımızın da ilk pillələrindən bəri şeirdə məfkurə birinci, şəkil, vəzn, qafiyə ikinci yeri tutmalıdır – fikri çox haqlı olaraq irəli sürülür.

Etiraf edəlim ki, bu iri addımlarla bərabər, əsaslı, həm də qiymətli bir şeyi az gördük. Bu isə "şeirdə səmimiyyət" məsələsidir.

Sənət aləminə unudulmaz simalar, bu günə qədər "səmimiyyət şerin anasıdır" deyə gəlmişlər. Burası ... haqlı bir nöqteyi-nəzərdir.

Şair qələmə alacağı bir mövzunu, təsvirə qalxışdığı bir lövhəni mənimsətmək üçün böyük bir ehtiyac qarşısındadır. Bu da duyduğunu duydurmaq olsun gərək. Yəni oxucunun qəlbini çalmaq, özü keçirdiyi iztiraba yaxın oxucuda bir həyəcan və çalxantı oyatmalıdır. "Nə kimi şeirlər bu təsiri bağışlamağa qadirdir?" – sualına böylə cavab vermək olar: yaşanılaraq yazılan şeirlər.

Bu xüsusda fikrimizi bir az daha sürətlə irəli sürmək üçün bir neçə misal göstərəlim.

S.Rüstəm:

"Üç il əvvəl bir afətə vurularaq ağladım,
Hər bir şeyi unudaraq ona könül bağladım."

– misraları ilə başlanan "Bir az da özümdən" adlı parçası yaşanılaraq yazıldığından "həqiqi şeir" adını qazanmağa haqlıdır.

Yaxud, Fövzinin "Axşam günəşi" də bu zümrədən olmaq üzrə sayıla bilər. Burasını da qeyd edəlim ki, gənclərimiz içərisində şeri bir əppək parçası kimi çeynəyənlər, ən adi və xırda-xuruş şeyləri belə quru və cansız qafiyələr pərdəsilə şeir halına salmaq istəyənlər var. Buna ədəbiyyatda "təsəvvü", yaxud "zorlama" deyirlər. Bu səbəbdəndir ki, bu günün şeri bir çoxlarına xoş gəlməyir. Məncə, bu "zorlama" nəticəsi olaraq, şeir yavan həm duzsuz, həm də yazıq bir hal alır.

Bu "zorlama" ən çox Ə.Nazimdə vardır (yanılmıramsa, bunun səbəbi, Nazim yoldaşın bir əl ilə iki qarpız tutmaq fikrindən doğur). Burada bir sual irəli gəlir ki, yazıçı səmimiyyəti nə kimi yollarla qazanar? Bir çoxları mütaliəni tövsiyə edirsə, bu, çox dardır. Məncə, mütaliə üzündən qazanılan səmimiyyət adlı bir şey olmamışdır. Əgər yazıçı səmimiyyət qazanmaq istərsə, o, mütləq yaşamalıdır. Yəni həyatın ən dərinliyinə doğru özünü atmalıdır (bu yolda bir çox ağrılar, bəlalar varsa, daha

yaxşı olar, şerindəki səmimiyyətlə bərabər məna və ifadə coşqunluğu da olar). Bu hal tərbiyə də tələb edir. Xırda çocuqlarla müşahidə dərsi keçərkən, onlar cismi görür, yoxlayır, qoxuyur, dadır, ağırlığına baxır və ilaxır. Nəhayət, o cisim barədə möhkəm bir təsir alır. Şair də qələmə alacağı fikir ətrafında bir çox müşahidələrdə bulunmalıdır. Əks təqdirdə... solğun, cansız, bir halda qalmağa məhkumdur.

Son söz olaraq demək istərəm ki, ədəbi gəncliyimiz yalnız mütaliə və mübahisələrlə kifayətlənməsin.

Alimlərimizdən biri "Həyat böyük bir məktəbdir" demişdir. Biz də yönümüzü həyata, onun acı və dadlı tərəflərinə çevirsək, onu öz dərimiz və damarlarımızla hiss etsək, yazacağımız şeylər də o nisbətdə təbii və səmimi olacaqdır.

Yaşasın yaşanılmış şeirlər.

*1930*

## BÖYÜK VƏ TARİXİ QURULTAY

Şura yazıçılarının böyük siyasi və mədəni əhəmiyyəti olan birinci qurultayı proletar mədəniyyəti tarixində ölməz səhifələr açdı. Böyük şura ədəbiyyatının bu təntənəsi sosialist mündəricəli və milli mədəniyyətimizin varlığını, onun son illər ərzində böyük müvəffəqiyyətlər əldə etdiyini və bu mədəniyyətin xarici ölkələrə belə dərin təsirlər buraxdığını bütün dünya qarşısında nümayiş etdirdi.

Qurultay tarixi və zəruri idi. Böyük şura ədibi Maksim Qorki öz elmi və olduqca mədəni məruzəsində bədii ədəbiyyatın tarixi inkişaf mərhələlərini, şura ədəbiyyatının dərin analizini və gələcək perspektivlərini böyük insan məharəti ilə göstərdi. Qurultayın nümayəndələri dərin bir maraqla artmaqda və yüksəlməkdə olan milli cümhuriyyətlər ədəbiyyatının vəziyyətini dinlədilər. Bütün bu məruzələr ədəbi faktlarla isbat etdi ki, geniş Şuralar ölkəsinin şura ədəbiyyatı böyük addımlarla tərəqqi edir. Başqırdıstan kimi 1924-cü ilə qədər öz ana dilində yazı ədəbiyyatı olmayan bir cümhuriyyət son müddət ərzində canlı və bədii məhsullar vermişdir. Bütün qurultay nümayəndələri arasındakı səmimiyyət, siyasi və sinfi ayıqlıq, ölkəmizə qarşı sədaqət böyük və əyilməz bir qələm ordusunun qüvvəti idi.

Karl Radeqan yoldaşın məruzəsi və Fransa, Almaniya, Amerika, Çin, Yaponiya, Türkiyə və başqa xarici ölkələrdən gəlmiş qonaqların çıxışı açıqcasına göstərdi ki, kapitalist ölkələrində bu və ya digər şəkildə inqilabçı proletar ədəbiyyatı inkişaf edir. Onlar Şuralar torpağını öz ana beşikləri zənn edir və bizim böyük yazıçılarımızın əsərlərindən çox istifadə edirlər...

Klassik ədəbiyyatı dərindən öyrənmək, geniş xalq ədəbiyyatını yaşatmaq, sosialist quruluşunun müsbət insanlarını sevmək, onların bədii ifadəsini vermək, ədəbiyyatımızda qadın tipləri yaratmaq, sosialist realizmini yüksək formalara qaldırmaq, yeni və gənc istedadların tərbiyə işləri ilə məşğul olmaq, bədii tərcümə işlərini canlandırmaq, çocuq ədəbiyyatını yaratmaq qurultayın ən canlı və mübahisəli məsələlərindən idi.

Azərbaycan Şura yazıçıları təşkilatı qurultayın bütün materiallarını bir iş proqramı kimi işləməli, yüksək bədii keyfiyyət uğrunda ən dəyərli qüvvələrini səfərbərliyə almalıdır.

*1934*

## MƏN NECƏ YAZIRAM?

Mən necə yazıram? – sualını verməkdə sox çətinlik çəkirəm.

Hər zaman hərəkət və inkişafda olan bir prosesin müəyyən bir formasını almaq və ona dair mülahizələr yürütmək, elmi analiz vermək, heç də bu prosesin qurtarmış bir xarakterizəsi olamaz. Xüsusən bədii yaradıcılıq ki, öz mürəkkəbliyi ilə seçilir, o, bəzən "şüur altında"da hərəkət edir, onu təyin etmək, müəyyən qəlibdə təqdim etmək imkan xaricindədir.

Odur ki, öz yaradıcılığımın yalnız mənə məlum momentlərindən danışa bilərəm.

Şübhəsiz ki, "necə yazmaq" "nə yazmaq" ilə üzvi surətdə bağlıdır.

Ona görə də ən əvvəl, məni daha çox maraqlandıran "nə"lərdən deməliyəm.

Bu "nə"lər sevinc, iztirab və kədər ətrafında dolaşırlar. Mən hər hansı ictimai bir hadisəni yaza bilməyirəm. Bunların arasında hissi cəhəti daha üstün olan, insan duyğusunu daha tez danışdıra bilən hadisələr məni maraqlandırır. Bunun nəticəsindədir ki, mənim poemalarımda hiss, xəyal, sevinc, kədər daha çox yer tutur. Lakin mən çalışıram ki, bunlar

"havadan düşmə", qondarma olmasınlar, hadisələrin, insanların real varlığından doğsunlar.

Məncə, şerimizin gələcəyi bu yolun yüksək bir formasını verəcək. Zira, qanlı və sərt mübarizələrdən sonra qurulacaq qansız və düşmənsiz bir gələcək insan hissi, insan psixolojisini oxşayaraq, onun sinirlərini bir ana səsi ilə laylaya tutacaq, dolğun, hissi, ahəngdar və sakit bir musiqi lirikası verə bilən şeirlər istəyəcəkdir.

Mənim sevdiyim bu şeir formasını siz sadə və məzmunsuz düşünməyiniz. Çünki tarixi inkişafı ilə insan şüurunun mündəricəsi də hər vaxt inkişaf etdiyindən və şair də bir insan olduğundan, onun şeri mündəricəsizliyi ilə gedə bilməz, xüsusən, sinifsiz bir cəmiyyət şəraitində.

Şəxsi həyatımda yaşadığım, yaxından tanış olduğum hər hadisəni daha tez, daha bədii yaza bilərəm. Mən o hadisəni, o insanı günlər, həftələr, aylarca düşünürəm, yaşayıram, onlarla birlikdə sevinir, ağlayır, çırpınır, vuruşur, sonra yazıram. Mən bunu sənətkarın sənətə qarşı səmimiyyəti kimi yenə iddia edirəm və təzə başlamış yazıçılarımıza məsləhət görürəm. Sənət məhsulunu "başdan sovurma" etmək, onu quru söz yığınına döndərmək, beləliklə oxucularımızın hisslərini qabalaşdırmağı bir ictimai cinayət hesab edirəm. Bu cinayətdən yaxa qurtarmağın yolu həm asan, həm də çətindir. Şerin üzərində çox çalışmaq, onu dəfələrlə ölçmək, oxucunun mənimsəyə biləcəyi bir şəklə saldıqdan sonra dərcə vermək. Məncə, ən böyük münəqqid və ölçü oxucu kütləsidir! "El atan daş uzaq gedər".

Şeir öz quruluşu və xüsusiyyəti ilə nəsrdən ayrıldığı kimi, dil etibarilə də ayrılır. Mən şeirlərimin dili üzərində çox çalışıram. Hər kəsin anlaya biləcəyi sadə kəlmələr işlətməklə geniş kütlə daxilindəki ifadə formalarından da istifadə edirəm. Bu sadəlik olduqca çətin və mürəkkəb bir yoldur. Çünki fikri ifadə zamanı müxtəlif ərəb, fars, rus və başqa gəlmə ifadələr yolu asan bir yoldur. Əsil çətinlik isə türk şeirlərində türk dili yaratmaqdır. Bu dil yalnız sadə sözlərdən ibarət olaraq qalmayır, bütün dilimizin xüsusi danışıq formalarını, onun bütün varlığını, ana xətlərini almaq və inkişaf etdirməklə rəndələnmiş bir ahəng daxilinə almaqdır. Bundan başqa, müxtəlif insanları bir dildə danışdırmaq yaramaz. Həyatdan götürdüyümüz tiplər öz mündəricəsinə görə də danışmalıdırlar. Azsavadlı, elmsiz bir insanı alim, filosof dili ilə danışdırmaq, aferist, əxlaqsız bir adamı nəcib və nəzakətli danışdırmaq təbii və real vəziyyəti təhrif etməkdir ki, bu da nəticədə çox gülünc olur.

Sosializm məndəricəli şerimizdə milli forma yaratmaq proqressiv bir iş sayılmalıdır. Həyatdan aldığımız bir qəhrəmanı hər yerdə və hər millətdə ola biləcək bir formada deyil, əsas etibarilə onu, bir millətin bir sinfə mənsub spesifik bir şərait insanı olduğunu göstərməyi bacarmaq lazımdır. Tipləri abstrakt, zaman və məkan xaricində vermək şerə solğunluq, ümumi sözçülük və ibarəçilik gətirir. Bunu öz yaradıcılıq təcrübəmdə müşahidə etdiyimdən, konkret tarixi şəraitdə konkret tarixi insanlardan yazmağa başladım. Mənim bu arzum, hələlik, bir başlanğıc olaraq qalır.

"Komsomol poeması"ndakı Gəray bəy tipinin türk mülkədarı olduğunu bildirmək üçün:

"Belə getsə bu güzəran
Əllərimdə donmasa qan,
Papaq mənə haram olsun"

– dili ilə danışdırıram. Yaxud onun dərdlərinə, qayğılarına şərik olan mürtəce bir aşığın da türk aşığı olmasını bildirmək üçün:

"Ay ağalar, ay paşalar,
Dərd başımdan aşdı yenə,
Açıldı tanrının gözü,
Sellər, sular daşdı yenə.

Heç gülmədi aşıq Vəli,
Haqqa müsafir gələli,
İmamların kömək əli
Bizdən uzaqlaşdı yenə"

deyir. Məncə, bu sözləri yalnız türk aşıqları deyə bilər, başqaları üçün xarakterik ola bilməz.

Eyni zamanda, xüsusən, qəhrəmanların təsvirində, onların simasında yalnız bolşeviklərə, işçi sinfinə mənsub olan xarakterləri, hərəkətləri də vermək zəruridir. Bununla da biz öz qəhrəmanlarımızı dar və məhdud bir şəraitə qaldırmış olarız. Hər iki cəhət eyni zamanda üzvi surətdə bağlı verilməlidir.

Bunların hamısı yalnız təxminən söylənə bilər, əsil mahiyyət isə hər yazıçının öz xüsusiyyətindən asılıdır.

*1934*

# ƏLƏKBƏRLİNİN DİALEKTİKA DƏRSİ

Əziz oxucularımız! Siz "Ədəbiyyat qəzeti"nin 9 yanvar nömrəsinin birinci səhifəsində "Səmədin həsrəti" adlı bir məqaləni oxuyursunuz. Bu nəticəyə gəlirsiniz ki, "Həsrət" adlı şeir yazmış bir şura şairi dönüb reaksioner olmuşdur. Bu bəlkə də sizi təəccübləndirir, bəlkə də şübhələnirsiniz. Baxalım, bu nə qədər doğrudur?

Mən yazmış olduğum "Həsrət" şerinin ideyası haqqındakı fikrimi söyləmədən əvvəl Ələkbərli yoldaşın mənə verdiyi nəsihətlər və proqovorlar haqqında bir neçə söz deməliyəm.

O yazır ki, "bu şeirdə əsas mövzu budur: şəhər kəndə qarşı qoyulur, şəhər kəndi yeyir, kəndin yetişdirdiyi Səməd belə kəndə, arxa çevirir". Siz görürsünüz ki, Ələkbərli yoldaşın dediyinə görə, mən Şura hökumətinin şəhər və kənd siyasətinə zidd bir insan olmuşam. Mənə verilən bu siyasi töhmətə sözlə yox, yazmış olduğum şeirlər ilə cavab vermək istəyirəm. Yazmış olduğum və dəfələrlə dərc olunmuş Bakı mədən işçilərinə – "Raport" adlı şeirdə:

Vur, dedim, vur!
Zərbələrini bərk vur!
Mənim arzum budur:
Qollarına
yeni qüvvət gəlsin!

Və
sənin əlinlə yüksəlsin
kirli, yamaqlı kəndimiz,
yüklü, alaqlı kəndimiz!

Mən kəndin səadət və gələcəyini daima proletar sinfinin rəhbərliyində görmüşəm. Yaxud, "Kənd səhəri" adlı poemada:

Gülzarın yanında orta dirəkdən
Asılmış radio deyir ürəkdən:
Oyanın, yoldaşlar, iş zamanıdır,
İnsan, həyatının qəhrəmanıdır. –

sözləri ilə kəndimizi radiolaşmağa, mədəniləşməyə və iş başına çağıran sosialist şəhərimizin səsini tərənnüm etmişəm. Əfsus ki, Ələkbərli yoldaşa bu yazılarımız məlum olmadığından o məni siyasi və elmi bir

savadsız, bir reaksioner düşünməyə məcbur olur və mənə dərs verməyə başlayır: "İnsan təbiətin içərisindədir, fəqət, ona qarşı mübarizə aparmaq, onu özünə tabe etmək insanın məqsədini təşkil edir", – deyir. Ələkbərli qədər savadlım olmasa da, bu "nəzəriyyə" haqqında qısaca fikrimi deməliyəm. Ən əvvəl, bu sözlər çox primitiv, xırdaca çocuqların bildiyi bir şeydir ki, burada məqalə müəllifi Amerika kəşf etməmişdir.

İkinci, təbiətlə mübarizə insanın məqsədini təşkil etməmiş və etməyəcəkdir. İnsan üçün əsil məqsəd onun şəxsi və ictimai həyatıdır. Lakin bu məqsədi təyin etmək üçün insan insanla və təbiətlə mübarizə aparmağa məcbur olur. Bundan xaric, göydəndüşmə bir həyat yoxdur. Yoxsa, mücərrəd halda təbiətlə mübarizə insan üçün məqsəd olmamış, olmayacaq. Bir də təbiətlə insan arasındakı ziddiyyətlərə baxmayaraq, insan da ictimai bir insan olmaqla bərabər təbiətin üzvi bir hissəsidir. Təbiətlə insan arasında ayrılmaz bağlar var. Əks təqdirdə heç bir həyat və hərəkət ola bilməz. Qısa deyəcək olursaq, təbiətlə insan arasındakı ziddiyyətlərin vəhdətidir ki, bunu yoldaş filosof şairə verdiyi dialektika dərsində unutmuşdur. Və az qalmışdı ki, əlimə bir tapança alıb, təbiəti və ondakı gözəlliyi atəşə tutam. Lakin əllərim titrədi, təbiətdə özümü, özümdə isə təbiəti gördüm!

O yenə davam edib yazır ki, "analar indi evdə oturub yun daramır, pambıq tarlalarında çalışırlar". Yazmış olduğum "Macəra" poemasında:

İndi at üstündə gəzib bəndləri
. . . . . . . . . . . . . . . . . . . . . . . .
Çağırıb yarışa qonşu kəndləri
Dalda qalanları haraylayırsan.
Artıq ağlamırsan, ana yaslarda,
Hər gün özəklərdə və iclaslarda
Sədrdən söz alıb, danışdıqca sən,
Xəyalım nə qədər yüksəlir bilsən.

misraları ilə matəmlərdən, yaslardan ayrılaraq, ictimai həyata, iclaslara atılan, iqtisadi və mədəni həyatımızda şüurlu olaraq iştirak edən analarımızı bacardığım qədər təsvir etmişəm. Çox əfsus ki, yoldaş Ələkbərli, verdiyi bu nəsihətdə üç il gecikmişdir.

Müəllif yenə davam edib yazır ki, "Səməd nahaq yerə anasının örtdüyü kəlağayını arzu edir. Kəndli anaların indi şlyapa aradıqlarından, görünür ki, xəbərsizdir."

Məncə, bu bizim kəndli qadınlarımıza iftiradır. Azərbaycan kəndlərində şlyapa daşımaq xarakter bir hadisə deyildir. Bir də insan mədəniyyətini şlyapada görmək çox gülüncdür. Bu mədəniyyətimizi xarici, zahiri bir şey kimi düşünməkdir. Məncə, kəlağayı geysə də, həyatı anlayan, elm və mədəniyyət uğrunda canlı mübarizə aparan həqiqi bir insan yalandan şlyapa taxan və zahiri işarələrlə özünü mədəni göstərən başıboş insanlardan çox üstün və şərəflidir.

"Həsrət" adlı yazdığımız şerə gəlincə, bu şerin əsas ideyası bu gün kəndə qarşı yuxarıdan baxan, mədəniyyəti və böyüklüyü yalnız şəhərlərdə görən yoldaşların qəlbində kəndimizə qarşı bir həvəs və maraq oyatmaqdır.

Anama bir gizli sözüm var, ancaq  
Bir ağac altında bir parça torpaq  
Ayır ki, yurd salım kölgəsində mən,  
Əylənib söz açaq doğan səhərdən...

Mən kəndimizə doğan səhərlərin nümayəndəsi kimi getmək istərkən, yoldaş Ələkbərli məni batan axşamların, ölümə məhkum insanların matəmini saxlayan bir mərsiyəçi düşünmüşdür. Mən "əyləşib söz açaq doğan səhərdən" dediyim zaman yeni və coşqun həyatımızı, böyük inqilabımızı nəzərdə tutmuşam. Lakin bu fikrimi şeir dili ilə dediyimdən, şeir kulturasına yaxından bələd olmayanlar təşvişə düşüblər.

Bir də insan zövqü, insanın gözəlliyə olan əlaqə və baxışı əmrlər, qanunlar və priqovorlar ilə dəyişməyir. Onu həyat prosesi öz qanuni inkişaf yolları ilə dəyişir. Odur ki, mənim kəlağayıdan xoşlanmağıma heç kəs qızmasın. Sənət dar və çıxılmaz cığırlarla inkişaf edə bilməz. Şairə onun şəxsi zövqləri qadağan olunarsa, yaradıcının şəxsiyyəti və sənət xüsusiyyətləri inhisar altına alınmış olur.

Bütün bunlarla bərabər, yoldaş Ələkbərli məni bir də təqsirləndirir ki, mən kənddəki yeni istehsal alətləri əvəzində "babamın divardan asılı sazını" görürəm.

Vaxtilə

Şair danışmasın hər zaman işdən,  
Qanundan, qaydadan, sadə vərdişdən,  
Bunları öyrədir başqa kitablar,  
Şerinsə ayrıca gözəlliyi var.

demişdim. Bununla şerimizi quru və cansız təbliğata döndərən, şablon və ritorika yolu ilə gedən böyük sosialist sənətinin dəmir parçalarının quyruğunda sürünən, onu sadələşdirən və qabalaşdıran bəzi yazıçılarımıza qarşı və etirazım bildirmişdim. Saz məsələsinə gəlincə deməliyəm ki, saz öz ona bənzər bəzi şeylər bizim milli xüsusiyyətlərimizdir ki, onlar böyük işlər ərəfəsində bizə yardımçıdırlar. Sazlarımız aşıqlarımızın yeni tərənnümləri və nəğmələri ilə həyatımızda az iş görməyiblər. Şair bunlardan ilham almaya bilməz. Yoldaş Ələkbərli bu milli xüsusiyyətlərimizi bir sinif kimi ləğv etmək istəyir. Lakin dövrümüzün milli xüsusiyyətləri sosializm quruluşu mənafeyinə uyğun olaraq inkişaf etdirilməlidir. Bunu firqəmiz dəfələrlə göstərmişdir.

* * *

"Həsrət" şerində hələ də kəndimizdə davam edib gələn bir çox patriarxal elementlər idealizə olunmuşdur. Bu isə çocuqluq dövrünü xatırlayan bir şairin hissə qapılmasından başqa bir şey deyildir. Bir də insan özünü daima kontrol altına ala bilməz.

Məncə, Ələkbərli yoldaşın verdiyi töhmətlər mürəkkəb insan varlığının daxili ziddiyyətlərini düşünmək yolu deyil, bəlkə, müəyyən düsturlar, formulalar çərçivəsindən kənara çıxa bilməyən sxolastik düşünüş yoludur. Bu isə marksizm tənqidinin yolu ola bilməz. Onun kəndimizə, real varlığımıza olan baxışı belədir. Onun fikrincə, kəndimizdə hər şey öz qaydasındadır. Həyat və insanlar o qədər yüksəklərə qalxmış ki, bircə şeyləri çatmır: o da şlyapadır. Lakin böyük sosialist təsərrüfatı yaradan kəndimizin daxilində əski kəndin bir çox xüsusiyyətləri hələ də yaşayır. Yeni kəndimizdəki bu daxili ziddiyyətləri şair "görə bilməsə də", filosof görməli idi. Həyata, varlığa doqma halında baxmamalı idi. O, mənə sual verə bilər ki, bəs nə üçün bu şeirdə sosialist kəndimizin qələbələrini, onun aparıcı tendensiyasını göstərməmişsən? Bu suala cavab olaraq deyə bilərəm ki, bu ideya başqa yazılarımda olduğundan təkrar etməmişəm. Bir sual da mən verirəm: Tutalım ki, "Həsrət" şeri, sizin dediyiniz kimi, mürtəce bir əsərdir. Siz bunu öz məqalənizdə savadsızlıq bəlası olaraq izah edirsiniz. Əcəba, siz mürtəce bir əsərə bəraət qazandırmayırsınızmı? Əgər mürtəce əsərlərin bəlası savadsızlıq isə, insanlardakı mütləq dünyagörüşü ziddiyyətləri harada qalır?!

Siz məqalənizi belə qurtarırsınız: "Səməd inqilabi axın qarşısında bir an duraraq yıxılana qarşı bir ah çəkdi. Bu isə əhvolunmaz bir gü-

nahdır. O, üzərinə düşən bu çirkin ləkəni inqilabi yolla silməli və öz təqsirlərini təmizləmək üçün şura ədəbiyyatı qarşısında öz əsərləri ilə bəraət qazanmalıdır".

Məncə, bu vulqar, RAPP dövrünü xatırladan sol zərərli bir nəticədir. Bu isə əsərdə müşahidə edilən nöqsanların əsil səbəbini tapmaqdan aciz bir münəqqidin uydurduğu bir nəticə, "aha, düşməni tapmışam!" – deyə qışqırdığı bir "urra", inqilabçılıqdır.

*1935*

## SƏNƏTKAR ÖLDÜ

Böyük və mahir sənətkarımız, səhnəmizin fəxri ilə bəzəyi, səmimi və sadə insan nümunəsi, yaxın əməkdaşım və yaxın dostum Cəfər Cabbarlının vaxtsız ölümünə dərin təəssüflər edirəm. Azərbaycan ədəbiyyatının bu böyük itkisi uzun müddət hiss ediləcəkdir. Cəfər artıq sıramızda yoxdur. Bu qara həqiqət insana röya kimi gəlir, buna insan inanmaq istəməyir.

Sənətkar öldü! Yaşasın onun yaratdığı böyük sənət və bu sənətin böyük ordusu!

*1935*

## AZƏRBAYCAN ƏDƏBİYYAT TƏNQİDİ HAQQINDA

Yoldaşlar, mən Azərbaycan türk tənqidinin vəziyyətinə dair bir neçə söz demək istərdim.

Azərbaycan Yazıçıları İttifaqı Heyəti idarəsinin yaxınlarda öz işini qurtaran birinci plenumu başqa plenumlardan onunla fərqlənirdi ki, bu plenum çox işgüzar idi və hazırkı tənqidimizin əsas nöqsanlarını, əsas qüsurlarını aşkara çıxartdı.

Biz tənqidimizin geridə qalmasından danışarkən bir şeyi unuduruq ki, ümumiyyətlə, tənqidimizin geri qalmasından danışmaq azdır, bu geridəqalmanın konkret səbəblərini aşkara çıxarmaq, bu nöqsanların ləğv edilməsi yollarını, tənqidimizin gələcək inkişaf yollarını göstərmək tələb olunur.

Ümumiyyətlə, tənqidimiz və xüsusilə Azərbaycan türk tənqidi, şübhəsiz, bədii ədəbiyyatın səviyyəsindən geridə qalır. Əgər son iki-üç ildə Azərbaycan türk ədəbiyyatı ona yaxın böyük roman, onlarca yüksək keyfiyyətli yeni poema, onlarca hekayə yaratmışdırsa, ədəbiyyatımızın məhsulu kəmiyyət və keyfiyyət etibarilə tənqidimizin məhsulu ilə müqayisə edilərsə, şübhəsiz, plenumumuzun çıxardığı nəticəni, tənqidimizin ədəbiyyatımızdan çox-çox geridə qaldığı nəticəsini çıxararıq.

Talantlı türk tənqidçisi Əli Nazim yoldaş öz məruzəsində dedi ki, bəzi yoldaşlar tənqidimizin belə geridə qalmasından bəzən ehtikarlıq edir və tənqidimizdə müsbət heç bir şey görmürlər. Bu söz çox haqlı və yerində deyilmişdir. Həqiqətən tənqidimizin geridə qalması nisbi məfhumdur. Çünki tənqid təfəkkürü ümumi ideolojimizin orqanik hissəsi olmaqla geriyə, ölümə doğru getmir, bəlkə gündən-günə artır. Lakin söz yox ki, o, ədəbiyyatımızın səviyyəsindən və xüsusilə ümumi həyatımızdan geriyə qalır. Biz plenumda tənqid məsələsini həmin bu mənada qoymuşduq.

Əvvələn, mənə elə gəlir ki, tənqidçi, bu və ya digər yazıçının müəyyən bir əsərini götürdükdə, hər şeydən əvvəl, bu yazıçını tanımalıdır. O, yalnız tənqid etdiyi ayrı-ayrı əsərləri tanımaq deyil, yazıçını, onun yaradıcılığını bütün mürəkkəbliyi ilə tanımalıdır. Bunsuz tənqidçi heç bir zaman müəyyən əsərə obyektiv, doğru qiymət verə bilməz, onu düzgün təhlil edə bilməz. Şura yazıçısının hər bir əsəri onun ümumi yaradıcılığının orqanik hissəsidir.

Türk tənqidimizdə belə bir hal meydana gəlmişdi. Tənqidçi pədərşahi kəndin momentlərini idealizə edən bir şeri almış, bunun səbəbini ümumi nöqsanımızda, hazırkı kəndin simasına bələd olmayan və ona görə də onun pədərşahi xüsusiyyətlərini idealizə edən yazıçının savadsızlığı, mədəniyyətsizliyi ilə izah etmişdir. İşin mahiyyətinə görə bu, həqiqətə müvafiq deyildir. Zira bu şairin digər əsərləri də vardır ki, burada kəndimizin nailiyyətləri tərənnüm olunur. Kənd həyatının pədərşahi xüsusiyyətlərini idealizə etməsi isə ondan irəli gəlir ki, bu şair əsasən kənd şairi olmaqla və keçmişdə pədərşahi psixolojiyə qapılmış olduğundan, bu psixolojidən özünü tamamilə azad edə bilməmişdir.

Tənqidçi konkret yazıçını tanımadıqda, onun konkret daxili xüsusiyyətlərini, onun psixolojisini öyrənmədikdə, bu və ya qeyri əsərin səhvlərini ümumi səbəblərdə aramağa başlayır.

Yoldaşlar, tənqidçilərimizin bir nöqsanından daha danışmaq istəyirəm. Şair müəyyən bir şey yazdıqda, onu birdən-birə yaratmır. Əgər

öz şerini iki saata, üç saata qurtararsa, buna qədər o, günlər, gecələr və bəlkə də aylar və illərlə öz əsəri üzərində düşünür, daxili iztirab çəkir, can yandırır. O öz sənətini sevir. Bəzən o, qarşısına qoyduğu problemi həll etməyincə, öz qəhrəmanını heç olmazsa özü istədiyi kimi güldürməyincə, bütün gecələr yatmır. Zənnimcə, tənqidçilərimiz də bəzi yazıçılarımız kimi öz sənətini sevməlidirlər. Belə tənqidçilərin, həqiqətən özlərini incəsənət adamı hesab edən tənqidçilərin az olduğu plenumumuzda aşkara çıxdı. Onlar təsadüfdən-təsadüfə yazırlar, enerji sərf etmədən, öz sənətini sevmədən və ona ehtiram bəsləmədən yazırlar. Bu da tənqidimizin geridə qalmasının konkret bir səbəbidir.

Digər bir səbəb daha vardır. Biz, yazıçı və şairlərimizdən həqiqi həyatı yaxşı bilməyi, bu həyatı öyrənməyi tələb edirik. Zira belə olmazsa, onların əsərləri həyatımıza müvafiq olmaz, onların əsəri bu həyatın dialektikası deyil, quru sxemi, fantaziyası olar. Zənnimcə, biz onu tənqidçilərimizdən də tələb etməliyik. Bu məsələdə biz hətta təşkilat tədbirləri görməliyik. Yəni yazıçılarımızı ezam etdiyimiz kimi, həyatı öyrənmək üçün tənqidçimizi də ezam edə bilmərikmi? Biz bunu tənqidçilərimizdən tələb etməliyik, həm də yalnız tələb etmək deyil, bu nöqsanın aradan qaldırılması üçün müvafiq təşkilatların yardımı ilə şərait yaratmalıyıq.

Yoldaşlar, bir çox tənqidçilərimiz yazıçını öyrətməyi çox sevirlər. Bəzən bu, artıqdır. Onlar yazıçının özünə çoxdan məlum olan şeyləri söyləyirlər. Bütün iş burasındadır ki, hazırkı türk tənqidimizdə başlıca bir şey çatışmır. Tənqidi materialı oxuyarkən, bu məhsulun yazıçını öyrədə biləcək və eyni zamanda ona ilham verəcək dərəcədə yüksək bədii tərzdə yazılmadığı aşkar olur. Dahi tənqidçi klassiklərin əsərlərini oxuduqda görürük ki, onlar nəinki yazıçıları öyrədirlər, hətta onların əsəri həqiqətən bədii bir əsər kimi oxunur. Söz yox ki, mən bu bədii əsəri hekayə, romanla bir sıraya qoymuram. Lakin bu adamlar yazıçıya ilham verməyə, ona proqressiv ideyalar verməyə müqtədirdilər. Bunun üçün yüksək mədəniyyət və həyatı dərindən anlamaq tələb olunur. Bizim tənqidçilərimizdə çatışmayan da budur.

Tənqidimizdə digər bir təhlükə daha vardır. Bəzi tənqidçilər, bizdə böyük tənqidi əsərlərin olmamasını indiyə qədər böyük bədii əsərin olmaması ilə bəraətləndirirlər. Bununla onlar özlərinin bəzi səhvlərini bəraətləndirmək istəyirlər. Şübhəsiz, böyük tənqidi əsərin olması üçün böyük ədəbi əsərin olması lazımdır. Tənqidçini həmişə yeni yazmağa

başlayanlar, xırda əsərlər haqqında yazmağa məcbur etmək doğru olmazdı. Əgər tənqidçi bu və ya digər böyük klassik əsər və yaxud müasir əsər haqqında yaza bilərsə, bu onun gələcək zehni inkişafına təkan verər. Lakin burada yoldaşlar bir cəhəti unudurlar ki, hamımızın səy etdiyimiz belə böyük, ölməz əsərlərin yaradılmasında tənqidimiz aktiv rol oynamalıdır. O, müəyyən yazıçının konkret şəraitini, onun yaradıcılığını nəzərdə tutaraq göstərişlər verməli, onun əsərinin bütün nöqsanlarını, bütün konkret səhvlərini aşkara çıxarmalı, yazıçının bütün daxili xüsusiyyətlərini bilərək onun yaradıcılığının gələcək inkişafı üçün yollar göstərməli və bununla da onun gələcək inkişafına yardım etməlidir.

Demək istədiyim əsasən bunlar idi. (*Alqışlar*)

*1935*

## A.S.PUŞKİNİN "YEVGENİ ONEGİN" POEMASININ TƏRCÜMƏSİ HAQQINDA

A.S.Puşkinin ən böyük əsəri "Yevgeni Onegin" mənzum romanının tərcüməsi üzərində mən iki il işləmişəm. Bu iş həcm etibarilə olduqca böyük, məzmun etibarilə isə çox mürəkkəb, gərgin və məsuliyyətli idi.

İndiyədək "Yevgeni Onegin" romanını heç kəs Azərbaycan dilinə tərcümə etməmişdir. Bu mənim üzərimə daha böyük məsuliyyət qoyurdu. Mən öz qarşıma belə bir məqsəd qoymuşdum ki, Puşkinin bu böyük və gözəl əsərini Azərbaycan xalqına bütün gözəlliyilə çatdıram. Mən əsər üzərində nə qədər çox işləyirdimsə, əsər məni o qədər həvəsləndirirdi.

Mən öz tərcüməmdə məşhur Onegin strofasını – misraların sayını və qafiyələnmə qaydasını bütünlüklə qoruyub saxlamışam, bəzi yerlərdə imkan daxilində hətta qafiyələri də qorumağa çalışmışam.

Puşkin dilinin sadəliyini və onun fikir dərinliyini qorumağa böyük diqqət vermişəm. Tərcümə etdiyim zaman mən həmişə özümə belə bir sual verirdim: görəsən Puşkin özü burada öz fikrini Azərbaycan dilində necə ifadə edərdi? Bu sual məni məcbur edirdi ki, Puşkinin obrazlarını daha diqqətlə və dərindən dərk edim, onları mümkün qədər dəqiq, sadə və ifadəli tərcümə edim.

Tərcümə zamanı Puşkinin yaradıcılığı haqqında tarixi materiallar, tənqid və biblioqrafiya mənə çox kömək etmişdir. Bu materiallardan

istifadə edərək, mən Puşkinin nə cür şəraitdə yaratdığını, onun həyəcanlarını və sairəni öyrənirdim.

Tərcümə zamanı daim çalışırdım ki, sxematizmə yol verməyim, tərcüməni canlı, dolğun edim, elə edim ki, əsər Azərbaycan xalqı üçün aydın olsun.

"Yevgeni Onegin" tərcüməsində mən həmçinin Azərbaycan dilinin saflığını, əlvanlığını, ahəngdarlığını və orijinallığını qoruyub saxlamağa çalışmışam, əsrlər boyu bu dili zibilləyən ərəb-fars sözlərini və ifadələrini rədd etmişəm.

"Yevgeni Onegin" romanının tərcüməsinin öhdəsindən necə gəldiyimi mən özüm deyə bilmərəm. Tərcümənin ayrı-ayrı parçalarını və fəsillərini dəfələrlə Puşkinin yaradıcılığını yaxşı bilən yoldaşlarıma və oxucularıma oxumuşam. "Yevgeni Onegin" romanı Puşkinin anadan olmasının yüz illiyi münasibəti ilə Azərbaycan dilində ayrıca nəşr ediləcəkdir. Lakin mən bu əsər üzərində işimi bitmiş hesab etmirəm. Sonrakı nəşrlərdə mən tərcüməmi təkmilləşdirəcək və daha da yaxşılaşdıracağam.

Qoy mənim tərcüməm bizim beynəlmiləl birliyimizin və qardaşlığımızın yeni bir sənədi olsun!

*1937*

## "AZƏRBAYCAN" EPOPEYASI

Mən Azərbaycan düzlərində dünyaya gəldim. Mənim atam və anam yoxsul kəndli idilər.

Mənim otuz bir yaşım var. İnqilab məni savadlı etmiş və məndə təhsil almağa coşqun bir həvəs oyatmışdı. Mən məktəbi bitirib pedaqoji fəaliyyətlə məşğul olmuşam.

1926-cı ildən yazmağa başlamışam. Şeir mənim idealımdır. Poeziya mənim ikinci həyatım oldu. Mənim birinci şeirlər kitabım – "Şairin andı" Bakıda 1930-cu ildə nəşr olunmuşdur. Onun bir hissəsi rus dilinə tərcümə edilmişdir. Sonra bir neçə şeirlər kitabım nəşr olunmuşdur ("Fanar", "Könül dəftəri" və s.).

Son zamanlar mən "Azərbaycan" adlı böyük bir epopeya yazmışam. Burada mənim vətənimin iki min illik tarixinin əsas mərhələləri və ona azadlıq gətirən sovet illəri öz əksini tapmışdır. Bu epopeya bir-biri

ilə bağlı olan otuz poemadan ibarətdir. Epopeya Azərbaycan xalqının azadlıq mübarizəsinə böyük partiyamızın göstərdiyi tarixi xidmətlərə həsr edilmiş “Ordenli qəhrəman” poeması ilə qurtarır. Ölkənin ən yüksək mükafatı ilə təltif olunduğum 1936-cı il mənim həyatıma ən gözəl, ən fərəhli bir tarix kimi daxil olacaqdır.

Böyük Oktyabr inqilabının iyirmi illiyinə köhnə kəndin kollektivləşmə yoluna düşməsini göstərən mənzum romanım “Komsomol poeması” çapdan çıxacaqdır. Bu, sovet ədəbiyyatı tarixində birinci mənzum roman olacaqdır.

Mənim tərcümə etdiyim “Yevgeni Onegin” çapdan çıxmışdır. Bu, dahiyanə poemanın mənim dilimə ilk tərcüməsidir...

*1937*

## VAQİF HAQQINDA

Böyük şairlərimizdən olan Vaqifin həyat və taleyi məni uzun illər boyu düşündürmüşdür.

Hər kəsə məlumdur ki, Azərbaycan xalqının bu böyük şair oğlu xalqının azadlığı uğrunda öz canını qurban vermişdir. Vaqif Azərbaycan dili uğrunda, farsçılığa, ərəbçiliyə qarşı mübarizədə böyük işlər görmüşdür.

Vaqif gözəllik aşiqidir. Lakin onun gözəlləri “hurilər”, “pərilər” deyil, yer qızlarıdır, həm də Azərbaycan qızlarıdır. Başı kəlağayılı, toylarda kəklik kimi süzən gəlinlər Vaqifin real insanlarıdır.

Bir çoxları Vaqifin zahiri gözəlpərəst olmasını iddia edirlər. Bu fikir, şübhəsiz ki, yanlışdır. Şair zahiri gözəlliyə aşiq olmaqla, mənəvi gözəlliyə də çox əhəmiyyət verərmiş.

Tavus kimi cilvələnə hər səhər,
Bəzək verə camalına sərasər,
Dindirməmiş, verə könüldən xəbər,
İşarə anlayıb, hal bilən gərək.

Görünür ki, şair “dindirməmiş könüldən xəbər verən, işarə anlayıb hal bilən” gözəllərin aşiqi olmuşdur. Nə qədər həssas bir qəlblə deyilmiş sözlərdir!

Bizcə, Vaqif böyük estetik zövqlər şairi olmuşdur. Lakin bu zövqlər Azərbaycan xalqının öz doğma zövqləri olduğundan, Vaqifin şeirləri dillərdə əzbərdir. Onlar öz əhəmiyyətini bu gün belə itirməmişdir.

Vaqif yaradıcılığı Azərbaycan poeziyasının birəsrlik inkişaf yolunu təyin etmişdir, onun yüzlərlə təqlidçisi olmuşdursa da, yenə Vaqifin yerini verən olmamış. Doğrudan da, "hər oxuyan Molla Pənah ola bilməmişdir". Vaqif yaradıcılığını dar, milli bir çərçivədə demək də böyük bir xəta olar.

Bizcə, Vaqifdə yüksək bəşəri hisslər, zövqlər, ideyalar vardır ki, bunların ətrafında elmi işçilərimiz, tədqiqatçılarımız böyük əsərlər yazmalıdırlar. Vaqifin:

Alilər xaki məzəllətdə, dənilər mötəbər,
Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər.
İşlənən işlərdə əhkami-ləyaqət görmədim.

– sözləri feodalizm cəmiyyətinin iç üzünü açır, bütün bir epoxanı xarakterizə edir. Bu sözlər göstərir ki, böyük şair öz dövrünün üfüqlərinə qalxaraq, şahin qanadlarını gərir, özünə məxsus bir səslə azadlıq dünyası axtarır...

Vaqif sarayda vəzir vəzifəsində çalışmışdır. Lakin onun qəlbi daim öz xalqının qəlbi ilə bir çarpmışdır. Onun İran şahı Məhəmməd Qacara qarşı apardığı böyük mübarizə açıq göstərir ki, şair heç kəsə satılmadan öz vətəninin azadlıq və istiqlaliyyəti uğrunda zindanlara düşmüş, gözü ilə ölümlər görmüşdür...

Biz sovet yazıçılarının vəzifələrindən biri də qaranlıq keçmişin işıqlı cəhətlərini – böyük insanlarını yaxından öyrənmək və xalqımıza tanıtmaqdır. Bu məqsədlə də mən "Vaqif" dramını yazdım. Əsərin fonu, Azərbaycan xalqının yerli xanlara və xarici invervent Məhəmməd Qacara qarşı apardığı mübarizədir ki, bu mübarizənin ruhlandırıcısı Vaqif olmuşdur. Götürülmüş məqsəd nə dərəcədə həll olunmuşdur? Bu xüsusda tamaşaçılarımızı və tənqidçilərimizi gözləyirik!

*1938*

## MƏHƏBBƏTLƏ DOLU ÜRƏK

Taras Şevçenkonun yaradıcılığı ilə mən hələ gənc yaşlarımda, iyirmi beş il bundan qabaq tanış olmuşam. Şairin obrazı ilə isə daha əvvəl tanış olub doğmalaşmışam. O vaxtlar Şevçenko xəyalımda əfsanəvi xalq qəh-

rəmanlarının igidlikləri ilə tərbiyələnmiş, xalqının azadlığı uğrunda düşmənlə açıq vuruşa girən qüdrətli bir mübariz kimi canlanırdı. Sonralar böyük Ukrayna şairinin tərcümeyi-halı ilə yaxından tanış olduqda gördüm ki, romantik xəyalım məni aldatmayıb.

Xalqın fəxr etdiyi qəhrəmanlarda bizim diqqətimizi hər şeydən qabaq onların möhkəm iradəsi, yorulmaz mübarizliyi, əqidə saflığı cəlb edir. Bütün bu cəhətləri biz Taras Şevçenkoda da görürük. Bu xüsusiyyətlər şairi, hər cür vasitə ilə onun iradəsini qırmağa çalışan çap hökumətinin barışmaz düşməninə çevrilmişdir. Azərbaycan xalqının IX əsrdə yetişmiş qəhrəman oğlu, iyirmi il ərəb işğalçılarına qarşı mübarizə aparıb, düşmənin bütün təkliflərini cəsarətlə rədd edən Babək kimi Şevçenko da bütün varlığı ilə xalqına bağlı olmuş, çar hökumətinin boş vədlərinə inanmamışdır.

Adətən, Şevçenko kimi şəxsiyyətlər hansı dildə yazmasından, düşmənə qarşı hansı silahla vuruşmasından asılı olmayaraq bütün xalqların əbədi məhəbbət və rəğbətini qazanır.

Biz sovet yazıçıları Şevçenkodan çox şey öyrənirik. Biz ondan öz yüksək vətəndaşlıq duyğularımıza kamil bədii forma geydirib, düşmənə qarşı amansız olmağı, dost qəlbində daim yuva qurmağı öyrənirik. Elə buna görə də Taras Şevçenkonun kəskin siyasi və lirik şeirləri dünya poeziyası panteonunda görkəmli yerlərdən birini tutur. “Qafqaz”, “Qaydamaqlar”, “Yuxu” əsərlərini oxuduqda öz xalqının arzu və istəklərini məharətlə qələmə alan mübariz şairin yüksək vətəndaşlıq hissləri məni məftun edir. Ölməz Qorkinin sozlərini xatırlayıram. O, 1909-cu ildə Kapridə Şevçenkoya həsr etdiyi məruzəsində şairləri xalqla qaynayıb-qarışmağı, xalq yaradıcılığından istifadə etməyi Taras Qriqoryeviçdən öyrənməyə çağırırdı. Şevçenkonun bütün əsərlərindəki azadlıq eşqi, xalq səadəti kimi xoş arzular məhdud milli mövzular deyil. Şevçenko yaradıcılığındakı bu motivlər onun odlu şeirlərini bütün xalqlara, o cümlədən əsrlər boyu yadelli işğalçılara qarşı mübarizə aparmış azəri xalqına yaxınlaşdırır və doğmalaşdırır. Bax, buna görə də böyük şairin anadan olmasının 125 illiyini qeyd etdiyimiz gündə vətənimizin bütün xalqlarının ürəyi bir daha şairə məhəbbət hissi ilə dolur.

Çar hökumətinin illərlə maneçilik törətdiyi xalqlar dostluğunun böyük mədəni əhəmiyyətini biz indi dərindən dərk edirik. Taras Şevçenkonun yaradıcılığı Azərbaycan mədəniyyəti üçün qiymətli incidir. O, biz azərbaycanlılara daha yaxın və doğmadır. Keçən il Pavel Qri-

qoryeviç Tıçinanın bizdə (Bakıda – *red.*) bu mövzuda söhbəti oldu. Onda mənim azərbaycanlı dostlarım Şevçenkonun qüdrətli bir sənətkar olduğunu, siyasi ideyalarını yüksək sənətkarlıqla ifadə etmək bacarığını xüsusilə qeyd etdilər. O, hərtərəfli, zəngin ideyalı şeirlərini, məhz, öz siyasi fikirlərinin xidmətinə vermişdir.

Çarizmin bütün təqiblərinə baxmayaraq, Şevçenko şerinin al şəfəqləri onun müasiri olan Azərbaycan şair və yazıçılarına da çatmış və onlar Taras Qriqoryeviçi yüksək qiymətləndirmişlər.

Azərbaycanda Sovet hakimiyyətinin qələbəsindən sonra onun adi bizim xalqımız arasında daha geniş yayıldı və sevildi.

Partiya bizə doğma vətən torpağında yaşayan bütün millətlərin böyük sənətkarına hörmət etməyi öyrədir. Lap bu yaxınlarda Sovetlər İttifaqı öz milli qəhrəmanlarını, sənət titanlarını – Puşkini, Rustavelini və Cambulu dünyaya layiqincə tanıtmağa qadir olduğunu sübut etdi. Ukrayna xalqının böyük oğlunun qarşıdakı yubileyi sovet xalqlarının öz mübariz sənətkarlarına hörmət və məhəbbətini bir daha nümayiş etdirir.

Sovet Azərbaycanının şəhər və kəndlərində bu bayram xüsusi məhəbbətlə qeyd ediləcəkdir. Biz Şevçenkonun yubileyinə öz milli bayramımıza hazırlaşan kimi hazırlaşırıq. Çünki Şevçenkonun həyat yolu və taleyi xalqımıza, yeni Azərbaycan şerinin yaradıcısı, şair və dövlət xadimi, bütün istedadını Azərbaycanın müstəqilliyinə sərf edən Vaqifi xatırladır.

Azərbaycan oxucusu Şevçenkonu bir də ona görə sevir ki, onda poetik sözün qüdrəti ilə sərkərdəlik qılıncını birləşdirib xalqının səadəti uğrunda mübarizə aparan sevimli, əfsanəvi qəhrəmanımız Koroğlunun cizgilərini görür.

Mən inanıram ki, yubileyə hazırlıq günlərində bizim sovet ədəbiyyatı mübariz şairin obrazını yaradan əsərlərlə zənginləşəcəkdir.

Mən özüm Azərbaycan xalqının şair və elçisi kimi bu yubileyi yalnız şairin əsərlərinin tərcüməsi ilə deyil, ona həsr elədiyim poema ilə qarşılamağı özümə şərəfli borc hesab edirəm. Bu poemanı mən uzun illər bundan qabaq çar Rusiyasının zülmət gecələrində Taras Şevçenkonun poetik qılıncının tufandan qabaqkı şimşək kimi parladığı bu torpaqda – çiçəklənən sovet Ukraynasında yazacağam.

*1938*

## [S.VURĞUNUN YAZIÇI VƏ BƏSTƏKARLARIN YARADICILIQ ƏLAQƏLƏRİNİN MÖHKƏMLƏNDİRİLMƏSİNƏ HƏSR OLUNMUŞ MÜŞAVİRƏDƏ ÇIXIŞI]

Operalarımızın yaradılması barədə mənim bir qeydim var. Əvvəla, elə bilirəm ki, bir yazıçı kimi mənim üçün opera sənəti hələ kifayət qədər aydınlaşdırılmamışdır. Əgər mən opera yazsam, çox şey itirərəm.

Bu nədən irəli gəlir? Bəlkə, həmin məsələdə məlumatım azlıq təşkil edir. Mən Rəfilinin o fikri ilə razılaşmıram ki, bizim bütün şairlər musiqini duymaq bacarığından məhrumdur. Nadir musiqi əsərləri poeziyanı üstələyə bilər. Bizim kimi yaradıcı adamlara bir məsələni aydınlaşdırmaq lazımdır. Belə güman edək ki, opera musiqisi yazıçıya təsir göstərər və bunun yeni əsərin yaranmasına köməyi olar. Bu məsələdə Hacıbəyovun fikri ilə şərikəm. Əgər bir şeydən təsirlənməsən, yaxud ilham almasan, heç bir əsər yarada bilməzsən. Onda yalnız sadəcə, mexaniki surətdə sifarişi yerinə yetirmiş olarsan. Mənim fikrim belədir.

"Yevgeni Onegin" operasını dinləyəndə Çaykovskinin gözəl musiqisinə valeh olursan. Hiss edirsən ki, bu musiqi Puşkinin poeziyasını daha da canlandırır. Məsələn: "Hara, hara uçub getdiniz, mənim baharımın qızılgülləri?" Bu, romantikadır. Əlbəttə, buna Çaykovskinin musiqisi əlavə olanda. Bəs bu necə yaranır? Aydın olur ki, bizim bəstəkar və yazıçılar birgə işləməyi bacarmırlar. Üzeyir bəy məsələni düzgün qoyur, mən onun fikri ilə razılaşıram. Məncə, şair şeirlə elə mətn yaratmalıdır ki, bəstəkar ondan təsirlənsin, ilhama gəlsin, onu dəyişdirməyə əli gəlməsin. Opera üçün ədəbi libretto yazmaqdan ötrü şair bizim şeir yaradıcılığını hərtərəfli bilməlidir. Bir var, əvvəldən axıra kimi eyni formada şeir yazasan, bir də var, poeziyanın bütün şəkillərindən istifadə edəsən. Şair bilməlidir ki, şikəstə olan yerdə çoban bayatı oxumalıdır. Ona görə şeri bayatı formasında yazmalıdır. Bəstəkar isə həmin formanı dəyişdirməməli, onun üzərində musiqi bəstələməlidir.

Deyəsən, məsələdən bir az uzaqlaşdım. Mənə elə gəlir ki, opera səhnəsində ədəbi obraz alınmır. Əgər "Koroğlu" operasının gözəl musiqisini atsaq, bir səhnə obrazı kimi Koroğlu surəti səciyyələnərmi? Əgər yazıçılardan hər hansı biri musiqisiz "Koroğlu" dramı yazmış olsa, onda Koroğlunun səhnə obrazı tamam başqa cür alınar, hərtərəfli, zəngin və bitkin bədii surət kimi meydana çıxar. Deməli, opera sənəti öz xüsusiyyətləri ilə yazıçının geniş şəkildə və əhatəli göstərmək imka-

nını məhdudlaşdırır. Operaya dramatik əsər kimi baxmaq olmaz. Bu məsələ mənim üçün tamamilə aydın deyil. Təsəvvür edə bilmirəm: belə bir qarşılıqlı anlaşma yaratmaq olarmı ki, mənəvi cəhətdən həm şair, həm də bəstəkar razı qalsın.

Mənə çox qəribə gəlir: nə üçün opera 4 və ya 5 pərdədə göstərilir? Bu məsələdə dəyişiklik etmək mümkün deyilmi?

Müxtəlif dialoqlardan istifadə yolu ilə qəhrəmanı ayrı-ayrı şəraitdə təsvir etməklə, şəkillər yaratmaq olarmı?

(Hacıbəyov: – Mən şəkilləri qəbul etmirəm.)

Bilirəm, şəkillər yaratmaq sizə xoş gəlmir. Hər halda, mənə maraqlıdır ki, məsələlər dərindən aydınlaşdırılsın. Bizdə yazıçılarla bəstəkarlar arasında canlı yaradıcılıq əlaqələri yoxdur.

Məsələn, biz məmnuniyyətlə sizin əsərlərinizi və musiqinizi dinləyirik. Ancaq mən əminəm ki, bəstəkarlarımızın çoxu ədəbiyyatımızı bilmir, ondan bəhrələnmir. Elə bir hadisə yadıma gəlmir ki, bəstəkar bir ədəbi əsəri oxuyub, gəlsin yazıçının yanına və desin: "Mən sənin əsərinlə tanış oldum, o mənə böyük təsir etdi". İlhamsız əsər yazmaq olmaz, bəstəkarlarımızsa bu məsələyə soyuq yanaşırlar.

"Leyli və Məcnun" operasını götürək. Əgər Üzeyir bəy onu yenidən "Koroğlu" kimi notlu opera yaratsa, bu, əvəzsiz əsər olardı. Ancaq qoy ilk variant qalsın. (Haçıbəyov: – Onu nota da salmaq olar). Mənə elə gəlir ki, biz bugünkü müşavirənin müzakirə etdiyi məsələdən çox uzaqlaşırıq. Qanadlı sözlər deyir, konkret yaradıcılıqdan söhbət açmırıq.

Üzeyir bəy dedi ki, 4 il oturub "Koroğlu"nu yaradıb. Yalnız operalar deyil, bütün bədii əsərlər də belə yazılır.

Qəzetlər yazır ki, ongünlükdən 6 ay keçməsinə baxmayaraq, hələ heç bir əsər yaradılmayıb. Bununla razılaşmaq olmaz. Əgər bu 4 ildə Üzeyir bəydən başqa daha 4 bəstəkar yaradıcılıq axtarışları aparsaydı, bəlkə də, daha 4 "Koroğlu" yazılardı.

Bəstəkarları səfərbərliyə almaq lazımdır ki, onlar yaxşı mövzulara girişsinlər və iki ildən sonra bizim bir neçə operamız olsun.

Bütün yazıçıları operaya cəlb etmək lazım deyil. Yoldaş Ordubadi, bəzi müvəffəqiyyətsizliyinə baxmayaraq, məndən və Süleymandan çox iş görə bilər. O bu işin pərəstişkarıdır. Qoy yazsın. Başqa bir məsələ ki, bu işə kollektiv surətdə girişməliyik. Kimin yazmağa həvəsi var, onu bu işə cəlb etmək lazımdır. Fikrimcə, belə yaradıcılıq müşavirələrini tez-tez çağırmaq vacibdir. Bu yazıçı və bəstəkarların bir-biri ilə görüş-

mələrinə imkan yaradır. Bir-birimizə mane olmadan evlərimizə getmək və birgə gəzməyə də çıxmaq mümkündür...

Burda zəif bir cəhət var. Tutaq ki, məni "Xanlar" mövzusu maraqlandırır, Rəfilini "Mirzə Fətəli Axundov", yaxud müasir mövzu. Əgər mən bu mövzunu işləməsəydim, fikrimcə, libretto başlamaq olardı. Ancaq indi çətindir.

Hər bir yaradıcı işçi və bəstəkar ki, başlıcası işə başlamaq və işin gedişində təsirlənmək, başqa sözlə, ilhama gəlmək vacibdir.

Əgər mövzu onu tutursa, həvəsə gəlir, ürəyincə olmursa, işə girişmir. Yaxşı əsər yaratmaq üçün opera üzərində bir neçə il işləmək lazımdır. Bir əsəri başlayıb 5 ilə tamamlamaq olar, yaxud bütün enerjini, diqqətini və yaradıcılıq qüvvətini toplayıb onu daha tez qurtara bilərsən.

Mənə maraqlıdır ki, bəstəkarlar üçün lazımi şərait yaradılıbmı? Yazıçılardan ötrü hələlik belə bir şərait yoxdur...

Mən Üzeyir bəyi bir neçə işdə görürəm. Bir tərəfdən bu heç də xoşuma gəlmir. Hansı məqsədlə belə istedadlı bir bəstəkarın vaxtının 80 faizini əlindən almaq olar? Halbuki onun çalışdığı yerlərdə, tutalım, Niyazi, yaxud başqa gənc bəstəkarlar işləyə bilərlər. (Hacıbəyov: – Mən özümə şərait yaratmaq üçün bütün tədbirləri görürəm.)

Bu başqa məsələ ki, mövzu Üzeyir bəyi tutub, o da yazır. Yaradıcılıq əlaqəsi bağlayıb bilet alar, qatara minər və 3-4 aylığa Yaltaya gedər. Bu adamı həyatın kiçik işlərindən azad etmək lazımdır.

Mənim həyatım qəribə bir şəkil alıb: səhər saat 10-dan axşam saat 10-a kimi günümü yaradıcılığıma heç bir dəxli olmayan müxtəlif yığıncaqlarda keçirirəm. Bütün günü şəhərin o baş-bu başına gedir, evə yorğun qayıdıram. Bu da yaradıcılıq fantaziyama xeyli təsir göstərir, onu zəiflədir. Bizə şərait lazımdır.

Yaxşı deyil, müqavilə bağlamağı təklif edir, adamların əsər yaratmağı öhdələrinə almalarını istəyirsiniz. Ən başlıca məsələ şərait yaratmaq, operamızın inkişafını elə səviyyəyə qaldırmaqdır ki, biz onu ürəkdən sevək, fəxr edək. Bu, operaya olan yaradıcılıq meylini daha da qüvvətləndirər.

Mən bir yazıçı kimi həmin yaradıcılıq əlaqəsində iştirak etməyi özümə borc bilirəm... Ancaq konkret olaraq öhdəmə heç bir şey götürmürəm. Mən müxtəlif mövzular üzərində düşünürəm. Adamları tələsdirməyin, vaxt vermək lazımdır ki, fikirləşsinlər. Kim hansı mövzunu seçər, özü də ərizə verər. Onda işlər yaxşı gedər...

Fikrimcə, Vətəndaş müharibəsi və Nizami mövzuları aktualdır. Əvvəla, “Vaqif”i mən libretto kimi yazmayacağam. Çünki onu opera şəklinə salmaq çətindir. Həm dram, həm də opera teatrında bir sıra nöqsanlar hökm sürür ki, bunlar hamımızı narahat etməlidir. Bunlardan biri Vətəndaş müharibəsi mövzusunda operamızın azlığı məsələsidir. Doğrudur, bu mövzuda hələlik “Nərgiz” operamız var. Tarixi mövzuda isə “Koroğlu” operası yaradılıb. İkincisini də yazmaq olar. İncəsənətimiz sosializm əsrinin pafosunu əks etdirməlidir. Bu baxımdan bütün bunlar bizi qane edə bilməz. Bizim romantikamız – yeni insanın romantikasıdır. Bu, incəsənətimizdə öz əksini tapmalıdır. Biz bunu etməyə borcluyuq. Başqa sözlə, biz – sovet yazıçı və bəstəkarları həmin vəzifəni yerinə yetirməliyik...

... Bu baxımdan mən bir yazıçı kimi sizə iki əsər vəd edə bilərəm; əvvəla, 40-cı ildə Çaykovskinin yubileyi münasibətilə göstərmək istədiyiniz “Yevgeni Onegin” librettosunun tərcüməsini. Bu əsər mənə tanışdır, onu çevirərkən öz tərcüməmdən istifadə edəcəyəm. Mən çox şey vəd edib, az iş görən adamların cərgəsində olmaq istəməzdim...

Sonra müasir sovet həyatından bir libretto yazacağam. Qurtaran kimi gətirib sizə oxuyaram. Həmin işi bu il yerinə yetirməyə çalışacağam.

Bəstəkarlarla isə gələn ilin yazında bu barədə danışarıq. Müasirimiz olan yeni insan məni çox maraqlandırır. Siz deyəndə ki, öz qüvvəni sına, bu, mənim çox xoşuma gəlir. Yeni insanı təsvir etmək lazımdır. Məsələn, Bəsti Bağırovanı göstərmək olar. Yoxsul sağıcı qadın, görün necə yüksəlmişdir. Yoldaş Üzeyir bəy, bu mövzuda opera yaratmaq olar, ya yox?.. Əlbəttə, olar. Belə mövzu məni çox maraqlandırır. Bu mövzuda bir sıra şeir və poemalar yazmışam. Kəndlilərin, yeni adamların həyatını pis bilmirəm. Bu mövzuda mən əsər yazacağam, bir şərtlə ki, musiqisini Üzeyir bəy bəstələsin.

*1938*

## [I ÇAĞIRIŞ AZƏRBAYCAN SSR ALİ SOVETİNİN II SESSİYASINDA ÇIXIŞI]

Deputat yoldaşlar! II sessiyamızın müzakirəsində duran məsələlərdən biri də yeni Azərbaycan əlifbası yaratmaq məsələsidir. Bu, şübhəsiz ki, olduqca böyük siyasi və dövlət əhəmiyyəti olan müqəddəs bir məsələdir.

Xalq dili, xalq əlifbası! Bunun qədər məsul, bunun qədər şərəfli və müqəddəs bir vəzifə çox az-az olur.

Sessiyamızın müzakirəsinə qoyulmuş bu böyük məsələ bir daha sübut edir ki, bizim sosializm dövründə xalq dili, xalq əlifbası yüksək bir dövlət işi şəklini almışdır. Qabaqlar belə məsələlər bir ovuc istismarçılar, çinovniklərin əli ilə həll olunardı.

Bu gün isə bütün xalq özünün ən yaxşı nümayəndələri simasında bu məsələni həll edir. Bu, bir daha bizim qarşımızda və bütün dünya qarşısında böyük partiyamızın xalqa qarşı hörmət və ehtiram hissini nümayiş etdirir. (*Gurultulu alqışlar*)

Bu, bir daha bizim demokratiyamızın... dünyada ən həqiqi, ən proqressiv və revolyusion demokratiya olduğunu dünya qarşısında nümayiş etdirir.

Nə üçün biz Azərbaycan sovet intelligensiyası yeni Azərbaycan əlifbası məsələsini dövlət və partiya qarşısında irəli sürmüşük? Bunun nə kimi səbəbi vardır?

Yoldaş Mirzə Məmmədov öz məruzəsində bizim tariximizə bir nəzər yetirdi. Bilirsiniz ki, əsrlərdən bəri ərəb əlifbası bizim Azərbaycan dilini nə kimi məhkumiyyət altına almışdı. Bilirik ki, qəhrəman xalqımızın böyük insanları bu əlifbaya qarşı əsrlər boyu üsyan etmişlər. Bu gün bizim tribunadan, heç şübhəsiz ki, Füzuli, Axundov, Sabir və başqa böyük klassiklərimizin də səsi gəlir. Bu o deməkdir ki, Azərbaycan xalqı yalnız indiki vəziyyəti ilə deyil, keçmiş tariximizin də ən proqressiv cəhətləri ilə birlikdə yaşayır, yaradır və inkişaf edir...

Azərbaycan xalqı əsrlərdən bəri ərəb əlifbasına qarşı mübarizə apardısa, yalnız sovet quruluşunun, sovet dövlətinin köməkliyi ilə Şərqin qapısında, birinci dəfə olaraq, ərəb əlifbasını dəfn edə bildi.

Bizim arxamızca bir çox xalqlar da ərəb əlifbasını dəfn edərək, yeni latın əlifbasına keçdi.

Heç şübhəsiz ki, bu əlifba bizim tariximizdə ərəbçilik, farsçılıq, osmançılığa qarşı mübarizədə olduqca proqressiv bir rol oynadı. Lakin bu gün rus əlifbasının qrafikası əsasında qurulmuş yeni Azərbaycan əlifbasını daha mənfəətli görürük. Heç şübhə yoxdur ki, yeni düzəldəcəyimiz əlifba, hər şeydən əvvəl, öz ana dilimizin inkişafına, onun daha mədəni bir dil olmasına xidmət edəcəkdir...

Biz yeni əlifbanı qurduğumuz zaman nə kimi əsas şərtləri nəzərdə tutmalıyıq? Birinci şərt bu olmalıdır ki, yeni quracağımız əlifba Azər-

baycan xalqının dilinin bütün xüsusiyyətlərinə cavab versin. Ana dilimizin bir nöqtəsinə, bir vergülünə, balaca da olsa, zərər gələ bilməyəcəkdir. Çünki dil əlifba üzərində qurulmur, əlifba dil üzərində qurulur. Odur ki, biz bu işdə olduqca ehtiyatlı tərpənməliyik ki, bir çox "ura", yalançı internasionalizmə doğru iş aparmaq istəyən adamlara yol verməyək.

Bilirsiniz ki, bizim dilimizdə bir çox səslər vardır ki, ruscada bunlar yoxdur. Məsələn, ə, ö, h, g, ğ və sairə. Bu səslər rus dilində olmadığı üçün bunların hərfləri də rus dilində yoxdur. Bu səslər dilimizin xüsusiyyətlərini doğuran səslərdir. Bu səsləri saxlamaqla onlara münasib şəkil tapıb qoymalıyıq.

Bir çox hərflər də vardır ki, bəzi yoldaşlar onların bizim yeni əlifbamıza daxil olmasını təklif edirlər. Məsələn: "ъ", "ц", "щ", "я" "ю" və sairə. Lakin bizdə iki səsdən əmələ gəlmiş hərf yoxdur.

Mən bu hərflərin yeni əlifbamıza daxil edilməsinə başdan zidd olmuşam, yenə də ziddəm! Çünki buna heç bir ehtiyac yoxdur və həmin səslər bizim dilimizi süniləşdirə bilər. "Hedrin" sözünü sadəcə Şedrin yazmaq, yaxud "Üetkin" sözünü Setkin yazmaq milli dilimizin xüsusiyyətlərini gözləmək deməkdir. Dilimizə daxil olan bütün sözlərin yazılışı Azərbaycan dilinin xüsusiyyətlərinə tabe edilməlidir.

Bütün mədəni xalqlar da belə edir. Məsələn: Henrix sözü, rusca Qenrix yazılır, çünki rus dilində "h" yoxdur. Bir də biz yeni əlifbanı belə qurmalıyıq ki, bu əlifba uzun illər yaşasın. Çünki təcrübə göstərir ki, əlifbanın möhkəm qurulması, birdəfəlik qurulması dilin inkişafına böyük xidmət göstərir.

Mən çıxışımın başında söylədim ki, iş böyük işdir, məsul işdir. Ona görə də çox şərəfli işdir. Odur ki, biz qabaqcadan bu işdə bir çox xalq düşmənlərinin istər aşkar, istərsə gizli işlərini unutmamalıyıq. Xalq düşmənləri orda-burda bir çox şayiə buraxır ki, "Azərbaycan dili zərər çəkəcək". Heç bir vaxt onlar Azərbaycan xalqını, Azərbaycan xalqının tarixini, kulturasını sevməmişlər. Onlar hər bir zaman Azərbaycan xalqına düşmən olmuşlar. Qoy onlar öz qara fikirlərini yeritmək üçün bizim xalqımızın adından orda-burda istifadə etməsinlər, heç şey də bacarmayacaqlar.

Mən əlifba ilə əlaqədar olaraq, bir neçə dil məsələlərinə də toxunmaq istəyirəm. Məlumdur ki, bizim dilimiz hər bir milli dil kimi sosializm dövründə özünün xəzinəsi hesabına zənginləşir. 20 il müddətində Azərbaycan dilinin keçdiyi inkişaf yolunu nəzərdən keçirsək, biz görə-

rik ki, partiyamızın milli siyasəti nəticəsində dilimizin gözəlliyi, təmizliyi, qüvvət və qüdrəti 100 illik bir inkişaf yolu keçmişdir. Ərəbçilik, farsçılıq, osmançılıqla apardığımız mübarizə nəticəsindədir ki, bu gün ədəbi dilimizlə canlı dilimiz arasında heç bir ziddiyyət qalmamışdır.

Heç şübhəsiz ki, bugünkü ədəbi dilimiz çox şirin, narın, xalqa məxsus bir dil olmuşdur. Məncə, bu xalq düşmənlərinə ən gözəl cavabdır. Azərbaycan xalqının dili ən bədii, ən tərəqqipərvər, zəngin bir dildir. (*Alqışlar*)

Lakin heç bir dil yalnız öz xəzinəsi hesabına yaşaya bilməz. Təbiətdə heç bir dil saf, təmiz bir dil deyildir, çünki bütün xalqlar arasında iqtisadi, ictimai, siyasi əlaqələr olduğundan dillər bir-birinə təsir edir. Burada bir nazik məsələyə toxunmaq istəyirəm. Heç bir vaxt xarici sözlərin dilimizdə işlədilməsi bu dili sıxışdıra bilməz. Əksinə olaraq, dil zənginləşə bilər.

Bizim bir çox tərcüməçilərimiz isə işə vicdansız yanaşır. O tərcüməçilər xalqımızın dilini sevmir. Biz xalq təsərrüfatını gözləyirik. Xalqın böyük bir dövləti də vardır. Əlbəttə, müqəddəs bir dövləti də vardır. O da xalqımızın dilidir. Dil xalqın namusu deməkdir, tarixi deməkdir, vicdanı deməkdir. Biz dil məsələsini hər bir yerdə göz bəbəyimiz kimi gözləməliyik. Dilimizi korlamaq istəyən adamlar da vardır ki, mən bir neçə misal göstərmək istəyirəm. Əgər o adamlar təmiz adamlardırsa, nə üçün demirlər ki, səhv edirik. Madam ki, susurlar, görünür, onlar şübhəli adamlardır. Xalq düşmənlərindən başqa, bir çox savadsızlar da, mərifətsizlər də dilimizə ziyan vururlar ki, o yoldaşları da başa salmaq lazımdır. Şübhəsiz ki, hər bir səhv edənin yaxasından tutub, sən xalq düşmənisən, demirik. Belə bir sual verirəm: nə üçün bizim qəzetimiz "kapitalizm okrujeniyası" yazsın? Dilimizdə kapitalist əhatəsi, yaxud mühasirəsi varkən, "okrujeniye" sözü kimə lazımdır? Artıq bir sözün gəlməsi dilin başına nə qədər oyun aça bilər?!

Sonra "мобилизация" sözünü götürək. "Мобилизация" – bunu nə edəcəksən? Bizim gözəl səfərbərlik sözü vardır. Nə ehtiyac varmış ki, onun əvəzində "мобилизация" işlədək?

Sonra "finans" sözü. Bunun əvəzinə bizdə maliyyə sözü vardır. Maliyyə sözü ola-ola niyə "finans" işlədək? Məncə, bu zərərli tərcümələr təsadüfi deyil, biz bu sünilik və ziyançılıqla mübarizə etməliyik.

Doğrudur, biz ərəbçilik, farsçılıqla mübarizə aparmışıq. Ancaq bir şeyi unutmaq lazım deyil ki, bizim dilimizdə min illərdən bəri vətən-

daşlıq hüququnu qazanmış ərəb-fars sözlərini dilimizdən çıxarmamalıyıq. Həqiqət, ədalət, maliyyə sözü işlətmişik və bunu bütün xalq bilir. Bədii ədəbiyyatımızda da vardır. Nə üçün bu sözlər dilimizdə qalmasın?

Sonra, "kultura" sözü. Bizdə gözəl mədəniyyət sözü vardır. Nə üçün onun əvəzinə "kultura" sözü işlədirsiniz? XII əsrdən bəri bu sözlər bizim ədəbiyyatımızda vardır. Böyük yazıçılarımız Sabir və başqaları mədəniyyət sözünü işlədir. Biz Füzulinin mədəniyyət sözünü dəyişdirib, "kultura" sözü yazmayacağıq! Yeni nəslimiz Füzulini də oxuyub başa düşməlidir. Odur ki, biz bu sözü və buna bənzər bir çox sözləri öz dil ailəmizdən qova bilmərik.

Mən çox misal göstərərdim, zənnimcə, 3-4 misal göstərmək kifayətdir.

Bəzən də rus dilindən aldığımız sözlər eyni ilə yazılır.

Misal üçün, rus dilindən "büdcet" sözü götürülmüş. Biz də onu "byudcet" yazırıq. Zənnimcə, bu, doğru deyil, çünki bizim dilimizdə "ö" olmadığından "бюджет" deyil, "büdcet" yazılmalıdır.

Buna görə rus dilindən aldığımız kəlmələri xalq dilimizin qanunlarına uyğun işlətməli və yazmalıyıq.

Biz yeni Azərbaycan əlifbası məsələsini tarixi bir vəzifə olaraq öhdəmizə götürmüşük. Şübhə yoxdur ki, biz bu işdə böyük proqressiv addım atırıq. Bu addım bütün sovet xalqları tərəfindən qəbul edilməkdədir və ediləcəkdir. Bizim qəhrəman xalqımız bu işdə geridə qala bilməz.

Bununla sözümü qurtarıb deyirəm ki, var olsun bizim azad xalqımız!

Var olsun bizim gözəl dilimiz, zəngin dilimiz!.. (*Gurultulu alqışlar, hamı ayağa qalxır*)

*1939*

## BÖYÜK AZƏRBAYCAN ŞAİRİ

Böyük Azərbaycan şairi Nizami Gəncəvinin anadan olmasının 800 illiyi yaxınlaşır. Nizami öz xalqının mədəni inkişafında yeni bir dövr açan həqiqi xalq şairi və yaradıcı fikir nəhəngidir.

XII əsrdə böyük şairin anadan olduğu, yaşadığı və öldüyü Gəncə şəhəri Şirvanşahlar hökmranlığına daxil idi.

Şirvanşah müstəbidi Əhsitan Nizamini ana dilindən əl çəkməyə məcbur etmişdi. Şair müstəbidin bu təhqiredici əmrini öz şeirlərində göstərir: "Sənin yaratdığınla, Nizami, biz çoxdan tanış olmuşuq. Lakin

başa düş: kimin sevinci, kimin fərəhi üçün sən öz mirvarini gözəl ziynət qutusundan üzə çıxartdın? Sənin türk dilin bizə yaraşmır. Bizim sarayımız türkəsaya adətlərə öyrənməmişdir. Madam ki, biz varlıyıq və mənsəbimiz yüksəkdir, demək, biz yüksək dillər eşitməliyik".

Şairi o zaman azərbaycanlılar üzərində ağalıq edən İran əsarətçilərinin, İran istilaçılarının dili ilə yazmağa məcbur edirdilər. Lakin qanı və canı ilə, bütün ömrü ilə öz doğma xalqına bağlı olan Nizami bu məcburiyyətə qarşı üsyan etdi.

Şair Şirvan şahının məktubuna dərin bir nifrət və həyəcanla cavab verir: "Mən oxudum... Qan başıma sıçradı. Demək, mənim qulağımda köləlik sırğası var, demək, mən gözümü zülmətdən çəkə bilməyəcəyəm. Mən qurudum, zəiflədim, susdum. Utandığımdan başımı gizlətdim. Bəlanın nədən ibarət olduğunu bilən bir dost varmı, varsa haradadır?"

Nizami vətənini zindana çevirən talançılara və əsarət gətirənlərə qarşı sonsuz bir kin bəsləyirdi. Şair böyük bir cəsarətlə o zamankı ictimai qaydanı məhv etməyə çağırırdı. O, insanın və insan azadlığının, insan ləyaqətinin alçaldılması əleyhinə bütün varlığı ilə alovlu üsyan qaldırırdı.

Nizami "Xosrov və Şirin" poemasında adı ilə fəxr etdiyi Azərbaycan xalqının o zamankı hüquqsuzluğunu dərin bir kədərlə ifadə edir. "Hərgah mənim türk olmağım saraydan gizlin qalmışdırsa, ilahi, sən özün ki, bunu bilirsən..."

Nizami hələ ondan əvvəl şair Əbül-Üla Gəncəvi, şairə Məhsəti xanım Gəncəvi kimi söz ustaları yetirən çoxəsrli Azərbaycan ədəbiyyatının ən yaxşı tradisiyaları ilə tərbiyələnmişdir. Böyük Fələki Şirvani və Xaqani Şirvani isə Nizami ilə bir zamanda yaşayırdılar.

Nizami öz yaradıcılığında Azərbaycan xalqının olduqca zəngin folklorundan geniş istifadə etmişdir. Nizaminin çox əsərlərində təsiri görünən məşhur Azərbaycan xalq eposu "Kitabi-Dədə Qorqud" hələ XI əsrdən bəri şöhrət qazanmışdır.

Klassik və xalq poeziyasının ən yaxşı tradisiyalarına sadiq olan Nizami Azərbaycan ədəbiyyatının özünü qüdrətli sözü ilə zənginləşdirərək onu görünməmiş yüksəkliyə qaldırdı, dünya poeziyasının şah əsərlərini yaratdı.

Azərbaycan şairinin yaradıcılığı bütün Şərq xalqlarının ədəbiyyatına da məhsuldar bir təsir bağışladı.

Nizami öz zamanındakı hadisələri dar – milli çərçivədə anlamaqdan uzaq olan böyük bir humanist, insanpərvər idi. Onun ölməz poema-

larında müxtəlif xalqların nümayəndələrinə rast gəlirik. Şair irqi əlamətlərdən və dini görüşlərdən asılı olmayaraq, bunların hamısına eyni bir hörmətlə yanaşır.

Dahi humanist olan Nizami xalq kütlələrinin əmək və şücaətini səmimi bir ilhamla mədh edir. Şair feodal aristokratiyasına qarşı kəskin nifrət bəsləyir: onların rəhmsizlik, qəddarlıq və yalançılığını ardıcıl surətdə ifşa edərək öz səsini cəsarətlə feodal əsarəti əleyhinə qaldırır. Saf qəlbi xalqın məşəqqəti, xalqın ümid və arzuları ilə dolub-daşırdı. Ona görə heç də təsadüfi deyil ki, Nizami öz müsbət qəhrəmanlarını xalq kütlələrinin içərisindən alır.

Nizami "Yeddi gözəl" poemasında varislik hüququna görə yox, öz mərdlik və səxavətinə görə taxta çıxan Bəhram şah obrazını yaradır. Bəhram şah xalqa çox xeyir verdi. Lakin kübar adamlar onu yad istilaçılara təslim etmək üçün sui-qəsd düzəldirlər. Bəhram bundan xəbər tutur. O, sui-qəsdçilərlə mübarizə apararkən "torpaq və əməklə bağlı olan adamların" namusuna, sədaqətinə inanıb, kəndlilərə arxalanır. Beləliklə, o, düşmənin güclü ordusuna qalib gəlir. Sonra Bəhram öz köpəyini asmış bir çobanla tanış olur. Köpək ağasına xəyanət edərək, canavarla dost olubmuş. Bunu görən Bəhram çobandan dərs alıb yad istilaçılarla əlaqəyə girişən xain vəziri edam etdirir. Bəhram öz tacını çobana verərək: "Xalqı idarə edən ən ağıllı, ən müdrik bir adam olmalıdır, – deyir. – Sənin mərifətin mənimkindən çoxdur, ona görə mən yox, sən çoban padşahlıq etməlisən!" Və o vaxtdan əməkçi çobanın padşahlığı bütün dünyada şərəflənməyə başladı.

Böyük Azərbaycan şairi öz müqəddəs arzusunu belə ifadə etmişdir. O istəyirdi ki, dövləti əməkçi xalqın özü idarə etsin, xalqın taleyi onun öz əlində olsun.

Nizaminin bütün yaradıcılığı dərin patriotizm hissi ilə doludur. O, yad torpaqdan gəlmiş istilaçılar əleyhinə çıxaraq öz xalqında vətənə, azadlığa və azadlıq uğrunda, istiqlaliyyət uğrunda mübarizəyə qarşı hörmət, məhəbbət oyadır.

Nizami öz məşhur "Leyli və Məcnun" poemasının müqəddiməsində qəzəblə deyir: "Nə vaxta qədər öz başını alçaq adamlar qarşısında əyəcək, nə vaxta qədər namussuzların əlaltısı olacaqsan?.. Çiyinlərini qaya kimi ucalt ki, başından yumruqla vurmasınlar. Müstəbidlər əleyhinə tikan olmaq, mərd olmaq lazımdır. Qızılgül dəstəsini azad qucaqlamaq istəyirsənsə, qızılgülü qoruyan tikanlar kimi ol, silahını hazır tut!".

Nizami başa düşürdü ki, xalq öz azadlığını ancaq qul edənlər əleyhinə silahlı mübarizə vasitəsi ilə ala bilər. Şairin qüdrətli sözü, onun hər bir kəlməsi əsarət altında inləyən əməkçilərin düşüncəsinə qarşı yönəldilmiş islam dinini ağır bir zərbə ilə vurur, ifşa edir. İslam dini "müqəddəs dünya xatirinə fani olan bu dünyanın məşəqqət və iztirablarına dözməyə" çağırırdı.

Nizami feodal aristokratiyası ədəbiyyatının tradision qaydalarını pozaraq bütün kökləri ilə xalqın mənafeyinə xidmət edən və xalqla bağlı olan yeni qüdrətli ədəbiyyata yol açdı.

Nizami və Azərbaycan xalqının bundan sonra gələn Nəsimi (XIV əsr), Füzuli (XVI əsr), Vaqif (XVIII əsr), M.F.Axundov (XIX əsr) kimi dahi sənətkarları Azərbaycanın klassik ədəbiyyatını o zamankı müsəlman Şərqində ən qabaqcıl bir ədəbiyyata çevirdilər.

Azərbaycanın klassik şerinin ulu atası olan Nizami bu günün özündə də böyük xalq şairi kimi yaşayır. Onun adı Sovetlər İttifaqının bütün xalqları üçün əziz və qiymətlidir.

Nizami kimi sənətkar və mütəfəkkirlər əsrlər boyu insanların qəlbində yaşayırlar. Buna görədir ki, şairin o əsrdən bəri Gəncə şəhərində qorunan qəbrinə axın-axın əməkçi kütlələri gəlir.

Xalqa xəyanət edən əclaf burjua millətçiləri Nizaminin yalnız Azərbaycan kulturası tarixində deyil, bütün dünya kulturası tarixində də böyük əhəmiyyəti olan zəngin ədəbi irsini hər cür vasitələrlə xalqdan gizlətməyə çalışırdılar. Düşmənlərin başqa pis niyyətləri ilə bərabər bu alçaqlıqları da ifşa edildi. Heç kəs və heç bir vaxt Azərbaycan xalqını onun böyük şairinin irsindən məhrum edə bilməyəcəkdir.

Böyük Azərbaycan şairi bilirdi ki, xalq onu unutmayacaqdır, onun peyğəmbərcəsinə dediyi sözlər indi sarsıdıcı bir qüvvətlə səslənir: "Əsrlər keçəcək və soruşacaqlar, o haradadır? Onda mənim hər misram bu suala cavab verəcəkdir: mən buradayam!"

*1939*

## MƏNİM "VAQİF" DRAMIM HAQQINDA

Azərbaycan xalq poeziyasının yaradıcısı XVIII əsrin böyük lirik şairi Molla Pənah Vaqif olmuşdur. Vaqif çoxəsrli Azərbaycan ədəbiyyatının inkişafında yeni bir dövr açmışdır. Onlarla gözəl Azərbaycan

şairi Vaqifin yüksək lirikası qarşısında baş əymiş, onun ədəbi irsindən geniş istifadə etmişdir.

Vaqif bütün xalqın sevimlisi idi. Dahi şair eləcə də öz dövrünün görkəmli alimi idi. O, xalq arasında müdrik bir loğman kimi şöhrət tapmışdı. Onun haqqında xalq məsəli vardır: "Hər oxuyan Molla Pənah olmaz".

Hələ uşaq ikən mən Vaqif yaradıcılığının təsiri altında idim. Onun gözəl şeirləri, aydın və xalq dili mənim yaradıcılığıma böyük təsir göstərmişdir. Mən ilk şeirlərimi Vaqifin qüvvətli poetik cazibə qüvvəsinin təsiri altında yazmışam. Azərbaycanın öz azadlığı uğrunda yadelli işğalçılara qarşı apardığı mübarizə tarixinin qəhrəmanlıq səhifələri Vaqifin adı ilə bağlıdır. Vaqif Qarabağ xanlığının vəziri olduğu zaman bizim xalqın yadelli işğalçılara qarşı, İran şahı Qacara qarşı mübarizəsinə başçılıq edirdi. Vaqif böyük siyasi xadim və diplomat kimi xalqın səadət və azadlığı uğrunda mübarizədə çox işlər görmüşdür. Onun xatirəsi ürəklərdə yaşayır, xalq öz dahi şairi və vətənpərvərini qızğın məhəbbətlə sevir.

"Vaqif" dramında mən, bizim sosialist nəslimizə mübariz şairin surətini göstərmək, Azərbaycan xalqının yadelli işğalçılara qarşı qəhrəmancasına mübarizəsinin epizodlarını göstərmək məqsədini izləmişəm.

Azərbaycan xalqı bizim böyük Sovet İttifaqı xalqları ilə birlikdə formaca milli, məzmunca sosialist mədəniyyətin yaranması sahəsində böyük müvəffəqiyyətlər əldə etmişdir. Vətənimizin bütün xalqları kimi, Azərbaycan xalqı da xalq səadəti və azadlığı uğrunda canlarından keçmiş böyük adamlara öz qəlbində dərin ehtiram bəsləyir. Bu xalq qəhrəmanlarından biri də Vaqifdir.

Pyesdə Vaqifin müasiri olan böyük lirik şair Vidadinin surəti də yaradılmışdır. Mən iki şairin ideya dostluğunu, onların ümumi xalq işi uğrunda mübarizəsini göstərməyə çalışmışam.

Pyesdə eləcə də mən bizim xalqların qardaşlıq və dostluğunun çoxəsrlik bir ənənə olduğunu göstərmək istəyirəm.

"Vaqif" əsərinin rus dram teatrı səhnəsində qoyulmasını mən böyük sevinclə qarşılayıram. Bu işə çox zəhmət sərf etmiş teatr kollektivini ürəkdən təbrik edirəm.

*1940*

## [NİZAMİ VƏ NƏVAİ YUBİLEY KOMİTƏLƏRİNİN İCLASINDA ÇIXIŞI]

Nizami əsərlərinin tərcüməsi və nəşri sahəsində indiyədək hansı tədbirlər həyata keçirilmişdir? Azərbaycanda aşağıdakı işlər görülmüşdür: 1. "Şərəfnamə"nin rus dilinə nəsrlə tərcüməsi (çapdan çıxmışdır). 2. "Xosrov və Şirin"in rus dilində ikinci hissəsi (tərcümə olunur). 3. "Xosrov və Şirin"in nəsrlə Azərbaycan dilinə tərcüməsi (çapa verilmişdir). 4. "Yeddi gözəl"in nəsrlə Azərbaycan dilinə tərcüməsi (çapa verilmişdir). 5. "Şərəfnamə"nin Azərbaycan dilinə mənzum tərcüməsi (çapa verilmişdir). 6. "İqbalnamə"nin Azərbaycan dilinə mənzum tərcüməsi (çapa verilmişdir). 7. "Xosrov və Şirin"in mənzum tərcüməsi redaksiyadadır). 8. "Yeddi gözəl"in mənzum tərcüməsi (çapa verilmişdir). 9. "Leyli və Məcnun"un mənzum tərcüməsi (redaksiyadadır). 10. "Məhzənül-əsrar"ın mənzum tərcüməsi (redaksiyadadır). 11. "Xosrov və Şirin"in birinci hissəsini rus dilinə mənzum tərcüməsi (Lipskerov yoldaş tərcümə edir). 12. "Sirlər xəzinəsi"nin mənzum tərcüməsi. 13. Nizaminin lirikası. Azərbaycan dilində (çapdan çıxmışdır). 14. Azərbaycan dilində Nizaminin əsərlərindən parçalardan ibarət olan 6 kitabça çapdan çıxmışdır. 15. Azərbaycan dilində Məhsətinin rübailəri çapdan çıxmışdır. 16. Nizaminin müasirlərinin şeirlər məcmuəsi çapa hazırlanır. 17. Nizaminin həyat və yaradıcılığı haqqında elmi-tədqiqat əsərlərindən ibarət kitab çapa hazırlanır. 18. Heydər Hüseynovun "Nizaminin dünyagörüşü" və akademik Krımskinin "Nizaminin müasirləri" və başqa əsərlər çapa hazırlanır.

Nizaminin bütün əsərləri – onun beş poeması və lirik şeirləri bütünlüklə Azərbaycan dilinə tərcümə edilmişdir.

Bunlardan bəziləri çapdan çıxmış, bəziləri isə redaksiyada və nəşriyyatdadır. Yaxın iki-üç ay ərzində hamısı çapdan çıxacaqdır.

Bundan əlavə, mən rəyasət heyətinə məlumat verməliyəm ki, bizim Azərbaycanda "Nizami" adında dövri almanax nəşr olunur. Almanax rus və Azərbaycan dillərində buraxılır. Bu almanaxda Nizaminin dövrü və yaradıcılığı, Azərbaycanın tarixi və sair məsələlər haqqında müxtəlif məqalələr çap olunur.

Bizim qəzetlərdə və jurnallarda Nizaminin yaradıcılığı haqqında müntəzəm olaraq məqalələr verilir. Bizim yerli qəzetlərin və jurnalların elə bir nömrəsi olmur ki, orada Nizaminin yaradıcılığı haqqında məqalə çap edilməsin.

Hazırda bizdə Nizami muzeyi yaradılır. Bu, Bakı şəhərində ən zəngin muzey olacaqdır. Bu, Azərbaycan xalqının Nizamiyədək, Nizami dövründə və Nizamidən sonrakı tarixini əks etdirəcək tarixi-ədəbi muzey olacaqdır.

Nizami komitəsi Nizami abidəsinin layihəsini qəbul etmişdir. Abidənin hazırlanması üçün sifariş verilmişdir.

Respublikanın bir sıra şəhərlərində biz eyni zamanda Azərbaycan ədəbiyyatının altı klassikinə – Nizaminin müasirlərinə heykəllər qoydururuq.

Bizim bugünkü iclasımızın məqsədi əsas etibarilə Nizami yubileyinə hazırlıq sahəsində Moskvada və bütün Sovet İttifaqında nə kimi tədbirlər həyata keçirildiyini, Ümumittifaq Nizami komitəsinin nə işlər gördüyünü aydınlaşdırmaqdır. Əgər maraqlıdırsa, mən bu barədə bir neçə söz deyər, yoldaşlarımızın rəyini bildirərəm.

Ümumittifaq Nizami komitəsinin və nəşriyyatlarımızın, ilk növbədə, jurnalların, bizim "Literaturnaya qazeta"nın və başqalarının fəaliyyəti bizi qətiyyən qane etmir.

Çox əlamətdardır ki, Nizamiyə həsr olunmuş müşavirələr yalnız biz buraya gələndə və bunu yada salanda çağırılır. Biz komitənin özünün bu işlə müntəzəm məşğul olmasını görmürük.

Mən hələ bizim ədəbiyyat dekadası zamanı "Literaturnaya qəzeta"mızın Nizami yubileyinə münasibəti haqqında sizə demişdim. "Literaturnaya qazeta"nın tutduğu mövqeyə təəccüb qalırsan. Bu qəzet yalnız yubiley ərəfəsində Nizami haqqında söz açmışdır. Necə ola bilər ki, Nizami haqqında yalnız iki məqalə ilə kifayətlənəsən, həm də yubiley ərəfəsində.

Nizami haqqında, Şərqdə ədəbi renessans dövrü haqqında yüzlərcə kitab yazmaq olar və bununla əlaqədar olaraq təkcə Azərbaycanda deyil, bütün Şərqdə olan böyük sərvətləri açıb göstərmək olar. İnsan bilmədiyi şeyin düşmənidir. Məncə, yoldaşların hələ hamısı Nizamini tanımır və buna görə onlara elə gəlir ki, Nizaminin yubileyi adi bir yubileydir.

Bizim jurnallarda Nizami haqqında, onun dövrü haqqında, onun ədəbi üslubu və dünyagörüşü haqqında bir çox məqalələr vermək olar. Alimlərə, Şərq və Azərbaycan ədəbiyyatını yaxşı bilənlərə sifariş vermək olar ki, onlar bir çox mövzularda məqalələr yazsınlar: Nizami romantik görüşlərin banisi kimi, Nizaminin ədəbi formaları haqqında.

Nizami yaradıcılığında beynəlmiləlçilik motivləri. Nizami və Şərq ədəbiyyatı. Nizami və Qərb ədəbiyyatı və sair.

Nədənsə, belə məqalələr yazılmır. Belə çıxır ki, biz yubileyə hazırlaşırıq, dövlət Nizami yubileyi üçün milyonlarla pul sərf edir, nəticədə isə, Azərbaycanda buraxılmış bir neçə kitab istisna edilməklə, bizim əlimizdə Nizaminin həyat və yaradıcılığı haqqında bircə dənə layiqli kitab yoxdur.

Nizami yaradıcılığının rus dilinə tərcüməsi sahəsində işlər çox böyük təhlükə doğurur. Mən qorxuram ki, Nizaminin yubileyi üçün onun bir-iki poeması bütünlüklə çapdan çıxmasın. Birtomluğun çap olunması yaxşı hadisədir, lakin Nizami yubileyini bir kitabla qeyd etmək olmaz, çünki, o, beş bitkin iri poema qoyub getmişdir. Nizami yubileyinə qədər bütünlüklə rus dilinə tərcümə olunmalı, heç olmasa, iki poema nəşr edilməlidir. Tərcüməçi şairlərin işi, demək olar ki, heç irəli getmir.

Nə üçün bizim nəşriyyatlarda və jurnallarda Nizaminin adı çəkilmir? Onun "Sirlər xəzinəsi" fəlsəfi poeması ilə əlaqədar olan bir fakt maraqlıdır. "Sovetski pisatel" nəşriyyatı bu poemanı çap etməkdən boyun qaçırır, ona görə ki, hansı bir tənqidçi isə belə bir rəy yazmışdır ki, guya bu poema dini və sxolastik əsərdir. Müasir dövrlə heç bir əlaqəsi yoxdur. Görünür, bu adam poemanı oxumamışdır. "Sirlər xəzinəsi" dərin fəlsəfi poemadır və o bizim zəmanəmizdə də yaşayacaqdır. Bütün bu xarakter faktlar təsdiq edir ki, ədəbiyyat və incəsənət sahəsində çalışan yoldaşlarımız məsələyə dərindən yanaşmamışlar, Nizami komitəsi və bizim Yazıçılar İttifaqının milli sektoru isə bu işlə, görünür, çox pis məşğul olurlar. Mən xahiş edirəm ki, bu sözlərimdən incitməyəsiniz.

Əgər sizin burnunuzun qabağında nəşriyyat Nizaminin poemasını çap etməkdən boyun qaçırırsa, sizin isə bundan xəbəriniz yoxdursa, siz nəşriyyata demirsinizsə ki, rəy əsasında böyük şairin taleyini həll etmək olmaz, belə çıxır ki, siz bu işə ürəkdən can yandırmırsınız.

Bizim Azərbaycanda Nəvai yubileyinə hazırlıq haqqında. Mən Əlimcan yoldaşın öz çıxışında dediklərinə şərik oluram ki, biz hələ geniş kütlələrin diqqətini nə Nizamiyə, nə də Nəvaiyə cəlb edə bilməmişik, onların yaradıcılığını bütün əzəməti ilə təbliğ edə bilməmişik.

Mən özüm başa düşürəm ki, bəlkə də Moskvada Nəvainin yaradıcılığını və dövrünü yaxşı bilən adamlar yoxdur, ancaq, mənim zənnimcə, belə adamları tapmaq olar. Məncə, belə alimlərimiz vardır. Hər şey bu işin necə təşkil edilməsindən asılıdır. Leninqradda Nəvai yaradıcılığını

gözəl bilənlər az deyildir. Moskvada da heç olmasa dərindən bilməsələr də, Nəvai yaradıcılığını az-çox yaxşı bilən yoldaş tapılar. Belə yoldaşların Daşkəndə, ümumiyyətlə, Özbəkistana səfərini təşkil etmək olar ki, orada xalqın məişəti ilə, tarixi ilə, Nəvainin yaradıcılığı ilə yerindəcə tanış olsunlar. Özbəkistanın özündə isə yoldaşlar bu sahədə onlara yardım göstərərlər.

İşi məhz bundan başlamaq lazımdır!

O biri tərəfdən mən biz azərbaycanlıları da, özbək yoldaşları da bir məsələdə təqsirləndirirəm. Biz rus yoldaşlarımızdan tələb edirik ki, onlar bizim ədəbiyyatın tarixi ilə məşğul olsunlar, bu haqda yazsınlar və sairə... Bu yaxşıdır. Lakin bu heç də o demək deyildir ki, biz özümüz – yerli yazıçılar, ədəbiyyatşünaslar, tarixçilər hamıdan çox və yaxşı tanıdığımız öz şairlərimiz haqqında rus mərkəzi mətbuatına yazmamalıyıq.

*Səslər* – Doğrudur!

Mən sizin Nəvaiyə həsr edilmiş plenumunuzda oldum. Sizin Nəvai yubileyinə necə hazırlaşdığınızla çox maraqlanırdım. Plenumda sizin özbək yoldaşlar müxtəlif məruzələrlə çıxış edirdilər. Mən yəqin etdim ki, sizdə yüksək mədəniyyətli gənc qüvvələr yetişir və inkişaf edir, onlar Nəvainin dövrünü və yaradıcılığını çox gözəl, fəlsəfi mövqedən təhlil edirdilər.

Bəs nə üçün biz özümüz yerlərdə Nizami və Nəvai haqqında konkret məqalələr yazmayaq və onları buraya, Moskvaya göndərməyək?

Biz bu işi sevən moskvalı yoldaşlarımızın qüvvələrinə arxalanmamalıyıq. Mən belə hesab edirəm ki, yerli yoldaşlar, azərbaycanlılar məqalələr yazmalı və öz məqalələrini, əsərlərini mərkəzi qəzetlərə və jurnallara göndərməlidirlər. Bunu unutmaq lazım deyil. Bunu təşkil etmək lazımdır.

Mən və mənim yoldaşlarım son illərədək bilmirdik ki, Nəvai özbək şairidir, hər yerdə onun adı bir Azərbaycan şairi kimi çəkilirdi. Nəvai, xüsusilə, bütün Şərq xalqlarının ədəbiyyatından fars dilinin qovulması sahəsində olduqca böyük rol oynamışdır.

Nəvainin şəxsiyyəti, siması olduqca əzəmətlidir. Nəvai yalnız böyük ədəbiyyat deyil, böyük dil də yaratmışdır. Nəvai bir alim kimi, dilşünas kimi, tarixçi kimi çıxış edir. O, son dərəcə çoxcəhətli istedaddır.

Mən Nəvaini dərya ilə müqayisə etdim və dedim ki, bizim bəzi alimlərimiz onun sahillərinə taxta qayıqlarda üzmək istəyirlər.

Mənim zənnimcə, bu dəryaya müasir elm və mədəniyyət əsasında tikilmiş böyük bir gəmi salmaq lazımdır.

Nizaminin böyük şəxsiyyəti ilə çiyin-çiyinə böyük Nəvai dayanmışdır.

Bəzi yoldaşlar deyirlər ki, biz Nizami ilə çox məşğul oluruq, Nəvai isə kölgədə qalır. Mən bu yoldaşlarla şərik deyiləm. Böyük insan heç bir zaman kölgədə qalmaz. Biz çalışırıq ki, onların hər birini xalqımıza bütün böyüklüyü ilə göstərək.

Azərbaycanda Nəvai yubileyinə hazırlıq haqqında.

Yazıçılarımızın ən yaxşı qüvvələri Nəvai əsərlərinin tərcümələri ilə məşğul olmuşlar. Nəvainin əsərləri bizim xalqımıza çoxdan məlumdur. İndi bizdə Nəvainin "Fərhad və Şirin" poeması bütünlüklə tərcümə olunmuşdur. Sonra biz onun lirika kitabını hazırlayırıq. Jurnallarımızda və qəzetlərimizdə müntəzəm surətdə Nəvai haqqında məqalələr nəşr edilir. Yubiley üçün Nəvai haqqında yaxşı bir kitab buraxmağa hazırlaşırıq. "Leyli və Məcnun"un tərcüməsini başlamaq fikrindəyik. Şərqdə üç "Leyli və Məcnun" vardır. Birinci "Leyli və Məcnun" poemasını Nizami yazmışdır, ikincisini Nəvai, üçüncüsünü isə Füzuli. İndi bizdə, Azərbaycan dilində Nizaminin və Füzulinin "Leyli və Məcnun"u vardır. Nəvainin "Leli və Məcnun"unu da tərcümə etsək, yaxşı olar.

Şəxsən mən belə fikirləşirəm ki, maya qədər biz bütün hazırlıq işlərini qətiyyən qurtara bilməyəcəyik. Nəşriyyatlar nə bizdə, nə də Moskvada yetirə bilməyəcəklər, Nizami muzeyi də hazır olmayacaqdır.

Mən Azərbaycan KP MK-nın katibi ilə söhbət etmişəm. O belə hesab edir ki, noyabrın birindən axırınadək bütün respublikada yubiley təntənəsini təşkil edə biləcəyik.

Lakin indi Nizami yubileyini noyabrda bayram edəcəyimizi qəti bildirsək, qorxuram redaktorlar, tərcüməçilər yenə öz işlərini ləngitsinlər. Məncə, may ayınadək bütün işləri qurtarmaq lazımdır.

Mənim fikrimcə, plenumu əvvəlcə Bakıda başlayıb, sonra Bakıdan Xəzər dənizi və Orta Asiya dəmir yolu ilə Daşkəndə getmək və orada Nəvainin yubileyini qeyd etmək çox yaxşı variantdır.

*1940*

# [LENİN ORDENLİ HƏRBİ-SİYASİ AKADEMİYADA KEÇİRİLMİŞ GECƏDƏ MƏRUZƏ]

Azərbaycan xalqının iki min ildən artıq tarixi vardır. Onun ata-babaları qəhrəman Midiya xalqı olmuşdur. Hələ miladdan beş əsr əvvəl indiki Sovet Azərbaycanının və İran Azərbaycanının territoriyasında qüdrətli Midiya dövləti yerləşmişdi. Bu dövlət 150 il davam etmişdi. Herodot, Strabon kimi qədim tarixçilərin əsərlərindən biz bilirik ki, Midiya xalqının Şərqdə öz qabaqcıl yüksək mədəniyyəti olmuşdur. Tarixçilər təsdiq edirlər ki, İran mədəniyyəti və incəsənəti midiyalılardan əxz etmişdir. Midiya xalqı öz qəhrəmanlığı və azadlığı sevməsi ilə məşhur olmuşdur. Midiya dəfələrlə İran hökmdarları ilə mübarizə etmiş və bir zaman İran Midiya dövlətinin hökmranlığı altında olmuşdur. Hətta İranı fəth etmiş İskəndər Kəbir başa düşmüşdü ki, Midiya xalqı tamamilə məhv olar, lakin kimsəyə tabe olmaz; buna görə də müstəqil dövlət idarəsini midiyalıların öz ixtiyarlarına buraxmağa məcbur olmuşdu.

Çox qədim Azərbaycan xalqının öz zəngin qəhrəmanlıq tarixi vardır. Azərbaycan territoriyasında az cahangirin başı əzilməmişdir. Hələ IX əsrin birinci yarısında Azərbaycanın böyük oğlu Babək tam 25 il ərzində ərəb xilafətinə qarşı mübarizə aparmış və ərəb qoşunlarını dəfələrlə darmadağın edərək, Arazın dalğaları içərisində batırmışdır.

Hələ bundan əvvəl Şirvan çariçası İran hökmdarı Keyxosrovu məğlub edərək onun başını kəsmiş və qanlı başını tazın içinə qoyaraq demişdir: “Sən öz sağlığında tökdüyün qandan doymamışsan, indi bu tazdan nə qədər istəyirsən iç!”

XVIII əsrdə də Azərbaycan xalqı Azərbaycanı zəbt etmək üçün gəlmiş İran şahı Məhəmməd Qacar kimi cəlladın qarşısında boyun əyməmişdir. Lakin özünün böyük şairi Vaqifin həbsə alınmasından qəzəblənərək Şərq Neronu deyə adlandırılan Şah Qacarı öldürdü. Azərbaycan xalqının tarixi onun yadelli və daxili düşmənlər üzərində çaldığı qələbə və qəhrəmanlıqlarla zəngindir. Əgər indi də xarici düşmənlərdən birisi özlərinin biabır olmuş ata-babalarının qəsbkarlıq siyasətini təkrar etmək cürətində olarsa, biz əminik ki, böyük, məğlubedilməz 183 milyonluq sovet xalqının zərbəsi altında belə başabəla qəsbkar öz başını öz xüsusi territoriyasında qurban verəcəkdir.

Çoxəsrlik tarixi olan Azərbaycan ədəbiyyatı, qüdrətli ədəbiyyatın yaradıcısı olan Azərbaycan xalqının qəhrəmanlıq və rəşadət tarixidir. Azərbaycan ədəbiyyatının ən qədim abidəsi IX əsrdə yaradılmış olan məşhur xalq eposu "Kitabi-Dədə Qorqud"dur. "Kitabi-Dədə Qorqud" hekayələrində xalqın qəhrəmanlığı, onun müdrikliyi və ümidləri əks olunmuşdur. Xalqın köçəri həyatı çox gözəl təsvir olunur. "Dədə-Qorqud"un qəhrəmanları çadırlarda yaşayırlar. Bu eposda biz bir çox xalq qəhrəmanları və bahadırlarının obrazlarını görürük, biz burada xalqın böyük optimizmini görürük. Mədəniyyət cəhalətə qalib gəlir, namuslu qəhrəmanlar namussuz xainlərə qələbə çalır, ədalət ədalətsizliyi məğlub edir. Qəribə burasıdır ki, "Kitabi-Dədə Qorqud" hekayələrində çox cəsur və nəcib qadınlar təsvir olunmuşdur. Səfərə çıxan bahadırların qadın və nişanlılarına öz toy günlərində əbədilik bir sədaqət vəd edilir.

Orası da xarakterdir ki, qəhrəmanların həyatında çoxarvadlılıq yoxdur; hər bahadırın bircə arvadı vardır.

Çoxarvadlılığı və başqa vəhşi adətləri yayan islam şəraitinə qarşı xalqın saf moralı, yüksək və müqəddəs məhəbbəti tərənnüm edilir.

XII əsr Azərbaycan klassik ədəbiyyatı tarixinə onun qızıl dövrü kimi daxil olmuşdur. XII əsrdə Şirvanşah dövləti adlı qüdrətli Azərbaycan dövləti var idi. Bu dövlətin rəsmi dili fars dili idi. Azərbaycanın ən yaxşı şairlərini fars dilində yazmağa məcbur edirdilər. Bu dili yüksək saray aristokratiyası dili sayırdılar. Lakin bu, formal cəhət idi. Çünki böyük şairlər Azərbaycan xalqının doğma qardaşları olduqları üçün onu İran dilində olsa da, daima tərənnüm edirdilər. XII əsrin böyük şairlərindən biri olan Xaqani milli zülmün bütün acılıqlarına dözərək belə yazırdı: "Türk olmağıma görə məni kim məzəmmət edirsə, türk dilində deyilən eyni sözlərlə də Allah cəza verəcəkdir".

Böyük Nizami isə: "Mənim türk olmağım kimə xoş gəlmirsə, yəqin ki, o, türklərin doğasının dadını bilmir".

Gözəl "Xəmsə"nin avtoru olan ölməz Nizami Azərbaycan poeziyasının ən böyük iftixarıdır. Hələ səkkiz əsr bundan əvvəl Azərbaycan xalqının bu dahi oğlu beş dənə elə poema yaratmışdır ki, bütün bunlar dünya poeziyası xəzinəsinin bəzəyidir. Xalqın sadiq oğlu olan Nizami öz poeziyasını xalqa xidməti üçün verərək şahları və hökmdarları tərənnüm edən saray şairlərinin əsrlərlə davam etmiş ənənəsini cürətlə pozdu.

Öz vətəninə, öz xalqına sadiq olan Nizami Şərq şerində birincidir, çünki o öz böyüklüyü ilə yalnız Azərbaycanı deyil, bütün Şərqi əhatə

etmiş, xalq qəhrəmanları, qəhrəman daşkəsənlər (bənnalar) və müdrik çobanlar obrazı yaratmışdır. Onun qələmi şahlar haqqında yazmışsa da, o, şah paltarına geydirilmiş ideal obrazlar, taxta sahib olmuş əfsanəvi qəhrəmanlar haqqında yazmışdır. O, həqiqi xalq kütləsinin şairi, onun kədərini daşıyan bir nümayəndəsi olduğundan heç vaxt keçmiş dünyanın güclüləri qarşısında baş əyməmiş, bütün ömrünü ehtiyac və məhrumiyyətdə keçirmişdir. Lakin böyük azərbaycanlının ruhi faciəsi bunlardan ibarət deyildir. İran hökmranlığı böyük şairin ən qiymətli, ən əziz şeyini – onun doğma ana dilini, öz doğma Azərbaycan dilində yazmaq hüququnu əlindən almışdır.

Odur ki, Nizami öz vətəni, öz xalqı haqqında o zaman rəsmi dövlət dilində və şeirdə hakim yer tutan fars dilində yazmağa məcbur olmuşdur. Lakin Nizaminin şairlik dühası o qədər yüksəlmişdir ki, hətta ona yad olan fars dilində yazmasına baxmayaraq uzun əsrlər boyunca yalnız Azərbaycan şerinə deyil, bütün Şərq şerinə də təsir etmişdir. Onun xeyirli təsiri fars şairlərinin, özbək klassiki Nəvainin və başqalarının yaradıcılığında əks olunmaqdadır. Nizami özündən iki əsr əvvəl əzəmətli "Şahnamə" dastanını yaratmış, bəşəriyyətin ən böyük şairi Firdovsi ilə münaqişəyə girişmişdi. O öz məğrur başını hətta bu şeir pəhləvanının da qarşısında əyməmiş, onu həyatı doğru əks etdirməməkdə, tarixi təhrif etməkdə təqsirləndirmişdir. Bundan ötrüdür ki, Nizaminin həyatı və insanları realistik bir surətdə əks etdirməyə böyük bir meyli olmuşdur.

Nizami bütün yaradıcılığında Şərq şahları, vəzirlər və sair saray mənsəb sahibləri simasında istibdadı böyük bir cəsarətlə, amansızcasına qamçılayıb ifşa edir. Budur, gör o hansı ifadələrlə öz xalqına müraciət edib, onları ictimai ədalətsizliyə qarşı silahlanmağa çağırırdı: "Sən çoxmu susub başını cəlladlar qarşısında da əyəcəksən. Azad olmaq istəyirsənsə, çiyinlərini qaya kimi dik tut. Silahlan ki, səni yeməsinlər. Axı incə gül də özünü müdafiə etmək üçün tikanlarla silahlanır".

Nizami öz xalqında müstəbidə və zalıma qarşı nifrət hissi oyadıb, onu tərbiyə etmək üçün ölkəyə qan udduran, evləri, kəndləri xaraba qoyan şah obrazı yaradır. O, şahın qulaq asdığı, fəlakət və bədbəxtlik simvolu olan iki bayquşun söhbətini təsvir edir. Şah bayquşların dilini anlamadığından öz yoldaşından onların nə barədə söhbət etdiklərini soruşur. Şahın yoldaşı onu başa salaraq deyir ki, birinci bayquş öz oğlunu ikinci bayquşun qızı ilə evləndirmək istəyir; ikinci bayquş isə

başlıq olaraq dörd xarabalıq tələb edir. Birinci bayquş: "Mənə bir neçə ay möhlət ver, onda mən sənə dörd xarabalıq əvəzində bir neçə yüz xarabalıq verərəm, çünki bizim şahın dövründə çox çəkməz ki, bütün ölkə başdan-başa xarabalığa çevrilər", – deyə cavab verir.

Nizami xalq şairi olduğundan əsil demokratik ideyaları inkişaf etdirir. Bəhram şahla olan təsadüf buna bir misal ola bilər. Bəhram şah özü də gözləmədən vuruşlarda məğlub olur. Bu məğlubiyyətin səbəbi vəzirin satqınlığı olmuşdur. O, düşmənlə əlaqəyə girişib Bəhram şahın bütün gizli hərbi sirlərini ona vermişdir. Bəhram öz vəzirinin bu satqınlığını biləndən sonra uzun zaman onu necə cəzalandırmaq üzərində düşünür. O, yolda bir çobana rast gəlir. Bəhram çobanın öz itini ağacdan asdığını görüb təəccüb edir və ondan nə üçün belə etdiyini soruşur. Xəbər alır ki, nə üçün o öz sürüsünü güdən itini asmışdır? Çoban ona belə cavab verir: "Mən arxayındım ki, it mənim sürümü qurdlardan qoruyur, amma məlum oldu ki, mənim nankor itim qurdlarla dostlaşıb, gizlində qoyunlarımı tələf edirmiş. Budur, mən də bu itlə öz xalqımızın adəti ilə rəftar edib itimi asmışam, çünki satqınlar üçün yalnız bircə cəza vardır, bu da satqını asmaq cəzasıdır". Çobanın bu ağlından heyrətə düşən Bəhram şah öz tacını başından götürüb çobanın başına qoyur və deyir: "Çoban, sən məndən ağıllı olduğundan bu gündən belə mən deyil, sən şahlıq etməlisən".

Biz bu epizodla Nizaminin böyük demokratik baxışlarını aydınca görürük. O, müdrik zəhmətkeşlər simasında xalqı onun özü idarə etməsini istəyir. Nizami bununla dövlət quruluşunda irsi monarxiya prinsipini cəsarətlə qırıb dağıdır. Nizami ömrü boyunca əsil xalq azadlığını arzulamış və bunun yalnız əsil xalq hökumətində ola biləcəyini mümkün hesab etmişdir...

Böyük Nizaminin adı uzun zamanlar bir İran şairi kimi qələmə verilmişdir. Nizaminin öz əsərlərinin əksəriyyətini İran dilində yazdığını bəhanə edərək, xalq düşmənləri – millətçilər, müsavatçılar, pantürkistlər və s. satqınlar onu öz doğma xalqının əlindən almaq istəyirdilər. Lakin partiyamız Azərbaycan xalqının qocaman şairi Nizamini onun özünə qaytarmışdır. 1941-ci ildə Nizaminin anadan olmasının 800 illik yubileyi olacaqdır. Bu, yalnız Azərbaycan kulturasının deyil, bütün böyük sovet kulturasının böyük bayramı olacaqdır.

Azərbaycan şeri Nizamidən sonrakı inkişafında bir sıra böyük şair adları meydana çıxarmışdır. Bu şairlər öz doğma ölkəsini, doğma xalqını tərənnüm etmişlər, onun istiqlaliyyəti və azadlığı uğrunda çarpışmışlar.

Cəlladlar əlində məhv olan panteist şair Nəsimi bu şairlərdən biridir, o öz haqqında belə yazmışdır:

Məndə sığar iki cahan, mən bu cahana sığmazam,
Gövhəri-laməkan mənəm, kövnü-məkana sığmazam.
...Gər ki, bu gün Nəsimiyəm, Haşimiyəm, Qüreyşiyəm,
Məndən uludur ayətim, əyatə, şənə sığmazam.

Fanatik mollalar və qaniçici müstəbidlər Azərbaycan xalqının bu müstəqil, məğrur oğluna, döyüşkən və filosof şairinə ən dəhşətli cəza verərək dərisini diri-diri soyub dara çəkmişlər. Lakin şair axır nəfəsində belə düşmənlərə təslim olmamışdır. Cəllad, şairin ölüm qarşısında da solub-saraldığını istehza ilə söyləyərkən, Nəsimi ona belə cavab vermişdir: "Sərsəri! Sən günəş batarkən onun rənginin saraldığını bilmirsənmi?"

Bu, XIV əsrdə olmuşdur, bundan sonra keçən yüzillik bir müddət ərzində çoxlu görkəmli şairlər doğulmuşdur, yüksək məhəbbət və sevinclər şairi, yüksək insan hissini, dərin insan həyəcanlarını tərənnüm edən böyük şair Füzuli də bu zaman şeir meydanına çıxmışdır. Onun "Leyli və Məcnun" adlı gözəl poeması böyük Nizaminin poemasının adını daşıyırsa da, bu, tamamilə müstəqil bir bədii əsərdir.

Füzuli şairi hakimlə müqayisə edərək üstünlüyü birinciyə verir:

Padişahi-mülk dinarü dirəm rüşvət verib,
Fəthi-kişvər qılmağa eylər mühəyya ləşgəri,
Yüz fəsadü fitnə təhrikilə bir kişvər alır,
Ol dəxi asari-əmnü istiqamətdən bəri.
Göstərən saətdə dövrani-fələk bir inqilab.
Həm özü fani olur, həm ləşkəri, həm kişvəri,
Gör nə sultanəm məni-dərviş kim, feyzi-süxən
Eyləmiş iqbalimi asari-nüsrət məzhəri.
Hər sözüm bir pəhləvandır kim, bulub təyidi-həqq
Əzm qıldıqda tutar təcrid ilə bəhrü bəri.
Qanda kim, əzm etsə, mərsümü məvacib istəməz,
Qansı mülkü tutsa, dəyməz kimsəyə şurü şəri.
Payimal etməz onu asibi-dövri-ruzigar,
Eyləməz təsir ona dövrani-çərxi-çənbəri.
Qılmasın dünyada sultanlar mənə təklifi-cud,
Bəs durur başımda tovfiqi-qənaət əfsəri.
Hər cəhətdən fariqəm, aləmdə haşa kim ola.
Rizq üçün əhli-bəqa, əhli-fənanın çakəri.

Azərbaycanın klassik şairi Füzulinin və bütün başqa yaxşı nümayəndələrinin yüksək idealı belədir. Bu döyüşkən şairlər öz sözləri ilə dünya və insanların məhəbbətini qazanmışlar.

XVIII əsrin həyatla bağlı olan dərin lirik, yer üzündəki zövqisəfaların, sevgi və həyat sevincinin tərənnümçüsü Vaqif də belədir. O öz dövrünü realistik surətdə əks etdirərək Azərbaycan klassik şerinə yeni bir canlılıq vermişdir. Vaqif də özündən əvvəl gələn şairlər kimi şeir bayrağım yüksək tutmaq, qəhrəmanlara məxsus bir ölümlə ölmüş, Qarabağ hakimi tərəfindən edam edilmişdir.

Öz xalqının düşüncələrinin hakimi, onun sevimlisi olan böyük şair Vaqif öldu, lakin onun şeir bayrağını başqa bir dövrün, rus çarizmi tərəfindən Azərbaycanın istila olunması dövrünün şairi Zakir ələ aldı. Zakir Azərbaycan şerində satirik xətti davam etdirərək, öz şeirlərində ruhanilik nümayəndələrini və çar qulluqçularını qamçılamışdır.

Özlərini şerə həsr edən, lakin tək olmayan Azərbaycan qadınlarından Aşiq Pəri və Natəvan kimi iki Azərbaycan şairəsi Zakirin müasirlərindən olmuşlar. Onlar Azərbaycan klassik şerinin gözəl tradisiyalarını davam etdirərək, işıqdan məhrum edilmiş, lakin öz insanlıq hüququ uğrunda çarpışan Azərbaycan qadınlarının incə qəlbinin çırpıntısı eşidilən gözəl nəğmələr yadigar qoyub getmişlər.

Azərbaycan xalqı XIX əsrdə öz böyük oğullarından biri olan ilk dramaturq, görkəmli nasir, materialist filosof və ateist M.F.Axundovu meydana çıxarmışdır. M.F.Axundov yeni Azərbaycan ədəbiyyatının atası, realizmin əsasını qoyan, teatr yaradıcısı, böyük maarifpərvər olmuşdur. Onun Avropada şöhrət tapıb bəyənilmiş altı komediyası, onun klassik povesti "Aldanmış kəvakib"i, onun islam və bütün feodal aləminə qarşı qızğın çıxışı, onun mübariz ateizmi Azərbaycan ədəbiyyatını yeni yüksək pillələrə qaldırmış, onun qarşısında yeni geniş inkişaf yolu açmışdır. M.F.Axundov öz bədii əsərlərində öz müasiri olan Azərbaycan ictimaiyyətinin həyat və yaşayışının ensiklopediyasını vermiş, öz fəlsəfi əsərlərində o, orta əsr sxolastikasına, mövhumata, Allaha, Şərq despotizmi və cəhalətpərəstliyinə öldürücü zərbələr endirmişdir. Azərbaycan ədəbiyyatının başqa gözəl nümayəndələri kimi, o, yalnız doğma Azərbaycan ədəbiyyatının sonrakı inkişafına deyil, bütün Şərq, yəni İran, Türkiyə, özbək, türkmən və sair xalqların ədəbiyyatına da böyük təsir etmişdir. M.F.Axundova Şərqdə ilk realist və dramaturq olmuşdur. O, Şərqdə ilk ədəbi münəqqid olmuşdur. O öz dəlillərini elmi əsaslar üzərində qurmuş ilk ateist və materialist filosof olmuşdur.

Azərbaycan ədəbiyyatı bütün XIX əsr müddəti zərfində düz 1905-ci il revolyusiyasına kimi bu nəhəngin təsiri altında inkişaf etmiş, onun təsiri altında Azərbaycan xalqının yeni kulturası yaranmışdır. Vəzirov, Zərdabi, Şirvani, Səhhət, Haqverdiyev və başqa yazıçı, şair və publisist maarifpərvərlər onun ən yaxşı şagirdləri və işini davam etdirənlər olmuşlar.

İlk rus revolyusiyası Azərbaycan ədəbiyyatında yeni böyük bir simanı da meydana çıxarmışdır; bu yazıçı Azərbaycan ədəbiyyatının inkişafında yeni bir səhifə açmış, onda revolyusion demokratik istiqamətin əsasını qoymuşdur. Bu, "Molla Nəsrəddin" təxəllüsü ilə bütün Şərqdə məşhur olan Cəlil Məmmədquluzadə idi. O, uzun illər ərzində "Molla Nəsrəddin" adlı mübariz revolyusion bir jurnal nəşr etmiş, bu jurnalda nadanlığı, zülmü, fanatizmi və cəhaləti qamçılamış, zəhmətkeş kütlələri işıqlığa, öz hüquqlarını anlamağa, bu hüquqlar uğrunda mübarizəyə dəvət etmişdir. Bu alovlu publisist qəzəbli bir satirik olmuş, bədii nəsrimizdə və dramaturgiyamızda Molla Nəsrəddinə xas olan bir satira yaratmışdır. Ölməz "Ölülər" komediyasının və bir sıra povestlərin, hekayələrin avtoru olan Cəlil Məmmədquluzadə ədəbiyyatımıza sosialist revolyusiyasının bir bayraqdarı kimi daxil olmuş. O, proletar revolyusiyasının qələbəsindən sonra da öz qələmi ilə sosialist quruculuğu interesləri̇nə xidmət etmişdir.

Onun ən yaxşı silahdaşı olan böyük şair Sabir, təəssüf ki, yaşayıb bu günləri görmədi, Sabirin qəzəblə dolu satirası Azərbaycan şerində çox yüksək şeir kimi qalır. Budur, baxın, bu heyrətləndirici satira sənətkarı insanları mütiliyə, alçalmağa və mübarizədən əl çəkməyə dəvət edənlərin hamısına qarşı necə cavab vermişdir:

Görmə! – Baş üstə, yumaram gözlərim.
Dinmə! – Mütiəm, kəsərəm sözlərim.
Bir söz eşitmə! – Qulağım bağlaram.
Gülmə! – Pəkey, şamü-səhər ağlaram.
Qanma! – Bacarmam! Məni məzur tut,
Böyləcə təklifi-mahalı unut!
Qabili-imkanmı olur qanmamaq?
Məcməri-nar içrə olub yanmamaq?
Eylə xəmuş atəşi-suzanını,
Qıl məni asudə, həm öz canını!

Sabir revorlyusiyanın, zülm altında əzilən zəhmətkeş kütlələrin tərənnümçüsü idi; öz vətəninin çar cəlladlarından, Azərbaycan bəy, mülkədar və kapitalistlərindən azad olunması arzularının həyata keçirildiyini görmədən yoxsulluq içərisində öldü. Lakin o, zəhmətkeşlərin zalımlara, istismarçılara tezliklə qələbə çalacaqları, köləlik zəncirinin tezliklə parçalanacağı, xalqın yeni həyat keçirəcəkləri inamı ilə öldü.

Bu zaman yetişdi, Azərbaycan xalqı... köləlik zəncirini öz üzərindən atdı və Nizamidən Sabirə kimi Azərbaycan xalqının ən yaxşı nümayəndələrinin arzuladığı, həsrətini çəkdiyi gözəl həyatı qurmağa başladı.

Min ildən artıq poetik keçmişə malik yeni zəngin sovet Azərbaycanının ədəbiyyatı da çiçəkləndi.

Sovet ədəbiyyatı Azərbaycan ədəbiyyatı xəzinəsinə çoxlu yeni əsərlər vermişdir. O, keçmiş ədəbiyyatımızdan öz yüksək ideyalılığı ilə ayrılır. Azərbaycan sovet ədəbiyyatı humanizmlə dolu olan ən proqressiv fikir və hissləri tərənnüm edir. Bu ədəbiyyat sovet xalqının azadlıq və səadətini tərənnüm edir. Zülm altında inləyən Şərq xalqlarını da istismarçısız, zalımsız işıqlı bir dünya qurmağa çağırır. Revolyusiyaya qədər olan Azərbaycan ədəbiyyatında tənqidi realizm hakim yer tuturdusa, sovet ədəbiyyatının əsasında sosializm realizmi metodu hakim yer tutur. Azərbaycanın sovet yazıçıları köhnə kapitalizm dünyasının qalıqlarını yalnız danmaq deyil, yeni Sovet sosialist dünyasını tərənnüm edirlər. Onların yeni əsərlərində sosializm quruluşunun bütün pafosu əks etdirilir. Onların əsərlərinin qəhrəmanları revolyusiya qəhrəmanları, yeni xoşbəxt həyat yaradıcıları, əməkçi ziyalılardır.

Azərbaycan ədəbiyyatı öz qidasını qalib gəlmiş internasionalizm ideyasından, sovet quruluşundan alır. Dünyanın altıda bir hissəsində qurulmuş sosializm uğrunda mübarizənin 20 illik təcrübəsindən, eyni zamanda çox əsrə malik olan öz klassik mədəniyyətindən də istifadə edir. O, həm də keçmiş əsrlərdə Azərbaycan xalqı tərəfindən yaradılmış Babək, Koroğlu, Vaqif, Qaçaq Nəbi kimi ölməz qəhrəmanları, şanlı bolşeviklər olan Əzizbəyovu, Xanları və başqalarını tərənnüm edir.

Bütün bunların hamısı birlikdə yenidən doğulmuş xalqın ədəbiyyatının simasını təyin edir.

Sovet hökumətinin 20 ili ərzində Azərbaycan ədəbiyyatı bir sıra Ümumittifaq əhəmiyyəti olan yazıçılar tərbiyə etmişdir. Sovet dövrü-

nün böyük dramaturqu Cəfər Cabbarlı belə şəxsiyyətlərdəndir. O, bizim üçün dramaturgiya sənətinin "Od gəlini", "1905-ci ildə", "Sevil", "Almas", "Yaşar" və sairə kimi ən yaxşı nümunələrini qoyub getmişdir.

"Dumanlı Təbriz", "Gizli Bakı", "Döyüşən şəhər" kimi çoxcildli romanların və başqa əsərlərin avtoru məşhur yazıçı Ordubadi belə yazıçılardandır.

Vətəndaş müharibəsi və sosializm quruluşu temalarında yazılmış gözəl əsərləri ilə ədəbiyyatımızı zənginləşdirən sovet dövrü yazıçılarından iki böyük romanın avtoru Əbülhəsən, "Şamo" adlı ilk Azərbaycan sovet romanının yaradıcısı Süleyman Rəhimovu, iri roman və novellalar avtoru H. Mehdini, bir sıra roman və çoxlu yüksək bədii hekayələr avtoru Mir Cəlalı, Ənvəri, Sabit Rəhmanı, Əli Vəliyevi, Cahanbaxşı və başqalarını qeyd etmək lazımdır.

Azərbaycan dramaturgiyası Cabbarlının ölümündən sonra M.İbrahim, H.Mehdi, S.Rəhman, S.Rüstəm və başqaları kimi yeni, talantlı dramaturqlar yetişdirmişdir.

Uzun əsrlərə malik klassik şerin tradisiyaları ilə tərbiyələnən sovet şerimiz Azərbaycan ədəbiyyatının irəlidə gedən janrıdır. S.Rüstəm, M.Rahim, O.Sarıvəlli kimi şairlərimiz, Dilbazi, Nigar və başqaları kimi şairələrimiz Azərbaycanın xaricində belə, geniş oxuculara bəllidir. S.Rüstəmin "Yaxşı yoldaş" adlı gözəl poeması, "Gecənin romantikası", "Çapayev" və başqa ilham dolu şeirləri, habelə lirik şair M.Rahimin şairanə əsərləri, onun Kirov haqqında poeması, Sarıvəllinin "Fantaziya" adlı poeması, parlaq şeirləri geniş oxucu kütlələri arasında məşhurdur. Sovet şeri ustaları ilə bir sırada Zeynal Xəlil, Ə.Ziyatay, Cəfər Xəndan və başqaları kimi yeni, talantlı sovet şairləri kadrı yetişir və bəziləri artıq yetişmişlər...

*1940*

## XURŞİDBANU NATƏVAN

Qarabağ gözəldir. Onun keçilməz dağlarını, qayalarını, qalın və ayaq dəyməmiş meşələrini, dağ sellərini və şəffaf bulaqlarını Azərbaycan şairləri öz şeirlərində az tərənnüm etməmişlər. Uca dağların döşündə Şuşa şəhəri düşmüşdür. Şuşa nəinki özünün gözəl təbiəti, yüksək poetik və ahəngdar kulturası ilə də şöhrət tapmışdır. Şuşanı əbəs yerə musiqi və poeziyanın beşiyi adlandırmırlar. Demək olar ki, Azərbay-

canın bütün məşhur oxuyanları və çalanları Cabbar Qaryağdıoğlu, kompozitor Üzeyir Hacıbəyov, Bülbül, məşhur tarçalan Qurban Primov və bir çox başqaları Şuşada doğulmuşlar.

Məşhur lirik şair, şadlıq və səadət müğənnisi Vaqifin qəbri bu gözəl şəhərdədir. Bəli, bütün xalqımızın sevimli oğlu, Azərbaycanın poetik kulturasını görünməmiş bir yüksəkliyə qaldıra bilmiş Vaqifin böyük ürəyi hələ XVIII əsrdə Şuşa şəhərində döyünmüşdür.

Şuşada başqa bir çox məşhur şair, amansız satirik, öz şeirlərində çar çinovniklərinin və Azərbaycanın feodal təbəqələrinin iyrəncliyinə gülən, onları ifşa edən Qasım bəy Zakir yaşayıb yaratmışdır. Nəhayət, XIX əsrin birinci yarısında, yüz il bundan əvvəl Şuşada Azərbaycan şairəsi Natəvan yaşayıb-yaratmışdır.

Çoxəsrli Azərbaycan poeziyası tarixində şairlərin az rolu olmamışdır. XII əsrin şairəsi, böyük Nizaminin müasiri, səmimi, əsil xalq şeirləri yazmış Məhsəti xanımın, sözləri indi də Azərbaycanda dillərdə əzbər olan məşhur xalq şairəsi Aşiq Pərinin adını çəkmək kifayətdir. Lakin Xurşidbanu Natəvan Azərbaycan şairləri arasında xüsusi yer tutur.

Natəvan 1837-ci ildə Şuşa şəhərində doğulmuşdur. O, əsas etibarilə lirik şairədir. Natəvanın bütün yaradıcılığı XVI əsrin dahi Azərbaycan şairi Füzulinin təsiri altında olmuşdur. Talantlı və həssas şairə, nəcib insan olan Natəvan islamın və şəriətin zəncirini daşıyan feodal Azərbaycanında hüquqsuz qadının və ananın ağır vəziyyətini dərindən duyurdu.

Natəvanın şeirlərində böyük insanın qüssə və kədəri var:

Zəmanə saldı əcəb möhnətü məlalə məni,
O mahrudan iraq verdi qəm zavalə məni.

Başqa bir şerində o belə yazırdı:

Nə mən olaydım ilahi, nə də bu aləm olaydı!
Nə də bu aləmərа dil müqəyyədi-qəm olaydı!

Şairəmizin bu acı sətirlərində feodal dünyasının düşüncə və hiss adamlarına nə qədər darlıq etdiyini görürük. Onların kədəri ictimai ədalətsizliyə qarşı, insanın köləliyinə və onun ləyaqətinin alçaldılmasına qarşı olan protest formalarından biridir.

Natəvanın yaradıcılığında uşaqlara olan böyük ana məhəbbəti tez-tez tərənnüm edilir. Şairə vaxtsız ölmüş oğlunun taleyi üçün acı göz yaşları axıdır:

Yanar canım oğul, daim sənin nari-fərağında,
Necə pərvanələr hərdəm yanar şəmin ayağında.
Güli-ruyin havasilə çıxır əflaka əfğanım,
Olur bülbül nəvası gül fəraqü iştiyaqında.
Sənin vəslin xəyaliylə gözü-könlüm gəzər daim
Ki, çün, Məcnuni-sərgəştə, gəzər Leyla sorağında.
Nə hali-qamətin zikri mənim virdi-zəbanımdır,
Dəmadəm naleyi-qumri olur sərvin budağında.
O şirin ləblərin şövqi, günü-gündən olub əfzun,
Əgər Fərhad tək yüz il dolansam hicr dağında.
Hərisəm bəs ki, ol Şirin zəbanın zikrinə, hərdəm
Olur xoş nitqli tuti şəkər olsa dəmağında.

Natəvan "Məclisi-üns" ədəbi dərnəyini təşkil etmişdi. XIX əsrin bütün böyük Azərbaycan şairləri bu dərnəyin üzvləri idi.

Bir çoxları Natəvanı təqlid etmiş, öz şeirlərində onun adını tərifləmişlər. Zakir, Seyid Əzim Şirvani, M.F.Axundov öz şeirlərində dəfələrlə Natəvanı tərənnüm etmişlər.

Partiyanın böyük qayğısı ilə azadlıq qazanmış xalq özünün ən gözəl oğullarının və qızlarının xatirəsinə dərin hörmət bəsləyir. Sovet hakimiyyəti illərində Natəvanın yaradıcılığı xalq kütlələri içərisində geniş yayılmışdır. Aşıqlarımız onun gözəl şeirlərini hər yerdə oxuyub onun sözləri üzrə yeni-yeni nəğmələr yaradırlar.

Azərbaycan poeziyasının dühası Nizaminin 800 illiyi ilə əlaqədar olaraq Bakıda yeddi böyük klassikə abidə qoyulur, onların arasında biz Azərbaycanın gözəl şairəsi Xurşidbanu Natəvanın da simasını görəcəyik.

*1940*

## AZƏRBAYCANIN ELMİ TARİXİNİ YARADAQ

Tarix elmi bütün ictimai elmlərin beşiyidir. Tarixi bilmədən xalqın bütün əzəmətini və onun əməllərini müəyyənləşdirmək çətindir.

Azərbaycan xalqının şərəfli keçmişi vardır və o, ən qədim, ən mədəni xalqlar sırasına daxildir. Azərbaycan xalqının mədəniyyəti tarixin ayrı-ayrı mərhələlərində bütün Şərqdə ən qabaqcıl və ən mütərəqqi mədəniyyət olmuşdur. Azərbaycan poeziyası, onun zəngin musiqisi

əsrlər boyunca yaranıb inkişaf etmişdir. Azərbaycanın şair və müğənniləri ümumxalq məhəbbətini və hörmətini qazanmışlar. Dahi rus şairi Lermontov vaxtı ilə demişdir ki, fransız dili Avropada geniş yayıldığı kimi, Azərbaycan dili də Zaqafqaziyada geniş yayılmışdır.

Ölməz xalq əfsanələri, Azərbaycan aşıqlarının nəğmələri və onların xalq bahadırları haqqında yaratdıqları qəhrəmanlıq epopeyaları, bizim sədaqət və məhəbbət haqqında olan məşhur dastanlarımız əsrlər boyu bir çox xalqların dillərinin əzbəri olmuşdur.

Azərbaycan xalqı bəşəriyyətə ədəbiyyatda Şərq renessansının böyük yaradıcısı, Şərqdə romantik poeziyanın banisi, böyük filosof və alim, bədii təfəkkürün dühası Nizami Gəncəvini vermişdir. Təkcə bu, ona dünya mədəniyyəti tarixində fəxri yer tutmağa haqq verir.

Bu prinsipial yüksəklikdən alim və tarixçilərimizin əzəmətli xalqımız haqqında, onun çoxəsrli mədəniyyəti və qəhrəmanlıq tarixi haqqında gur səslə danışmalarının vaxtı çatmışdır.

Vətənin məhəbbəti ilə alovlanmayan, onun tarixini bilməyən alim və ya tarixçi, yazıçı və ya rəssam öz xalqına layiq heç bir şey yarada bilməz.

Azərbaycan xalqının düşmənləri xalqımızın milli istiqlaliyyətini inkar edir və Azərbaycanın, əsrlər boyunca xalqımızın yaratdığı bütün yaxşı şeyləri başqa xalqların adına yazırdılar. XIII–XIV əsrlərdə Azərbaycanın artıq yüksək inkişaf etmiş mədəniyyəti olmasına baxmayaraq, onlar sübut etməyə çalışırdılar ki, guya Azərbaycan xalqı yalnız bu əsrlərdə səlcuq, monqol və başqa köçəri qəbilələrin qalıqlarından əmələ gəlmişdir.

Dahi Azərbaycan şairi filosof və ateist Nəsimi XIV əsrdə yazırdı:

Məndə sığar iki cahan, mən bu cahana sığmazam,
Gövhəri-laməkan mənəm, kövnü-məkana sığmazam.

Nəsimi kimi bir dühanın poeziyası yalnız milli dilin və milli mədəniyyətin əsrlər boyu inkişafı nəticəsində meydana çıxa bilərdi. Ölkəmizin bütün tarixi Azərbaycan xalqının müstəqil xalq olmadığını və bununla da Azərbaycan dilini müstəqil deyil, yalnız "şivə" adlandırmaq mümkün olduğunu təsdiq edən pantürkistlərin və murdar burjua millətçilərinin həyasız böhtanlarını alt-üst edir. Xalqın böyük həqiqəti qarşısında hər cür saxta "nəzəriyyələr" göyə sovrulur.

Hələ 2500 il bundan qabaq Azərbaycan ərazisində qədim Azərbaycan xalqı olan midiyalılar yaşamışlar. Böyük Midiya dövləti bütün dünyada şöhrət qazanmışdır.

Qədim yunan alimləri Strabon və Herodot təsdiq edirlər ki, İran öz mədəniyyətini o dövrün ən qabaqcıl, ən mədəni xalqı olan midiyalılardan götürmüşdür. Bizim qəhrəman ulu babalarımız midiyalıların bir sıra adət və ənənələri nəsildən-nəslə keçmişdir.

Qədim tarixçilərin yazdığına görə, Midiya xalqı öz qəhrəmanlığı və azadpərvərliyi ilə fərqlənirdi. Midiya dövləti 150 ildən artıq yaşamış və İran şahları Kir və Daraya qarşı dəfələrlə mübarizə aparmışdır.

Hətta İranı fəth etmiş Makedoniyalı İskəndər Midiyada müstəqil dövlət idarəsini saxlamağa məcbur olmuşdur. Qədim Midiya – Azərbaycan dövlətinin təşəkkülündən 2500 ilə yaxın keçmişdir. Bu müddət ərzində ərəb, səlcuq, monqol və bir çox başqa tayfalar Azərbaycan ərazisinə soxulmuş və qismən onlarla assimilyasiyada olmuşlar. Yadelli qəsbkarların saysız basqınlarına baxmayaraq, Azərbaycan xalqı öz dilini, adət-ənənələrini və mədəniyyətini qoruyub saxlamışdır. Azərbaycanın maddi mədəniyyət abidələri və bizim minillik yazılı ədəbiyyatımız buna parlaq sübutdur.

Azərbaycan xalqının tarixi – onun azadlıq və müstəqillik uğrunda apardığı mübarizə tarixidir. Azərbaycan xalqının böyük oğlu Babəkin adı bütün bəşəriyyətə məlumdur. IX əsrin birinci yarısında Babək ərəb xəlifələrinə qarşı 25 ilə yaxın amansız mübarizə aparmışdır. O özündə qəhrəman xalqın iradə və mərdliyini təcəssüm etdirirdi.

Təəssüf ki, partiyamızın dəfələrlə göstərişinə baxmayaraq, Azərbaycan tarixçiləri indiyə qədər Babək dövrünü, Azərbaycan xalqının qəhrəmanlıq tarixinin qızıl səhifələrini xarakterizə edən ləyaqətli elmi əsər yaratmamışlar.

Azərbaycan milli eposunun qəhrəmanı Koroğlunun adı bütün Şərq xalqlarının nəğmələrində mədh edilir. Lakin Koroğlu və onun dövrü haqqında bizim kitabxanalarda tarixçilərimizin əsərləri yoxdur.

Bizdə nəinki ictimai fikir inkişafının və Azərbaycan dövlət quruluşunun tarixi, hətta ölkəmizin tarixi xəritəsi belə yoxdur.

Tarix cəbhəsinin geri qalması dözülməzdir. SSRİ EA-nın Azərbaycan filialı öz işini elə qurmalıdır ki, bizdə tarix elmləri özünə layiq yer tutsun.

Azərbaycan xalqı əsrlər boyu mübarizəsi ilə nəinki öz tarixinə, hətta mütərəqqi bəşəriyyətin tarixinə qızıl səhifələr yazmışdır. Azər-

baycanın tarixini bilmədən Şərqin, hətta Qərbin bir sıra ölkələrinin tarixi haqqında tam təsəvvür əldə etmək olmaz.

Dahi azərbaycanlı Nizaminin anadan olmasının 800 illiyi yaxınlaşır. Tarixçilərimiz və ədəbiyyatşünaslarımız var qüvvələri ilə bu tarixi günə hazırlaşırlar. Onlar əl-ələ verərək Nizaminin yubileyinə qədər Azərbaycanın ümumi tarixini, eləcə də Azərbaycan ədəbiyyatı tarixini yaratmalıdırlar.

*1940*

# BƏDİİ TƏNQİD BAYRAĞINI YÜKSƏKLƏRƏ QALDIRAQ

Ümumiyyətlə tənqid, xüsusilə bədii ədəbiyyat tənqidi, həmişə böyük ictimai məqsədlərə malik olmuşdur.

Sosializm ədəbiyyatı – həqiqi xalq ədəbiyyatı yaradıldığı bir zamanda tənqid qarşısında daha böyük vəzifələr və məqsədlər durmaqdadır.

Əgər böyük klassiklərimizin, məsələn, Belinskinin yaxud M.F.Axundovun tənqid irsini götürərsək, onların yalnız ayrı-ayrı ədəbi hadisələri təhlil etməklə kifayətlənmədiklərini, öz zəmanələrinin qabaqcıl adamları – parlaq zəka və böyük qəlb sahibləri olan bu böyük tənqidçilərin yazıçı və şairləri öz dövrlərinin böyük ictimai problemlərinə və təkamülə çağırdıqlarını da görəcəyik. Bu iş onlara nəinki talantlı insanlar olduğu üçün müyəssər olmuşdur. Bundan başqa, onlar bir də ona görə bu cür nəhəng işləri görə bilmişlər ki, öz zəmanələrinin qabaqcıl kulturası səviyyəsində dayanmışlar. Mən bununla demək istəyirəm ki, tənqidçinin yüksək kulturalı olması, yüksək dərəcədə inkişaf etmiş bədii zövq sahibi olması onun yaradıcılığında həlledici rol oynayır.

Bu nöqteyi-nəzərdən biz müasir tənqidçilərimizə yanaşarsaq, çox böyük təəssüflə olsa da, cürətlə deməliyik ki, bizim müasir bədii ədəbiyyat tənqidi nəinki qarşısında durmuş böyük vəzifələrə girişməyə bəraət qazana bilməmişdir, bəlkə hətta bu ədəbiyyatın quyruğunda sürünür, onun arxasından çata bilmir.

Bizim tənqidimizin belə dözülməz vəziyyəti hansı səbəblərlə izah oluna bilər? Əsas etibarilə bu səbəblər aşağıdakılardır:

Birincisi – tənqidçilərimizin çoxunda öz sənətinə kifayət qədər məhəbbət və ehtiram hissi yoxdur. Öz peşəsi vasitəsilə xalqa xidmət etmək istəyən hər əqidə sahibi, şəxsi həyatının tam mənasını öz peşə-

sində görmürsə, çox pis sənətkardır. Hər kəs öz peşəsini sevmirsə, buna qarşı özündə böyük məhəbbət alovu hiss etmirsə, o, heç bir dəyərli, inandırıcı və faydalı şey yarada bilməz!

Deməк, bizim tənqidçilərimiz öz peşələri ilə təsadüfdən-təsadüfə məşğul olmamalı, bəlkə hər gün, hər saat və hər dəqiqə onunla yaşamalıdırlar. Bəşər tarixindəki bütün zəkalı tənqidçilər bizə bunu öyrədirlər.

İkincisi – bizim tənqidçilərimiz bədii tənqid klassiklərimizin və marksist klassiklərin çox zəngin mirasına az yiyələnmişlər. Böyük klassiklərimizdən yüksək ideyalılığı və prinsipiallığı öyrənmək vaxtı çatmışdır! Onların iş metod və formalarına yiyələnmək lazımdır. Bizim tənqidçilərimiz öz işlərinin formasına çox zaman lazımınca diqqət vermirlər. Lakin müəyyən və müvafiq forma olmadan insan zəkasının heç bir məhsulunu xalqa tanıtmaq mümkün deyildir. Çünki forma yalnız formal bir məfhum deyildir, o, eyni zamanda, həyati, kəsərli, aktiv və məzmunlu, mündəricə məfhumudur.

Tənqid əsəri öz forması, bədii ifadəliliyi, öz kəsərli və inandırıcı olması etibarilə incəsənətin hər hansı bir əsərindən aşağıda durmamalıdır.

Üçüncüsü – tənqidçilərimizin həmişə bu və ya digər sənət əsərinə obyektiv qiymət verməyi bacarmamasıdır. Bəzən onlar əsərləri ədəbiyyatımızın ümumi və doğma interesi nöqteyi-nəzərindən deyil, bəlkə təsadüfi, yaxud şəxsi interesler nöqteyi-nəzərindən tənqid edirlər. Bununla da tənqid oxucu kütləsi nəzərində öz hörmətini itirir; çünki oxucu kütləsi əsərlərə obyektiv və dürüst qiymət verməyə alışmışdır. Qısaca desək, tənqid geniş oxucu kütləsini öz böyük həqiqətçiliyi və obyektivliyi ilə məftun etməli, lazımsız, bəzən də zərərli hisslərə qapılmamalı, istər tənqidçinin, istərsə də geridə qalmış oxucuların duyğularına tabe olmamalıdır.

Dördüncüsü də bundan ibarətdir ki, bizim tənqidçilərimizin çoxu uzunəsrlik tarixi olun Azərbaycan ədəbiyyatını lazımınca bilmir, öz inkişaf yolunda bu ədəbiyyatın ayrı-ayrı dövrlərdəki dolğun mənzərəsi haqqında təsəvvürləri yoxdur, ədəbi məktəblərin, stil və formaların mübarizələrindən xəbərsizdirlər. Bunsuz bütün əzəməti ilə bizim müasir nəslin ictimai düşüncəsinin təşəkkülündə onun tarixi rolunu təyin etmək mümkün olmadığı kimi, onun gələcəyini də, qarşısında duran vəzifələrini də müəyyən etmək olmaz.

Beşinci cəhət də bundan ibarətdir ki, tənqidçilərimizdə hələ də kifayət qədər yaradıcılıq cürəti çatışmır. Onlar çox zaman öz əsərlərini

uzun-uzadı (bəzən heç zaman olmayan və yersiz) sitatlarla doldurur, öz yaradıcılıq xüsusiyyətlərini bir kənara buraxır, öz görüşlərini və bədii zövqünü tamamilə unudurlar. Başqalarının göstərişlərini və fikirlərini etinasız buraxmamaqla bərabər, tənqidçi öz başını özgəsinin yorğanı altında gizlətməməli, o öz orijinal yaradıcı simasını göstərməlidir. Çünki həmişə özgənin atına minmək olmaz. Bu ondan irəli gəlir ki, çox vaxt tənqidçilərimizin bir çoxu bədii tənqid sahəsində öz orijinal və yeni fikirlərini söyləməyə cürət etmirlər. Lakin bir həqiqət var ki, ağıllı cürət olmadan heç bir şeylə irəliyə doğru inkişaf mümkün deyildir. Köhnə bir Azərbaycan məsəlini xatırlatmaq istərdim: "Qorxan gözə çöp düşər".

Kimsəyə baxmadan tənqid bütün yazıçılar haqqında öz cürətli sözünü deməlidir. Yeri gəlmişkən bunu da qeyd etməliyik ki, bəzən tənqidi sevməyən ədəbi avtoritetlər də vardır. Bu adamlar öz avtoritetlərindən pis istifadə edərək, yaradıcılıqlarında səliqəsiz çalışır, bəzən ucuz xalturaya qədər tənəzzül edir; beləliklə istər öz əsərlərinin, istərsə də bizim ədəbiyyatımızın məhsullarının keyfiyyətini aşağı salırlar. Lakin tənqidimizin gözündə bu cür "böyük" və ya "balaca" avtoritetlər olmamalıdır. Onlar bizim ədəbiyyatımızın ümumi intereslərini ayrı-ayrı şəxsiyyətlərin interesindən yüksək tutmalıdırlar.

Altıncısı da odur ki, tənqidçi hər bir yazıçıdan fərqli olaraq öz xalqı və öz epoxası ilə ayaqlaşa bilməlidir. Bunun üçün də o, xalqın nəfəsi ilə tənəffüs etməli, onun yüksək ideal və istəkləri ilə yaşamalı, ən incə və insanpərvər duyğuları ondan almalı, incəsənət, həyat, böyük xalq müdrikliyi və mərdliyi zövqlərini ondan öyrənməlidir. Buna görə də kabinetçiliyin və ədəbiyyatçılığın məhdud çərçivələri qırılmalı, tənqidçi ən real həyatın geniş yollarına çıxmalı, onun nəbzini və ürəyini tuta bilməli, öz yaradıcılıq taleyini xalqın yüksək interesləri ilə, onun real və həqiqi həyatı ilə bağlamalıdır. Çünki həyatımız o qədər gözəlləşmiş və füsunkarlaşmışdır ki, insan onu bir dəstə gül kimi qucaqlamaq və onun ətri ilə əbədiyyən tənəffüs etmək istəyir. Bax, bu səbəbə görə də bizim tənqidçilərimiz daima sosialist varlığımızın böyük simfoniyasını, bizim mahnılarımızın simfoniyasını, bizim öz şəxsi azadlıq və səadətimizin simfoniyasını diqqətlə dinləməlidirlər.

Partiyamızın Mərkəzi Komitəsinin tənqidin və biblioqrafiyanın vəziyyəti haqqındakı qərarının çox böyük tarixi əhəmiyyəti vardır. Bu qərar bizim tənqidimizi böyük qüdrət və təsir sahibi olmağa çağırır, sovet ədəbiyyatının gələcək təşəkkülündəki roluna çağırır.

Ədəbi tənqid ədəbiyyatımızdakı müxtəlif yaradıcılıq istiqamətlərinin, ədəbi stillərin gələcək inkişafına kömək etməli, bu uğurda mübarizə aparmalıdır ki, ədəbiyyatımız yeknəsəq birçeşidli ədəbiyyat kimi nəzərə çarpmasın. O, ədəbiyyatımızın əsil simasını bütün xalqımıza tanıtmalı və bu ədəbiyyatı get-gedə daha da xalqın sərvəti etməlidir. Bununla da tənqidimiz bizim ən yaxşı sovet əsərlərindəki görkəmli cəhətləri təşkil edən ictimai şəxsiyyətləri və bədii motivləri inkişaf edən ictimai şəxsiyyətləri və bədii motivləri inkişaf etdirib yaymaq işinə yardım etməlidir.

Bizim tənqidimiz incəsənətimizin yüksək namusu və vicdanı keşiyində dayanmalıdır. O, ədəbiyyatımızın interesini təsadüfi intereslərdən, antibədii kələklərdən qorumalı, şikayət və ərizə qovluqları dolu, lakin yaradıcılıq cəhətdən heç bir şeyi olmayan xalturaçılar və ədəbiyyat oğrularından qorumalıdır.

Tənqidimizin indiki geriləməsi üçün əldə heç bir ictimai zəminə və əsas yoxdur. Tənqidçilərimiz unutmasınlar ki, bütün insan zəkası məhsulu olan elmlərin tamamilə geniş surətdə çiçəkləndiyi və hamımızın canlı şahidi olduğumuz bir epoxada, sosialist kulturanın qalib gəldiyi bir epoxada, ən proqressiv kultura kimi bəşəriyyətin ən yaxşı zəkalarının bizdən öyrəndikləri bir epoxada yaşayırlar.

*1941*

## "SƏBUHİ" HAQQINDA

"Səbuhi" – Azərbaycanın böyük maarifpərvərləri, dramaturqu, şairi, materialist filosofu Mirzə Fətəli Axundovun şairlik təxəllüsüdür.

Azərbaycan dramaturgiyasının əsasını qoymuş Axundovun həyatı ilə sovet tamaşaçılarının tanış olmasının çox böyük mədəni əhəmiyyəti vardır.

Azərbaycanın revolyusion-demokrat ədəbiyyatı Axundovun adı ilə möhkəm bağlıdır. Həm də yalnız Azərbaycanın deyil!

Axundov Yaxın Şərqdə birinci olaraq istibdada və monarxiyaya qarşı çıxış edib bütün məzlum xalqları işıqlı zəka aləminə, elmləri dərk etməyə, islamın köhnəlmiş ənənələrinə qarşı, şahların və Türkiyə sultanlarının alçaq hərəkətlərinə qarşı mübarizə aparmağa çağırmışdır.

XIX əsrin böyük demokratlarının ən yaxşı ideallarını özündə canlandıran Axundov böyük rus və Avropa kulturasına birinci olaraq "pəncərə açmışdır".

Yazıçı M.Rəfili tərəfindən yazılmış "Səbuhi" ssenarisi (biz bu ssenari ilə A.Bek-Nazarov, R.Təhmasib və Y.Dukor tərəfindən işlənmiş rejissor nüsxəsi üzrə tanış olduq) çox diqqətəlayiq bir əsərdir, bu əsər maraqlı və yüksək bədii film yaratmaq üçün əsas ola bilər.

Təbiidir ki, böyük maarifpərvərin çoxcəhətli fəaliyyətinin hər tərəfini ssenarinin məhdud çərçivəsi daxilində təsvir etmək olmazdı. Avtorun xidməti bundadır ki, o zamanın ən qabaqcıl adamlarından birinin, cəsarətli və ağıllı, nəcib ürəkli bir adamın obrazını yarada bilmişdir.

"Səbuhi" filmi Azərbaycan ictimai fikri tarixinin parlaq dövrlərindən birini göstərəcəkdir.

Axundovun ideyaca dekabristlərə yaxın olması fikrinin ssenaridə yürüdülməsi xüsusilə qeyd edilməlidir. Gənc Axundov Tiflisə gəldikdən bir az sonra Bakıxanov tövsiyəsilə Qafqaz canişininin yanında rəsmi tərcüməçi sifətilə qulluğa girir. Yenə də Bakıxanovun vasitəsilə Bestujevlə tanış olur. Bestujevin başına yığışan adamların azadlıq fikirləri və yüksək idealları Axundova yaxın və onun başa düşdüyü fikir və ideallar idi, gənc Axundovun fikrinə və ideallarına uyğun idi.

Axundov qulluğa girdiyi ilk günlərdən etibarən çar çinovniklərinin, bəylərin və ruhanilərin törətdikləri ədalətsizliklərə, xalqı aldatmalarına rast gəlir. Gənc Axundovun incidilən kəndliləri müdafiə etmək təşəbbüsləri naçalniklərlə Axundov arasında kəskin toqquşmalara səbəb olur. Haqsızlığı görmək istəməyən bu coşqun ruhlu, namuslu gənc, ədalətin qalib gələ bilməsi yolları üzərində çox düşünür. Sevimli şair Puşkinin şeirləri, Bestujevlə yaxın dostluq, gürcü şairi Orbeliani və aşıq Səttarla görüşmələr bu zamanlarda gənc Axundovun mənəvi yüksəlişinə kömək edən faktorlardan ibarət olur.

Axundov Bestujevə deyir: "Siz mənim müəllimimsiniz. Rusiya haqqında bir çox gözəl şeyləri mən sizdən eşitdim. Senat meydanında olan böyük üsyan haqqında həqiqəti mən sizdən öyrəndim".

Axundov Bestujevə deyir: "Siz mənim müəllimimsiniz. Rusiya haqqında bir çox gözəl şeyləri mən sizdən eşitdim. Senat meydanında olan böyük üsyan haqqında həqiqəti mən sizdən öyrəndim".

Axundovun "səhər adamı" demək olan "Səbuhi" təxəllüsü də burada, Bestujevin dərnəyində meydana çıxır. Burada yeni-yeni mahnılar doğur.

Axundov Puşkinin ölümü haqqında yazdığı və Bestujev tərəfindən rus dilinə çevrilmiş şerində deyir:

Dostlarından uzaq düşdün,
Bağçasaray mülkündən sənin o
iki gülünün ətri
Bahar nəsimi ilə sənin qəbrinə
fəvvarə verir.
Ağ saçlı Qafqaz sənin şerinə
mükafat olaraq
Səbuhi şeirləri ilə sənə yas tutur.

"Səbuhi" ssenarisi təcrübəli bir yazıçı tərəfindən, Axundovun həyat və yaradıcılığına bələd olan bir adam tərəfindən yazılmışdır.

Axundovun ölməz obrazına məhəbbət Azərbaycanın böyük maarifpərvərlərinin ədəbi irsi üzərində Rəfilinin illərdən bəri işləməsi nəticəsidir.

Ssenaridə olan yaradıcılıq temperamenti, obrazların həqiqətən şairanəliyi insanı fərəhləndirir. Əsas səhnələr böyük ustalıqla yazılmışdır.

Budur, misal üçün, Səbuhinin toy məclisini götürək. Ailədə hamı sevinir. Molla gəlir. Bunun gəlişi dinin yırtıcılığına, peyğəmbərə və onun xadimlərinə qarşı Axundovun kinayəli və istehzalı çıxışına səbəb olur. Səbuhinin sözü ilə işi arasında təfavüt yoxdur: o, gəlinin duvağını çıxarır. Səbuhinin sevgilisi Tubu isə riyakar və hiyləgər molla qarşısında üzünü açır.

Səbuhinin ərəb əlifbasının reforma edilməsi proyekti ilə Türkiyə Elmlər Akademiyasındakı çıxışı çox dramatik bir epizoddur. Xalqın böyük çoxluğu üçün çətin və anlaşılmaz olan yad əlifbanın dolaşıq hərfləri xalq ilə kultura arasına bir hasar çəkmişdi, böyük maarif ideyalarını kütlə içərisində yaymağa imkan vermirdi. Səbuhi öz proyektini həyəcanla qoca akademiklərə izah edir. Onun bu cəsarətli təklifi sükutla qarşılanır. Yalnız bir ağbaş alim, o da Axundov haqqında təhqir sözləri söyləmək üçün kafedraya qalxır. Səbuhinin təklifi rədd edilir, Səbuhi zalda tək qalır.

Qarabağ səhnələrində də böyük, həqiqi bir dramatizm vardır. Üsyançı kəndlilərin başçısı Adıgözəl Qafqaz canişinin paketi ilə Qarabağa göndərilmiş Səbuhini qarşılayır və salamlayır. Səbuhi elə bilirdi ki, buraya yoxlama və istintaq üçün gəlmişdir. Lakin Adıgözəl haqlı çıxır: Səbuhi kəndliləri köçürmək üçün əmr gətiribmiş. Bu əmri gətirən çinovnik Səbuhi deyil, başqa bir adam olsaydı, Adıgözəl paketi də, çinovniki də məhv edərdi. Budur ki, sonra baş verən hadisələr heç bir təqsiri olma-

yan Səbuhiyə çox ağır təsir bağışlayır: kazaklar müdafiəsiz kəndlilərə amansızcasına divan tuturlar, evlər yandırılır, qocalar və uşaqlar döyülür.

Son, məscid səhnəsi və mollanın fitvası ilə qızışdırılmış fanatiklərin Səbuhinin evini dağıtmaları da inandırıcılıqla təsvir edilmişdir.

Məscid səhnəsi, canişin sarayı, Səbuhinin komediyası tamaşaya qoyularkən teatrın göstərilməsi səhnəsi, meyvəsatan Vanonun xalq yumoru, Səttarın oxuduğu mahnıların dərinliyi və lirizmi – bütün bunlar diqqətlə işlənmiş gözəl səhnələr olub, bizi Səbuhinin epoxasına aparır.

Ssenari avtorlarını yalnız bir şeydə məzəmmət etmək olar ki, onlar bəzi qəhrəmanları lazımınca dolğun təsvir etməmişlər. Səbuhi, Bakıxanov, Bestujev, aşıq Səttar obrazları ssenaridə yaxşı yaradılmışdır. Lakin bu sözü əsərdə iştirak edən şəxslərin hamısı haqqında söyləmək olmaz.

Ssenarinin materialı, ssenarinin yazılışındakı şairanəlik, temperament və coşqunluq aktyorların öz yaradıcılıq bacarığını göstərə bilmələri üçün geniş meydan açır. İndi vəzifə ssenarinin obrazlarını həqiqi məharətlə canlandırmaqdan ibarətdir.

Ümid etmək olar ki, "Səbuhi" ssenarisi Azərbaycan kino incəsənətinin inkişafında, milli kinematoqrafiyamızın yüksək bədii əsərlər yaratmasında dönüş dövrü olacaqdır.

Azərbaycan kinosunun Sovet Azərbaycanının başqa kultura və incəsənət sahələrindən geridə qalması, məncə, indiyədək dolğun bədii ssenarilər olmaması ilə izah edilə bilər.

Bədii film insan orqanizmi ilə müqayisə edilərsə, ssenarini insan qəlbinə bənzətmək olar. Biz yalnız yaxşı ssenarilər yaratmaqla Azərbaycan kino incəsənətinin tərəqqisinə nail ola bilərik. "Səbuhi" məhz bu cür ssenarilərdəndir.

Bakı kinostudiyası bu filmin çəkilişinə xüsusi fikir verməli və var qüvvəsini sərf etməlidir ki, "Səbuhi" filmi ölkəmizin həqiqətən ən yaxşı şəkillərindən biri olsun.

*1941*

## [ÜMUMBAKI İNTELLİGENSİYASI MİTİNQİNDƏ ÇIXIŞI]

Yoldaşlar! Dünən, iyul ayının 3-də SSRİ Müdafiə Komitəsi sədrinin radio vasitəsilə olan çıxışını, müraciətnaməsini bütün Sovetlər torpağı böyük bir diqqət və məhəbbətlə dinlədi...

Hitler və onun əlaltı nökərləri, o quldurlar dəstəsi ana Vətənimizə oğurluqla soxularaq bizim körpələrimizi səhər yuxusundan vaxtsız oyatdı. O quldurlar sovet torpağının çörəyini və neftini əlindən alaraq, bizim azad xalqlarımızı da özlərinə bir qul etmək kimi xam xəyallar bataqlığına düşmüşlər. Lakin azadlığı öz qanı və halal zəhməti ilə yaratmış olan böyük bir xalq öz mənliyi, öz namus və şərəfini hər şeydən uca tutur və bu uğurda son damla qanına qədər bütün qara qüvvələrlə çarpışacaqdır. Bir qayda var ki, heyvan qudurduğu zaman çox dəhşətli və qorxunc olur. Bu saat Hitler də qudurmuş və şüurunu itirmiş bir öküz kimidir. Lakin bu qudurğan özünü ora-bura toxuduğu zaman onun başı bizim polad səngərlərimizə, sinəmizdən qurduğumuz qalalarımıza çarpınaraq darmadağın olacaqdır.

Faşizm insanlara, ölkələrə ölüm gətirən bir çumadır. Faşizm zərbələr, qəbiristanlıqlar sevən bir bayquşdur. O, bəşəriyyətin min ildən bəri yaratmış olduğu ən gözəl kultura abidələrini uçurur, ən böyük dahilərin humanist əsərlərini, tom-tom kitablarını yandırıb külə döndərir. Faşizm ağızlara qıfıl, qollara zəncir vurur. O, axar çeşmələri öz murdar ayaqları ilə bulandırır, günəşin qarşısını qara bulud kimi alaraq yer üzünü həyatdan məhrum etmək istəyir.

Sovetlər İttifaqının faşizmlə apardığı mübarizə yalnız iki ordunun bir-biri ilə vuruşması kimi adi bir müharibə deyil. Ali Baş Komandan deyir ki, "Faşist Almaniyası ilə aparılan müharibəni adi müharibə hesab etmək olmaz. Bu müharibə yalnız iki ordu arasında gedən bir müharibə dyildir. Bu müharibə, eyni zamanda, nemes-faşist qoşunlarına qarşı bütün sovet xalqının apardığı böyük müharibədir, faşist zalımlara qarşı aparılan bu ümumxalq vətən müharibəsindən məqsəd təkcə öz ölkəmizin başının üstünü alan təhlükəni aradan qaldırmaq deyil, habelə alman faşizminin zülmü altında inləyən bütün Avropa xalqlarına da kömək etməkdir".

Hitler öz avantürası ilə bir çox xırda Avropa ölkələrini Almaniyanın müstəmləkəsi edərək, o məhkum xalqların qanını sorur. Hitler Fransa dövlət başçılarının kütbaşlığından istifadə edərək, böyük Fransa torpağını və Fransa xalqını da özünə bir qul etmişdir. Lakin Volterlər, Maratlar, Viktor Hüqolar yaradan böyük xalq məhkum yaşaya bilməz, o öz intiqamını Almaniya faşizmindən və öz daxili satqınlarından alacaqdır.

“Marat qalxıb məzarından soruşduqda hanı vətən?
Hər fransız aslan kimi tərpənəcək öz yerindən.
Al bayraqlı kommunarlar çıxacaqdır yollar üstə,
Qadınlar da gül tökəcək eyvanlardan dəstə-dəstə”.

Alman faşizminin pəncəsi altında əzilən bütün Avropa xalqlarının gözü və ümidi bizdədir! Hitler avantürasını dağıdacaq böyük qüvvə çoxmilyonlu sovet xalqıdır!

Buna sübut düşmənin 12 gün ərzində verdiyi böyük tələfatdır. Qəhrəman ordumuzun ağır amansız zərbələri altında düşmənin ən yaxşı diviziyaları, ən yaxşı aviasiya hissələri artıq tarmar edilmişdir və döyüş meydanında onlara məzar qazılmışdır. Düşmən fitnəkardır, amansızdır. O, təpədən dırnağa qədər silahlanmışdır. Öz daxili çürüklüyünü hiss edən, iqtisadi vəziyyəti böhran keçirən alman faşizminin əsas müharibə metodu “sürətli zərbə”dir. Lakin böyük sovet xalqı ilə olan bu müharibənin ilk günləri göstərdi ki, düşmənin dediyimiz bu müharibə metodu tarmar olmuşdur!

Partiyamız bütün sovet xalqlarını faşizm ilə qəti vuruşa çağırır. Şərəfli işdə Azərbaycan sovet intelligensiyasının üzərinə çox məsul və şərəfli vəzifələr düşür. Hər sovet intelligenti öz cəbhəsində bir qızıl əsgər, bir çekist kimi dayanmalıdır!

Sıramızda qorxaqlara, çaxnaşma salanlara, şayiələr uyduran boşboğazlara, satqınlara yer yoxdur. Birə on, birə yüz işləməklə ordumuzun arxasında qala kimi durmaq bizim vəzifəmizdir! Hamımız bir nəfər kimi çoxminli xalq cəbhəsinə yazılmaqla faşizmə qarşı böyük bir xalq müharibəsi aparmalıyıq...

Qoy faşizmin qara buludları əriyib məhv olsun! Biz həyat aşiqləri olduğumuzdan həyat bizimdir! Faşistlər ölüm xəbərçisi olduğundan ölüm onlarındır.

Yaşasın ana vətən! Yaşasın napoleonların məğrur bayrağını yerə salan qəhrəman rus xalqı!

Yaşasın sovet torpağının məğlubedilməz xalqlar qardaşlığı! Ordumuza, qızıl şahinlərimizə, qəhrəman flotçularımıza eşq olsun!..

*1941*

# FAŞİZMİN DƏHŞƏTLƏRİ

Bütün Avropa hərbin alovları içində yanır. Kəndlər, şəhərlər xaraba qalır. Ayaqlara, qollara zəncir vurulur, boğazlara qurşun tökülür. Gündə yüzlərlə, minlərlə ev qapısı bağlanır. Ocaqlar sönür, çıraqlar keçir. Südəmər körpələr anaların döşlərindən ayrı salınaraq cidalar ucunda parçalanır. Səhərin aydınlığında, axşamın qaranlığında evlərə basqın olur! İnsan zəhmətinin yaratdığı bütün nemətlər talan olur. Bir cüt qızıl üzük, yaxud qolbağı üçün qızların, gəlinlərin qolları kəsilir. Ələ düşən əsirlərin əllərinə bel, külüng verilir. Onlara, özünə qəbir qazın, əmri verilir. Yüzlərlə, minlərlə insanlar diri-diri, gözü görə-görə yerə basdırılır. Axar çaylara min-min insan cəsədləri tökülür. O meyitləri suyun dalğaları sahillərə vurub çıxarır. Su müqəddəsdir! O, cinayət qəbul etməyir. Top atəşlərinin dəhşətləri altında qadınlar, körpələr öz isti yuvalarını, çörək təknələrini, yorğan-döşəklərini, dünənki xoşbəxt ailəsini tərk edir, quruca canını götürərək dağlara, meşələrə qaçırlar.

Qorxudan, aclıqdan, susuzluqdan, yuxusuz gecələrin təsirindən qızlar, gəlinlər bir neçə gün ərzində qocalır, saçları ağarır, gözləri çuxura batır. Beş gün əvvəl bülbül kimi zümzümə deyən dodaqlar indi söz tutmur. Bəli, həyat vaxtsız qocalır! Budur faşizm ordularının, o qaragüruhların yaratdığı “Yeni Avropa qaydaları”.

Hitlerizm yalnız evlər uçurmaqla, kəndlər, şəhərlər yandırmaqla, xalqların maddi dövlətini, maddi nemətlərini talan etməklə kifayətlənmir. O, insan cəmiyyətinin ən böyük dövləti olan insanın daxili aləmini də qurd kimi içindən yeyir. Faşizm insandakı ən gözəl hissləri, arzu və əməlləri, dostluğu, sədaqəti, nəhayət, vicdan kimi böyük və müqəddəs bir hissi inkar edir. Hitler yazır ki: “Biz sakit vicdana qarşı amansız olmalıyıq. Xeyirxah duyğular zamanı çoxdan keçmişdir”.

Bu insan qəssabının fikrincə, insanda xeyirxah duyğular deyil, vəhşilik, cəlladlıq duyğuları olmalıdır.

Onun həyasızlığı, azğınlığı və qudurğanlığı həddini aşmışdır. O yenə yazır ki: “Mən insanları vicdan adlanan alçaq bir həyuladan azad eləyirəm”. Görürsünüz ki, Hitler bəşəriyyətin daxili dünyasında bir damcı da olsa gözəl hisslərdən əsər qoymaq istəmir. Çünki o, insaniyyət aləmindən çox uzaq, vəhşilər, yırtıcılar aləminin “müxtəxəssisidir”.

Budur, hitlerizmin təklif etdiyi “yeni əxlaq”, “yeni moral!”

Faşizm xalqlara zəncir və ölüm gətirir. O, istila etdiyi bütün ölkələrdə milli azadlıqdan, milli dövlət quruluşundan əsər qoymayır. Hitler deyir ki: “Germaniya ilə geoqrafik vəziyyətcə bitişik heç bir dövlət, xüsusən hərbi qüvvəsi olan bir dövlət belə qalmamalıdır”. Odur ki, faşizm qəsb etdiyi bütün Avropa ölkələrində dövlət quruluşunu dağıdaraq, bütün xalqları özünə bir qul edir, istədiyi əmri və fərmanı verir. Buna canlı sübut faşizm tərəfindən istila olunmuş Fransa, Polşa, Rumıniya, Çexoslovakiya və başqa Avropa xalqlarının indiki vəziyyətidir.

Bu hərislənmiş vəhşi, nəhayət, böyük Sovetlər İttifaqının üzərinə də öz qara qüvvələrilə hücum etdi. Ukraynanın taxıl zəmiləri, Azərbaycanın neft mədənləri çoxdandır ki, Hitlerin iştahını qıcıqlayır. Lakin bu kor və kütbaş bir şeyi düşünə bilməmişdir ki, Sovet dövləti və onun qüdrəti sarsılmazdır. Sovet dövləti öz xalqının yüksək və mədəni səviyyəsi etibarilə, şüurlu və idrakı etibarilə, həm də özünün qəhrəman ordusu etibarilə dünyanın ən qüvvətli, ən qüdrətli və qabaqcıl bir dövlətidir. Budur, altı həftədən artıq davam edən müharibə göstərir ki, böyük sovet xalqının qüdrəti qarşısında Germaniya faşizminin əsas müharibə metodu – avantürası olan “sürətli müharibə” metodu artıq tarmar edilmişdir. Artıq faşist generalları, ofiserləri və ordusu dillərilə etiraf edirlər ki, onlar indiyə qədər Sovet Ordusu kimi qüvvətli və yüksək iradəli bir orduya rast gəlməmişlər!

Faşizm elmin, mədəniyyətin, incəsənətin ən qəddar düşmənidir. Faşizmə görə, elm yalnız müharibə məqsədlərinə, talançılıq məqsədlərinə xidmət etməlidir.

Hitler özünün “Mənim mübarizəm” adlı kitabında və “faşist nəzəriyyəçiləri” özlərinin əsərlərində sübut etmək istəyirlər ki, Germaniyanın başına gələn fəlakətlərin əsas səbəbi maarif və mədəniyyətdir. Bir də “adi insanların” həddindən çox bilik və məlumat dalınca getmələridir. Həyasızlıq və qansızlıq o dərəcəyə çatmışdır ki, faşizm “maarif” ministri, daha doğrusu, cəhalət kabusu belə bir iddia eləyir: “Kor-korana qulaq asıb tabe olmaq adi insanların ən böyük ləyaqətidir. Çünki o, nə qədər ağıllı olsa, o qədər az itaət elər, az sözə qulaq asan olar”.

Germaniya faşizmi istila etdiyi Avropa ölkələrinin mədəniyyətini talan edir. Milli mədəniyyət, ana dili, milli tarix və milli həyatdan əsər qoymayır. Buna ən gözəl sübut bugünkü Polşanın vəziyyətidir. Varşavanın bütün teatrları, muzeyləri, mədəni müəssisələri ləğv olunmuşdur. Qədim əlyazıları, tarixi abidələr yandırılmışdır. Varşavanın ən gözəl

muzey binaları Germaniya ordusunun at tövləsi olmuşdur. Ana dilində mətbuat yaratmaq, elm oxumaq, hətta danışmaq belə qadağan edilmişdir. Alçaq Hitler belə bir vəziyyəti azad və xoşbəxt sovet xalqları üçün də yaratmaq istəyir. O, bizim əlimizdən nəinki maddi dövlətimizi, hətta ana dilimizi, əsrlərdən bəri yaratmış olduğumuz milli mədəniyyətimizi də almaq istəyir. O, german olmayan bütün başqa xalqları bir qul, bir kölə etmək istəyir. Hitler yazır ki, mən heç vaxt, başqa xalqların german xalqı ilə bərabər hüquqda olmağını qəbul etmərəm. Bizim "missiya"mız başqa xalqları özümüzə tabe etməkdən ibarətdir. German xalqı bütün dünyada yeni ağalar sinfi yaratmalıdır.

Hitlerin bu alçaq irq nəzəriyyəsinin heç bir elmi həqiqətlə əlaqəsi yoxdur. Bir irqin başqa irqlər üzərində olan hakimiyyəti daima insan tarixi tərəfindən rədd olunmuşdur...

Belə bir çürük nəzəriyyə praktiki olaraq həyata keçə bilməz. Çünki bir vaxt romalılar da germanların babalarına "aşağı irq" kimi baxırdılar ki, onlar daima "yüksək irq" olan böyük Romanın itaətində olmalıdırlar.

Hitler utanmadan deyir ki: "Həqiqi hakimiyyət həqiqi itaət olan yerdə yarana bilər. İnsanlar arasında bərabərsizliyi heç də ləğv etmə lazım deyil, əksinə, onu genişləndirmək və tarixdən əvvəlki böyük mədəni ölkələrdə olduğu kimi, uçurulmaz hasarlarla əhatə olunmuş bir qanun halına salmaq lazımdır. Hamı üçün bərabər hüquq ola bilməz". Faşizm bütün xalqları özünə məhkum etmək istədiyi kimi, Azərbaycan xalqını da, onun azad və xoşbəxt həyatını da məhv etmək istəyir. Çünki faşizmə Azərbaycan nefti lazımdır. O, bizim neftlə özümüzü və bütün qardaş sovet xalqlarımızı yandırmaq istəyir. Azərbaycan xalqı Germaniyanın oğru və yalançı alimlərindən olan Bodenştedti unutmamışdır. Bu haman Bodenştedtdir ki, Azərbaycanın məşhur şairi Mirzə Şəfinin şeirlərini, onun həkimanə sözlərini öz adına çıxaraq dəfələrlə Germaniyada çap etdirmişdir. Bugünkü faşistlər də oğruluğu, quldurluğu öz babaları olan bodenştedtlərdən öyrənmişlər. Onlar bizim xalqın mənəvi dövlətini, onun iki min illik mədəniyyət tarixini oğurlamaq, yandırıb külə döndərmək istəyirlər. Lakin azadlıqsevən Azərbaycan xalqı faşist quldurlarının hər bir fırıldağını yaxşı bilir. Azərbaycan xalqının taleyi yüz illərdən bəri böyük rus xalqının taleyi ilə bağlanmışdır. Heç bir provokasiya, heç bir qara siyasət bu qardaşlığı bizim əlimizdən ala bilməyəcək. Bütün sovet xalqlarının qardaşlıq ailəsi alınmaz bir qaladır.

Azərbaycan torpağında dünyanın dahi şairi Nizami Gəncəvinin məzarı vardır. Azərbaycan torpağında öz lirası ilə insan gözəlliyini misilsiz bir şəkildə tərənnüm etmiş Vaqifin məzarı vardır. Bu torpaqda böyük materialist filosof və dahi dramaturq olan Mirzə Fətəli Axundovun xatirəsi vardır. Bu torpaqda Xəzər dənizinin sahilində 800 ildən bəri "Qız qalası" adlanan böyük bir abidə var ki, bizim qocaman tariximizdən xəbər verir. Azərbaycan xalqı və ziyalıları öz ana torpağının bu gözəl və şairanə abidələrini göz bəbəyi kimi qoruyacaq, onları faşist toplarının güllələrinə, yanğınlarına qurban verməyəcək!

Mədəniyyətin düşməni faşizmə ölüm! Bu qərar 200 milyonluq sovet xalqının qərarıdır! Xalqlara zəncir və məhbəs gətirən faşizmə ölüm! Bu qərar bütün qabaqcıl bəşəriyyətin qərarıdır!

Məhv olsun ölüm və qaranlıq kabusu olan faşizm!

*1941*

## "FƏRHAD VƏ ŞİRİN" BARƏDƏ...

Yoldaşlar, mən "Fərhad və Şirin" əsəri barəsində və mübahisəli məsələlər ətrafında çox danışmaq istərdim. Ancaq bu gün mən səfər üstündəyəm. Bunun üçün bir az ixtisara salıram.

Siz bilirsiniz ki, bir avtorun öz barəsində danışması çox çətin məsəldir. Ələlxüsus elə bir vaxtda ki, onun əsərləri bir-biri ilə müqayisə oluna. Bir ataya desəniz ki, hansı balanı çox istəyirsən, o belə cavab verər ki, bala-baladır. Ancaq balanın biri çirkin olar, biri gözəl olar.

Mən əsas fikrimi deməzdən əvvəl bir şeyi qeyd etməliyəm ki, mən özümü hələ dramaturq hesab etmirəm. Bəlkə şairlik aləmində bir çoxları ilə yarışa girişə bilərəm. Ancaq dramaturgiya aləmində özümü hələ dramaturq hesab etmirəm. Eyni zamanda bir çox dramaturqlara cavab verməyi bacararam.

Hər şeydən əvvəl, yoldaşlar zəhmət çəkib disput düzəltmişlər. Əsərin, xüsusilə nöqsan cəhətləri göstərilir və bu nöqsan cəhətləri nəzərə almaq, heç bir yekəbaşlıq etməmək hər bir yazıçının vəzifəsidir. Bəzən, yazıçı özünə müştəbeh olur, gözləri kor olur, inkişafdan məhrum olur. Ancaq ağıllı yazıçının qulağı həmişə səsdədir. Yazdığından həmişə narazıdır. Mən özümü ağıllı göstərmək istəmirəm. Ancaq mən özüm yaradıcılığımı sevən adamam, bilirəm ki, bir şey var. Çalışıram və ona əmin olun ki, həmişə çalışıram yazım və yazacağam. (*Alqışlar*)

Əsas fikrimi deməzdən əvvəl, mən xüsusən bizim teatr kollektivinə, başda yoldaş Adil İskəndərova öz təşəkkürümü yetirirəm. (*Alqışlar*) Çünki dram əsərini yazmaq nisbətən asandır, nəinki onu səhnədə yaratmaq, canlandırmaq. O barədə yoldaşların çox haqqı vardır. Xüsusən "Fərhad və Şirin" əsəri üzərində. Deməliyəm ki, müharibə ilə əlaqədar hamının başı qarışmış və mən əsər üzərində çox işləyə bilmədim. Mənim əvəzimdə Adil, aktyor kollektivi böyük fədakarlıqla işləmişdir. Mən disputu təşkil edən AzFAN-a da təşəkkür edirəm. Bu gün disputa qulaq asdım. Heydər və başqa yoldaşların çıxışından bir çox nəticələr əldə etmişəm və gələcək əsərlərimdə də bunlardan istifadə edəcəyəm. Ancaq göstərilən nöqsanlardan bir çoxuna razıyam, bir çoxuna, daha doğru, ən çoxuna razı deyiləm. Mən burada öz fikrimi deyəcəyəm. Çünki mən fikrimi münaqişə etməmiş, təslim olun oğlanlardan deyiləm. (*Alqışlar*)

Ən əvvəl, yoldaş Heydərin dediyi Azərin (Azər babanın – *red.*) – son monoloqu. Heydər göstərir ki, hamı öldü, kimlə mübarizə edəcək. Azər (Azər baba – *red.*) deyir ki, söz mənimdir, mübarizəyə gedir. Kimlə mübarizə edəcək, məlum deyil. Xosrov, Şirin, hamısı ölür. Xəyanət durduqca hələ dünyada bütün yer üzünü bürüyəcək. Xəyanət qurd kimi çoxdur. Azər baba ağıllı adamdır. O yaxşı bilir ki, bu faciənin səbəbi nə Xosrov və nə də başqasıdır. Odur ki, o göstərir, xəyanət adlı cəmiyyətdə qara qüvvə vardır. Xosrov və Şirin ölmüşsə, xəyanət ölməmiş. Biz də təsdiq edərik. Şairin yaratdığı xəyanət olmamışmı? Bununla mübarizə etməli və bu Xosrov ilə mübarizə məsələsi yox, xəyanət deyilən qara qüvvə ilə mübarizə məsələsini qoyur. Odur ki, mən bu barədə yoldaş Heydərin fikri ilə şərik deyiləm.

Fərhad ilə Şirinin ölümü. Bu barədə çox mübahisə getmiş. Bizim də ağlımıza gəlmiş ki, Fərhad ölməsin, qalsın. Sözün doğrusu, qorxdum ki, axırda ya "Məşədi İbad", ya "Arşın mal alan" çıxar. Ölməli, yoxsa yox? Bu barədə heç kəs qanun qoymamışdır. Mən də deyə bilərəm ki, Otello ölməyə bilər. Yaylıq məsələsini bir dəqiqə qabaq Otelloya desəydilər, o ölməyə bilərdi. Bəs nə üçün o öldü?.

Sonra yazıçı bir çox əsər yazdıqda bir çox şeyləri nəzərdə tutur. Mən istəmişəm ki, o da Vaqif kimi qalib gəlsin və Fərhadın ölümünü düzgün hesab edirəm. O, ictimai konflikt əsasında ölür. Bu ölüm ictimai konflikt əsasında qurulmuş ölümdür və onun yüksək forması şüurun böyük xəyanətidir. Bu da ancaq ictimai konfliktdir.

Şapur İran şahlığı üçün bir şimadır. İctimai konflikt mütləq daxilən olmalıdır. Buna mən şərik deyiləm. Doğrudur, burada Fərhad qalıb gələ bilər. Xarici qüvvələr, Şapurun müvəffəqiyyəti onu ölümə doğru aparır. Bu barədə çox danışmaq olar və onların ölümünü düzgün hesab edirəm.

Sonra Heydər göstərir ki, Fitnə çox ağıllı sözlər danışır. Bilməlisiniz ki, Fitnə xalq içərisindən çıxmış ağıllı qadındır. Nizaminin yaratdığı obraz bundan daha ağıllıdır. Əqli, zəkası etibarilə şahların sözünü kəsən adi qul, kölə qadındır. Məncə, adi insanlar içərisində dərin ağıllara rast gəlmək olur. Odur ki, Fitnənin haqqında danışılan sözləri yersiz görürəm.

Şapur obrazı məsələsi. O, Xosrovun şəklini çox böyük məharətlə çəkmiş, hətta Şirin bu şəkli gördükdə ona vurulur, çünki o, sənəti sevən insandır. Lakin göstərirsiniz ki, əsər boyu belə bir moment tapmadım ki, onun rəssamlığı az da olsa göstərilsin. Çünki mən Şapuru bir xəyanətçi kimi göstərirəm. Əgər mən qarşıma məqsəd qoysaydım ki, Şapuru böyük bir insan kimi verim, onda onun rəssamlığını daha yüksək verərdim. Lakin onun fəlakəti odur ki, talantlı olmaqla bərabər, istəyir ki, baş vəzir olsun. O da get-gedə onun talantını öldürür. Əlbəttə, burada mən Nizami yolu ilə getməmişəm. Nizamidə Şapur obrazı bambaşqadır.

Bununla əlaqədar olaraq bir şeyi tənqidçilərdən xahiş etməliyəm ki, mənim bu əsərimin qəti surətdə motivlərindən başqa, Nizaminin "Xosrov və Şirin"i ilə əlaqəsi yoxdur. Düzdür, əsərə bəzi obrazları salmışam, bu da Nizamiyə hörmət etmək üçün. Şapur əvəzində başqa ad qoya bilərdim. Nizamidə tamamilə başqa süjet qurulmuş, orada Xosrov ilə Şirin arasında böyük bir məhəbbət gedir. Nizaminin ideyası budur. Bundan ibarətdir. Lakin mən belə yanaşmamışam. Müasir azadlıq, müasir tələbat nöqteyi-nəzəri ilə, bir şahın məhəbbət vasitəsilə islah olmasını, ədalətli olmasını bugunkü ədəbiyyatda qoya bilərdim, qoymadım. Çünki bugünkü görünüş nöqteyi-nəzərilə bunu mən aktual tema hesab etmirəm. Belə qoymuş olsaydım, Nizaminin əsərini "Vaqif"dən sonra səhnədə verməklə kifayətlənmiş olardım. Mən istərdim ki, Nİzami ideyasını təkrar etməyim. Fəqət o ideyadan çıxmaq mənim üçün çətindir. Çünki onu oxuduqdan sonra mütləq onun əsiri oluram. İki il mən Nizaminin təsirindən çıxa bilmədim. İki ildən sonra süjeti istədiyim kimi qura bildim.

Sonra yoldaş Heydər və Mehdi göstərdilər ki, əsərdə bir çox dramaturji nöqsanlar vardır. Mən etiraf edirəm: bir çox dramaturji nöqsanlar vardır. Çünki məndə bəzən olur ki, rabitələrin bağlanması qırılır. O da ümumi süjet inkişafını zəiflətmiş olur. Bu ondan əmələ gəlir ki, mən

əsərlərimi şeir ilə yazıram. Şerin də bir xüsusiyyəti vardır ki, daima uçur. Çox vaxt görürsən ki, xəyali fikirlər, şeir məni aparıb gedir, sonra görürəm ki, dramaturji müqavimət qırılır. Bunu düzəltmək üçün gərək şeri qırım. Şeri qırmağa da əlim gəlmir...

Əgər dramaturji nöqsanlar əsərdə varsa və əsərin ümumi gedişatı onun həm dramaturji, həm konflikt, yaxud dil nöqsanlarını bizə unutdurursa, mən arzu edirəm bu nöqsanlar əfv olsun.

İstər Şirin, istər də Fərhad bir qəhrəman olaraq bilavasitə Azər babanın məsləhəti altında gedirlər, yaşayırlar. Nə üçün mən onun adını Azər baba qoymuşam. Çünki Azər xalqın bir simvoludur. Bir belə bağlamaq olar, bir də... başqa cür bağlamaq olar. Göstərirsiniz ki, Azər baba qızlar məclisinə haradan gəlir. Azər baba ziyarətdən qayıdır. Şərqi səsinə qulaq asır, sonra gəlib burada söhbət edir. Ola bilər ki, o səhnədə yol yaxşı göstərilməmişdir, bu təbii haldır. O eşidir ki, burada məclis vardır, ziyarətdən gəlib söhbət edir. Əlbəttə, bu məsələləri əsərə birinci baxışda təfərrüatı ilə bilmək olmaz. Ancaq mən demək istəyirəm ki, dram əsərini şeir ilə yazmaq çox çətindir. Lakin bu heç də bizim əsərimizdə olan nöqsanlara bəraət qazandırmır. Mən razıyam. Fərhad obrazı daha büllur, daha canlı verilməlidir. Mən razıyam, əsərdə bir çox gülməli zarafatlar deyirəm. Yoldaşın göstərdiyi kimi, əsgər deyir: – "Qoy çarığımı bağlayım" və sairə. Lakin göstərməliyəm, bu əsərdə Fərhadın başqa obrazlara nisbətən istədiyimiz yüksəklikdə olmamasına bir səbəb vardır. Yoldaş Mehdi də göstərdi. Əsərdə bir çox xətlər vardır. Onların hamısını yaratmaq dram əsərində çətindir. Deyirlər ki, Məryəm kimi qəhrəman qadın nə üçün öldü? Əsərin bir yerində Məryəm göstərir: "Oğlum alar intiqamımı".

Kimə inanmaq, kimə arxalanmaq?..

Məncə Məryəmi heç bir tüfəng öldürə bilməz. Çünki Məryəm igid qadındır. Burada Məryəmi ancaq ana məhəbbəti öldürür. Mən buna belə baxıram. Odur ki, mən bu məsələ ilə razı deyiləm. Ancaq deyirəm ki, "Vaqif", "Xanlar"da da bir çox dramaturji nöqsanlar vardır, yoldaşlar düzgün tələb edirlər. Ancaq mənim qanunum ilə yanaşsanız, mən buna belə yanaşıram, görürsən ki, evdə iki cür plov bişirilir. Birinci plovun hər şeyi yerindədir, ancaq nə isə dadı yoxdur. İkinci cür plov vardır. Bunun da qarası çatmır, ancaq nədənsə, bu plov çox dadlıdır. Bu ondandır ki, birinci xörəyi bişirən xörəyi vaxtından ötürüb. Əsər də iki cürədir. Bir dram əsəri vardır ki, hər şeyi vardır, adamları

vardır. Ancaq ürəyə yatmır. Çünki bunun içərisində nə varsa, dad deyilən şey gözlənilməmiş, ancaq bəzi əsərlər də vardır ki, ikinci plov kimi nöqsanları varsa da dadlıdır. "Fərhad və Şirin" əsərinin nöqsanları olmaqla bərabər, əgər dadlı plov kimidirsə, onda məni bağışlayın.

O nöqsanları da nəzərdə tutacağam.

Qaldı ki, gələcək yaradıcılıq metodu, mən demişəm ki, qabaqca düzəldilmiş qanunlar mənim üçün yoxdur. Mənim məqsədim odur ki, əsərdə xalqımızı, xalqımızın böyük amalını, mübarizə tarixini ifadə edən səhnə olsun. Bu məqsəd üçün mənim əlimdə drama böyük vasitədir. Hələlik bu xəstəliyə tutulmuşam, yazıram və yazacağam.

Mən burada öz əsərlərim barəsində çox danışmağı bacarmıram. Başqa mübahisə olsaydı, danışardım. Ancaq demək istəyirəm ki, iki cür at vardır. Biri işgüzar at, bu, dümdüz yol ilə gedər, bir də belə at vardır ki, onu sulayandan sonra arpa yeməyə gəlir. Heç kəs onu düz sürə bilməz. Gah sağa, gah sola gedir. Şair təbiəti də belədir. Heç bir bədii əsəri qabaqcadan, yoluna salmaq düzgün deyildir. Aydır at kimi sağa, sola gedəcək. Yenə də onda hünər hiss olunacaq və mən şairin o təbiətinə daim sabiq qalacağam. Şairin o təbiətinə minnətdaram, şairin o təbiəti olmasaydı, belə drama olmazdı.

Odur ki, mənə icazə verin şairin öz təbiətinə həmişə sadiq qalım. Son sözümdə deyirəm, mənim boynuma vəzifə qoydunuz, bizim müasir vaqiflərimiz, fərhadlarımız vardır. Böyük Vətən müharibəsi cəbhəsində böyük qəhrəman Azərbaycan xalqının başını ucaldanlar vardır. Mən sizə dedim ki, səfər üstündəyəm. Bu gün Kirovabada gedirəm. İsrafil Məmmədov adlı xalq müəllimi birinci dəfə olaraq, Böyük Vətən müharibəsi cəbhəsində Sovetlər İttifaqı Qəhrəmanı adını almışdır. (*Alqışlar*)

Əlbəttə, hamımız gözləyirik. Azərbaycan xalqının oğulları bu Böyük Vətən müharibəsində Sovetlər İttifaqı Qəhrəmanı adını mütləq almalıdır. Çünki bu oğullar Babəklər, Koroğlular, Vaqiflər balalarıdır.

Oxucularımız, tamaşaçılarımız əmin ola bilər ki, Məmmədovun, Kamalın göstərdiyi bu qəhrəmanlıqları mən təkidlə təqib edirəm. Onları yaxından öyrənirəm. Bununla yaşayıram. Bu gün gedirəm onun ailəsi ilə tanış olam və ümidvaram ki, uzun zaman çəkməz ki, mənim indiki qəhrəmanlara həsr olunmuş dördüncü dram əsərimə səhnədə tamaşa edərsiniz. (*Alqışlar*)

*1941*

## [SOVET İTTİFAQI QƏHRƏMANI İSRAFİL MƏMMƏDOVLA GÖRÜŞDƏ ÇIXIŞI]

Yoldaşlar! Bizim İsrafil Məhərrəm oğlunun göstərdiyi böyük hünər, doğrudan da bütün Azərbaycan xalqı üçün unudulmaz bir bayramdır. Həyat və səadət üçün qəhrəmanlıqla vuruşmaq, xalqın və Vətənin keşiyində durmaq – hər insan üçün şərəf və namus deməkdir.

Xalqımız öz yetirməsi olan İsrafilin adı ilə fəxr edir. Heç şübhəsiz ki, onun adı aşıqlarımızın şirin dastanlarında, şairlərimizin, söz ustalarımızın əsərlərində illər boyu tərənnüm ediləcəkdir. Vətən müharibəsi qəhrəmanlarımıza üz tutub deyirik:

Sizinlə fəxr edir, sevinir hamı,  
Bu məclis, bu büsat, bu el bayramı.  
Qoy matəm oxunsun qəsbkarlara,  
Qoy azad yaşasın bəxtiyar ellər,  
Bizim bu ceyranlı, turaclı göllər.  
Qoy bir də yuxusuz qalmasın Vətən,  
Düşmən atlarının ayaq səsindən.

Mən bu gün üzümü İsrafilin anası Gülşən xalaya və bütün Azərbaycan qadınlarına tutub deyirəm:

Ömrünüz daima laləzar olsun,  
Hər keçən gününüz bir bahar olsun.  
Bizdən bu dünyaya hünər qalacaq  
İgidlər anası bəxtiyar olsun.

Böyük Nizaminin vətənində yetişmiş İsrafil Qoşqar və Kəpəz dağlarının əzəməti ilə böyümüş, Xaçbulaq yaylaqlarının durna gözlü bulaqlarından su içmişdir. O, azadlıq və səadətin böyük nemətini öz babası olan Nizami Gəncəvinin şeir incilərindən almışdır. O, qəhrəmanlıq və cəsarəti yenə öz babası olan Koroğlunun Misri qılıncından öyrənmişdir.

Faşizm insanlığa ölüm gətirir. O, bütün xalqların mədəniyyətini məhv etdiyi kimi, Azərbaycan xalqının da minillik mədəni tarixini məhv etmək istəyir. Lakin biz, Nizami kimi dahi bir şairin sərdabəsini öz köksündə yaşadan ana Vətənimizi faşizm cəlladlarının yanğınlarına verməyəcəyik.

Bütün sovet xalqları, başda rus xalqı olmaq üzrə, faşizmə ölüm zərbələri vurur. Mübarizəmiz çətin və məsuldur...

Bu böyük müharibədə dünyanın demokratik dövlətləri və qabaqcıl insanları bizim tərəfimizdədir. Düşmənin ölüm günləri yaxınlaşır. Qalibiyyət bizimlədir, çünki həqiqət bizimlədir.

Yeni tarix əyə bilməz cəlladlara öz başını,
Qoca dünya tez qucaqlar öz ədalət qardaşını.
Bütün xalqlar, qəbilələr od içindən çıxacaqdır
Qaliblərin mərd əlini dönə-dönə sıxacaqdır.

*1941*

## "KOROĞLU NƏSİLLƏRİNƏ BİZİM SALAMIMIZ"

Azadlıq müharibəsinin ağır günlərində sizə, xalqımızın cəsur oğullarına, hərarətli salamımı və xoş arzularımı yetirirəm. Sizin vətən müharibəsi cəbhələrindəki hünərimizə xalqımız fəxr edir. Öz həyatını ana yurdun şərəfi və azadlığı uğrunda qurban vermiş babalarımızın qəhrəmanlığının canlı şahidi olan dünya görmüş ağsaqqallarımızın nəzərləri sizə dikilmişdir. Sizin hər birinizin anası cəbhədə göstərdiyiniz şücaət barədə xəbərləri səbirsizliklə gözləyirik ki, öz halal südü ilə yetirdiyi qəhrəman oğullarına xeyir-dua versin.

El nəğməkarları – aşıqlarımız özünü xalqın qeyrətli oğlu kimi göstərmiş hər biriniz haqqında gözəl nəğmələr qoşur, Azərbaycan şairləri öz şeir və poemalarında sizi tərənnüm edirlər. Xalqımız sizin simanızda özünün milli vüqarını, çoxəsrlik ənənələrimizə hörmət və məhəbbətin ifadəsini görmək istəyir.

Siz dünyanın ən şanlı sərkərdələrindən birinin – Babəkin nəslindən olduğunuzu heç vaxt unutmursunuz. O həmin Babəkdir ki, ərəb işğalçılarına qarşı 25 il mübarizə aparmış və dəfələrlə düşmən qoşunlarını Arazın və Kürün sularına qərq etmişdir. Mən istərdim ki, bu gün Babəkin obrazı, mətin iradəsi və yenilməz döyüşçü xarakteri yenidən sizin qarşınızda canlansın. Düşmənlər Babəki parça-parça doğrayarkən o, son nəfəsində acı gülüşlə demişdir: "Mən çox təəssüflənirəm ki,

bu düşmən itlərini az qırmışam”. Babək bu sözləri on minlərlə düşmən əsgərini məhv etdikdən sonra demişdir. Bu sözlərdə xalqımızın düşmənlərinə Babəkin sonsuz nifrəti ifadə edilmişdi. Babəkin dediklərini biz bu gün – ölüm-dirim müharibəsi günlərində də xatırlayırıq. Siz də faşist köpəklərini daha çox qırmaqdan çəkinməyin.

Siz heç vaxt unutmayın ki, şanlı qəhrəmanımız Koroğlu öz əfsanəvi Misri qılıncını məhz sizə vəsiyyət etmişdir. O, əlçatmaz dağlarımızın zirvələrində xalqımızın qədim şöhrətinin şahidi olan onlarca qüllə və qala ucalmışdır. Onun xalqımızın canına və qanına hopmuş vəsiyyətlərindən birini sizə xatırlatmaq istəyirəm. Koroğlu qeyri-adi gücə və qüvvəyə malik olduğuna baxmayaraq döyüş dostluğunu yüksək qiymətləndirir və öz döyüşçülərini hədsiz sevərdi. Dəlilərdən biri itkin düşəndə pəhləvan və aşıq Koroğlu gecələri yatmaz, yeməz və içməz, döyüşçü dostu üçün göz yaşı axıdardı. Düşmən əlinə keçmiş döyüşçünü xilas etməyincə sakitləşməzdi:

Qəm eyləmə, alagöz yar,
Səhər gətirrəm Eyvazı.
Ürəyinə salma qubar
Sana yetirrəm Eyvazı.

Eyvazsız alışar sinə,
Könül istəməz ki, dinə.
Çəkərəm Qırat tərkinə,
Sana yetirrəm Eyvazı.

İnan Koroğlu sözünə,
Həsrətəm Eyvaz üzünə,
Qurban o ala gözünə,
Səhər gətirrəm Eyvazı.

Koroğlu döyüşdə itirdiyi qəhrəman dostu üçün bur cür kədərlənərdi. O, igidləri və qəhrəmanları sevər, qəhrəmanın gücünü və qüvvəsini sarsılmaz dostluqda görərdi. Koroğludan belə məsəl qalmışdır: “Aslan da yalnız olmasın”. Buna görə də o, igidlərin dostluğunu hər şeydən qiymətli hesab edərdi.

Lakin cəbhə dostluğu bizim günlərimizdə Koroğlu dövründə olduğundan daha böyük əhəmiyyətə malikdir. İndi döyüş dostluğu ayrı-

ayrı döyüşçülərin və ya dəstələrin dostluğu deyildir. Bu dostluq müqəddəs sosialist Vətənimizdə yaşayan xalqların və millətlərin dostluğudur. Məhz buna görə də biz dostluğun qədrini keçmiş vaxtlarda olduğundan yüz dəfə artıq bilməliyik.

Yalnız bir döyüşdə 73 faşist quldurunu məhv edən Azərbaycan xalqının mərd oğlu, Sovet İttifaqı Qəhrəmanı İsrafil Məmmədov məhz xalqların bu böyük ailəsində özünə əbədi şöhrət qazanmışdır. Biz bir döyüşdə 7 faşist təyyarəsini vurub salan, 17 yerindən yaralansa da, öz təyyarəsini xilas edən 22 yaşlı Hüseynbala Əliyevin qeyri-adi iradəsi ilə də fəxr edirik. O, qəhrəmancasına həlak oldu. Onun xatirəsi heç vaxt unudulmayacaq, bu şanlı qəhrəman haqqında ən yaxşı əsərlər yaranacaqdır.

Əziz dostlar! Siz böyük rus torpağında, qardaş Ukrayna və Belorusiya çöllərində vuruşmaqla, eyni zamanda, günəşli Azərbaycan Respublikasını da qoruyursunuz. Siz öz analarınız, arvad-uşaqlarınız həyatını və namusunu faşist quldurlarından və vəhşilərindən qoruyursunuz. Siz bizim qədim milli mədəniyyət abidələrimizi qoruyursunuz. Siz dünya ədəbiyyatı tarixində bədii fikrin dahi ustadlarından birinin – Nizaminin məqbərəsini qoruyursunuz. Siz insan gözəlliyinin misilsiz nəğməkarı Vaqifin nəğmələrini qoruyursunuz.

Siz öz yaradıcılığı ilə dünya xalqlarının ədəbiyyatına güclü təsir göstərmiş dahi yazıçı Lev Tolstoyun abidəsi üzərində faşistlərin törətdiyi rüsvayçılığı heç vaxt unutmayacaqsınız...

Əziz yoldaşlar! İndiki müharibə nə qədər ağır və uzun sürən olsa da, bizim hər birimizdən böyük qəhrəmanlıq və ardıcıl olmağı tələb edir. Nə etməli? Düşmən amansız, rəhmsiz və hiyləgərdir. O, Avropanın qul etdiyi xalqlarından ələ keçirdiyi hərbi texnika ilə öyünə bilər, lakin bizim qarşımızda öz qəhrəmanlığı ilə lovğalana bilməz. Biz yalnız qabaqcıl hərbi texnikamızı və silahımızı deyil, yenilməz iradəmizi, Sovet İttifaqı xalqlarının sarsılmaz iradəsini də düşmənə qarşı qoymuşuq. Çünki tarixdə baş vermiş bütün müharibələr həm də xarakterlər və ehtiraslar müharibəsi olmuşdur.

Oğru və quldurun sifəti tez dəyişən və dönük olur. Faşistlərin hərəkəti bunu bir daha sübut edir. Onlar əllərini qaldıraraq əsir düşür, yalvarır, aman diləyirlər. Yox! Bu cür vəhşiliklər edən, yurdumuza bu qədər fəlakət gətirən, həyatımıza qəsd etmək istəyənlərin yaşamağa haqqı yoxdur.

Sizə əsl qəhrəmanın bir xüsusiyyətini xatırlatmaq istəyirəm. Bu barədə müdrik xalq məsəlində belə deyilir: "Ehtiyat igidin yaraşığıdır". Qəhrəman babalarımızın bu müdrik kəlamını heç vaxt unutmayın. Qələbənin ən az qurbanlarla başa gəlməsinə çalışın, döyüşdə bir-birinizi qoruyun, çünki sizin hər birinizin həyatı sonrakı mübarizələr üçün, minlərlə faşist quldurunun məhv edilməsi üçün lazımdır. Döyüşdə cəld və ehtiyatlı olun, vuruşlara isti ürək və ağılla gəlin.

Vətənimin övladları! Bizim üzərimizə, Sovet İttifaqı xalqlarının üzərinə təkcə özümüzü deyil, Avropanın qul edilmiş xalqlarını da faşist taunundan xilas etmək kimi böyük bir tarixi vəzifə düşmüşdür. Bu şərəfli işdə qarşımızda böyük çətinliklər durur. Düşmən geri çəkilərkən minlərlə adamı evsiz-eşiksiz qoyaraq şəhər və kəndlərimizi yandırır. Lakin yandırılan hər bir evin alovu düşmənə qarşı intiqam hissimizi daha da alışdırır...

Bəşəriyyətin faşist vəhşilərindən və yırtıcılarından xilas ediləcəyi gün uzaqda deyildir. Bu işdə biz öz tarixi vəzifəmizi yerinə yetirəcəyik. O zaman tam hüquqla bütün dünyaya deyəcəyik:

Yıxıldıq, ağrıdıq, qalxaraq yenə
Mehriban günəşin qoynuna girdik...
Doğdu qurtuluşun gözəl səhəri
Azaddır vicdanlar o gündən bəri!

*1942*

## AZƏRBAYCAN ƏDƏBİYYATI VƏ VƏTƏN MÜHARİBƏSİ

Böyük Vətən müharibəsi dövründə Azərbaycan yazıçı və şairləri Sovet İttifaqı xalqlarının yırtıcı hitlerçi işğalçılara qarşı müqəddəs mübarizəsi mövzusunda ona qədər pyes və bir çox şeirlər, hekayələr, povestlər, novellalar yaratmışlar.

Şairlərimiz xeyli mahnı qoşmuşlar, Azərbaycanın ən yaxşı bəstəkarları isə (Ü.Hacıbəyov, Səid Rüstəmov, Əfrasiyab və başqaları) bu mahnılara musiqi bəstələmişlər.

Bu mahnıları geniş xalq kütlələri sevə-sevə oxuyurlar.

Şair Məmməd Rahim bir sıra gözəl vətənpərvərlik şeirləri və mahnıları yaradaraq, özünü çox fəal göstərmişdir. Müharibə illərində

şairlərdən Süleyman Rüstəm, Rəsul Rza, Osman Sarıvəlli, Əhməd Cəmil, şairə qadınlardan Mirvarid Dilbazi, Nigar Rəfibəyli və başqaları da yaradıcılıqla ciddi məşğul olmuşlar. Bunların hər biri dövrümüzün qəhrəmanlıq səhifələri, xalqın Vətənimizə böyük məhəbbəti və onun düşmənlərinə hədsiz nifrəti tərənnüm olunan onlarca şeir yaratmışdır.

Müharibə dövründəki Azərbaycan poeziyasının xarakter cəhəti bundan ibarətdir ki, şairlərimizin, demək olar ki, hamısı öz yaradıcılığında bilavasitə cəbhənin və orduya xidmət edən arxanın həyatından götürülmüş konkret mövzulardan bəhs etmişlər. Şairlərimizin əsərlərində Vətən müharibəsinin İsrafil Məmmədov, şanlı snayper İsmayılov, təyyarəçi Abbasov və bir çox başqa müharibə və əmək cəbhəsinin qəhrəmanları tərənnüm edilmişlər. Bu qəhrəmanlıq mövzuları bizim poeziyamızı xüsusi olaraq fəallaşdırmış, siyasi cəhətdən istiqamətləndirmişdir.

Nəsrimizdə də ideya-yaradıcılıq dönüşü əmələ gəlmişdir. Nasirlər içərisində hamıdan əvvəl böyük həcmli romanların müəllifi olan Ordubadi yoldaşı göstərmək lazımdır. Müharibə dövründə o, bir sıra müvəffəqiyyətli hekayələr, publisistik məqalələr və felyetonlar yazmışdır.

Məşhur "Bir gəncin manifesti" povestinin müəllifi yazıçı Mir Cəlal bir neçə gözəl hekayə və povest yazmışdır. O, bir sıra əsərlərində faşizmin yırtıcılığını satirik formada ifşa edir.

Satira janrı müharibə günlərində xüsusilə lazımdır. Xalqımız öz qəddar düşməninə qüdrətli zərbələr vura bilir. O, eyni zamanda, bu düşmənə gülmək də istəyir.

"Şamo" və "Saçlı" kimi geniş yayılmış romanların müəllifi olan Süleyman Rəhimov özünü son dərəcə istedadlı bir yazıçı kimi göstərmişdir. Onun Böyük Vətən müharibəsi mövzularına həsr olunmuş yeni hekayələri və povestləri xalq müdrikliyi ilə doludur. Süleyman Rəhimovun "Torpağın səsi" hekayəsini oxucularımız heç bir zaman unutmayacaqlar. Bu hekayədə o, faşist yırtıcılarının ağ saçlı bir qocanı öz arvadı ilə diri-diri basdırdıqlarını hədsiz qəzəb və nifrətlə təsvir edir. Ağ saçlı qocanın və onun arvadının "təqsiri" budur ki, onlar öz sosialist vətənlərini canlarından artıq sevirlər.

Müharibəyə qədər Azərbaycan ədəbiyyatının nisbətən zəif sahəsi publisistika idi. Lakin bizim tənqidçilər və publisistlər son aylar ərzində xeyli fəal işləməyə başlamışlar. Məmməd Arifin, Mehdi Hüseynin, ədəbiyyatşünas Əziz Şərifin və bir sıra başqalarının publisist məqalələrini xüsusilə qeyd etmək lazımdır. Gənc tənqidçilərdən M.C.Cəfərov

və Əkbər Ağayev son dərəcə məhsuldar işləmişlər. Onlar bir sıra əsərlərində müasir faşizmin "mənəvi atası" olan Fridrix Nitşenin fəlsəfəsindən başlayaraq, faşist yırtıcılarının indiki "ideoloqları" Hitlerə, Hebbelsə və Rozenberqədək bütün faşist məfkurəsini ifşa etmişlər.

Vətən müharibəsi günlərində bizim igid, şanlı ata-babalarımızın obrazlarını şöhrətləndirmək çox böyük əhəmiyyət kəsb edir. Bu el qəhrəmanlarının əfsanəvi vuruşmaları, yenilməz xarakteri və öz xalqına böyük məhəbbəti kütlələrin vətənpərvərlik tərbiyəsinə qüvvətli təsir göstərir.

Bu məqsədlə bizim yazıçılar Azərbaycan eposunun və bütün xalq ədəbiyyatının qəhrəmanlıq motivlərinə həsr olunmuş populyar kitabçalar buraxmaq sahəsində böyük iş görmüşlər.

Azərbaycan dramaturgiyasında çox əhəmiyyətli dönüş əmələ gəldiyini qeyd etmək lazımdır. Bu müddət ərzində böyük və kiçik formalı onadək pyes yazılmışdır. Bunlardan xüsusilə dramaturq Təhmasibin "Aslan yatağı" əsəri və şair Zeynal Xəlilin "İntiqam" pyesi diqqəti daha çox cəlb edir.

Birinci pyesdə Krım partizanlarının faşist işğalçılarına qarşı mübarizəsi, ikincidə isə Ukrayna partizanlarının qəhrəman mübarizəsi təsvir olunur.

M.Əzizbəyov adına Azərbaycan Dövlət Dram teatrı M.İbrahimovun "Madrid" adlı antifaşist pyesinin yeni variantını tamaşaya qoymuşdur. Bu canlı, koloritli əsərdə müəllif faşist yırtıcılarının qəhrəman ispan xalqına etdikləri zülmü göstərir.

Əl-ələ verərək bizim ümumi düşmənimizə qarşı fədakarlıqla vuruşan SSRİ xalqlarının qardaşlığı ideyası Azərbaycan ədəbiyyatında öz geniş inikasını tapmışdır. Şairlərimizin Moskva və Leninqradın müdafiəsinə, qardaş Ukrayna, belorus və başqa xalqların qəhrəmancasına mübarizəsinə həsr olunmuş şeirləri bunu parlaq surətdə nümayiş etdirir. Bizim nasirlər və dramaturqlar Vətən müharibəsinin bir sıra rus, ukraynalı, belorus, qəhrəmanlarının obrazlarını yaratmışlar.

Milli respublikaların şairləri və nasirləri istərdilər ki, onların xalq azadlıq mübarizəsinə həsr etdikləri şeirləri, əsərləri ukraynalılar, beloruslar, ruslar və başqaları tərəfindən də başa düşülsün. Lakin Azərbaycan ədəbiyyatının tərcüməsi sahəsində iş, demək olar ki, dayandırılmışdır. Halbuki bu, beynəlmiləl əhəmiyyəti olan böyük bir işdir. SSRİ Yazıçıları İttifaqı bu işə çox ciddi diqqət yetirməlidir. Qardaş xalqların yazıçılarının ən gözəl əsərləri bütün sovet xalqlarına çatdırılmalıdır.

Azərbaycan ədəbiyyatı və onun xadimləri heç bir zaman ölkənin ictimai-siyasi həyatı ilə müharibə dövründə olduğu kimi sıx bağlı olmamışlar. Otuz nəfərə yaxın Azərbaycan yazıçısı (bu isə yazıçılar aktivinin yarısından çoxunu təşkil edir) ordu sıralarındadır. Bəziləri bilavasitə döyüşlərdə iştirak edirlər, başqaları isə hərbi mətbuatda işləyirlər.

"Vətən uğrunda" ordu qəzetinin redaksiyasında fəal çalışan dörd azərbaycanlı yazıçının – Mirzə İbrahimovun, Süleyman Rüstəmin, Osman Sarıvəllinin və Məcnunbəyovun xidmətlərini xüsusilə qeyd etmək lazımdır...

*1942*

## BİZİM ANDIMIZ

Əziz qardaşlar və bacılar! Çiçək kimi açmış Sovet Cənubunun üzərini qara buludlar almışdır. Qardaş Ukraynanı, Belorusiyanı, Moldaviyanı, Baltik sahillərindəki sovet respublikalarını və Vətənimizin başqa bir sıra rayonlarını müvəqqəti olaraq tutub viranəyə döndərən qaniçən hitlerçilər indi Qafqaza soxulmağa can atırlar. Onlar öz qanlı əllərini vətənimizin incisi olan neft Bakısına, Azərbaycanın ucsuz-bucaqsız tarlalarına uzadırlar... Düşmən kinlidir və vəhşidir, ayaq basdığı hər yerdə qarşısına çıxan hər şeyi yandırır və məhv edir. Düşmən bizim şəhərlərimizin və kəndlərimizin küçələrini dar ağacları ilə doldurmaq istəyir. Düşmən bizim torpaqlarımızı arvadlarımızın, uşaqlarımızın, analarımızın qanına boyamaq istəyir. Düşmən çalışır ki, gürcü və Azərbaycan xalqlarının ən yaxşı oğullarını vəhşicəsinə qırıb məhv etsin.

Düşmənin bu dəhşətli məqsədlərini yalnız bizim polad möhkəmliyimiz və mərdliyimiz məhv edə bilər. Nemes faşizmi keçdiyi qanlı yollarda əsarət altına aldığı xalqların milli dövlətlərindən əsər belə qoymur. Nemes faşizmi bütün elmi və mədəni sərvətləri dağıdıb puça çıxarır, xalqların ana dilində danışmasını və adətlərini qadağan edir, işğal etdiyi ölkələrin xalqlarının bütün qəhrəmanlıq ənənələrini məhv edir.

Hitlerçilər bəşəriyyətin böyük zəkaları tərəfindən yaradılmış əsərləri tonqal vurub yandırırlar, bəşər zəkası və qəlbinə çox əziz olan ən qiymətli abidələri həyasızlıqla puç edirlər.

Azərbaycanın sədaqətli oğulları bütün sovet xalqlarının oğulları ilə bərabər silah götürüb vəhşi nemes imperialistlərinə qarşı müqəddəs Vətən müharibəsində düşmənlə mərd-mərdanə vuruşurlar. Biz sovet xalqlarının vətəni birdir, bizim sovet torpağı bizim doğma Vətənimizdir. Biz hamımız vahid sovet xalqının oğullarıyıq, biz hamımız qanı bir, əməklə mübarizəsi bir olan doğma qardaşlarıq.

Əsgərlərimizdən hər biri bilir ki, o öz doğma torpağını, öz yurdunu, öz xalqının əsrlərdən bəri yaratmış olduğu mədəniyyəti qaniçən düşmənlərdən müdafiə edir.

Azərbaycan xalqı öz azadlığını, abad etdiyi öz şəhərlərini və kəndlərini, öz əlilə tikdiyi fabrikləri və zavodları, öz neft sərvətlərini, becərib hasilə gətirdiyi pambığını və taxılını müdafiə edir. Bizim xalqımız vüqarlı xalqdır, azadlıqsevən xalqdır. Bizim xalqımız öz azadlığı və istiqlaliyyəti uğrunda min illər boyu yorulmadan mübarizə etmişdir, xalqımız Babək və Koroğlu kimi oğullar yetişdirmişdir. O, Azərbaycan torpağına heç vaxt düşmənin ayaq basmasına yol verməz.

Biz heç zaman yadımızdan çıxarmırıq ki, burada, Azərbaycan torpağında, dastanlarda deyilən qalaları və qüllələri olan keçilməz dağlar arasında xalqımızın ölməz qəhrəman sərkərdələri – Cavanşir, Babək və Qaçaq Nəbi mərdliklə vuruşaraq düşmənlərimizi əzmişlər, burada bu yerlərdə Xanlar Səfərəliyev, Bünyad Sərdarov, Məşədi Əzizbəyov və bir çox başqaları öz xalqının azadlığı uğrunda mərdliklə vuruşmuşlar. Bu gün də Azərbaycan xalqı yenə öz şərəfli əcdadının qəhrəman ənənələrini davam etdirərək özünün ən yaxşı oğullarını və qızlarını Böyük Vətən müharibəsi cəbhələrinə göndərir.

Biz, Azərbaycan xalqının oğulları – Vətən müharibəsinin qəhrəmanları Hüseynbala Əliyev, Kamal Qasımov, Bəxtiyar Kərimov, Məzahir Abasov, Midhət Ələkbərov və başqaları haqqında, döyüş meydanında vətənə öz hədsiz sədaqətini göstərənlər haqqında nəğmələr qoşuruq, qəhrəmanlıq dastanları yaradırıq!

Yoldaşlar! Düşmən bizim şanlı Azərbaycanı tutmağa cəhd edir, düşməni bu yerlərə çəkən Abşeron yarımadasının neft mədənləridir, ucsuz-bucaqsız Muğan düzlərindəki ağ qızıldır; düşmən çalışır ki, Azərbaycan xalqını əsarət altına alıb onu yer üzündən yox etsin. Lakin azad və xoşbəxt Azərbaycan torpağına, öz şanlı tarixinin böyük ənənələrini davam etdirən bir xalqın torpağına, böyük şeir dahisi Nizami Gəncəvinin yatdığı torpağa nemes işğalçılarının ayağı dəyə bilməyəcəkdir.

Nemes imperialistləri Bakının üzünü, şanlı revolyusion ənənələrə malik olan neft şəhərinin üzünü görməyəcəklər...

Qardaşlar! İndi bizim üçün ağır vaxtdır. Bu gün Vətənimiz bizlərdən hər birimizi sınaqdan keçirir. Düşmənin müvəqqəti hərbi müvəffəqiyyətləri ancaq öz canının hayına qalanları qorxuda bilər.

Qədim Azərbaycan misallarından birində deyilir ki, "İgidi bərk ayaqda sınayarlar". Biz nə qədər ağır imtahan qarşısında olsaq da, iradəmiz polad kimi möhkəm olmalıdır, xalqımız əlbir və sarsılmaz olmalıdır, qanlı faşizm üzərində qəti qələbəmizə inamımız möhkəm olmalıdır.

Yoldaşlar!

Mən düşmənə nifrət bəsləməyə çağırıram! Mən düşməndən amansız intiqam almağa çağırıram! Qoy bu gün qəlbimizdə düşmənə qarşı coşan ədavət alovu düşməni yandırıb kül etsin. Əlinə ölüm bayrağını alıb torpağımızı, yurdumuzu viran etməyə gələn qatillərə ölüm! Qana-qanla, ölümə-ölümlə cavab verməliyik!

Biz bu gün öz doğma anamız olan Vətənimizin qarşısında and içirik ki, onun azad və şən şəhərləri və tarlaları üzərində həmişə işıqlı səhər günəşi və Cənub gecəsinin kəhkəşanları parlayacaqdır, yurdumuzda həmişə bahar olacaqdır.

Biz bu gün öz qəhrəman babalarımızın xatirəsinə and içirik ki, onların müqəddəs məqbərələrini qoruyacaq və bədnam olunmasına yol verməyəcəyik.

Biz duz-çörəyimizə and içirik ki, öz xalqımızın şərəfini və azad əməyini qorumaq uğrunda son nəfəsimizə qədər vuruşacağıq.

Biz doğan və bəsləyən anaların halal südünə and içirik ki, uşaqlarımızı, vüqarlı Qafqazın qadın və qızlarının təmiz namusunu faşist zabitləri və soldatlarından köksümüzlə qoruyacağıq...

(*Gurultulu alqışlar*)

*1942*

## BİR SƏHƏR

Axşamın da özünə məxsus gözəlliyi var, şairənə bir görünüşü var. Xüsusən cənub axşamları. Günəş saçlarını toplayıb uca dağların arxasına çəkildiyi zamanlar təbiətə çökən mənalı bir sükut nə qədər ilahidir!

Lakin mən səhərləri daha çox sevirəm. Günəş öz rübəndini açıb, gözəl camalını üfüqdən göstərdiyi zamanlar o, sevimli və dilbər bir qız kimi səni həyata çağırır.

Bəli o, səni həyata çağırır; sən hər səhər mehriban günəşlə qarşılaşdığın anda əlinlə yazdığın həyat kitabına bir vərəq... yeni bir vərəq də əlavə olunur. Sən bu dilbər günəşi, bu vəfalı dostunu hər gün görmək üçün yaşamaq, yenə də yaşamaq istəyirsən.

Yenə də səhərdir. Lakin bu səhər mənim gözlərimin hələ beşikdə yatdığım zamanlardan alışmış olduğum cənub səhəri deyildir. Burada nə yaqut rəngli günəş, nə də pəncərəmizin önündə öz körpə qanadlarını süzdürüb uçuşan qaranquşlar var. Lakin bir həqiqət vardır: səhər hər yerdə səhərdir!

Mən səhəri hər yerdə sevirəm! O, harada olursa-olsun bizi yenə də həyata çağırır. O öz eşqinə vəfalı bir pəridir!

Dediyim bu səhər Moskva səhəridir!

Günəşin yaqut rəngi dumanlar içindən görünmür. Lakin onun böyük qüdrəti hiss olunur. Elə bil ki, günəş bu dəqiqə dumanları yırtacaq və gözəl camalını aləmə göstərəcəkdir! Bəli, Moskvanın səhəri də əbədidir.

“Moskva! Basılmaz sənin qüdrətin
Canlı heykəlisən əbədiyyətin!”

Mən geniş pəncərəmdən Qorki küçəsinə, qədim evlərin çardaqlarına baxıram. Qocaman Moskva yenə də dəniz kimi təlatümdədir. Hərəkət onun əbədi bir hüsnüdür. Mən şad və xoşbəxtəm. Qapı döyülür. Buyurun, deyirəm. Gənc və qüdrətli əllər qapını açaraq deyir:

– Siz yoldaş Səməd Vurğunsunuzmu?

– Bəli, mənəm!

Gəncin gözləri sevincindən parlayır, o, bir neçə addım da irəli gələrək əlini mənə uzadır, “tanış olaq”, – deyir. Biz əl verib görüşürük. O deyir:

– Mənim adım İdris Vəliyevdir. Qərb cəbhəsindən gəlmişəm. Eşitdim ki, siz Moskvadasınız. Axtarıb tapdım. Özümü nə qədər xoşbəxt hiss edirəm.

Mən qonağımı qəbul edirəm, ona yer göstərib:

– Əyləş, – deyirəm.

– Xoş gəlmisən!

– Mən də sizinlə tanış olmağıma çox şadam!

Mən qonağıma diqqətlə baxıram. Onun boy-buxunu, qəşəng və nəcib sifəti nə qədər doğma, nə qədər mehribandır!

Hələ əynindəki hərbi paltar ona nə qədər yaraşır. İdrisin qabarmış köksü qalib bir pəhləvan köksü kimi hamıya meydan oxuyur. Onun sıx və qara qaşları kaman kimi çatılmışdı. Qara və uzun kirpikləri kamandan ayrılmış oxlar kimi irəli süzür. Onun baxışları alıcı tərlan baxışları kimi kəskindir. Elə bil ki, bu tərlan öz ovunu görmüş və bu dəqiqə qanadlarını yığışdıraraq onun üzərinə şığıyacaqdır. İdrisin baxışlarında insan iradəsi və hünəri oxunur. Onun gözləri axar çeşmələrin suyu kimi şəffaf və ləkəsizdir.

Bu, bəlkə də müqəddəs və hər zaman xeyirxah yaşamış bir xalqın ürək timsalıdır...

Şübhəsiz ki, belədir!

Mən indi anladım ki, biz Azərbaycan yazıçıları bir məsələdə yanılırıq. Biz öz xalqımızın daxili aləmini, onun saf və müqəddəs hisslərini ifadə etmək üçün, adətən, ağ saçlı qocalarımızın simasına müraciət edirik. Biz insan hünəri, namusu və qəlb saflığı deyilən nəcib hissləri çox zaman qocalarımızda axtarıb və onlarda görürük. Bəs gənclik? Biz bəzən böyük bir həqiqəti unuduruq ki, yaşamağa haqqı olan bir xalqın həyat qüdrəti, mübarizə qabiliyyəti, onun gələcək taleyi, hər şeydən əvvəl, bu xalqın qoynunda bəslədiyi gəncliklə ölçülməlidir! Biz möhtərəm qocalarımızın simasında yaradılmış tariximizi sevib alqışlamalı, lakin gəncliyimizin simasında yeni tariximizi yaratmalıyıq!

Bəli! Gənclik bizə sabahdan xəbər verir...

O, bu gün bizim ellərin karvanını dumanlar və qaranlıqlar içindən aparıb sabaha çıxaran bir sarbandır!

Gənclik vətən torpağının səhəridir! Onun surətində günəşin qüdrəti, baharın həyat ətri vardır.

“Onun gözlərində həyat eşqi var,
Var olsun gələcək, var olsun bahar!”

Mən qonağımın döşündəki nişana nəzər yetirərək “Sən qvardiyaçısanmı?” – deyə soruşdum. “Bəli, qvardiyaçıyam. Özümü də ali mükafata təqdim etmişlər. Beş gündür ki, Moskvada istirahət edirəm. Bu gün yenə də cəbhəmizə getməliyəm”, – dedi.

– Sən nə hünər göstərmisən ki, səni ali mükafata təqdim etmişlər?

O, azca gülümsədi. Hərbi çantasını açdı, orda saxladığı cəbhə qəzetindəki kiçik bir məqaləni mənə göstərərək, oxuyun, dedi. Bu məqalədə İdris Vəliyevin qəhrəmanlığından, onun rəşadət və hünərindən bəhs olunurdu. Məqalənin bir yerində deyilirdi ki, İdris Vəliyev üç gün müddətində düşmənə amansız müqavimət göstərərək 160 nəfər nemes soldatı və zabiti qırmışdır! Mən məqaləni oxuyub qurtardıqdan sonra:

– Doğrudan da böyük hünərdir! Sən, doğrudan da, ali mükafata layiq bir igidsən, – deyə dostumu tərifə başladım.

Ancaq İdris mənim sözümü kəsərək vüqarla əlavə etdi:

– Orada yazılanlar hamısı deyil. Başqa bir gündə də düşməndən 50 nəfərini bir yerdə qırmışam.

– Bəs qışla necəsiniz, Rusiyanın şaxtalarına tab gətirirsinizmi? – deyə soruşdum.

O, qəti bir cavabla:

– Lap yaxşı tab gətiririk, – dedi. – Yemək və paltar tərəfdən kefimiz lap kökdür. Qışa da isti qarın və isti paltar lazımdır.

Söhbətimiz bir az da uzandı. İdris üstü yazılı bir məktubu mənə uzadaraq:

– Zəhmət çəkin, bunu Bakıdan bizim evə göndərin, – dedi.

Mən, baş üstə, deyib məktubu ondan aldım. O, ayağa qalxmaq istərkən mən onu bir az saxlayaraq: – “Sənə bir iki kəlmə sözüm var”, – dedim.

– İdris! Sən yaxşı bilirsən ki, müharibə dəhşətli bir müharibədir. Onun çovğunları və boranları hələ qabaqdadır. Gələcəkdə də dözümlü ol! Məndən yoldaşlarına salam söylə və de ki, hər xalqın qəhrəmanlıq və hünəri müharibə günlərində imtahan olunur. Siz də böyük bir xalqın oğullarısınız. Azərbaycan torpağı hər vaxt igidlər yuvası olmuşdur. İndi vətənimizin namusu, bayrağı sizin əllərinizə tapşırılmışdır.

Siz hər gün göstərdiyiniz hünərlə xalqımızın qəhrəmanlıq tarixinə bir səhifə də artırırsınız. Siz bir şeyi də unutmayın ki, bu saat Azərbaycan xalqının hər sahədə böyük insanları və nümayəndələri var. Ordu sıralarında, hərbi aləmdə də bizim böyük mütəxəssislərimiz – generallarımız çox olmalıdır. Ordumuzun hər hissəsində igid oğullarımız və qızlarımız öz hünərini göstərir. Bu vaxtdan siz istifadə edərək xalqımız üçün öz içinizdən hərbi dühalar yetirin! Bu da yalnız uzun müddət ordu sırasında qalmaqla və hərbi elmlərə sahib olmaqla mümkün ola-

caqdır. Başqa bir sözüm yoxdur. Ancaq sənə xırdaca bir hədiyyəm var. Mən yazı masamın üstündəki "Səadət uğrunda" adlı şeir kitabçamın ilk vərəqinə "Xalqımızın qəhrəman oğlu İdris Vəliyevə məndən yadigar" sözlərini yazdıqdan sonra kitabçanı ona verdim.

– Apar, qardaşım, özün və yoldaşların bu kitabçadakı şeirləri vaxtınız olduqca oxuyun, – dedim.

İdris kitabçanı əlinə alaraq:

– Çox sağ olun! – dedi. – Bundan gözəl nə hədiyyə ola bilər? Mən sizin başınıza and içirəm ki, bu kitabçadakı şeirlərin hər birinə bir faşist də indən belə öldürəcəyəm!

O, kitabçanın üzünü əli ilə sığallayaraq (bu, kənd adətidir) öz hərbi çantasına qoydu. "Artıq salamat qalın, mən gərək bu saat gedəm", – dedi.

Biz əl verib ayrıldığımız an Moskva səhərinin günəşi dumanları yararaq pəncərədən içəri düşmüşdü.

Günəşin mehriban şəfəqləri İdrisin bahar qoxusu verən saf və təmiz üzündə oynayırdı.

Mən onun bu bəxtiyar sifətində başqa bir səhər də gördüm.

Bu, Azərbaycan torpağının yeni, qəhrəmanlıq səhəridir!

*1942*

## "MƏHƏBBƏT" BARƏDƏ

Əsərin* ən sevindirici cəhətlərindən biri odur ki, pyesdə həyat vardır.

Ailə və məişət məsələləri ədəbiyyatımızda ən zəruri temalardan biridir. Bu məsələ müharibə şəraitində xüsusilə böyükdür. Mirzə bu məsələləri çox gözəl həll edə bilmişdir. Müəllif Məhəbbət obrazının simasında ağıllı, düşüncəli və gözəl Azərbaycan qızı yaratmışdır. Lakin çox təəssüf ki, Məhəbbət rolunu oynayan Fatma Qədri Azərbaycan qızının dəruni varlığını yarada bilmir. Xarici görünüş cəhətdən də bu obraz Azərbaycan qızına bənzəmir. Bizim köhnə ailələrimizdə olan ən gözəl cəhətləri yeni ailəyə keçirmək məsələsini müəllif çox vaxtında və yaxşı yaratmışdır. Məhəbbətin zəhərlənməsi məsələsi artıqdır. Bu, şpion Murtuz ağanın fəaliyyətini yüngülləşdirir.

---

* Mirzə İbrahimov "Məhəbbət" pyesi

Məncə, bu gözəl dramanın zəif cəhəti odur ki, burada 3-4 cür sevgili birdən meydana çıxır. Nəticədə, obrazlar tamamlanmamış qalır.

Hurinin müqəddəratı müstəqil bir temadır. Qəşəm Məmişov tipi ədəbiyyatımızda yeni bir obrazdır və teatrımız tərəfindən gözəl yaradılmışdır.

"Məhəbbət" əsərinin müəllifi Mirzə İbrahimovun, quruluşçu rejissor Adil İskəndərovun və əsəri yaradan aktyor kollektivinin işi diqqətəlayiq və sevindirici bir hadisədir.

*1942*

## QAFQAZIN MƏDƏNİYYƏTİ ÖLMƏZDİR

Sovet İttifaqının mədəni sərvətlərini "xüsusi təyinatlı batalyon"dan olan faşist quldurlarının necə oğurlamaları barədə əsir Norman Ferstenin ifadəsini böyük qəzəb və faşist cəlladlarına nifrət hissi ilə oxudum. Bu ifadə bizim üçün gözlənilməz deyil.

"Faşizm elm və mədəniyyətdən it dəyənəkdən qorxan kimi qorxur". Bu, əbəs deyilməmişdir. Mədəniyyət, xalqları "yeni alman ağalığı sinfi"nə tabe etmək, vicdan və namus anlayışlarının inkarı, bəşəriyyəti orta əsrlərə qaytarmaq cəhdləri kimi faşist anlayışları ilə bir araya sığmır.

Mən, Azərbaycan xalqının yazıçısı və övladı, qardaş Ukrayna və Belorusiya xalqlarının, xüsusilə böyük rus xalqının mədəni sərvətlərinin faşistlər tərəfindən oğurlanmasına dözə bilmərəm. Çoxəsrlik rus mədəniyyəti, ölkəmizin xalqlarının qabaqcıl mədəniyyəti milli mədəniyyətlərin, o cümlədən Azərbaycan mədəniyyətinin inkişafında mühüm rol oynamış və oynamaqdadır. Mənim xalqımın taleyi və onun mədəniyyəti rus xalqının taleyi və mədəniyyəti ilə qədim tellərlə bağlıdır. Məşhur Azərbaycan filosofu və yazıçısı Axundovun görkəmli rus dekabrist şairi Bestujev-Marlinski ilə böyük ideya dostluğu müasirlərinin və gələcək nəslin xatirindən heç vaxt silinməyəcək. Biz maarifpərvər şair Bakıxanovun ölməz rus şairi Püşkinlə şəxsi və poetik dostluğunu heç zaman unutmayacağıq. Biz böyük Azərbaycan maarifpərvəri Həsən bəy Zərdabi ilə dahi rus yazıçısı Lev Tolstoyun yaradıcılıq əlaqələrini və bir-birinə qarşılıqlı ehtiramını unutmayacağıq.

Biz rus və Azərbaycan xalqlarının şanlı babalarımızın müqəddəs vəsiyyəti olan dostluğunu göz bəbəyi kimi qoruyacağıq.

Azərbaycan xalqı və ziyalıları alman "sənətşünaslarının" və "şairlərinin" hoqqalarını yaxşı bilirlər. XIX əsrdə belə alman şairlərindən biri – Bodenştedt Azərbaycan şairi Mirzə Şəfi ilə tanış olmuşdur. Bodenştedt guya alman dilinə tərcümə etmək məqsədilə Mirzə Şəfinin şeirlərinin üzünü həvəslə köçürmüşdür. Lakin bu şeirlər alman dilində nəşr olunarkən artıq Bodenştedt özünü tərcüməçi yox, şeirlərin müəllifi kimi təqdim etmişdir. Görünür, xüsusi təyinatlı batalyondan olan alman sənətşünasları oğurluğu xüsusi istedad kimi öz əcdadlarından əxz etmişlər.

Artıq, bəsdir! Sovet xalqının mənəvi sərvətlərini oğurlamaq faşist alçaqlarına bir daha nəsib olmayacaqdır. Qızıl Ordu onları darmadağın etməyə başlamışdır. Faşistlərin ayaqları nə Moskvaya, nə Leninqrada, nə də Azərbaycan torpağına dəyəcəkdir. Azərbaycan torpağında dahi Nizaminin sərdabəsi var, mənim xalqımın romantik ruhunun simvolu olan möhtəşəm Qız qalası bu torpaqdadır.

Azərbaycan incəsənət işçiləri şanlı ordumuzla birlikdə Qafqaz xalqlarının mədəniyyətini faşist quldurlarından və oğrularından qorumaq, onları dirçəlmiş sovet torpağımızdan həmişəlik qovmaq üçün son nəfəsinə qədər vuruşacaqlar.

*1942*

## MƏN... ÖZ YARADICILIĞIMI ÖLƏNƏ QƏDƏR FÜZULİNİN, VAQİFİN ÜZƏRİNDƏ APARACAĞAM

...Musiqi aləmində biz yazıçıların sözü çox da mötəbər sayıla bilməz. Bu sənətin ustaları çox gözəl danışdılar. Mən burada muğamat aşiqi və muğamatı çox sevən bir adam kimi çıxış etmək istəyirəm. Doğrudur, bugünkü iclas istər muğamat və istərsə də xalq musiqisi sahəsində, gələcəkdə görəcəyimiz ən böyük və zəruri işlərin əsası olmalıdır. Yəni dönüş iclası olmalıdır.

Bir şey mənim yadımdan çıxmaz. 1934-cü ildə mən "Şahsənəm" operasından yarımçıq çıxdım. Axıra qədər baxa bilmədim. Hərçənd orada müəllif bəzi muğam hissələrindən istifadə etmişdir, lakin mən tamaşanı tərk etdim.

İkinci təsadüf: Mən "Koroğlu"nun prasmotrunda şəxsən ağladım. Tamaşada bir yer vardı: Qırat gedən zaman çalınan musiqi adamı ağladır. Lakin mənim ağlamağım bədbinlik ağlaması deyil. Mən öz-özümə

dedim ki, buradakı musiqi əsl həqiqi musiqidir. Əsərdə bütün satqınlar xalqın böyük qüdrəti və qüvvəsi qarşısında məhkum olur.

Bu gün radio konsertlərini götürək. Bu konsertlərdə muğamat qol-qanadı qırılmış bir surətdə yaşayır. Mən bütün əsas ilə deyə bilərəm ki, muğamatın yaşamağa haqqı vardır. Çünki, Azərbaycan musiqisi muğamat üzərində qurulmuşdur. Muğamat təkcə Azərbaycanın yox, bütün Qafqaz və Şərq xalqlarının bədii zövqüdür. Biz fəxr edirik ki, bizim yaratdığımız böyük musiqi məktəbi nəinki Azərbaycanda, hətta bir çox xarici ölkələrin xalqları arasında böyük nüfuz kəsb etmişdir. Məgər ki, belədir, gəlin hər şeydən əvvəl bu məsələyə ciddi fikir verək və bu barədə mətbuatda çox söhbət aparaq. Seyid (S.Rüstəmov) hər şeyi düzgün göstərdi ki, adamlarda muğamata qulaq asmağı tərbiyələndirməliyik. Nə üçün Bethovenin musiqisinə qulaq asanlar zalda səs-küy salmırlar? Amma muğamata qulaq asanda biz özümüzü apara bilmirik. Dağlı məhəlləsinin xuliqanları bir-birilə mazaqlaşırlar: biz mədəni adamlar kimi konsertə gəlib istirahət etməliyik. Odur ki, özünü apara bilməyən, şuluq salan adamlarla hesablaşmaq lazımdır. Konsertə piyan gələnlər muğamatın nüfuzunu aşağı salırlar. Odur ki, bunun tarixi kökləri ilə mübarizə aparmaq lazımdır.

Köhnə oxuyanlar məsələsi: etiraf etmək lazım gəlir ki, yeni oxuyanlar nə qədər gözəl oxusalar da, onların səsi yenə də köhnə oxuyanların səsləri kimi gözəl səslənmir. Bu bir həqiqətdir. Bəs nə üçün bu belə olmuş? Çünki Bülbül vaxtı ilə əlinə qaval aldıqda onun qabağında Cabbar Qaryağdı oğlu dayanmışdı. Əgər Bülbül muğamat oxuduqda Cabbar kimi oxumasa idi, onu toydan fışqırıqla qovardılar. Ancaq Əlövsət (Ə.Sadıqov) pis oxuyur. Çünki o, qətiyyən öz üzərində işləmir və səsinə fikir vermir.

Mən burada məsələni çox da kəskin qoymuram. Və demirəm ki, pis oxuyanları işdən çıxarın. Bundan bir şey çıxmaz. Lakin onların qəlbinə aşılamaq lazımdır ki, öz sənətində özlərini böyük usta cərgəsində aparmasınlar. Əgər bu işləri inzibati yol ilə qaydaya salmaq olarsa, onda Mirzə (M.İbrahimov) ölçü götürə bilər.

Sonra burada köhnə oxuyanlar haqqında, xüsusilə Cabbar Qaryağdı oğlu haqqında və başqaları haqqında danışdılar. Nədənsə Xanın (X.Şuşinskinin) adı az çəkildi. Məncə, Zülfünün (Z.Adıgözəlovun) və Xanın dinləyiciləri olduqca çoxdur. Məsələn, radioda Zülfü oxuduqda, Xan oxuduqda, adları belə çəkilməsə, həmin saat bilmək olur ki, oxuyan

kimdir. Bunlarla işləmək lazımdır. Yaxşı olardı ki, bugünkü müşavirədə muğam ifaçıları iştirak edib çıxış edəydilər.

Mən Bülbülü düzgün başa düşdüm. O iki məsələ qoyur: birinci İslam (İ.Abdullayev məşhur "Segah" ustası) yolu, ikinci ondan kənar – yəni Azərbaycan təəssüratı olmayan yol.

Mən İslama kamil oxuyan kimi baxıram. O, "Yetim Segah"ını elə oxuyur ki, bütün məclisi ələ alır. İslamın yaxşı cəhəti odur ki, onun segahlarında Azərbaycan ruhu daha çoxdur. Mən cavan oxuyanlara deyə bilərəm ki, İslam kimi və yaxud bir başqası kimi oxusunlar. Lakin standart olmasın. Çünki hərə bir cür oxuyur. Biri muğamı ağır başlayır, digəri isə başqa cür başlayır. Mənim buna etirazım yoxdur. Lakin mən istərdim muğam yaxşı oxunsun. Məsələn, Keçəçioğlu Məhəmməd yaxşı oxuyur. Bir də görürsən ki, muğamın bir guşəsində zəngulə vura bilməyəcək, onda özünü itirmir, keçir başqa guşəyə.

1924-cü ildə bağda Cabbar Qaryağdı oğlu bir səs salmışdı ki, bütün yarpaqları səhər bülbülü kimi səsə gətirirdi. Demək bu, ustadır. Oxuyanlardan belə oxumağı tələb etmək lazımdır.

İkinci məsələ: Azərbaycan musiqisi məsələsidir. Mən bilmirəm belə vəziyyət necə yaranmışdır ki, bizim gənclik, Avropa musiqisinə meyl edib özünün milli musiqisinə barmaqarası baxsın. Əgər doğrudan da belədirsə, mən buna xalq qarşısında xəyanət deyə bilərəm. Bu düzgün hərəkət deyil. Çünki yoldaşlar, Avropa Avropadır, Şərq Şərqdir, Azərbaycan da Azərbaycandır.

Mən Avropa mədəniyyətini çox sevirəm. Bütün Avropa yazıçılarını bacardığım qədər oxumuşam. Ancaq öz yaradıcılığımı ölənə qədər Füzulinin, Vaqifin üzərində aparacağam.

Heç də uzağa getməyək. Bütün Azərbaycan bəstəkarlarını götürək. Bunların arasında Avropa musiqisi mədəniyyətinə Üzeyirbəy hamısından daha çox hakimdir. O, bizə Avropa mədəniyyətini milli mədəniyyətimizin vasitəsilə çatdırır. Ancaq elə yazıçılar var idi ki, həmişə Avropa deyirdilər. Odur ki, onların əsərləri özlərindən tez öldülər. Belə şeylər musiqidə daha çoxdur. Odur ki, bu işdə bizim gənclikdə elə bir tendensiya varsa, onu tənqidə almaq lazımdır. Müəlliflərimiz mətbuat vasitəsilə bu məsələləri qaldıra bilərlər. Biz musiqi məktəblərində nəinki Azərbaycan şöbəsi açmalıyıq, hətta musiqi məktəblərinin bütün işlərinin 90 faizini Azərbaycan dilində aparmalıyıq. Məgər onun adı Azərbaycan musiqi məktəbidir, orada da Azərbaycan dili hakim

olmalıdır. Bu işdə İncəsənət İşləri İdarəsi, birinci növbədə Üzeyirbəy məşğul olmalıdır. Yaxşı bir sənətkar kimi inkişaf etmək istəyirsənsə, onda gərək ayağını qoyduğun torpağa möhkəm basmalısan.

Şeirdə musiqi məsələsində Seyid doğru göstərdi. Hər bəstəkardan tələb etmək olmaz ki, sən filan şeyi yaz. Birisi simfoniya yazır, digəri balet yazır, bir başqası da opera yazır.

Şeir məsələsinə gəldikdə isə mən bilirəm kim nə dərəcədə Azərbaycan dilini bilir. Ancaq şeir bir balaca fərqli olmaqla yarana bilər. Məsələn, Bülbül, Sarabski söz deməkdə, başqasına çatdırmaqda qeyri oxuyanlara nisbətən yaxşıdırlar. Bir də muğam üçün qəzəl yazmağa ehtiyac yoxdur. "Rast" oxumaq üçün Füzulinin nə qədər desən qəzəlləri vardır. Odur ki, mən bir oxuyan üçün qəzəl yazıb verməmişəm. Çünki Füzulinin şeri qabağında mənim ən yaxşı şeirlərim belə plovdan sonra bozbaşa bənzəyir.

Dünən axşam (6 sentyabr 1942-ci il) Bülbülə əl vururdular. Çünki o, şerin bütün sözlərini camaata çatdırırdı.

Axırıncı məsələ muğamatın qəmginliyi məsələsidir. Mən etiraf edirəm ki, bizim muğamatda bədbinlik yoxdur. Axı niyə mən "Rast"a qulaq asanda ağlayım. Əksinə, mən heç zaman bədbin olmaram. Əgər adamlar "Rast"dan bədbin olsa idilər, onda ya ruhdan düşərdilər, ya da gedib qayalarda yaşayardılar. "Rast"ın elə əzəmətli yerləri vardır ki, elə bil qarşıdan karvan keçir. Həyatı, təbiəti daha çox hiss edirsən.

Sonra az oxumaq məsələsi: konsertdə üç dəqiqə çalıb-oxumaq muğamın qol-qanadın qırmaqdır. Üzeyirbəy deyir ki, "Rast"ın 7 qolu vardır. Onun hərəsini 1 dəqiqə, cəmisi 7 dəqiqəyə oxumaq olar. Bu düzgün deyil. Çünki oxuyan gərək meydan sürsün, tələsməsin.

– Bülbül, sən dünən nə qədər oxudun?

Bülbül:

– Bir saat 10 dəqiqə oxudum.

"Rast" yeddi havadır, 2 saat oxusa idin, sənə qulaq asardılar. Odur ki, qoy radio həftədə üç dəfə muğamat konserti versin və burada ən yaxşı xanəndələr oxusun. Sonra bizim oxuyanların hamısı ağzını açan kimi "Segah" oxuyurlar. Məsələn, mənim qulağıma çoxdan "Humayun", "Şüştər" gəlmir, "Dügah" gəlmir. Nə üçün xanəndələr bu muğamları unudurlar? Odur ki, onlardan tələb etmək lazımdır ki, əgər həftənin bu başında "Segah" oxuyurlarsa, o başında başqa şey oxusunlar.

*1942*

## BİR NEÇƏ SÖZ

Bədii ədəbiyyatımızın nə kimi istiqamət üzrə inkişaf etməsi hər zaman ictimai fikrimizin mərkəzində duran canlı bir məsələdir. Bədii tənqidimiz, hər şeydən əvvəl, yazıçılarımızın yaratdığı ayrı-ayrı əsərləri təhlil və tənqid etməklə kifayətlənmədən hər yazıçının götürdüyü yaradıcılıq istiqaməti ilə dərindən məşğul olmalı, onun yaradıcılıq qabiliyyətinin hansı janr üzrə daha məhsuldar, daha müvəffəqiyyətli olacağını da yazıçıya xəbər verməlidir. Çünki bu məsələdən ədəbiyyatımızın ümumi taleyi, onun gələcəyi asılıdır. Əfsuslar olsun ki, tənqidimiz bu mürəkkəb və canlı bir məsələ ilə qətiyyən məşğul olmur. Bəlkə də tənqidçilərimiz belə bir məsuliyyəti öz öhdələrinə götürməkdən boyun qaçırırlar. Buna görədir ki, hələ də bir çox şair və nasirimiz özlərinin həqiqi yaradıcılıq yolunu təyin edə bilməmiş, öz atlarını hər yana çapırdaraq hələ də səyahət aləmindədirlər...

Mən bu kiçik məqalədə, mübahisə təriqi ilə, yazıçılarımız qarşısında hamımızı düşündürən bir məsələdən danışmaq istəyirəm. Bu yaxın illər müddətində, xüsusən son iki il müddətində Azərbaycan dramaturgiyasına doğru yazıçılarımız arasında, demək olar ki, kütləvi bir axın vardır. Belə bir hadisənin yanından keçmək mümkün olmadığından bu "axının" nə dərəcədə təbii və xeyirli bir axın olması, heç şübhəsiz ki, bizi dərindən düşündürməlidir. Məncə, ədəbi siyasətimiz belə bir ciddi hadisəyə qeydsiz yanaşa bilməz.

Məlum olduğu üzrə, dramaturgiya və kino sənəti ədəbiyyatın ən aktiv və kütləvi bir sahəsidir. Odur ki, bu sahələrə doğru atılan hər bir müvəffəqiyyətli addım alqışlanmalıdır. Lakin əsas yazıçı kütləmizin, yəni bütün qabaqcıl yazıçılarımızın dramaturgiya sahəsinə bir stixiya olaraq atılmaları iki cəhətdən bizi maraqlandırır.

Birinci: hər yazıçıdan dramaturq ola bilərmi? İkinci: hər yazıçının dramaturq olması lazımdırmı?

Mən qısa da olsa, bu iki suala cavab vermək istərdim. Ədəbi tarix göstərir ki, hər yazıçıdan dramaturq ola bilməz. Nə üçün? Bunun cavabı çox sadə olduğu kimi, çox da mürəkkəbdir. Biz bilirik ki, dramaturgiya yüksək bir sənətlə yaradılmış ictimai konfliktlər və böyük insan xarakterlərinin gərgin mübarizəsindən yaranır. Madam ki, belədir, dramaturq olmaq üçün yüksək insan xarakterlərini yaratmaq, kəskin ictimai konfliktlər qurmaq və bütün bunları mahir səhnə dili ilə ifadə etmək

dramaturqun qarşısında duran əsas tələbdir. Bunsuz dram əsəri yarana bilməz. Odur ki, bəzən gözəl bir şairin, yaxud nasirin yazmış olduğu "dram" əsəri çox sönük də ola bilir. Çünki avtor öz yaradıcılıq təbiətini nəzərə almamışdır. O, gözəl şeir, poema, hekayə və roman yazsa da, dram əsərindəki xarakterləri və ictimai hadisələri döyüşən qılınclar kimi üz-üzə çarpışdırmağı və səhnə dilini kəşf etməyi bacarmadığından onun yazmış olduğu "dram" əsəri müvəffəqiyyət qazana bilmir. Demək ki, yazıçı dramaturgiya aləminə daxili bir yaradıcılıq zəruriyyəti nəticəsində gəlməmiş, o özünün əsil yaradıcılıq ruhuna xəyanət etmişdir.

İkinci sual: hamının dramaturq olması lazımdırmı? Şübhəsiz ki, yox! Bunun da səbəbi aydındır ki, hər hansı milli bir ədəbiyyatın zənginliyi, onun qüdrət və əzəməti yalnız dramaturgiya ilə ölçülə bilməz. Biz ədəbiyyatımızın ümumi inkişafını nəzərə aldığımız vaxt onun bütün janrlarının eyni bir hüquqla inkişafı uğrunda çalışmalıyıq. Böyük və ölməz əsər yaratmaq yalnız səhnə əsəri yaratmaq deyil! Kim iddia edə bilər ki, Nizaminin dastanları dünya ədəbiyyatının, tutaq ki, Şekspirin dram əsərlərindən həm mündəricə, həm də bədii forması etibarilə zəifdir? Yaxud kim iddia edə bilər ki, Sabirin yaratmış olduğu həcm etibarilə kiçik şeirlər, ictimai fikrimizin inkişaf tarixində Cəfər Cabbarlının nəhəng dram əsərlərindən az iş görmüşdür? Belə bir iddiada olanlar, şübhəsiz ki, çox böyük səhv etmiş olarlar. Demək ki, biz böyük əsərlər yaratmaq, daha kütləvi yazıçı olmaq istərkən, yalnız dramaturgiya yolunu deyil, ədəbiyyatımızın bütün janrlarını nəzərdə tutmaqla və bu janrlar (şeir, dastan, roman, kino-ssenari, dram, bədii tənqid və publisistika) sahəsində bir çox incilər yaratmaqla, ədəbiyyatımızın ümumi xəzinəsini bir daha zənginləşdirmiş olarıq. Bir də bir şeyi unutmaq olmaz ki, bütün saydığımız janrlar üzrə böyük əsərlər yaratsaq, bizim milli ədəbiyyatımız bütün dünya sahəsində mədəni, hərtərəfli inkişaf etmiş bir ədəbiyyat kimi qələmə verilər.

Lakin, çox təəssüf olsun ki, bir çox yazıçılarımız, bəzən də olsa, ədəbiyyatımızın ümumi mənafeyi məsələlərini unudurlar. Bunun nəticəsidir ki, son illər müddətində bizim ən qabaqcıl yazıçılarımız və orta səviyyəli yazıçılarımız arasında dramaturgiya aləminə kütləvi bir axın yaranmışdır. Yazıçılarımızdan A.Şaiq, H.Mehdi, M.S.Ordubadi, Mir Cəlal, O.Sarıvəlli, Süleyman Rüstəm, Rəsul Rza, Rza Təhmasib, Zeynal Xəlil, M.Seyidzadə, M.İbrahimov, Sabit Rəhman, Məcnunbəyov, Əbülhəsən, Cahanbəxş, Ənvər Məmmədxanlı və başqaları ya sistematik,

ya da hərdənbir dram əsərləri yazmaqla ədəbiyyatımızdakı başqa janrlara lazımi vaxt ayırmırlar. Mən yuxarıda adlarını çəkdiyim yoldaşların hamısına dramaturq olaraq bir gözlə baxmıram. Bunların arasında bir dramaturq olaraq öz istedadını sübut etmiş yoldaşlar da var. Lakin iş elə bir dərəcəyə gəlib çıxmışdır ki, bizim tənqidçilərimizdən A.Əkbər, M.C.Cəfərov yoldaşlar da öz qələmlərini dram sahəsində sınaqdan keçirmək istəyirlər. Mən yuxarıda adlarını çəkdiyim yoldaşlardan hansının dramaturq olacağı yaxud olmayacağı haqda peyğəmbərlik etmək fikrində deyiləm. Belə bir vəzifə, hər kəsdən əvvəl, bizim uzaqgörməyi bacaran tənqidimizin öhdəsinə düşür. Lakin dramaturgiyamıza doğru yaranmış bu kütləvi "axın" nədir? Bu hadisə nə dərəcədə qanuni bir haldır? Bu tendensiyanın əsil səbəbləri nədən ibarətdir?

Məncə, dramaturgiyamıza doğru yaranmış bu kütləvi axının birinci və əsas səbəbi bir çox yazıçılarımızın səhnəyə atılmaqla tamaşaçılar arasında daha tez və yüngül bir yolla tanınmaq, beləliklə, özlərinə daha tez ədəbi şöhrət qazanmaq məqsədləridir. Bu fakt acı olsa da, heç bir mübahisə və sübuta ehtiyacı olmayan bir həqiqətdir. Belə bir məqsədə bəraət vermək olarmı? Yox! Çünki ədəbiyyat tarixi göstərir ki, gözəl şeirlər, dastanlar, hekayə və romanlar yazmaqla da geniş oxucu və xalqın hüsn-rəğbətini qazanmaq olar. M.S.Ordubadi yoldaşın "Dumanlı Təbriz" romanı bizim hansı dram əsərlərimizdən az şöhrət qazanmışdır? Heç birindən! Buna sübut avtorun geniş oxucu kütlələrindən aldığı saysız məktublar deyilmi? S.Rəhimovun "Şamo" və "Saçlı" romanları hansı dram əsərimizdən az sevilir, az oxunur? Heç birindən! Lakin bir həqiqəti də açıq deməliyik ki, bizim şeir, dastan, hekayə və romanlarımız üçün yüksək səviyyəli mədəni oxucularımız (roman aşiqləri, şeir və dastan aşiqləri) istənilən dərəcədə deyil. Buna nail olmaq lazımdır və mümkündür. Lakin bu işdə yenə bizim tənqidimiz əsərlərin intişar tapması işində böyük rol oynamalı, bir də yazıçılarımızın xalqla olan canlı əlaqələri daha geniş və sistematik bir hal almalıdır.

İkinci səbəb: bəzi yazıçılarımız dram əsəri yazmaqla daha çox maddi gəlir məsələsini də nəzərdə tuturlar. Burada iki cəhəti nəzərə almaq lazımdır. Birinci: heç bir sənətkar maddi gəlir məsələsini əsas tutaraq özünü zorlamamalı və öz yaradıcılıq xüsusiyyətlərinə xəyanət etməməlidir! Belə bir hadisə yazıçılıq eşqinə müğayir bir cinayətdir! İkinci: etiraf etmək lazımdır ki, bizim şair və nasirlərimizin gəliri dramaturqlarımıza yaxud kompozitorlarımıza nisbətən azdır. Lakin biz belə bir

şərait yarada bilərik ki, şair və nasirlərimizin də gəliri onların normal həyatlarını təmin etsin. Bu məsələ, hər kəsdən əvvəl, Yazıçılar İttifaqının və nəşriyyat idarələrimizin öhdəsinə düşür.

Biz əminik ki, rəhbər dövlət idarələrimiz bu işdə bizə hər zaman olduğu kimi, yenə də kömək göstərəcəklər. Üçüncü bir şeyi də qeyd etməliyik ki, teatr işçilərimizin apardığı teatr siyasəti, bizim ümumi ədəbi siyasətimizlə həmahəng olmalıdır. Onlar teatr səhnələrimizdə heç bir güzəştə getməməlidirlər! Etiraf etməliyik ki, Azərbaycan Dövlət Dram Teatrı səhnəsində son illər müddətində "Qızıl çeşmə", "Şərqin qalası", "Yanar dərə", "Arzu", "İntiqam", "Şöhrət", "Aslan yatağı", "Bahar", "Vətən namusu", "Son gülən" və başqa bu kimi əsərlərin tamaşaya qoyulmasına teatr tərəfindən böyük güzəşt olmuşdur. Çünki bu əsərlərin heç biri Azərbaycan Dövlət Dram Teatrı səviyyəsinə layiq əsər deyildir.

* * *

Dramaturgiyamıza doğru atılan hər bir müvəffəqiyyətli addım alqışlanmalı, müvəffəqiyyətsiz addım isə şiddətli tənqidə məruz qalmalıdır!

Biz hər bir süni meylə, süni "yaradıcılıq istiqamətinə" qarşı amansız olmaqla, bir çox istedadlı yazıçılarımızı onların getdiyi yanlış yollardan qaytarmaqla onların əsil yaradıcılıq yollarını bir məşəl kimi işıqlandırmış olarıq! Mən bu kiçik, bəlkə də mübahisəli bir məqaləni belə qurtarmaq istərdim: hər bir yazıçının əsil yaradıcılıq istiqaməti uğrunda mübarizəyə!

*1943*

## MƏMMƏD RAHİMİN YARADICILIĞI HAQQINDA

Məmməd Rahimin poeziyası xalqımız arasında böyük şöhrət qazanmışdır.

Məmməd Rahim Azərbaycan ədəbiyyatının böyük klassiklərinin ənənəvi yaradıcılıq məktəbini keçmişdir. Məmməd Rahimin hələ ilk lirik şeirləri aydın göstərirdi ki, onun bədii ilham mənbəyi öz ölkəsinin

tarixi və həyatı, Azərbaycanın gözəl təbiətidir. Şair öz xalqının ruhu ilə, öz doğma torpağının ümid və arzuları ilə yaşayır və nəfəs alır.

Şairin gözəllik və poeziyanın beşiyi olan vətəninə, ölməz qəhrəmanlıq epopeyaları yaradan xalqına olan məhəbbəti çox böyükdür:

Bizim ellər əzəl gündən qəhrəmanlar yurdudur;
Tarix bunun şahididir, nəzər yetir, bax, budur:
Sərt qayadan mətanətli dəyanətin qalası,
Şöhrətilə öyündüyüm Azərbaycan balası,...
Düşmən ayaq basmaz deyib bu torpağın daşına,
Sal qayalar tolazladı yağıların başına...
Belə olmuş əzəl gündən Azərbaycan balası,
Belə olmuş səadətin, dəyanətin qalası.

Şair xalqının ölməzliyini bizim əlçatmaz dağların sərt gözəlliyində, şanlı babalarımızdan yadigar qalmış əfsanəvi qala və bürclərin daş kitabələrində, iti axan dağ çaylarının şırıltısında, aydın cənub səmasında qartalın uçuşunda, bizim xoşbəxt uşaqlarımızın gülüşündə və onların şanlı analarının ağ saçlarında görür və tərənnüm edir. Məmməd Rahim bədii yaradıcılığın əbədiliyini də xalqın bu ölməzliyində görür:

Dolanacaq aylar, keçəcək illər
Daha xoş sürəcək ömrünü ellər.
Cahan parlayacaq çilçıraq kimi,
Qəbrimin dövrəsi bağça-bağ kimi
Qönçələr verəcək, güllər açacaq,
Keçərkən yanımdan o zaman ancaq
Ölkənin gəlini, ölkənin oğlu
baxıb söyləyəcək, bəlkə bir zaman,
İndi qəbri belə çiçəklənən bu,
Daşları mamırlı bixəbər insan
Şeirlər yazardı əbədiyyətdən,
Azad insanlıqdan, azad sənətdən.

Məmməd Rahim 15 ildən artıq davam edən yaradıcılıq fəaliyyətində bizim poeziyamızın zənginləşməsi və inkişafı üçün çox iş görmüşdür. Onun şeir sazı yorulmaq bilmir. O, daima öz vətəninin səadət və gözəlliyini mədh edərək yaradır. Yüzlərlə gözəl şeir, onlarla poema onun qələminin məhsuludur.

Məmməd Rahim öz yaradıcılıq xarakterinə görə zərif və incə insan hisslərini tərənnüm edən lirik bir şair olmaqla bəzən xalqımızın qəhrəmanlıq tarixindən gözəl epik lövhələr də yaradır...

Məmməd Rahim yaradıcılığının belə geniş şöhrət qazanmasına səbəb onun zəngin Azərbaycan folklorunu hərtərəfli bilməsi və xalqın bədii yaradıcılığının bütün növlərindən istifadə etməyi bacarmasındadır.

Şairin ən müvəffəqiyyətli əsərləri içərisində xalqımızın dərin iztirablarını, onun yüksək əməllərini, qəhrəmanlıq rəşadətini əks etdirən Azərbaycanın qədim rəvayətlərinə həsr edilmiş poemaları əhəmiyyətli yer tutur.

Məmməd Rahimin Bakının son dərəcə gözəl qədim əfsanələrindən birinin əsasında yazdığı qırx qız haqqındakı gözəl poeması oxucularımızın xatirəsində həmişəlik qalacaqdır. Burada şair Xəzər dənizindəki qədim bir qayanı təsvir edir: bu qayadan öz namuslarının qəddar xan tərəfindən ləkələnməsini istəməyərək, dənizdə həlak olan qırx qızın göz yaşı kimi şəffaf su damcılayır.

Məmməd Rahim yaradıcılığında Azərbaycan təbiətinə olan sonsuz məhəbbət, onun əzəməti və gözəlliyini sənətkarlıqla təsvir etmək bacarığı parlaq surətdə nəzərə çarpır.

Məmməd Rahimdə təbiətin təsviri mücərrəd xarakter daşımır. O, təbiət gözəlliyini insan həyatının gözəlliyi kimi seçir. Təbiətə müraciət edərkən şair dünyanın əbədi baharı olan insana müraciət edir. Bu cəhətdən onun “Bahar müjdə gətirsin” şeri səciyyəvidir.

Yenə atıl cürətlə, qanlı düşmən bağrını yar.
Cəbhələrdən cəbhələrə şığıyaraq nərə çək.
Hümmətilə ana yurda gülsün azad gələcək.
Düşmən alsın fəsillərdən yenə ölüm payını,
Bu ölkənin ad qazanmış aprelini – mayını
Qışdan yaman hiss eləsin, titrəyərək o zağ-zağ...
Azadlığın gülü açsın öz ətrini saçaraq.
O zamanlar cəbhələrdən əsən bahar yelləri
Qalibiyyət xəbər verib, müjdələsin elləri.

Böyük Vətən müharibəsi illərində Məmməd Rahimin yaradıcılığı xalqımızın faşist barbarlığına qarşı apardığı mübarizədə mənəvi qüvvəsini səfərbər etmək işində mühüm rol oynamışdır. Xalqını, onun azadlıq və istiqlaliyyətini sonsuz məhəbbətlə sevən vətənpərvər şair

var səsi ilə dilə gəlmişdi. Onun əsərləri mədəniyyətin və tərəqqinin düşməni olan vəhşi faşistlərə qarşı alovlu nifrətlə doludur.

Onun "Üç qardaş", "Müqəddəs kədər", "İkiqat cinayət", "Aslanım partizandır", "Sənsiz", "Yenə gördüm səni, gözəl Moskva" və bir çox başqa şeirləri geniş oxucu kütlələri arasında böyük şöhrət qazanmışdır. Bəstəkarlarımız Məmməd Rahimin gözəl şeirlərinə musiqi bəstələmiş və bu nəğmələr Azərbaycan hərbi hissələrində geniş yayılmışdır.

Məmməd Rahim yaradıcılığında beynəlmiləlçilik motivləri öz parlaq ifadəsini tapmışdır. Şair möhkəm inanır ki, SSRİ xalqlarının birliyi və sarsılmaz dostluğu bizim azğın düşmən üzərində ümumi qələbəmizin rəhnidir.

Moskva altındakı böyük döyüşlərdən sonra öz qalib paytaxtına gəlmiş şair bütün sosialist Vətənimizin ürəyi və beyni olan böyük şəhərin qalibiyyətindən duyduğu səadət və qüruru tərənnüm edir:

Yenə gördüm səni ey gözəl şəhər,
Silindi qəlbimdə yer salan qəhər,
Yenə aldı məni isti qoynuna,
Kremlin yanında bir gözəl bina.

Məmməd Rahim bir çox şeirlərinin şanlı Leninqrad, Sevastopol, Stalinqrad şəhərlərinin qəhrəman müdafiəçilərinə həsr etmişdir. O, alman faşistlərinin zülmü altında inləyən qardaş Ukrayna və belorus xalqının iztirab və məşəqqətləri haqqında da az yazmamışdır.

"Biz yenə də qayıdarıq" adlı gözəl şerində şair müvəqqəti olaraq öz dinc ocaqlarını, səadət və azadlığını itirmiş insanların yenə də öz vətənlərinin sahibi olacaqlarına möhkəm inamını tərənnüm edir.

Siz ey hər gün əzab çəkən saf vicdanlar, ürəklər!
Yarpağına qan çilənmiş solan güllər, çiçəklər!
Sən ey viran qalan böyük incəsənət ocağı!
Ukraynanın bol məhsulu, bərəkətli torpağı,
Ey baş alıb, axıb gedən, qan çağlayan ləpələr,
Siz ey qışın çovğununda yurdsuz qalan körpələr!
Keçdinizsə cəlladların mərhəmətsiz çənginə,
Yaxınlarda bu yerlərə qayıdarıq biz yenə!

Şair top və mərmi gurultusundan məhəbbətin incə səsini seçir. O, müharibə şəraitində daha da möhkəmlənmiş əxlaq, ailə həyatının saflığı, dostluq və sədaqət hisslərindən söhbət açır.

Çox da böyük olmayan bir məqalədə Məmməd Rahimin bütün yaradıcılığını əhatə etmək çətindir. Onun şeirləri Azərbaycandan xeyli uzaqlarda da məşhurdur. Bu yaxınlarda Moskvada Sovet Yazıçıları İttifaqı klubunda Azərbaycan şeri gecəsi keçirilmişdir. Orada ən yaxşı tərcüməçi şairlər və aktyorlar Məmməd Rahimin şeirlərini oxumuşlar. Etiraf edirəm ki, məndə də Məmməd Rahimin müdrik və saf lirikasına qarşı nəcib qibtə və heyranlıq hissləri dilə gəldi.

Bizim düşmən üzərində tam qələbə çalacağımız gün uzaqda deyil. O gün gələn zaman biz tam hüquqla Azərbaycanın ən yaxşı şairlərindən biri olan Məmməd Rahimin gözəl sözlərini təkrar edərik:

Gəl ey qalibiyyət, şanlı zəfər, gəl!
Gətir ağ günümdən yenə xəbər, gəl!
Sən mənim həyatım, ömrüm, tacımsan,
Sən mənim əbədi ehtiyacımsan,
Səninlə nə gözəl günlərim vardır,
Səninlə Vətənim bir laləzardır.

*1943*

## ŞAİRİN EŞQİ

Şeir ilhamdır! Şeir rübabı əllə qayırılmış çalğı alətlərinə bənzəməz. Bu rübabın simləri insan qəlbinin gözlə görünməyən telləridir. Bu zərif və incə rübab mahir ustalar əli ilə çalındığı zaman biz ona valeh oluruq, o, bütün varlığımızı bir ahənrüha kimi özünə çəkir, onun mənalı və titrək səsi bizi düşündürür..., ağladır, sevindirir, bəzi böyük əməllərə, geniş fəzalara çağırır. Biz belə şeirləri oxuduğumuz zaman onların dadlı və mənalı səsində insan sözünün böyük qüdrətini görürük. Biz özümüzlə fəxr edirik, yarandığımıza sevinirik! Biz şeir pərisi ilə xoş rəftar etdiyimiz zaman, onun incə və saf ruhunu bir bahar nəsimi kimi oxşadığımız zaman o, bizim qəlbimizdə yuva salır, bizi əbədi bir eşqlə sevir, bizdən – insandan ayrılmağı özünə böyük bir fəlakət sayır! O, sanki dil açıb bizə deyir: mən insana minnətdaram! Mənim rübabımın qəlbini duyan, onun simlərini öz səsi..., öz nəfəsi ilə danışdıran insan əlləridir. Mən öz şirin nemətlərimi sizə halal eyləyirəm! Qoy dünya durduqca mənim yurdum və yuvam insanın könül mülkü olsun!

* * *

Şeir rübabı öz mahir səsi ilə aləmi valeh edən bir dünya gözəlidir. Lakin hər dünya gözəlinin bir faciəsi olduğu kimi, onun da öz faciəsi var! Bəzən bu gözəl rübab naşı ustalar əlinə də keçir. Qaba əllər bu gözəl rübabı kökdən salır, onun hər simindən əcaib və eybəcər səslər yaranır. Bu eybəcər səslər öz naşı ustalarına xoş gəlsə də, şeir pərisi onlardan küsür, o, bir də naşı sənətkarlar qəlbində yuva salmamağa and içir! O, bir dövlət quşu kimi həqiqi ilham və qəlb sahiblərinin başına qonur, öz könlünü və eşqini əbədi olaraq onlara tapşırır.

* * *

Mən, şair Əhməd Cəmilin çaldığı şeir rübabını dinləyirəm. Bu rübabın tellərindən qopan zərif və mənalı nəğmələr nə qədər dadlı və təbiidir! Bunlar saf dağ çeşmələri kimi şırıl-şırıl axır, ilk baharın gülləri kimi ətir saçır. Bu nəğmələrdə zorlanmamış, heç bir təzyiq altına alınmamış bir qəlbin, həm də həqiqi bir şair qəlbinin çırpıntıları səslənir! Mən həqiqi şair dedim. Bu, həqiqi ilham deməkdir. Əsil ilham könüllər yolçusu, könüllər aşiqi olan bir şairin hünəridir:

Kim bəstəkar könüllü, şair xəyallıdırsa,
Bu bəxtiyar günləri tərənnümdən yorulmaz.
Mənə verin sazımı, onsuz məclis qurulmaz,
Onsuz dərya könüllər dalğalanıb durulmaz...

Öz şeir rübabını belə qəlblə sevən şairə eşq olsun! Mən belə bir şair haqqında mülahizələrimi deməyi özümə tarixi bir borc və vəzifə bilirəm.

* * *

Bu nəğməkarın oxuduğu havalar müxtəlifdir. Lakin onların hamısı eyni səsin müxtəlif hava dalğalarıdır! Bütün bu rəngarəng nəğmələr eyni qəlbin müxtəlif çırpıntılarıdır. Eyni qəlb –üslub deməkdir! Öz üslubunu təyin etmək və ona daima sadiq yaşayıb-yaratmaq şair üçün səadətdir! Başqalarının söz, düşüncə və duyğu pərdələri altında gizlənib qalmaq isə şair üçün fəlakətdir!

Sənətin böyük bir düşməni var: yamsılamaq! Yaradıcılığın qəlbinə soxulmaq istəyən bir iblis də var: yaradılmışlara – yaraşmaq... Sənət əzəmət və vüqar deməkdir! Əgər sənin dediyin xırdaca bir söz özünə məxsusdursa, sən vüqarlı adamsan! Sənin dediyin böyük bir söz başqasınındırsa, sən vüqarsız adamsan! Demək ki, sən sənətkar deyilsən!

Əhmədin sözləri onun özünə məxsusdur. O, heç kəsin kölgəsində yaşamaq istəmir! Onun vüqarı başqa qalıblara sığa bilməz! Məhz buna görə də Əhməd Cəmil əsərləri şerimizdə olan bir çox yekrənglik, bir-birini təkrar xəstəliyindən uzaqdır!

* * *

Şair ilhama hörmət etdiyi kimi, sözə də hörmətcil olmalıdır. Söz ilhamın qapısıdır. Böyük bir ilham zəif bir sözlə ifadə oluna bilməz. Şeir dili boşboğazlıq sevməz. O, az sözdə böyük məna tələb edir.

“Moskva, Noyabr... Qırx birinci il.
Tarix yaddaşından silinən deyil!”

Bu xüsusiyyət də bir şairə nəsib olan nemət deyil!

Şeir humanizmdir. Şairin insanlara, ictimai hadisələrə olan baxışında dərin bir humanizm olmadan böyük sənət əsəri yaratmaq olmaz. İnsanı sevməyi bacaran bir şair insanlıq hüquqlarını tapdalamaq istəyən qara qüvvələrə nifrət etməyə bilməz. Buna görə də, şeir pərisi bütün haqsızlığa dəhşət və faciələr törədən qüvvələrə qarşı amansız və barışmazdır! Humanizm yalnız məhəbbət deyil. O, eyni zamanda məhəbbəti yaşatmaq üçün cəbhələrdə döyüşən müsəlləh bir əsgərdir.

Buna görədir ki, Əhməd Cəmil XX əsrə bir taun azarı gətirən indiki dəhşətli müharibəyə biganə qalmadı. Şairimizin səsi haqq və ədalət arzusunun tərəfindədir. Biz buna sevinirik. O öz incə rübabında çaldığı nəğmələrlə həyat və səadət ordumuzun qəlbinə ilham və qüvvət verir, qəhrəmanlarımızın mərd əllərini alqışlayır, həyat və azadlıq bayquşlarının törətdiyi dözülməz faciələrin bədii tablosunu verir. Əhmədin yazmış olduğu “Nişan üzüyü” şerini bir də xatırlayaq:

“Qarlı düzdən uçub qonur komaya qış axşamı,
Şölə çəkir kənd evinin titrək yanan ağ şamı.
Əsgərlərin miz üstünə əyilmişdir başları,
Qəzəbdənmi, kədərdənmi çatılmışdır qaşları.

Şamın solğun işığında bir qılınc, bir üzük var,
Qılınc qanlı, üzük qanlı!.. hər könüldə qəm, qübar...
Şam əriyir, ocaq sönür, hamı dalğın, hamı lal...
Buz bağlamış pəncərədən baxır solğun bir xəyal:
O tanıcaq üzüyünü, ala gözləri dolur,
Sonra yenə buz bağlamış pəncərədən yox olur!"

Əhməd Cəmil faşizmin törətdiyi bu qanlı faciənin şəklini mahir bir rəssam fırçası ilə çəkir! Bu səhnə bizim xatirə və hafizəmizdə nəqş olub qalır! Bu yol həqiqi şeir yoludur ki, hər cür sözçülük, uraçılıq və ritorika dediyimiz bataqlıq və çirkabdan təmiz olan bir yoldur!

Əhmədin "Laylay" şerini də xatırlayaq:

"Atan sənin bir igiddir büsatlı,
Çil papaqlı, yapıncılı, boz atlı.
Düşmən üstə şığıyanda deyirsən,
Qızıl quşdur, uçur şimşək qanadlı.
İgidlikdə el tanımır ona tay,
Laylay gülüm, laylay balam, a laylay."

Bu şeirdə indiki müharibənin alovları içində öz qəhrəmanlıq tarixinə yeni səhifələr yazan xalqımızın vüqar və fəxr hissi yaşayır! Analarımız nə qədər dəyişmişdir! Onlar öz körpə balalarının qulağına qəhrəmanlıq laylaları oxuyur. Sabahkı insan bugünkü atasının hünər bayrağına sahib olmalı, onun şərəfini daha ucaltmalıdır. Əhməd xalqımızın daxili aləmində yaranmış bu böyük dəyişikliyi öz şair gözü ilə görür və özünə məxsus, hay-küysüz bir səslə ifadə edir!

Məncə, bu ana laylaları yaranmaqda olan yeni Koroğlu dastanlarımızın bir başlanğıcı olmalıdır. Unutmayaq ki, o dastanlar da ana və atalarımızın mürəkkəbsiz yazılmış könül dəftərlərində yaranmışdır!

Əhməd Cəmil şeirlərinin sənətkarlığına gəlincə, onlar saf və təmiz bir bahar havası kimi asan udulur, günəşin ılıq təravəti kimi bizim sinirlərimizi oxşayır. Çünki onun şair qəlbində günəşin kiçik bir zərrəsi var! Mən bu gözəl şeir səhərinin daha bol işıqlı, daha aydın və parlaq olacaq günorta çağını arzu edir və səbirsizliklə gözləyirəm!

*1943*

## DÖVRÜMÜZÜN YÜKSƏK SƏNƏT ƏSƏRLƏRİ UĞRUNDA

Dörd gün davam edən Azərbaycan yazıçılarının ədəbi konfransı qurtardı. Konfransda Səməd Vurğunun "Müharibə və Azərbaycan ədəbiyyatı", Məmməd Arifin "Poeziya", Əkbər Ağayevin "Dramaturgiya", Əziz Şərifin "Nəsr" və Cəfər Cəfərovun "Müharibə dövrü ədəbiyyatının bəzi məsələləri" haqqında məruzələri dinlənilmişdir.

Hər şeydən əvvəl, konfransın yüksək nəzəri və yaradıcı səviyyədə keçdiyini qeyd etmək lazımdır. Şübhəsiz, o, gözlənilən nəticəni verdi və nəinki ədəbiyyatımızın ümumi inkişafına, hətta ayrı-ayrı Azərbaycan yazıçılarının yaradıcılıq yüksəlişinə də böyük xeyir verəcəkdir. Konfransı çağırarkən biz yazıçılarımızın, minlərlə oxucu kütlələrinin nəzərini yaradıcılıq və ədəbiyyat məsələlərinə cəlb etmək istəyirdik. Bu cəhətdən konfransın yekunları mənə ədəbiyyatımızın ən mühüm, ən müasir məsələlərinə toxunan böyük bir tənqidi əsər təsiri bağışlayır.

Müasir Azərbaycan ədəbiyyatının keyfiyyətini daha da yüksəltməli – konfransın şüarı, onun respublika yazıçıları qarşısında qoyduğu əsas məsələ bu idi. Konfrans qeyd etdi ki, Azərbaycan poeziya və nəsrinin böyük nailiyyətlərinə və dramaturgiya cəbhəsində müəyyən irəliləmələrə baxmayacaq, əjəbiyyatımız hələ də ağır məhrumiyyətlərlə yaşadığımız Vətən müharibəsi dövrünün kifayət qədər dərin, bədii və fəlsəfi cəhətdən dərk edilmiş, ümumiləşdirilmiş təsvirini verən əsərlər yaratmamışdır. Təbiidir ki, bədii ədəbiyyatın vəzifəsi bəzi yazıçıların çox zaman məhdudlaşdığı – həyat və mübarizəmizin çoxlu xırda faktlarını əks etdirməkdən deyil, məhz ətrafımızda baş verən hadisələrin tarixi və fəlsəfi mənasını açmaqla zəmanəmizin qabaqcıl ideyalarını göstərməkdən ibarətdir. Yalnız bu, yaratdığımız bədii əsərlərin uzun müddət yaşamasına, dərinliyinə və geniş yayılmasına səbəb ola bilər. Halbuki təcrübə göstərir ki, müharibə günlərində bədii sözün böyük rolunu başa düşməyən və ya qiymətləndirə bilməyən bir sıra yazıçılarımızın yaradıcılığı hadisələri yüngül, başdansovma təsvir etmək cəhətdən axsayır, sxematikliyə, bəzən də ədəbi bayağılığa gətirib çıxarır.

* * *

Konfrans böyük yaradıcılıq cəsarəti nümayiş etdirdi. Təkcə kiçik və orta həcmli əsərlər deyil, ümumun qəbul etdiyi, müəyyən dərəcədə

nöqsanlı olan Səməd Vurğunun "Vaqif" və "Fərhad və Şirin", M.İbrahimovun "Məhəbbət", S.Rüstəmin "Qaçaq Nəbi", M.Hüseynin "Nizami", S.Rəhimovun "Medalyon", Mir Cəlal və Əbulhəsənin hekayələri və s. kimi böyük həcmli əsərlər də kəskin və haqlı olaraq tənqid olundu.

İlham və sənətkarlıq haqqında məsələ Azərbaycan ədəbi həyatının ən zəruri məsələsi kimi ciddi qoyuldu. Sovet yazıçısı dərin məhəbbətlə sevməyi və bütün varlığı ilə nifrət etməyi bacarmalıdır. Ürək bədəni qanla qidalandırdığı kimi, ilham da əsərə hərarət verən alovdur. Ona görə də böyük, istedadlı əsərlər uğrunda mübarizə, hər şeydən əvvəl, həqiqi ilham, qəlbin atəşi, yüksək ideya, bədii təfəkkürü qartal kimi yüksəklərə qaldıran geniş qanadlar uğrunda mübarizə deməkdir. Axı bizim zamanda incəsənətin üfüqləri bəzən bizim təsəvvür etdiyimizdən daha genişdir! Konfransda çıxış edərək poeziya, dramaturgiya və nəsrimizdə məhəbbətsiz və nifrətsiz və yaxud çox kiçik ilhamın hərarəti ilə yazılmış əsərlərin az olmadığını göstərən yoldaşlar tamamilə haqlıdırlar.

Belə əsərlərin müəlliflərinə nə demək olar? Əgər yazıçı özü həyəcanlanmırsa, o, oxucuları həyəcanlandırmağa qadir ola bilməz. Dərin hiss etdiyin və mənən dərk etdiyin mövzuların bədii həllinə girişmək lazımdır. Konfransda həqiqi ilhamdan məhrum, yazıçının təbii tələbinə daxilən təkan verməyən yaradıcılığa misal olaraq, əsil dramatik əsərdən daha çox səhnələşdirilmiş oçerki xatırladan "İntiqam" və "Aslan yatağı" pyesləri göstərildi.

Konfrans nə kimi nəticələrə gəldi? O, müharibə günlərində yaranan, gözəl bədiiliyi ilə fərqlənən və birinci növbədə Vətənimizin şanlı müdafiəçilərinə həsr edilən bir çox əsərlərin timsalında çox inandırıcı və aydın surətdə göstərdi ki, Azərbaycan ədəbiyyatı xalq qarşısında öz vətəndaşlıq borcunu şərəflə yerinə yetirir. Müharibə günlərində ədəbiyyatımızın partiyalılığı və inqilabi ruhu onun döyüşkənliyi, vətənpərvərliyi və həqiqi beynəlmiləlçiliyi xüsusi qüvvətlə özünü göstərdi.

Lakin sovet xalqının faşist tauncuna qarşı böyük tarixi mübarizəsi ədəbiyyatımız qarşısında yüksək tələblər qoyur. Konfransda ən çox məhz bu tələblər haqqında danışıldı. Bizə müharibə nəticəsində həyatımızda əmələ gələn böyük dəyişikliklərin, bu müharibənin yaratdığı qəhrəmanların aydın və həqiqi təsviri lazımdır. Belə əsərlər nəinki bu gün, hətta sabah da gərəkli, qiymətli bədii sənəd rolunu oynamalıdır.

Biz ayrı-ayrı yazıçıların arxanın və cəbhənin döyüşçüsü – sovet adamının surətini bəsitləşdirmək və məzmunlaşdırmaq təşəbbüsünə qarşı var qüvvəmizlə, qızğın surətdə mübarizə aparmalıyıq. Oxucu qəhrəmanlar haqqında olan əsərlərdən bəsit, quru sxemlər deyil, bahadır sovet döyüşçüsünün romantik vüsətdə verilməsini tələb edir. Biz hələ də romantikadan qorxuruq, halbuki sosializm realizminə, eləcə də həyatımızın özünə romantika heç də yad deyildir.

Digər vacib məsələlərdən biri də müharibə dövrü ədəbiyyatının spesifikası ilə əlaqədardır. Bu ədəbiyyatın əsas vəzifəsi heç də (tənqidçi Cəfər Cəfərovun səhv olaraq iddia etdiyi kimi) müharibənin texniki tərəfini təsvir etməkdən deyil, vətənpərvər sovet döyüşçüsünü onun vətənə olan böyük məhəbbəti və qalibiyyət əzmi, zəngin mənəvi aləmi və məğlubedilməz xarakteri, xeyrin şər üzərində qələbəsinə, həqiqətin ədalətsizlik üzərindəki təntənəsinə olan dərin və müqəddəs inamı ilə tərənnüm etməkdən ibarətdir.

Konfrans xüsusi olaraq qeyd etdi ki, müharibə heç də tarixi mövzunu gündəlik məsələlərdən kənarda qoymur. Əksinə, müharibə dövründə o, daha mühüm xarakter daşıyır. Sovet döyüşçüsü çox gözəl bilir ki, o, mənfur düşməndən yalnız bu gününü və gələcəyini deyil, böyük keçmişini də müdafiə edir. Azərbaycanın milli qəhrəmanlarının, keçmişin böyük dövlət xadimlərinin surətlərini yaratmaq zəruriyyəti bizim qarşımızda yeni qüvvət və kəskinliyi ilə durur.

Konfrans böyük sənət əsərlərini yalnız şəxsiyyətin zehni cəhətdən inkişafını göstərmək əsasında yaratmaq mümkün olduğuna şərik çıxan bəzi yoldaşların fikrinin səhv olduğunu göstərdi. Görünür, bu yoldaşlar yaddan çıxarırlar ki, sovet ədəbiyyatı həmişə milyonların ədəbiyyatı olmuş və olacaqdır. Biz hər bir sadə fəhlə, kolxozçu və ziyalıda böyük mənəvi aləmin zərrəsini, xalqımızın müdrikliyini və həssaslığını tapa bilər, həyatımızın və tariximizin fəlsəfəsini görə bilərik.

Konfransda Azərbaycan ədəbiyyatının milli koloriti məsələsi də müzakirə olundu. Bu məsələdə hamı bir fikrə gəldi ki, xalqın bütün xüsusiyyətləri, dünyagörüşü, zövqü və psixoloji xassələrini əks etdirən həqiqi milli ədəbiyyatın yaranması, eyni zamanda, sosialist, ümumbəşər ədəbiyyatın yaranmasıdır.

Dörd gün davam edən konfransda meydana çıxan və müzakirə edilən məsələlər əsasən bunlardır. Konfrans böyük bir inam oyatdı ki, bəşəriyyətin və mədəniyyətin düşməni alman vəhşilərinə qarşı Qızıl

Ordunun mərd və qalib mübarizəsindən ilhamlanan Sovet Azərbaycanının yazıçıları Vətən müharibəsi haqqında qəhrəmanlıq epopeyasını yarada bilər, bizim günlərin "İskəndərnamə"sini yaza bilərlər. Bu çətin və şərəfli vəzifə bu gün hər bir Azərbaycan yazıçısının istedadına, bacarığına və zəhmətsevərliyinə həvalə olunur.

*1943*

## VƏTƏN MÜHARİBƏSİ VƏ ƏDƏBİYYATIMIZ

(*Azərbaycan Sovet yazıçılarının ədəbi yaradıcılıq konfransında məruzə*)

Biz tarixi günlər keçiririk. Yaşadığımız dövr mürəkkəb olduğu kimi, həyatımız, ictimai şüur və anlayışlarımız da mürəkkəbdir. Biz tarixin görmədiyi vüsətli və dəhşətli bir müharibə şəraitində yaşayır və yaradırıq. Zamanın nəbzi çox bərk vurur. Həyat və ölüm qılıncları üz-üzə çarpışır. Əfsanə dili ilə desək, işıq və səadət tanrısı Hümrüz zülmət və ölüm tanrısı Əhrimənlə yeni bir tarixi şəraitdə üz-üzə gəlmişdir. Zamanın döyüş meydanında müxtəlif rəngli ordular və müxtəlif rəngli bayraqlar görünür. Bunların hamısının tarixi mənası, ictimai kökü və özünə məxsus fəlsəfi mənaları vardır. Yeri gəlmişkən deyim ki, bir söz ustaları şahidi olduğumuz ictimai hadisələrin zahiri şəkillərini deyil, onların məna lövhələrini yaratmalıyıq. Sənət və yaradıcılıq, hər şeydən əvvəl, məna deməkdir. Məna gözəlliyi – əbədi gözəllikdir! Mənalı sənət əsəri isə əbədi bir gözəl deməkdir.

Müharibənin odları və alovları içində bizim sənət rübabımız susmadı. Əksinə, bu rübabın həyat və mübarizəsi səfərbər bir əsgər kimi cəbhələrdən gəlir. Nə üçün bizim rübabımız müharibə şəraitində susmadı? Onu yaşadan və onun nəğmələrinə qanad verən amil nədir? Hansı qüvvət və ilhamdır?

Bu suala cavab vermək üçün qarşımıza belə bir sual da qoyaq. İndiki müharibə meydanlarında ən qüdrətli əsgər kimdir? Mən belə bir cavab verirəm: azadlıq və istiqlaliyyət nemətinin mənasını daha artıq dərk etmiş, daha zəngin mənəvi bir dünya ilə silahlanmış bir əsgərdir! Biz sovet yazıçıları da bu əsgərlər ailəsinin bir üzvüyük. Biz də uzun illər boyu sosializm cəmiyyəti şəraitində əsil azadlığın nə olduğunu

duyan istiqlaliyyət və səadətin nemətləri ilə böyümüş insanlarıq. Ona görə də bizim sənət rübabımız müharibə şəraitində müsəlləh bir əsgərə döndü. O, nə üçün vuruşduğunu, qan tökdüyünü dərindən duyur və anlayır, yuxusuz gecələr, boranlı və fırtınalı zamanlar bu sənət məşəlinin gözlərini qamaşdıra bilmir.

* * *

Müharibə dövrünün Azərbaycan ədəbiyyatı öz yeni nemətləri ilə fəxr etməlidir. O öz vətəndaşlıq vəzifəsini namus və şərəflə ifa edir.

Ədəbiyyatımız öz mübariz və revolyusion ruhunu müharibə şəraitində yeni, daha canlı bir formada göstərdi. Öz demokratik, inqilabi və milli ənənələrinə sadiq yaşayan ədəbiyyatımız azadlıq və istiqlaliyyətimizin keşiyində duran bir əsgərdir.

Biz revolyusion ruh dediyimiz və düşündüyümüz zaman bunu özümüzün milli tariximizlə bağlamaya bilmərik. Bu isə bizim tənqidçilərimizin, ədəbiyyatşünaslarımızın qarşısında duran vəzifələrdən biridir. Məncə, Azərbaycan ədəbiyyatı Şərq aləmində ən revolyusion, ən proqressiv ədəbiyyat olmuşdur. Ta Nizami dövründən başlayaraq indiyə qədər gələn milli ədəbiyyatımızın revolyusion və proqressiv ruhu ilə bir azərbaycanlı olaraq fəxr etməliyik!

Ədəbiyyatımız xalqımızın hörmət və məhəbbətini döyüşlərdə qazanmış bir bahadırdır! Müharibə dövründə yaradılmış yüzlərcə şeir, onlarca hekayə, oçerk, bədii publisistika, bir çox dram əsərlərimiz ədəbiyyatımızın boy artımını açıqca göstərir. Mən müharibə dövründə yaranmış ədəbi əsərlərimizin bir xüsusiyyətini qeyd etməliyəm. Əgər müharibə dövrünə qədər xüsusən şerimizdə ümumi mücərrəd düşüncələrə təsadüf edirdiksə, müharibə dövrünün əsərlərində konkret insanlar, hadisələr,əhval-ruhiyyələr əsasında yaranmış bədii əsərlərə daha çox rast gəlirik. Yaşadığımız dövr yeni insanlar yaratdığı kimi, yeni əsərlər də yaradır. Müharibədən əvvəl Qüdrətov yaxud Məmişov, Mirzəxəyal kimi obrazlar yarana bilməzdi. Bu konkret bədii şüuru Süleyman Rəhimova, Mirzə İbrahimova və Mir Cəlala diktə edən yaşadığımız müharibə dövrüdür. Bu misallardan şerimizdə və hekayələrimizdə də göstərmək mümkündür.

Müharibə dövrü Azərbaycan ədəbiyyatının verdiyi ən dəyərli və öz bədii keyfiyyəti etibarilə yüksək, zəngin əsərlərdən qısaca bir siya-

hını sizə təqdim etməliyəm. Hərçənd siyahı oxumaq ümumiyyətlə mənim xoşuma gəlmir. Yoldaş M.Rahimin “Onu Don qucaqladı”, “Aslanım partizandır”, “İkiqat cinayət”, Süleyman Rüstəmin “Ana və poçtalyon”, Osman Sarıvəllinin “Gətir, oğlum, gətir”, “Panamalı dilənçi”, “Körpə quzu”, Əhməd Cəmilin “Bəxtiyar”, “Nişan üzüyü”, “Açıl, ey səhər”, Rəsul Rzanın “İntiqam”, Zeynal Xəlilin “Tatyana” və qeyriləri.

Azərbaycan sovet şairlərinin şeirləri müharibə şəraitində məzmun və bədiiyyat etibarilə inkişaf etmişdir. Bu şeirlərin hamısı xalqımızın və ordumuzun dilində əzbər olan və bizim cəbhədəki mübarizəmizi təşkil edən, xalqımızın yeni duyğularını ifadə edən əsərlərdir.

M.S.Ordubadinin “Gənc çekistlər” əsəri və tarixi memuarları, Süleyman Rəhimovun “Medalyon”, “Qüdrətov”, “Torpağın səsi”, “Su ərizəsi”, Mir Cəlalın “Vətən yaraları”, Əbülhəsənin “Oxu, bülbülüm”, “Sahildə”, “Görüş yeri” və başqaları, İlyas Əfəndiyevin “Durnanın günahı”, Əli Vəliyevin “Ərköyün”, H.Mehdinin “Moskva oçerkləri”, “Nişan üzüyü”, M.Ənvərin “Analar yollara çıxdı”, “Qəribə atəş” və qeyriləri... Nəhayət, gənc nasirlərimizdən Yusif Əzimzadənin “Sən yetim deyilsən” hekayələri mənim, hələlik, çox xoşladığım əsərlərdir.

Bundan başqa, müharibə dövründə bizim dramaturgiyamıza gəlincə, biz bu sahədə aktiv bir proses görürük. Bu proses həm bizim ədəbi siyasətimiz, həm də teatr sənətimizin və sənət işçilərimizin apardığı teatr yaradıcılığının gözəl bir nəticəsidir. Yəni onu görürük ki, Azərbaycan ədəbiyyat ordusunun ən qüdrətli yazıçıları dramaturgiya aləminə doğru hərəkət edir. Mən təkrar edirəm ki, bu hərəkat əsasən müsbət bir hadisədir və bu işdə xüsusən bizim teatr işçilərimizin, teatr bədii rəhbərlərimizin zəhməti, kömək və təşəbbüsü təqdirəlayiq olmalıdır. Lakin bu hərəkatın həm müsbət, həm də mənfi cəhətləri vardır. Müsbət cəhəti bundadır ki, dram ümumən ədəbiyyatın aktiv formalarından biridir. Bu aktiv formanın, yəni səhnəmizin daha zəngin əsərlərlə bəzənməsi uğrunda ədəbiyyat ordumuz gərək mübarizə aparsın. Lakin bu hadisənin kölgəli bir cəhəti də var ki, onu görməyi bacarmalıyıq.

Bəzi yazıçılarımız dramaturgiyaya bir moda kimi gəlir. Mən təkrar edirəm – dramaturgiyaya doğru gələn yazıçılarımızın bəziləri daxili bir yaradıcılıq zərurəti nəticəsində gəlmirlər.

Dramaturgiyanın böyük sirlərini öyrənməmiş, dramaturgiya sənətinə hakim olmamış və gözlənən dram əsərlərini yaratmağa qadir olmayan

yazıçılar da dram əsərləri yazır və səhnəmiz də öz qapısını onların üzünə həddən artıq açır. Bu da həmin hərəkətin mənfi cəhətidir ki, bunu biz qeyd etməliyik.

Əgər biz dramaturgiya aləmində formaya nə qədər əhəmiyyət versək və nə qədər səhnəmizə çox əsərlər yazmaq istəsək də hamıya qarşı güzəştə getsək, bizim səhnəmiz istədiyi kamil əsərləri yarada bilməz, yaxud çox gec yarada bilər.

Müharibə dövründə bizim səhnəmizdə əsas etibarilə beş əsər getmişdir. Qeyd etməliyəm ki, bu əsərlərin içərisində ikisi özünü göstərir. Mirzə İbrahimovun "Məhəbbət" əsəri öz bədiiliyi etibarilə, özünün səhnəyə gətirdiyi yeni motiv, yeni tema etibarilə, bununla bərabər, yaratdığı yeni insan xarakteri və yeni insan obrazları ilə bədii bir əsərdir.

Mehdi Hüseynin "Nizami" əsəri, hərçənd ki, mənim fikrimə görə, avtor Nizaminin şəxsi obrazını böyük şair və filosof dühası ilə yaratmaq qüdrətindən aciz qalmış, ümumiyyətlə əsər yaxşı dramlardan hesab olunmalıdır. Sonra "İntiqam", "Aslan yatağı", "Vəfa" bilavasitə müharibə dövründən və cəbhələrdən danışan əsərlərdir. Heç şübhəsiz ki, bunların bugünkü tamaşaçılarımız üçün, onların əhvali-ruhiyyəsi üçün və bugünkü mübarizəmiz üçün müəyyən dərəcədə qiymətləri vardır.

Teatrımızı da bu əsərləri tamaşaya qoymaqda müqəssir tuta bilmərik. Lakin dramaturgiya və yüksək bədii əsər nöqteyi-nəzərindən, məncə, bunlar dramaturgiya əsərlərindən çox səhnələşdirilmiş oçerklərə bənzəyir. Çünki burada nə kamil insan xarakterləri, nə dolğun ictimai hadisələr və konfliktlər var. Heç bir rejissor əli, rəngarəng səhnə işıqları, rəssamın verdiyi zəngin quruluş, incə telli musiqi nəğmələri mənası dayaz olan əsərləri öz arxasında gizlədə bilməz. Lakin qeyd etməliyəm ki, yazacağımız böyük dram əsərləri müharibə dövründə yaranmış və yaranmaqda olan ədəbiyyatın təcrübə, axtarış və sınaqlarından doğacaqdır.

Digər tərəfdən, mən əsas bir məsələni də qeyd etməliyəm. Dram janrına çox da məftun olmağın zərərli bir cəhəti də var. Unutmaq lazım deyildir ki, müasir müharibə dövrünün geniş vüsətini, onun zəngin mənəvi aləmini vermək üçün böyük romanlar və dastanlar janrına keçmək zamanı gəlib çatmışdır.

Mən iddia edirəm ki, Nizaminin yazdığı "İskəndərnamə" dastanını bizim səhnədə onlarla dram əvəz edə bilməmişdir. Böyük romanlar və dastanlar yaratmaq böyük enerji və yaradıcılıq cəsarəti tələb edir. Bir çox yazıçılarımız bu ağır zəhmətdən və böyük cəsarətdən qorxurlar.

Aldığımız cəbhə məktubları göstərir ki, döyüşçülər bizim şeirlərimizi və hekayələrimizi oxuyaraq and içib hücuma keçirlər. Ədəbiyyatımızın bu sağlam ruhunu görməyənlər yalnız spektiklərdir. Aldığım bir məktubda bir döyüşçü yazır ki, Mir Cəlalın "Vətən yaraları" hekayəsini oxuduqdan sonra mən düşmənə qarşı daha kinli və amansız oldum. Yaxud, mərkəzi mətbuat bizə xəbər verir ki, yoldaş S.Rəhimovun "Medalyon" əsəri döyüşçülərimiz arasında böyük həvəs və maraqla oxunur. Əhməd Cəmilin və başqa şairlərimizin əsərlərinin döyüşçülərimiz tərəfindən əzbərlənməsi bizi sevindirməyə bilməz. Demək lazımdır ki, bəzi tənqidçilərimiz hələ də ədəbiyyata səyyah kimi gəlib, ötəri bir baxışla mülahizələr yürüdürlər. Ədəbiyyatın vuran nəbzini, çarpan ürəyini hiss etmirlər. Ədəbiyyata hazır formullar və düsturlarla yanaşmaq olmaz. Bizim tənqidçilərimiz filosof olmalıdır. Ədəbiyyatda ayrı-ayrı zahiri faktlardan yapışmaq deyil, onun böyük daxili mənasında yaşayan tarixi motiv, arzu, ənənələrdən, istək və diləklərdən, ideyalardan yapışmalıdır! Tənqidin ruhu ədəbiyyatımızın proqressiv hərəkatı, axını ilə üzvi surətdə yaşamalıdır.

Mən indi hamımızı düşündürən ilham məsələsini qeyd etmək istəyirəm. Müharibə dövründə yaratdığımız istər şerimizdə, istərsə dram əsərlərimizdə və hekayələrimizdə bəzən ilhamsız, bəzən də zəif bir ilhamla yazılmış əsərlərə təsadüf edirik. Bizim apardığımız ədalətli müharibə qəhrəmanlıqdır. Qəhrəmanlıq isə ilhamdır. Bədii əsəri canlı bir insana bənzətsək, onun çarpan ürəyi ilhamdı.

Bu konfrans öz qəlbini bəzən zorlayıb yazan yazıçılarımızı və onların ilhamsız əsərlərini kəskin atəş altına almalıdır.

İkinci məsələ – böyük əsərlər və kiçik dramlar məsələsidir. Sovet ədəbiyyatının böyük məziyyəti odur ki, o öz ilhamının şirəsini geniş kütlələrin, həyatı yaradan insanların mahiyyətindən alır. Belə düşünənlər də var ki, guya böyük əsərləri yaratmaq intellekti inkişaf etmiş ziyalılar həyatından ola bilər.

Ədəbiyyatımızda ziyalılarımızın həyatını dərindən vermək lazım və zəruridir. Dahilər, filosoflar obrazı hələ bizim ədəbiyyatımızda özünə yer tutmamışdır. Xüsusən bizim sovet ziyalıları böyük ilham, yüksək və humanist əməllər daşıyan insanlardır. Lakin intellekt məsələsini yalnız oxumuş adamlarda görmək nəzəriyyəsi bizim nəzəriyyə deyil. Biz yazıçılarımızı elə tərbiyə etməliyik ki, onlar geniş kütlələrin, adi insanların zəngin daxili aləmini, onların həyat və mübarizə fəlsəfəsini verməyi bacarsınlar!

Nizaminin Fitnəsi institut yaxud akademiya qurtarmamışdır. Lakin o öz şüuru ilə Bəhram şaha qalib gəlir. Biz çox vaxt adi insanların zahiri cəhətləri ilə məşğul olduğumuzdan onların adı adi insanlar qalır, əsərlərimiz də adi əsərlər çərçivəsində qalır. Nizami adi insanları böyütdüyü halda, biz bəzən böyük insanları da kiçildirik. Bu işdə müqəssir insanlar deyil, yazıçılardır.

Müharibə bizim şüurumuzda ictimai hadisələrə olan əlaqələri dəyişdiyi kimi, tarixə olan baxışımızda da bir çox dəyişiklik yaratmışdır.

Biz müharibə dövründə tarixi əsərlərin sayını nəinki azaltmalıyıq, onların sayını və məzmununu daha yüksəkliyə qaldırmalıyıq. Nə üçün? İndiki xalqımız və ordumuz yalnız bu gününü deyil, həm də çox zəngin və qəhrəmanlıqlarla dolu olan öz milli tarixini, varlığını təhqir və ölümdən müdafiə edir.

Əsgər mübarizəyə o zaman ilhamla atılır ki, o, böyük xalqa, böyük bir torpağa və şanlı bir gələcəyə sahib olduğuna inanır. Odur ki, müharibədir deyə, tarixi əsərlərə qarşı olan bəzi laqeydliyi mən cinayət hesab edirəm. Əcəba, biz hələ milli tariximizdə “I Pyotr” kimi dillərə düşən və şöhrət qazanmış dastanlar yaratmışıqmı? Yox! Azərbaycanın keçmiş tarixi çox böyük, proqressiv bir tarixdir. Azərbaycan xalqının əcdadı ədəbiyyat renessansını yaratdığı zaman indiki faşistlərin əcdadı çöldə otlayırdı. Odur ki, indiki nəslimiz üçün, xüsusən çocuq və gənclərimiz üçün tarixi əsərlər yaratmaqla, onların ruhunda xalqımızın böyük mənəvi tarixini bütün zənginliyi ilə yaşatmalıyıq.

Biz realistlərik. Sovet ədəbiyyatının ən böyük xüsusiyyəti odur ki, o, realist ədəbiyyatdır. Lakin bu realizmdən sui-istifadə edirik. Buna görə də bəzən əsərlərimizdə realizm çox quru və qaba bir şəkil alır. O əsərlərin təsiri ilə həyatda olan hadisənin heç fərqi olmur. Adi həyat hadisələri təkrar olunur. Halbuki heç bir sənət əsəri adi həyat hadisələrini təkrar etməməlidir.

Əks təqdirdə, o, sənət əsəri ola bilməz. Nə üçün belə olur? Çünki bizim ədiblərimiz və şairlərimiz çox zaman həyatın temalarını romantik və yüksək fantaziya qanadları ilə uçurmağı bacarmırlar. Lakin xəyal, fantaziya dediyimiz şey sovet ədəbiyyatının ruhuna yabançı deyil, onun humanizm və yüksək əməllərini ifadə edən böyük bir forma olmalıdır.

Biz ədəbiyyatımıza yüksək romantika və xəyal qanadları verməklə əsərlərimizi quru realizmdən azad edə bilərik. Unutmayaq ki, həqiqi realist varlıq və hadisə özündə yüksək romantika yaşadır!

Bəzən deyirlər – nə üçün biz müharibənin kədər və qəmini vermirik. Mən bu məsələ üzərində xüsusi dayanmaq istəyirəm. Mən yeni əhvali-ruhiyyənin və zövqlərin nəzəriyyəçisi deyiləm; ancaq bu məsələyə mən nəzəri yanaşmalıyam. Mənim bildiyimə görə, insan cəmiyyətində nə mücərrəd kədər var, nə mücərrəd nəşə var. Mən fəlakətə düşdüyüm zaman kədərlənirəm, səadətə çatdığım zaman nəşələnirəm. Mən demirəm gəlin, kədərdən, yaxud nəşədən yazaq. Mən deyirəm – gəlin, həyatı və insanları yazaq! Əgər biz həyat və insanları olduğu kimi, obyektiv olaraq verməyi bacarsaq, onların kədəri də, nəşəsi də öz-özlüyündə yaranacaqdır. Lakin mən iddia edirəm ki, bütün xalqımızın ürəyində olan qəm, qüssə hisslərinə baxmayaraq, bu saat bizim xalqımız üçün qalibiyyət eşqi, düşməndən intiqam almaq hissi, zəhmət və fədakarlıq hissləri daha xarakterdir.

Mən indi forma uğrunda mübarizə məsələsindən iki kəlmə deyəcəyəm. Biz deyirik ki, müasir həyatımızın ölməz əsərlərini yaradaq. Bu bizim arzumuzdur. Müasir həyatımızın ölməz əsərlərini yaratmaq üçün yazıçılarımız öz elmi və mədəni səviyyələrini çox qaldırmalıdırlar. Çünki müasir dövrün fəlsəfi köklərini bilmədən heç bir ölməz əsər yaratmaq mümkün olmayacaq. Bu ölməz əsəri yaratmaq üçün biz daha cəsarətli olmalıyıq.

Mən ümidvaram ki, məruzəçilər və çıxışda bulunan yoldaşlar ədəbiyyatımızın qarşısında duran ən aktual yaradıcılıq məsələlərindən danışacaq, soyuq bir düşüncə, isti bir ürəklə bu ədəbiyyatımızın taleyi ilə məşğul olacaq, onun inkişafına bir təkan verəcəklər.

*1943*

## TAQANROQ QƏHRƏMANLARINA EŞQ OLSUN!

Mən Moskvadayam. Qarşımda qədim şöhrətli, bahadır, qalib bir şəhər durur. Moskva – rus milli şöhrətinin əzəmətli şəhəri, sosialist ölkəsinin bütün xalqlarının iftixarıdır. Bizim Vətənimiz qüdrətli, zəngin və öz solmayan, qocalmayan xalqı ilə əbədidir. Azərbaycan xalqı böyük rus xalqına olan məhəbbət və hörmətini öz azərbaycanlı əsgərlərinə yazdığı məktubda belə ifadə etmişdir: “Kimin zəkası dəniz qədər dərindir, kimin qılıncı vuruşda od kimi parlayır?”

Mən bu gün əzəmətli Moskvada ilk dəfə salam atəşləri eşitdim. Taqanroq şəhərini alman barbarlarından azad etmiş şanlı ordumuzun şərəfinə toplar guruldayır. Sevincimin həddi-hududu yoxdur. Qələbə olduqca böyükdür. "Qələbə!" bu söz necə də möhtəşəm səslənir! Qələbə qələbə ardınca – hər gün bu sözləri eşitmək necə xoş və fərəhlidir! Mənim sevinc və xoşbəxtliyim bir də ona görə artır ki, Taqanroq şəhərini və bütün Rostov vilayətini azad edənlərin içərisində 416-cı Azərbaycan atıcı diviziyası da vardır... Öz doğma xalqının böyük qəhrəmanlıq rəşadəti göstərdiyi bir dövrdə yaşayan şair xoşbəxtdir.

Mən Azərbaycan torpağını, şanlı dədə-babalarımızın torpağını sevirəm. Azərbaycan xalqının çoxəsrli tarixi salmanəsinə öz qanı ilə yeni səhifələr yazan xalqımızın oğullarının adı ilə fəxr edirəm.

Bir neçə gün bundan qabaq mən "Krasnaya Zvezda" qəzetində oxudum ki, Azərbaycanın şanlı oğlu, N. alayının bayraqdarı Əjdərov azad olmuş Oryol şəhəri üzərində birinci olaraq bayraq sancmışdır. O, əlli qumbara ilə onlarla faşist qəsbkarını məhv etmişdir. Mənim əməl qardaşlarım azərbaycanlılar, sizə eşq olsun! Siz ölkəmizin başqa xalqları ilə çiyin-çiyinə Sovet ölkəsini – bizim ucsuz-bucaqsız Vətənimizi XX əsrin barbarlarından qoruyursunuz. Siz xalqların azadlıq və istiqlaliyyət günəşinin nuru ilə boyanmış xoşbəxt qardaşlıq diyarını qoruyursunuz. Sizə hərarətli salamımı göndərirəm. Sizə yeni-yeni döyüş qələbələri arzulayıram. Sizə, şanlı sovet əsgərlərinə günəşli Azərbaycandan salam!

*1943*

## [BƏDİİ TƏRCÜMƏNİN NƏZƏRİ VƏ TƏCRÜBİ MƏSƏLƏLƏRİ HAQQINDA]

Yoldaşlar, mən bizim milli ədəbiyyatların rus dilinə tərcümə olunması haqqında bir neçə söz demək istərdim. Məsələ orasındadır ki, hər bir xalqın mədəniyyət tarixində başqa dillərdən edilən tərcümələr, məlum olduğu kimi, o xalqın ümumi mədəniyyətinin xəzinəsini zənginləşdirir. Qeyd etmək lazımdır ki, dünya ədəbiyyatının ən yaxşı əsərlərinin rus dilinə tərcüməsi təkcə rus xalqı üçün deyil, başqa xalqlar üçün də həmişə çox böyük əhəmiyyətə malik olmuşdur. Biz hamımız, ölkəmizin cənubunda yaşayanlar, Qafqaz adamları böyük rus dili vasitəsilə dünya ədəbiyyatı ilə tanış olmuşuq. Rus dilinin bizim üçün

böyüklüyü məhz bundadır. Məsələn, şəxsən mən Şekspiri, Göteni, Avropanın dünya şöhrətinə malik olan ədiblərindən heç birini orijinalda oxumamışam. Buna görə də, demək olar ki, rus yazıçıları Şərq və ya Qərb dillərindən tərcümə edərkən nəzərdə tutmalıdırlar ki, onlar yalnız rus oxucuları üçün tərcümə etmirlər, öz yaradıcılıq işləri ilə ölkəmizdə yaşayan bütün xalqların ziyalılarına böyük tarixi kömək göstərmiş olurlar. Elə buna görə də biz milli respublikaların yazıçıları və ziyalıları bizi dünya mədəniyyətinin ən gözəl nümunələri ilə tanış etmiş və edən rus mütərcim yoldaşlarımıza minnətdarıq.

Bununla əlaqədar olaraq, hər halda deməliyəm ki, biz, ümumiyyətlə, tərcüməçilərin çox böyük və müqəddəs əməyini bəzən kifayət qədər layiqincə qiymətləndirmirik. Çox vaxt onların əməyinə bir çoxları elə qiymət verirlər ki, hətta bu və ya başqa bir əsərin kim tərəfindən tərcümə edildiyini belə, göstərmirlər. Bundan başqa, nədənsə, bizdə özləri yazıb-yaradan yazıçılara daha çox ehtiram göstərirlər, tərcüməçilərə isə yazıçı kimi baxmırlar.

Mən tərcümənin iki tipi haqqında bir neçə söz demək istərdim. Bu barədə dünən P.Q.Skosırev yoldaş danışdı. Bu məsələ bizim dövrümüzdə də çox maraqlıdır. Bəzi tərcüməçilər dəqiq olmağa çalışırlar, başqaları isə dəqiqlikdən uzaq qaçır və demək olar ki, tərcümə etdikləri zaman həm də yaradırlar. İkinci tip tərcüməçilərin işində yaradıcılıq prosesi daha üstün yer tutur.

Mən hansı tərcümələri xoşlayıram? Mən bilirəm ki, mənim əsərlərimi bir çox yoldaşlar tərcümə etmişlər. Bunların içərisində ən yaxşı rus şairlərilə bərabər, orta səviyyəli və adi nəşriyyat tərcüməçiləri də vardır. Mən, məsələn, Aseyevin, Adalisin, Antokolskinin, Svetlovun, Pasternakın və bir sıra başqa yoldaşların tərcümələrini oxuyuram. Və mən görürəm ki, bizim tərcümələrdə bu iki əsas prinsip indi xüsusilə nəzərə çarpır. Mən ikinci tip tərcümələri üstün tutur və sevirəm. Mənim fikrimcə, tərcüməçi gərək sözlərin hərfi tərcüməsi ilə məşğul olmasın. O, gərək yaratsın. Bu haqda hələ Puşkin demişdi ki, dəqiqliyin heç bir mənası yoxdur. Bu nə deməkdir? Mən bunu belə başa düşürəm: əgər tərcüməçi obrazları da, sözləri də, cinasları da qoruyub saxlayırsa, nə üçün bunun mənası olmasın? Görünür, şeir təkcə bunlardan ibarət deyildir. Görünür, bu dəqiqlikdə şeriyyət yoxdur və Puşkin məhz bunu demək istəyir ki, belə tərcümədə hər şey olur, lakin şeir olmur. Orijinalda olan poeziya, ilham və qəlb çırpıntıları hərfi tərcümələrdə yoxdur.

Mən bəzən öz şeirlərimizin tərcüməsini oxuyuram. Əvvəlcə sözlərin, ifadələrin, obrazların dəqiq-dürüst, öz yerində saxlandığı mənim xoşuma gəlir, xoşuma gəlir ki, tərcüməçi özündən heç bir şey əlavə etməmişdir. Lakin bunlar hamısı tərcüməni birinci dəfə oxuyarkən ürəyimə yatır. İkinci dəfə oxuduqda isə belə dəqiqlik məndə ikrah oyadır.

Mən "Azərbaycan" şerinin ən yaxşı tərcüməçisi kimi Adelina Yefimovna Adalisə öz təşəkkürümü, minnətdarlığımı bildirmək istəyirəm. Bizim aramızda bəzən mübahisələr törəyirdi, lakin sonralar yəqin edirdim ki, mən haqlı deyiləm, o haqlıdır. Mən deyə bilmərəm ki, Adalis məni dəqiq tərcümə edir. Xeyr, onun tərcümələrində dəqiqlik yoxdur. Bəzən o özündən əsərə müəyyən şeylər artırır, lakin bunlar hamısı mənim materialımdın, mənim ilhamımdan doğan şeylərdir. Əgər Adalisin qarşısındakı əsər mənim şerim deyil, Cambulun, yaxud Süleyman Stalskinin şeri olsa idi, onun əlavələri başqa xarakter daşıyardı, belə əlavələr olmazdı.

Mən öz əsərimin rus dilində orijinaldakı qüvvəsi ilə səslənməsini istəyirəm. Misal üçün, Adalisin mənim "Azərbaycan" şerimi necə tərcümə etdiyi üzərində dayanaq. Mən qətiyyətlə deyə bilərəm ki, sovet dövründə heç bir şeir rus tərcüməsində belə qüvvətli səslənməmişdir. Bu şeir məhz həmin tərcümənin sayəsində belə geniş yayılmışdır. Bunun sirri nədədir? Tərcümədə sözlərin hərfi tərcüməsi mənada dəqiqlik yoxdur, lakin orada məndəki vətənpərvərlik ruhu, Azərbaycana olan böyük və dərin məhəbbətin odu vardır. Bununla birlikdə elə bir xüsusiyyət də vardır ki, bu mənim şerimi rus şeri kimi səsləndirir.

Mən belə yaradıcı tərcümədən qorxmuram. Ona görə yox ki, mənim hər hansı güzəştə ehtiyacım vardır. Yaxud N.Aseyev və ya Adelina Yefimovna mənim şeirlərimi yazdıqlarıma nisbətən gərək yaxşılaşdırsınlar. Xeyr, mənim güzəştlərə, yaxud bəzək-düzəyə, zənginləşdirməyə ehtiyacım yoxdur. Ancaq mən onlara ona görə minnətdaram ki, onlar poeziya yaradırlar.

Mən Aseyevin tərcümələrini oxuyarkən hiss edirəm ki, onlarda mənim ruhum, mənim qəlbim, mənim poeziyam vardır. Lakin bir sıra başqa tərcümələri oxuyanda görürəm ki, onlarda mənim sözlərim də, obrazlarım da, ayrı-ayrı milli ifadələrim də var, ancaq bununla bərabər duyuram ki, əsas şey – mənim qəlbim, mənim ruhum bu tərcümələrdə yoxdur.

İndi də öz tərcümələrim haqqında. Bildiyiniz kimi, mən öz tərcümələrimdə yaradıcılıq prinsipinə əsaslanıram. Hətta poeziyamızın günəşi

olan Puşkinin əsərlərini tərcümə edəndə də mən bəzi yaradıcılıq sərbəstliyinə yol vermişəm. Bu sərbəstlik Puşkinin şərəfinə, onun xeyrinə olmuşdur. Əlbəttə, Puşkin şerinin nə mənim, nə də başqalarının köməyinə ehtiyacı yoxdur, lakin mən belə sərbəstliyə necə və nə üçün yol verdiyimi söyləyəcəyəm.

Demək, biz yaradıcı tərcümə uğrunda mübarizə etməliyik. Mən heç də bunun tərəfdarı deyiləm ki, tərcüməçi pis şeirləri çevirib yaxşılaşdırsın. Əgər o belə edirsə, demək, xalq qarşısında cinayətə yol verir. Nə üçün? Bizim bəzi milli şairlərimiz həmişə şikayət edirlər ki, filan tərcüməçi bizim əsərlərimizi korlamışdır. Lakin onlar heç bir zaman açıq və cəsarətlə bu sözləri demirlər ki, sağ olsun o tərcüməçi mənim orta səviyyəli və yaxud ləyaqətsiz şerimi gözəl əsərə çevirmişdir. Siz bunu heç bir zaman eşitməzsiniz. Bu, namuslu hərəkət deyildir.

Adelina Yefimovna mənim "Azərbaycan" şerimi çox yaxşı tərcümə etmişdir. O mənim "Partizan Babaş" şerimi də tərcümə etmişdir. Yəqin ki, siz bu əsəri "Literaturnaya qazeta"nın son nömrəsində oxumuşsunuz. Lakin "Partizan Babaş" əsərini Adelina Yefimovna birinci şeir səviyyəsində tərcümə etməmişdir. Ona görə ki, birinci şeir vicdanla tərcümə olunmuş, ikinci şeir isə yox? İş burasındadır ki, "Azərbaycan" orijinalda həqiqi poeziyadır, "Partizan Babaş" isə belə deyildir.

Y e r l ə r d ə n – Nadir bir etirafdır!

S ə m ə d  V u r ğ u n – Mənim "Partizan Babaş" kimi şeirlərim yüzlərcədir. "Azərbaycan" şeri isə mənim həyatıma, bütün həyat proqramıma uyğundur. Mən nə qədər yaşayıb-yaratsam, 1933-cü ildə yazdığım bu kiçik şerə aşıladığım motivləri bütün əsərlərimdə oxuyacaq, duyacaqsınız.

Deməli, bizim tərcüməçilərimiz çalışmalıdırlar ki, orijinal əgər doğrudan da maraqlıdırsa, belə əsəri yaxşı da tərcümə etsinlər. Lakin şeir zəif və quru, ruhsuz yazılmışdırsa, tərcüməçi isə öz istedadının qüdrəti ilə onu rus dilinə çevirərkən həqiqi poeziyaya döndərirsə, mən belə hesab edirəm ki, bundan uzaq qaçmaq lazımdır. Təsəvvür edin ki, bu və ya başqa bir şeir orijinalda poeziya nümunəsi deyildir, lakin həmin şeri rus tərcüməsində oxuyanda təəccüb edirsən, görürsən ki, olduqca parlaq bir əsər yaradılmışdır. Mən belə tərcümənin əleyhinəyəm. Ancaq o zaman ki, orijinalda həqiqi poeziya var və tərcüməçi bu həqiqi poeziyanı daha da yaxşılaşdırır, təravətləndirir və zinətləndirir, bunun üçün biz yalnız ona təşəkkür edə bilərik.

Lakin, qeyd etdiyimiz kimi, bəzən ikinci bir hal da baş verir: orijinalın poeziyası yaxşı olur, tərcüməçi isə yalnız dəqiqliyi qoruyub saxlamaq xatirinə poeziyanı öldürür. Bu da cinayətdir.

Sovet İttifaqının bütün xalqları yalnız rus dili vasitəsilə bir-biri ilə ünsiyyət bağlayırlar və böyük Vətənimizin bütün oxucuları Azərbaycan şeri ilə də rus tərcümələri sayəsində tanış olurlar. Biz özümüz də, məsələn, Gürcüstan şeri ilə rus dilinin sayəsində, rus tərcümələri vasitəsilə tanış oluruq.

Bu o deməkdir ki, biz tərcüməçilərimizin sənətkarlığına xüsusi və çox ciddi diqqət verməliyik.

Mən öz tərcümələrim haqqında bir neçə söz deyəcəyəm. Bildiyiniz kimi, mən A.S.Puşkinin "Yevgeni Onegin" mənzum romanını bütünlüklə Azərbaycan dilinə tərcümə etmişəm. Mən buna həyatımın ən yaxşı illərini sərf etmişəm. "Yevgeni Onegin"in tərcüməsi üzərində dörd il işləmişəm. Əlbəttə, bu özü də azdır, lakin hər halda mən bu əsərə dörd il vaxt sərf etmişəm. Axı mən peşəm etibarilə tərcüməçi-şair deyiləm. Bəzən elə günlər olurdu ki, mən fikirləşirdim: qurtarmaq vaxtıdır, Puşkinin yubileyi yaxınlaşır, lakin elə o günlərdə mənim hafizəmdə yeni bir şerin, yaxud poemanın mövzusu parlayırdı. Tərcümədən ayrılmaq istəmirdim, ancaq ilham öz əsərimə girişməyə məcbur edirdi. O illər mənim üçün çox çətin yaradıcılıq illəri idi, lakin mən xoşbəxtəm ki, xalqımın tarixində ilk dəfə olaraq "Yevgeni Onegin"i Azərbaycan dilinə tərcümə etmişəm.

Mən bu əsəri necə tərcümə edirdim, mənim tərcümə prinsiplərim nədən ibarət idi?

Mən heç bir prinsipə əsaslanmırdım. Mən bu işə bilavasitə bir şair kimi girişdim. Əsər özü və mənim qəlbim necə tələb etsələr, necə diktə etsələr, elə də tərcümə edəcəyəm – mənim qərarım belə idi. Mən bununla demək istəyirəm ki, "Yevgeni Onegin" üzərində işləməyə bir daha qayıdacağam, çünki hiss edirəm ki, tərcüməmdə poeziya orijinalda olduğu kimi yüksək səviyyədə deyildir. Tərcüməni qurtardığım günlərdən altı-yeddi il keçir, bu müddət ərzində mən yaradıcılıq cəhətdən inkişaf etmişəm. Ola bilər ki, mən bu tərcüməyə əlli yaşında, dilin bütün sirlərini mükəmməl bildiyim zaman qayıdacağam.

Bir çox şeylər mənim üçün anlaşılmazdır, dumanlıdır. Bunlar hamısı öz qaydasına düşəcəkdir. Mən bu tərcüməyə bir də ona görə qayıdacağam ki, "Yevgeni Onegin"in tərcüməsinə hər hansı bir kitabın, yaxud kitabçanın tərcüməsi kimi baxmıram. "Yevgeni Onegin"i Azər-

baycan dilində vermək çox böyük və ağır işdir. Bu bizim xalqımız üçün də böyük bir hadisədir.

Mən Nizaminin “Leyli və Məcnun” poemasını, Şota Rustavelinin “Pələng dərisi geymiş pəhləvan” poemasını da Azərbaycan dilinə tərcümə etmişəm. Lakin burada yalnız “Yevgeni Onegin”in üzərində dayandım.

İctimai-tarixi motivlər, əsərin ideya istiqaməti, ayrı-ayrı insan xarakterlərinin təsviri, təbiət mənzərələri – bütün bunların hamısını küll halında hər bir tərcümədə qoruyub saxlamaq lazımdır. Lakin mən bu əsərdə nə isə başqa bir şey duydum. Bir var dağlardan sürətlə axıb gələn güclü çay ki, onun dalğaları üzrədir, lakin bir də var okean ki, üzdən sakit görünür, ancaq onun dərinliklərində nə isə qaynayır, coşur, çırpınır ki, bunların hamısını adi gözlə görmək mümkün deyildir.

“Yevgeni Onegin”də mən şairin dəryalar qədər dərin qəlbini, onun kədərini duyurdum. Mən bunu bədbinlik və yaxud həyatdan uzaqlaşmaq mənasında başa düşmürəm. Bu kədər onun – Puşkinin xalqı ilə, dövrü ilə bağlıdır.

Məhz buna görə Puşkin öz zəmanəsinin qabaqcıl şairi olmuşdur. Onun əsərində kədər vardır. O, Tatyananı da, Lenskini də düşünür, onların taleyinə ağlayır, o, Oneginin də taleyinə ağlayır. “Yevgeni Onegin”də olan bir çox lirik haşiyələrdə isə şair öz taleyinə də, öz xalqının müqəddəratına da ağlayır. Demək olar ki, Puşkinə böyük kədərin böyük müğənnisidir. Mən bir tərcüməçi kimi onun qüssəsini, dərdini, onun düşüncələrini qorumalı və Oneginin, Tatyananın, Olqanın obrazlarını, bütün əsərin məzmununu bu hisslər, düşüncələr əsasında verməli idim. Mən rus şerindən, rus şerinin quruluşundan qorxuram. Puşkində sözlər qüvvətlidir, onları dəyişdirmək və nə isə əlavə etmək istəmirsən, heyfin gəlir. Yeri gəlmişkən onu da deyim ki, mən tərcümədə “Yevgeni Onegin”in formasını – on dörd misralıq strofaları və qafiyələndirmə qaydalarını saxlamışam. Bu, mənim işimi bir az da mürəkkəbləşdirirdi.

Lakin bütün dediklərimdən əlavə, mən Puşkinin bəzi qəhrəmanlarına şəxsən və xüsusən rəğbət bəsləyirdim. Məsələn, Lenskinin taleyi, onun sözləri mənim tərcüməmdə hərarətlə təsvir və ifadə olunmuşdur. Bunun səbəbi o deyil ki, mən Onegini soyuq tərcümə etmək istəyirdim. Xeyr, bu qeyri-ixtiyari belə olmuşdur. Mən Lenski haqqında düşünəndə qismən öz taleyimi də düşünür, öz gəncliyimi də xatırlayır, onun sevgisində və kədərində mən bəzən özümü hiss edirdim. Mən

Lenskidə nə isə ümumbəşəri bir keyfiyyət tapmışdım. Mənə elə gəlir ki, əgər bir ingilis şairi "Yevgeni Onegin"i tərcümə edəsi olsa, o da Lenskinin simasında yaxın, doğma bir adam görəcək və onu eynilə mənim kimi yaradacaqdır.

Tatyana haqqında. Biz, adətən, nadanlığımız üzündən rus qadınına, rus qızına elə baxırdıq ki, guya onda sevginin ələmləri, zərif hissləri ola bilməz. Lakin mən Tatyananın obrazını gördükdə hiss etdim ki, vəziyyət tamam başqa cürdür. Onun xumar gözləri, baxışları, onun qəlbində coşan məhəbbət, onun təbiəti sevməsi... Tatyana təbiəti sadəcə sevmir. O, təbiətin qucağında öz böyük dərdini bütün mürəkkəbliyi və incəlikləri ilə yaşayır. Onun məhəbbəti dərindir. Onun: "Mən başqasına verilmişəm və həyatım boyu ona sadiq qalacağam" sözləri son dərəcə parlaqdır. Tatyana Onegini sevir və onun namusu, şərəfi uğrunda bütün həyatını qurban verməyə hazır olduğu məhəbbəti ilə kəskin mübarizəyə başlayır. Onun dərin zəkası, incə hissləri, kədəri və zərifliyi qarşımda bütün gözəlliyi və əzəməti ilə parlayarkən mənim əllərim və qələmim titrəyirdi.

Lakin mən qorxurdum. Fikirləşirdim ki, görəsən mənim tərcüməm Azərbaycan dilini korlamır ki? Mən istəyirdim Tatyananın etiraflarını, həyəcanlarını azərbaycanlılara mümkün qədər aydın çatdırım, mən istəyirdim ki, azərbaycanlı Tatyana haqqında oxuyarkən onun qəlbində nələr baş verdiyini bilsin, duysun, o da mənim kimi Tatyananı sevsin, ona ehtiram göstərsin.

Yayda mən həmişə üç ay Bakı bağlarında işlərdim. Milli ruhdan uzaqlaşmamaq üçün mən həyat yoldaşımdan xahiş edərdim ki, patefonda Azərbaycan havaları çaldırsın. Və həmişə balkonda Azərbaycan havalarını dinləyə-dinləyə işlərdim. Beləliklə, mən Azərbaycan ruhundan uzaqlaşmadım, yoxsa bu əsər məni öz qüdrətli dalğaları üzərində apara bilərdi. Mən qorxurdum ki, rus adamına çevriləm, qorxurdum ki, dilim Azərbaycan dilindən uzaqlaşsın.

Bu çox doğrudur ki, biz milli xüsusiyyətlərdən danışırıq, lakin bəzən bu sahədə lap həddini keçirik. Mən sizi inandırıram ki, insan həmişə insan olaraq qalır. Rus qadını ilə azərbaycanlı qadını arasında heç də bizim bəzən düşündüyümüz qədər dərin fərqlər yoxdur. Onların hisslərində, ruhlarında, şərəf və namus məsələlərində, dünyagörüşlərində, zövqlərində ümumi cəhətlər çoxdur. Biz ümumbəşər mədəniyyətinə doğru gedirik və bundan imtina etmirik. Biz öz tərcümələrimizdə bu

hissləri, zövqləri ümumiləşdirməli və yeni, ümumi mədəniyyətə doğru addımlamalıyıq.

Bəs sırf milli ifadələrlə qarşılaşanda nə etməli? Burada mən həmişə adekvat ifadələr tapmaq prinsipinə əsaslanmışam. Bizdə belə bir ifadə var: bir adamdan şübhələndikdə deyirlər: gözüm səndən su içmir. Buna müvafiq, buna adekvat bir şey tapmaq lazımdır.

Məsələn, Lenskinin bu sözlərini götürək: "Куда, куда, куда вы удалились весны моей златые дни?" Sanki burada heç bir aforizm, heç bir milli xüsusiyyət yoxdur. Lakin tərcüməyə gələndə Azərbaycan dilində "hara, hara?" deyə bilməzsən, – bu çox quru səslənər. Həmçinin "весны моей" və "златые дни" kimi ifadələri də olduğu kimi, hərfi tərcümə etmək olmaz. Beləliklə, əsərdəki ən gözəl misraları tərcümə etmək mümkün olmur! İki misrada üç ifadə azərbaycanca səslənmir. Deməli, burada axtarmaq, yaratmaq lazımdır. "Весны моей" ifadəsini azərbaycanca "bahar ömrünün", "златые дни" ifadəsini "əziz günlər" demək lazımdır. Axı, rus mətnində də bu günlər qızıldan qayrılan günlər deyil, əziz günlərdir. Ruscadakı "Куда, куда" ifadəsinin qarşılığında isə azərbaycanca "nə qədər tez ötüb getdiniz" fikrini vermək lazımdır. Elə rus mətnində də bu "hara" sualı şimala yaxud cənuba, dağlara yaxud dərəyə getdiyini soruşmaq məqsədi ilə deyilmir, bu o deməkdir ki, mən sizi nə üçün bu qədər tez itirdim?

Mən bütün bunları məhz Puşkinə olan dərin ehtiramım xatirinə dəyişməli oldum. Mənə elə gəlir ki, o özü mənimlə razılaşardı.

Puşkin onun müdrik poeziyasını, fikirlərini, zəngin hisslərini qorumaq xatirinə hətta ixtisarlara və ya əlavələrə də razı olardı. Mən elə belə də edirdim. Təkrar edirəm ki, son illərdə öz yaradıcılığımla məşğulam, lakin bu tərcüməyə yenidən qayıdacaq, onun üzərində işləyəcəyəm, çünki bu tərcüməni ən böyük əsərlərimdən biri hesab edirəm. Mən belə hesab edirəm ki, "Yevgeni Onegin" Azərbaycan dilində mənim orijinal əsərim olmalıdır, yəni Azərbaycan dilində onun tam hüquqlu müəllifi mən olmalıyam – bəli, məhz müəllifi. Və əgər mən buna nail ola bilməmişəmsə, demək, bu tərcüməyə yenidən qayıtmalıyam, onu elə yüksəklərə qaldırmalıyam ki, milli ədəbiyyatımızın və xalqımızın mədəniyyət xəzinəsinə daxil olsun. Bunun özü də Puşkinə və bizim böyük rus xalqına dərin ehtiramla bağlıdır. Bəli, tərcüməçi tərcümə etdiyi əsərə öz doğma və orijinal əsəri kimi baxmalıdır.

*1943*

# AZƏRBAYCAN ƏDƏBİYYATI HAQQINDA

Qədim Azərbaycan torpağı özünün yalnız maddi sərvətləri ilə deyil, çoxşaxəli ictimai fikir və mənəvi inkişaf tarixi ilə də zəngindir və bütün Şərqdə məşhurdur. Azərbaycan atəşpərəstlik fəlsəfəsinin ilkin yarandığı və bizim zamanda da, demək olar ki, yer üzünün hər bir guşəsində pərəstişkarları olan filosof Zərdüştü dünyaya vermiş odlar diyarıdır.

Bizim qədim xalq rəvayətləri və ölməz əfsanələrimiz xalq dühasının, onun yüksək fikir və düşüncələrinin, müqəddəs ideal və məqsədlərinin ən yaxşı ifadəçisidir.

Azərbaycan torpağı uzun əsrlərdən bəri qanlı müharibələr və toqquşmalar meydanı olmuşdur. Ərəblər də, monqollar da, romalılar da, farslar da onu xaricilərin müstəmləkəsinə çevirmək və azadlıqsevər Azərbaycan xalqını milli mövcudluqdan məhrum etmək məqsədilə dəfələrlə bizim torpağa soxulmuşlar. Ancaq onlara nisbətən sayca az olan xalqımız öz qüvvətli düşmənləri ilə müharibədə dəfələrlə qalib çıxmışdır. Biz müasir azərbaycanlılar fəxr edirik ki, rəşadətli və qəhrəman ata-babalarımız bizə müqəddəs milli iftixar hissi və duyğusu miras qoymuşlar. Onlar döyüşlərdə öz qanı bahasına xalqımızın namus və azadlığını, istiqlaliyyətini, doğma dilini, mədəniyyətini, onun milli varlığını qoruyub saxlamışlar.

Bizim ellər əzəl gündən qəhrəmanlar yurdudur,
Tarix bunun şahididir, nəzər yetir, bax, budur:
Sərt qayadan mətanətli dəyanətin qalası,
Şöhrətilə öyündüyüm Azərbaycan balası...

Bizim tanınmış şairimiz Məmməd Rahim öz xalqının şərəfli keçmişini belə poetik ifadə etmişdir.

Azərbaycan torpağı həmişə yüksək poeziya və çox zəngin musiqi beşiyi olmuşdur. Bizim poeziya və musiqimiz Yaxın Şərq, Zaqafqaziya və Dağıstan xalqlarının, Orta Asiya xalqlarının və b. şeir və musiqi mədəniyyətinə böyük təsir göstərmişdir. Fərəhlidir ki, dahi rus bəstəkarı Qlinkanın yaradıcılığında da Azərbaycan milli musiqisinin elementlərinə rast gəlirik və bu, Azərbaycan musiqi mədəniyyətinin çox geniş yayılmasını bir daha göstərir.

Bədii təfəkkür dahiləri Nizami, Xaqani, Füzuli, Vaqif, Axundov və Sabirin İran və Türkiyədə, Zaqafqaziyada və Azərbaycandan çox-

çox uzaqlarda onlar və yüzlərlə təqlidçiləri və şagirdləri olmuşlar. Xalqımızın fikrincə, bədii söz həmişə bəşəriyyətin yüksək ideyalar uğrunda, humanizm və idrakın təntənəsi uğrunda mübarizəsində çox təsirli bir vasitə kimi xidmət göstərmişdir. Səciyyəvi haldır ki, Azərbaycan tarixində, demək olar ki, bütün böyük sərkərdə və dövlət xadimləri eyni zamanda öz dövrünün qabaqcıl şairləri olmuşlar. Əbəs deyil ki, ölməz xalq qəhrəmanı və pəhləvanı Koroğlu bütün Şərqdə təkcə sərkərdə kimi deyil, böyük bir xalq şairi kimi də şöhrətlənmişdir.

Koroğlunun bu və ya başqa hərbi qəhrəmanlıqları ola bilər ki, bir zaman yaddaşlardan silinsin, ancaq şair Koroğlunun mərdliklə dolu qiymətli sözləri gələcək nəsillərin yaddaşından heç vaxt silinməyəcəkdir.

Dörd yüz il bundan əvvəl, yeni Azərbaycan ədəbiyyatının banisi Füzuli bədii sözün əbədi böyüklüyünü və ölməzliyini tərənnüm etmişdir.

Göstərən saətdə dövrani-fələk bir inqilab,
Həm özü fani olur, həm ləşkəri, həm kişvəri.
Gör nə sultanəm məni-dərviş kim, feyzi-süxən
Eyləmiş iqbalimi asari-nüsrət məzhəri.

Azərbaycan milli mədəniyyəti özündə Şərq və Avropa mədəniyyətinin ən yaxşı xüsusiyyətlərini və ənənələrini təcəssüm etmişdir. Son iki əsrdə ona böyük və qüdrətli rus mədəniyyəti, igid bir xalqın mədəniyyəti öz səmərəli təsirini göstərmişdir. Azərbaycan xalqı həyat və mübarizə yollarında böyük qardaşına "idrakı dəniz kimi dərin, qılıncı döyüşdə şimşək parlayır" – deyə öz məhəbbət və hörmətini ifadə etmişdir. Mən bugünkü çıxışımdan istifadə edərək Sizə və sizin şəxsinizdə bütün rus ziyalılarına xalqımızın hərarətli salamını və minnətdarlığını yetirirəm.

*1943*

## "AZƏRBAYCAN ƏDƏBİYYATI TARİXİ" KİTABINA RƏY

"Azərbaycan ədəbiyyatı tarixi" kitabı ədəbiyyatşünaslığımızın mühüm nailiyyətidir. Sovet Azərbaycanının bir qrup alimi tərəfindən Böyük Vətən müharibəsi illərində yazılmış xalqımızın çoxəsrlik mədəni inkişafını elmi ümumiləşdirmə yolu ilə əks etdirən bu kitab Azərbaycan

ədəbiyyatı tarixi sahəsində uzun illər boyu aparılan tədqiqatın uğurlu yekunu kimi meydana çıxmışdır.

"Azərbaycan ədəbiyyatı tarixi"ndə qədim dövrdən bizim günlərə qədər olan Azərbaycan xalqının ədəbiyyatının inkişaf tarixi sistemli şəkildə şərh olunmuşdur.

Əsərin birinci cildi qədim Midiyadan başlamış XVIII əsrin sonuna kimi olan bir dövrü əhatə edir. Giriş məqaləsində Azərbaycan mədəniyyətinin beşiyi sayılan qədim Midiya dövləti zamanı yaranmış xalq elmi əsərləri, yazılı abidələr mədəniyyətimizin təşəkkül və inkişaf qaynaqları barədə söhbət açılır, müəlliflər bizim erada ədəbiyyatın inkişafını tədqiq edərək indiyə kimi şərqşünaslıqda, demək olar ki, diqqət yetirilməyən I–XI əsrlərin mədəniyyət və ədəbiyyatını əks etdirən bir sıra materiallar aşkara çıxarmışlar. XI əsr xalq yaradıcılığının misilsiz abidəsi hesab olunan "Kitabi-Dədə Qorqud" eposu burada yüksək qiymətini alır.

Azərbaycan mədəniyyətinin çiçəklənmə dövrü olan XI–XII əsrlərə xüsusi diqqət yetirilmişdir.

Bu dövr poeziyasının görkəmli nümayəndələri Qətran Təbrizi, Əbül-Üla Gəncəvi, Fələki, İzəddin Şirvani və başqalarının yaradıcılığının geniş təhlili verilmişdir.

Azərbaycanın dahi humanist şairi Nizami Gəncəviyə və onun azadlıqsevər müasiri Xaqani Şirvaniyə ayrıca fəsillər həsr edilmişdir. Bu fəsillər "Azərbaycan ədəbiyyatı tarixi"ndə ilk dəfədir ki, işlənir. Bundan əvvəlki ədəbiyyat tarixini yaratmaq təşəbbüsləri zamanı Azərbaycan xalqının həmin dövrə qədərki ədəbiyyatına, demək olar ki, tamamilə etinasız yanaşılmışdır. Bununla da çoxlu təhriflərə yol verilmiş, ədəbiyyat tariximiz yanlış izah olunmuşdur.

Azərbaycan alimlər kollektivinin əsərinin əsas qiyməti ondadır ki, burada ilk dəfə olaraq ədəbiyyat tariximizin nəhəng dövrlərinin düzgün və hərtərəfli xarakteristikası verilmişdir.

XIII-XIV əsrlərin ədəbiyyatı və mədəniyyəti haqqında olan fəsildə Azərbaycanın mədəni həyatı geniş şəkildə işıqlandırılmışdır. Ədəbiyyatın inkişafı sənətşünaslıq, rəssamlıq və musiqinin inkişafı ilə sıx əlaqələndirilmiş, onun xalq poeziyası ilə, elm və fəlsəfə ilə bağlılığından söhbət açılmışdır. Azərbaycanın mədəni həyatının hər tərəfli təsviri, onun incəsənət sahəsində misilsiz inkişafının müxtəlif şəkildə göstərilməsi, bir sıra yeni adların və materialların aşkara çıxarılması, şübhəsiz, Azərbaycan ədəbiyyatı tarixinə aid bu dəyərli əməyin böyük nailiyyəti hesab olunur. Xətai və Füzulinin (XVI əsr) həyat və yaradıcılı-

ğından bəhs edən icmalda Azərbaycan xalqının bütün orta əsr mədəniyyəti üçün onların müstəsna rolu açılıb göstərilmişdir.

"Azərbaycan ədəbiyyatı tarixi"nin birinci cildinin sonuncu fəsli xalq eposunun ("Koroğlu" və b.) eyni zamanda, ölkənin feodal parçalanmaları dövründəki Azərbaycan ədəbiyyatının inkişafı məsələlərini əhatə edir. İcmal Azərbaycan xalqının öz tarixi taleyini Rusiya ilə möhkəm bağladığı bir zamanda, yeni Azərbaycan ədəbiyyatının qapıları önündə dayanan Vaqifin yaradıcılığının təhlili ilə başa çatır.

"Azərbaycan ədəbiyyatı tarixi"nin II cildi ədəbiyyatımızın sonuncu əsrlərdəki (XIX və XX əsrlər) inkişafına həsr edilmişdir. XIX əsr ədəbiyyatı tarixini əhatə edən fəsil bir də ona görə böyük maraq doğurur ki, Azərbaycanda maarifçilik və demokratik ideyaların inkişafına son dərəcə faydalı təsir göstərən böyük rus xalqının mədəniyyətinin əlaqələri məsələlərinə burada xüsusi diqqət yetirilmişdir.

XIX əsrin sonu və XX əsrin əvvəlinə aid ədəbiyyat da rus ədəbiyyatının təsiri ilə, daha demokratik şəkildə, dil və tənqidi realizm əlaməti altında inkişaf etmişdir.

Böyük mütəfəkkir-şair Azərbaycan teatrının banisi M.F.Axundovun yaradıcılığına xüsusi yer verilmişdir. Müəlliflər Azərbaycanda ictimai fikrin inkişafında son dərəcə mütərəqqi rol oynamış jurnalistikanın ("Əkinçi" qəzeti, "Molla Nəsrəddin" jurnalı və s.) inkişafına lazımi diqqətlə yanaşmışlar.

Alimlər ilk dəfə olaraq C.Məmmədquluzadə, Ə.Haqverdiyev, N.B.Vəzirov və b. görkəmli yazıçıların realist nəsrinin inkişaf yollarını tədqiq etmişlər.

XX əsrin əvvəlinin şairləri Ə.Sabir, M.Hadi və Səhhət yeni təqdimatda gözlərimiz önündə canlanır.

Azərbaycan xalqının sosializm quruculuğu şəraitində yaratdığı 25 illik ədəbiyyatın yekunu olan Azərbaycanda sovet ədəbiyyatının inkişafına xüsusi fəsil ayrılmışdır.

Bütün bunlar göstərir ki, Azərbaycan ədəbiyyatı tarixi elmi şəkildə dərindən işlənməyə başlanılmış, nəinki möhtəşəm dövrlər əhatə edilmiş, dağınıq materiallar sistemləşdirilərək qarşıya qoyulan problemlər böyük elmi cəsarətlə həll olunmuşdur. Əsər sadə və anlaşıqlı bir dildə yazılmış və oxucular tərəfindən geniş istifadə olunur. 1943–1944-cü illərdə nəşr olunmuş ikicildlik "Azərbaycan ədəbiyyatı tarixi" Azərbaycanın ali məktəbləri üçün yeganə və çox qiymətli bir vəsaitdir.

Azərbaycan alimlərinin əsəri, şübhəsiz sovet ədəbiyyatşünaslığına dəyərli hədiyyədir. Öz tarixi, əhatə dairəsinin genişliyi, qiymətli və zəngin məzmunu ilə diqqəti cəlb edən bu əsər Azərbaycan elminin böyük nailiyyətlərini, onun gələcək yüksək perspektivlərini əks etdirir və Azərbaycan ədəbiyyatının inkişaf salnaməsini daha elmi dərinliklə və hərtərəfli göstərmək üçün möhkəm bir mənbədir. Əsəri bütün əsaslarla 1943-1944-cü illər sovet elminin görkəmli nailiyyəti hesab etmək olar...

*1944*

## [MOSKVADA SSRİ YAZIÇILARI İTTİFAQININ IX PLENUMUNDA ÇIXIŞI]

Qəhrəman Qızıl Ordu faşist qəsbkar və vəhşilərini Qərbə doğru qovduğu bir zamanda, bizim müqəddəs Vətənimizi faşist qəsbkarlarının zülmündən azad etdiyi bir zamanda biz SSRİ Yazıçıları İttifaqının IX plenumunu keçiririk. Keçirdiyimiz dəhşətli müharibənin od-alovları içərisində ölməz və qəhrəman xalqımızın şərəf və şöhrəti ilə ruhlanmış ədəbiyyatımızın mübariz ruhu və məfkurə sağlamlığı bir daha imtahandan çıxdı.

Müharibə mövzuları Azərbaycan ədəbiyyatı üçün yenidir. Çünki bizim xalqımız son əsrlərin müharibələrində bilavasitə iştirak etməmişdir. Mən XIX əsri və XX əsrin əvvəllərini nəzərdə tuturam. Buna görə Azərbaycan sovet ədəbiyyatı müharibə mövzularında zəngin təcrübəyə malik deyildi. Bununla bərabər, biz klassiklərimizin sənət xəzinəsində babalarımızın qəhrəmanlıq və şücaətlərinə dair çox böyük əsərlər görürük. Lakin bu əsərlər ümumiyyətlə əfsanəvi bir mahiyyətdədir.

Demək olar ki, almanların bizi sövq etdikləri indiki müharibənin təhlükəsi Azərbaycanın bütün yazıçıları üçün qabaqcadan müəyyən dərəcədə aşkar idi. Bizim şairlər, yazıçılar, nəzəriyyəçilər və tənqidçilərimiz Böyük Vətən müharibəsinin elan olunduğu ilk günlərdən başlayaraq, vahid bir insan kimi Vətənimizin və qədim mədəniyyətimizin alman vəhşilərindən müdafiəsinə, böyük dövlətimizin əldə etdiyi qələbələrin müdafiəsinə qalxışdılar. Yazıçı döyüşçülər sırasına öz vətəninin yüksək və nəcib məfkurələrinə malik bir adam kimi, bu vətənin oğlu və nəğməkarı kimi daxil olmuşdur.

Sovet yazıçısının məhz belə yüksək bir məfkurəsi indiki müharibənin fırtına və dumanları içərisində ona yolgöstərici bir ulduz oldu.

O, məhz sosializm dünyasının bu böyük əməlləri uğrunda müharibə zamanının bütün iztirab və əziyyətlərinə, soyuq və acılarına, yorucu və yuxusuz gecələrinə köks gərmişdir. O, vətən naminə, qalibiyyət naminə bütün bunlara bir vətəndaş və bir yazıçı kimi dözmüşdür.

Azərbaycan ədəbiyyatı müharibə dövründə xüsusi bir inkişaf yolu keçmişdir. Bu ədəbiyyatın ilk dövründə xalqımızın müharibəyə, vətən müdafiəsinə çağıran ümumi çağırış səsi görkəmli bir yer tutmaqda idi. Şairlərimizin bu səslərində xalq müharibəyə, vətən müdafiəsinə, namus və hürriyyətimizin müdafiəsinə –nidalarını eşitməkdə və oxumaqda idi. Bu dövr üçün bir də bədii cəhətdən çox da əsaslı olmayan bir nikbinlik səciyyəvi bir hal idi. O zaman ədəbiyyatımızda qəhrəmanlarımız, onların şücaətləri bədii bir surətdə təsvir edilmədiyindən ədəbiyyat bu və ya digər dərəcədə publisistika mahiyyətində idi. Bu dövrdə ədəbiyyatımızdakı nikbinliyin iki cəhəti var idi. Bu nikbinliyin müsbət cəhəti bundan ibarət idi ki, ədəbiyyat bədii sözün qüvvəti ilə xalqın mənəvi qabiliyyətini döyüş meydanlarında düşmənlə qarşılaşmağa səfərbərliyə alırdı. Ancaq bu nikbinlikdə bir cəhət çatışmırdı: müharibənin böyük bir təhlükə olduğu, onun ağırlıq, iztirab və əziyyətləri bədii bir surətdə təsvir edilmirdi. Sonralar biz başa düşdük ki, müharibə bizim düşündüyümüz və təsəvvür etdiyimizdən çox mürəkkəb və təhlükəli bir hadisə imiş. Müharibə insanları və ədəbiyyatı dəyişdirdi. İkinci dövrdə biz artıq Süleyman Rəhimovun "Medalyon" adlı hekayəsini oxuyuruq ki, burada müharibə səhnələrindən epik bir mənzərə təsvir edilir. Onun "Torpağın səsi" adlı hekayəsində müharibənin dəhşətləri və alman işğalçılarının törətdikləri vəhşətlər ustalıqla göstərilir. Yaxud gözəl şairimiz M.Rahimin "Onu Don qucaqladı" şerində azərbaycanlı bir qəhrəmanın rus torpağı, Don çayı uğrundakı şiddətli vuruşmalarda qəhrəmancasına həlak olması təsvir edilir. O biri tərəfdən səhnəmizdə, istedadlı Mirzə İbrahimovun "Məhəbbət" adlı dramı meydana çıxır ki, burada müəllif öz qarşısına bədii bir qaye olaraq, məhəbbətdə və namuslu ailə həyatında sona qədər sədaqətli olmaq kimi saf əxlaqi bir məfkurə məsələsini qoyur. Bu isə müharibə zamanı xüsusilə böyük təsir göstərir.

Beləliklə, bizim ədəbiyyatımız öz inkişafının ikinci dövrünə, yəni adamlarımızı cəbhədə və arxada təsvir etmək, onların şücaət və zəhmətini göstərmək dövrünə girir. Ədəbiyyatımız, xüsusilə şerimiz dövlətimiz tərəfindən minlərlə yüksək mükafata nail olmuş Azərbaycan

döyüşçüləri üçün ən yaxın bir sirdaş və bəlkə də onlara ruh verən bir mənbə halını alır. Biz öz gözlərimizlə elə günlərin şahidi olmuşuq ki, Azərbaycanın milli qoşun hissələri bu və ya digər vətənpərvər şairin şerini oxuyub ondan aldığı tamamilə yeni bir təsir altında düşmən üzərinə hücuma keçmişdir. Sanki bu qəhrəman adamlar hücuma keçməzdən əvvəl yalnız öz vətənləri və xalqları qarşısında deyil, eyni zamanda, doğma və əziz ədəbiyyatımız, yüksək bəşəri şerimizin səsi önündə and içirdilər.

Qoy bütün dünya şüurlu xalqımızın, qəhrəman və yüksək şeir aşiqi olan xalqımızın qəlbində bədii sözümüzün qazandığı nüfuz və hörmətə həsəd etsin.

Beləliklə, bizim ədəbiyyatımız indiki dövrdə çoxcəhətli, canlı və bədii bir hal almağa başlayır. Mən yüzlərlə gözəl şerimizi, onlarla hekayə və povestimizi, romanımızı və səhnə əsərlərimizi saymaqla sizi yormayacağam. Bir də mən müharibənin nisbətən gənc şair və yazıçılarımızın inkişafına göstərdiyi xeyirli təsir üzərində durmaq istəyirəm. Bu cəhətdən Osman Sarıvəlli və Əhməd Cəmilin yaradıcılığı xarakterikdir. Hər iki şair çox söz işlətmək tərəfdarı deyildirlər. Bir sözlə, təntənəli sözlər və quru təbliğatdan uzaq olan əsil şairdirlər. Hər iki şair öz yaradıcılıq xüsusiyyətlərinə sadiq qalmışlar. Bu isə şair üçün əsas bir sifətdir. Fırtınalı zamanlarda öz yaradıcılıq simasını qorumaq, o tərəf bu tərəfə baş aparıb əllaməlik etmək lüzumsuz və faydasız bir işdir. Bu şairlər düşməni ifşa etmək, onun vəhşi təbiətini göstərmək istədikdə onu əclaf, rəzil, alçaq adlandırmırlar. Çünki düşmənə belə qiymət vermək üçün şair olmaq lazım deyil. Bu şairlər düşməni onun murdar və rəzil hərəkətləri vasitəsilə göstərirlər.

Onların bədii dildə təsvir etdikləri mənzərələr oxucu üzərində dərin təsir buraxıb, düşmən haqqında düzgün və əsil məfhum əmələ gətirir. Onlar bizim adamları da zahiri tərif və mədh etmək yoluna qapılmadan təsvir edirlər.

Mən deməliyəm ki, indi artıq şerimizdə bədiilik dərəcəsi aşağı olan əsərlərə az-az rast gəlmək olar. Mən bunu Azərbaycan milli şeri üçün yalnız bugünkü nöqteyi-nəzərdən deyil, onun gələcəyi nöqteyi-nəzərindən də böyük bir qalibiyyət sayıram.

Ancaq bu gözəl dövrü də biz artıq keçilmiş bir yol hesab edirik. Müharibə zamanı ədəbiyyatımızın inkişafında üçüncü bir dövr başlanmışdır. Bu dövr yaşadığımız zamanın böyük fəlsəfi ümumiləşdirmə-

lərini vermək dövrüdür. Etiraf etmək lazımdır ki, müharibə yalnız müxtəlif orduların, müxtəlif xalqların çarpışması demək deyildir. Müharibə, eyni zamanda, müxtəlif dünyagörüşlərinin, həyata, insana, hətta təbiətə fəlsəfi baxışların çarpışması deməkdir. Əgər məndən soruşsalar ki, siz alman soldatını necə təsəvvür edirsiniz? O, bir soldat olaraqmı, yoxsa ölümə məhkum bir məfkurəyə malik bir "filosof" olaraqmı daha çox müqəssirdir? Mən bu suala belə cavab verərdim ki, mən almana, hər şeydən əvvəl, ona görə nifrət edirəm ki, o məni insan saymır, mənim insanlıq varlığımı tapdalayır. Alman, indiki Hitler Almaniyasında bir vətəndaş və soldat olaraq, insanlıq məfhumundan məhrumdur.

Deməli ki, biz almanları mənəvi cəhətdən, əxlaqi cəhətdən ifşa etməli, onların miskin "fəlsəfələrini" göstərməliyik. Bu nöqteyi-nəzərdən mən gözəl şairimiz Pavel Antokolskiyə onun yazdığı "Oğul" poemasına görə təşəkkür edirəm. Bu əsərdə müəllif bir alman "atasını" məharətlə ifşa etmişdir.

Bizim qəhrəmanlarımızı göstərmək məsələsinə gəldikdə, bunu zəmanəmizin qəhrəmanlarını fəlsəfi cəhətdən təsvir etmək yolu ilə etməliyik. Biz çox zaman ədəbiyyatda qəhrəmanlarımızı fəlsəfi görüşlər yüksəkliyinə qaldıra bilmir, onları yüksək qayələr nöqteyi-nəzərindən göstərə bilmirik. Unutmaq olmaz ki, insanı və onun həyatını yalnız böyük ümumiləşdirmələr şəklində təsvir edən əsərlərə böyük sənət əsəri demək olar. Bunun üçün isə bizim ədəbi babalarımızın malik olduqları nəcib zəhmət əzminə və səbata sahib olmaq lazımdır. Bizim üçün artıq ədəbiyyatımızın sabahkı günü ilə ciddi surətdə məşğul olmaq zamanı gəlmişdir. Bu o deməkdir ki, bugünkü qəhrəmanları biz yalnız bugünkü istək və arzular nöqteyi-nəzərindən deyil, həm də onun öz xalqının və bütün bəşəriyyətin gələcəyinə bəslədiyi yüksək məfkurələrə və duyğular nöqteyi-nəzərindən təsvir etməliyik. Bizim qəhrəmanlarımızı yüksək romantik həyəcanlardan, yüksək duyğu və arzulardan, böyük məfkurə və meyllərdən məhrum etməyə heç bir haqqımız yoxdur. Bu sifətlər isə həm qızğın çarpışma zamanları, həm də rütubətli qazmalarda keçirdikləri istirahət zamanları bizim qəhrəmanlarımıza xas olan sifətlərdir.

Bu münasibətlə mən mərkəzi qəzetlərimiz haqqında bir neçə söz demək istərdim. Bəzən qəzet idarə işçilərinin əlinə bizim şairlərimizin elə əsərləri gəlib çıxır ki, onlar bu şeirlərin yaxşı olduğunu söyləyib tərifllədikləri halda, yalnız fəlsəfi, yaxud mücərrəd olduqları üçün

təəssüflə çap edə bilməyəcəklərini söyləyirlər. Halbuki şair mərkəzi qəzetlərdə iştirak etmək istəyir. Mənə elə gəlir ki, şeirdəki böyük ümumiləşdirmələr o yoldaşları qorxutmamalıdır. Çünki şeir sözü özü böyük bir ümumiləşdirmə məfhumudur. Bunu da söyləmək olmaz ki, belə şeirlər geniş oxucu kütlələri üçün anlaşılmaya bilər. Hətta keçmiş zamanlarda bizim savadsız, lakin dərin düşüncəli babalarımız Nizami, Rustaveli, Puşkin və başqalarının dahiyanə əsərlərini anlamış və sevmişlər. Mən sizi inandırıram ki, həqiqi şeir nə şəkildə olursa-olsun, şeri anlayanların ürəyinə yol tapacaqdır. Anlamayan oxuculara gəlincə, onlar qoy öz cəhalətlərindən küssünlər. Qoy onlar gecə-gündüz öz mədəniyyətlərini artırmağa çalışsınlar.

Mən inanıram ki, bizim plenum sovet torpağının bütün yazıçılarına Tolstoyun "Hərb və sülh", Nizaminin "İskəndərnamə"si kimi, zamanımızın böyük əsərlərini yaratmaqda ilham və həyəcan verəcəkdir.

*1944*

## [AZƏRBAYCAN SOVET YAZIÇILARI İTTİFAQI PLENUMUNDA ÇIXIŞI]

Biz nə vaxt və nə kimi yaradıcılıq məsələləri ətrafında yığışsaq, bütün işimizin əsasında bir məqsəd durmalıdır: çoxəsrli ədəbiyyatımızın, xüsusən Sovet hakimiyyəti dövründə yaranmış ədəbiyyatımızın parlaq həyat və mübarizə ənənələrini yaşatmaq və inkişaf etdirmək!

Sosializm və sovet varlığı daima ədəbiyyatımızın qida mənbəyi olmuşdur. Məhz buna görə də bizim ədəbiyyat öz ideyası etibarilə ən tərəqqipərvər, mübariz və insanpərvər bir ədəbiyyatdır.

Tarixin heç bir dövründə sənətkarla xalq və dövlət bizim dövrümüzdəki kimi üzvi bağlarla bağlanmamışdır. Sənətkarla xalqımız arasında böyük və müqəddəs bir məhəbbət var! Bu məhəbbət var! Bu məhəbbət bizim ilhamımızdır, bizi sənət aləmində xariqələr yaratmağa çağıran ən böyük və qadir bir amildir. Bu amil bizi yaşadır, bizə yeni-yeni yaradıcılıq imkanları və qüdrətləri verir. Sənətkarın nəfəsi xalq nəfəsi olduğu zaman, həyat və tarix onun zəhmətini çiçəkləndirir və təqdir edir. Var olsun məhəbbət və poeziya! Bu o deməkdir ki, böyük əsər böyük məhəbbət və böyük ilhamla yaranmalıdır.

Biz sovet yazıçıları öz ilhamımız və məhəbbətimizlə fəxr edirik. Biz öz dövrümüzün şərəfinə, doğma Sovet dövlətimizin tarixi nailiyyətlərini ifadə edən, xalqımızın sosializm cəmiyyəti uğrunda apardığı mübarizələrə yardım edən bir çox əsərlər yaratmışıq. Onlar xalqımızın ürəyində və şüurunda yaşayır, bugünkü Vətən müharibəsi cəbhələrində döyüşən qəhrəmanlarımıza ilham və qüdrət verir...

Ədəbiyyatımızın qüdrəti böyükdür. Ona görə də ədəbiyyatımızın qarşısında böyük tələblər durur. Bu böyük tələblərin öhdəsindən gəlmək üçün bizim ədəbiyyatın zəngin bir tarixi zəminəsi, xüsusən 25 il ərzində yaranmış sovet ədəbiyyatımızın gözəl və parlaq təcrübələri var. Bu nikbinliyimiz bizi dünənki günümüzə deyil, sabahkı günümüzə çatdırmalıdır. Mən bu gün və sabah dedim. Bu gün və gələcək bizi gözləyir. Onların bizdən əsas tələbi nədir?

Qısa desək, o tələb bundan ibarətdir: "Yoldaş yazıçı! Sən öz dövrünün, mənsub olduğun qəhrəman xalqın və tarixdə yeni bir anlaq olmuş xalqlar dostluğu cəmiyyətinin – sosializm cəmiyyətinin böyük dastanları, ölməz əsərlərini yarat! Biz bunu səndən tələb edirik". Biz yeni insanlarımızın bədii surətini, yəni onların həyatın fırtınalarında bərkimiş iradəsini, onların yüksək şüur və müqəddəs əməllərini, bütün sevinc və qayğılarını, zamanın və tarixin ziddiyyətləri içərisində yaranan və qalib gələn böyük həqiqətimizi, varlığımızı yüksək bədii dillə, üslubla ifadə edən əsərlər yaratmalıyıq. Əlbəttə, bu asan bir iş deyil. Lakin insan zəhməti hər şeyə qadirdir. Biz yazıçılar yüksək zəhmətə adət etməyincə, böyük əsərlər yarana bilməz. Biz indiyə qədər ədəbiyyatımızın soldatları olmuşuq. Lakin bugünkü inkişafımız və ictimai ehtiyaclarımız bizdən artıq ədəbiyyatın komandiri və generalı olmağı tələb edir. Bəli, üç il bundan qabaqkı komandir bu gün general olursa, nə üçün eyni müddətdə yazıçının yaradıcılıq rütbəsi, yəni əsəri artmasın. Lakin hərbi generallarımızın yaranmasına əsas səbəblərdən biri də onların hərbi cəsarəti olmuşdur. Yaradıcılıq da özünə məxsus bir döyüş meydanıdır, həm də çox mürəkkəb bir meydandır. Bu meydan bizdən, hər şeydən əvvəl, zəhmət, cəsarət tələb edir. Cəsarətli yazıçı böyük mövzulardan, böyük insan surəti yaratmaqdan, öz dövrünün dastanını yaratmaqdan qorxmayacaq! Cəsarət sənətin çarpan ürəyidir. Ürəksiz bir bədən və həyat yaşaya bilməz..."

Hər yazısı öz yaradıcılığını bir daha düşünərsə, o öz dövrünün nəbzini tutan, şahidi olduğu hadisələrin və yeni insanlarımızın böyük

qəlbi ilə yaşayan əsərlər yaradarsa, bütün ədəbiyyatımız da bu yolla tərəqqi edər, öz dövrünün bədii abidələrini yaratmış olar. Odur ki, Yazıçılar İttifaqı öz gələcək işini hər yazıçının yaradıcılığı ilə ayrı-ayrı məşğul olmaq, ona doğru istiqamət vermək üzərində qurmalıdır.

Həyatı sevmək və alqışlamaq azdır. Həyata hörmət etmək, bunun üçün də həyatı dərindən öyrənmək, onun bütün təfsilatına bələd olmaq, onun inkişafına çalışmaq sovet yazıçısının əsas vəzifəsi olmalıdır. Odur ki, yazıçılarımızın üzünü həyatın maddi nemətlərini yaradan, vətənimizin və sənətimizin şöhrəti olan insanlara – fəhlə və kəndlilərimizə, əmək ziyalılarımıza doğru çevirməliyik!

Bəzən bizim kabinetlərdə və öz evlərimizdə həddindən artıq oturmağımız bizi həyatın real varlığından ayıra bilər. İnsanlar hərəkət etdikcə sənətkarın fikri və diqqəti onları izləməlidir. Onlardan ayrılmağı yazıçı özünə bir müsibət saymalıdır. Biri təşkilat yolu, ikinci yazıçının öz təşəbbüsü, öz meyli və arzusu. Mən təşkilatın bu işdə oynayacağı rolu azaltmaq istəmirəm. Lakin əsil yol yazıçının özünün açdığı yol olmalıdır! Nə üçün? Çünki sənətkarla həyat arasında olan əlaqə yolu "kampaniya" xasiyyəti daşımamalıdır. Bu yol hər sənətkarın öz gözü ilə seçilməli, öz əli ilə açılmalı, həm də ömürlük bir yol kimi açılmalıdır...

Yetişən hər istedadın taleyi ilə məşğul olmaq onun gələcəyi ilə məşğul olmaq deməkdir.

Hamımıza məlumdur ki, bizim yaşadığımız tarixi şəraitdə insan istedadı tez çiçəklənir. Heç təsadüfi deyildir ki, yeni yazıçılarımızın sayı ildən-ilə artır. Bu yol artımı xüsusilə müharibə dövründə çoxalmışdır. Ədəbi gəncliyimiz ədəbiyyatımızın gələcəyi deməkdir. Yazıçılar İttifaqının gələcək işi ədəbi gəncliyimizi atalıq qayğısı ilə əhatə etməlidir. Onlarla bizim ən təcrübəli yazıçılarımız yaradıcılıq işi aparmalıdır. Bu gənclərin klublarda, fabrik və zavodlarda, mədəni ocaqlarda oxucularla görüşlərini təşkil etmək, onları indidən həyatı yaradan insanlarımıza bağlamaq, onları yüksək savad, mədəniyyət və elmlə silahlandırmaq lazımdır. Bizim tənqidçilərimiz ədəbi gəncliyin tərbiyəsi ilə daha canlı, müntəzəm və böyük bir ehtiyatla məşğul olmalı, onlara sağlam və dürüst istiqamət verməlidir. Mən əminəm ki, bu şərəfli işə, gəncliyin yaradıcılıq taleyi işinə bütün təcrübəli yazıçılarımız və təcrübəli tənqidçilərimiz böyük həvəslə kömək göstərəcəklər. Çünki bu iş – böyük xalq işidir. Bizim ədəbiyyatın gələcək ordusunun yaradılması işidir.

Ədəbiyyatımızın sağlam həyat və yaradıcılıq xəzinəsi, onun mövzusunun mədəni zəminəsi bizə daha uyğun, daha bədii əsərlər yaratmaq üçün ümid və inam verir. Müharibənin odları, alovları içində öz vətən və xalqlarını daha çox sevən, öz şeir və sənət ustaları ilə daha çox fəxr edən qəhrəmanlarımızı onların adına layiq, zəmanəmizə layiq, Azərbaycan xalqının həyat və yaradıcılıq dühasına layiq əsərlərlə qarşılayaq!

Qoy yaradacağımız zəfər dastanlarının əzəmətli səsi bizim qəhrəmanlıq dövrümüzdən gələcək qərinələrə və nəsillərimizə xəbər versin! Mən də bu iş uğrunda öz qələmimi səfərbərliyə almış əsgərlərdən olmağımla fəxr edirəm.

Günümüzün böyük əsərlərini yaratmaq uğrunda çalışan, həm də gecəli-gündüzlü ürək kimi dayanmadan çalışan qələm yoldaşlarıma müvəffəqiyyətlər arzu edirəm. Xalqımız əmin ola bilər ki, biz yazıçılar zəmanəmizin qüdrətinə, xalqımızın fədakarlıq və misilsiz qəhrəmanlığına əbədi bir şöhrət verən əsərlər yaradacağıq.

*1944*

## C.CABBARLI BÖYÜK BİR SƏNƏTKAR KİMİ*

10 il bundan qabaq Bakının Kommunist küçəsilə üzü yuxarı ağır addımlarla böyük bir izdiham qalxırdı. Axıb gələn insan dalğalarının qarşısında dayanmaq mümkün deyildi. Bu böyük küçədə yerimək üçün imkan tapmayan bir çox adamlar isə uca binaların geniş pəncərələri arasında, böyük eyvanlarda dəstə-dəstə toplaşaraq, küçədəki izdihamı seyr edir, onlar da öz qəmgin və mütəəssir nəzərləri ilə haman axında iştirak edirdilər.

O gün, yanvarın ikisində, o soyuqlu gündə gördüyümüz o böyük xalq izdihamı bir tabuğ müşayiət edirdi. Bəlkə də bizim bu qocaman şəhər bütün tarixi boyu belə bir izdiham görməmişdi. Ürəkləri qaplayan ağır bir sükut qara bir bulud kimi gözlərdə nümayan idi. Xalq öz böyük sənətkarı ilə vidalaşırdı. Ölüm ayrılığı çox amansız, həm də heç bir vüsala ümid verməyəcək bir ayrılıqdır. Lakin vaxtsız ölümün kabusu isə daha amansız, daha dəhşətli, daha uğursuz bir kabusdur!

Dediyimiz izdihama toplaşanların qəlbi, vaxtından tez və gözlənilmədən vəfat etmiş bir sənətkarın həsrəti ilə alovlanırdı. Siz o izdi-

* Ölümünün 10 illiyinə həsr edilmiş xatirə gecəsində söylənilən nitq

hamda, müxtəlif yaşlı, müxtəlif sənətli insanlar görürdünüz. Yazıçı, alim, fəhlə, kəndli, hələ çarşafdan ayrılmamış evdar qadınlar, aktyorlar və bəstəkarlar, rəhbər dövlət və partiya xadimləri, oğlanlı-qızlı məktəbli uşaqlar, bir çox başqa sənət adamları – bir sözlə, bütün xalq öz məşhur dramaturq və ədibi ilə vidalaşırdı. O gördüyünüz insanların hamısı C.Cabbarlının oxucuları və tamaşaçıları idi. Cəfər öz sağlığında haman müxtəlif insanların müxtəlif həyatlarını, tale və arzularını əməl və məslək eşqlərini, onların nəşə və kədərlərini tərənnüm edən, xalqımıza böyük bir səadət arzu edən, həm də bu səadət uğrunda çarpışan mübariz bir sənətkar idi!

Odur ki, xalq yalnız bir sənətkarını deyil, bəlkə bir ictimai xadim və mübarizini də vaxtsız itirdiyini dərindən duyub dərk edir, ona bir ana qəlbi kimi yanırdı.

“Ölmək! O geniş körpünü hər kəs keçəcəkdir;
Bir badə ki, ondan bütün aləm içəcəkdir!”.

Ölüm fəlsəfəsinin həm dəhşətini, həm də təbii bir zəruriyyət olmasını yüksək bədii bir dillə ifadə edən bu şeir isə Cəfərdən ayrıldığımız gün bizə az-çox təsəlli verirdi.

Siz mənim bu çıxışımdan Cəfərdən gətirəcəyim misalları onun şeirlərindən başlamağımı heç də təsadüfi saymayın! Mən böyük bir dramaturq olan Cabbarlının bütün yaradıcılığında zəngin bir poeziyanın qüdrətini duyuram ki, bu xüsusda məruzə boyu xüsusi qeydlərim olacaqdır!

Cabbarlı kimdir? Onun Azərbaycan ədəbiyyatında tutduğu mövqe nədən ibarətdir? Bu suala cavab vermək üçün Cabbarlının bizə irs qoyub getdiyi ədəbi xəzinəni uzun illər boyu axtarmaq, onun hələ bizə məlum olmayan bir çox kamal və sənət incilərini kəşf etmək, bu xüsusda qalın cildli kitablar yazmaq lazımdır. Heç şübhəsiz ki, inkişaf və tərəqqidə olan elmi fikrimiz, ədəbi nəzəriyyəmiz bu şərəfli işin öhdəsindən yaxın bir zamanda gələcək və gəlməlidir. Mənim Cabbarlının yaradıcılığı haqqında olan fikirlərimi isə siz elmin, yaxud nəzəriyyənin verdiyi hökmlər kimi deyil, bəlkə kiçik bir sənətkarın böyük bir sənətkar haqqında olan bilavasitə mülahizələri, təəssürat və ürək çırpıntıları kimi qəbul edin!

Hər xalqın milli mədəniyyət tarixində nadir simalara təsadüf olunur ki, onların dühası vasitəsilə haman xalqın varlığı, mənəvi həyatı və

milli şöhrəti qol-qanad açır, gündən-günə çiçəklənir, yeni-yeni təravət və mənəvi yüksəliş dövrləri keçirir. Belə nadir şəxsiyyətlərin ədəbi, yaxud elmi fəaliyyəti nəticəsində xalq kamalı, onun mənəvi dünyası, həyat və mübarizə qüdrəti düha süzgəcindən keçirilərək ümumiləşdirilir, xalq şüuruna yeni-yeni məfkurələr, tərəqqipərvər əməllər və arzular aşılanır, xalq öz tarixi və öz istiqbalı ilə fəxr edir; o, dünya mədəniyyəti səhnəsində tanınır, bir çox ölkələrin və xalqların da nəzərində yüksəlir, onların da hörmət və məhəbbətini qazanır.

Cabbarlı XIX və XX əsr Azərbaycan ədəbiyyatı tarixinin ən nadir simalarından biridir. Cabbarlı öz yaradıcılığının vüsəti, sənət xəzinəsinin zənginliyi etibarı ilə Mirzə Fətəli Axundovdan və Cəlil Məmmədquluzadədən (Molla Nəsrəddin) sonra XX əsr ədəbiyyatının ən görkəmli simasıdır. Cabbarlı Azərbaycan klassik şeri zəminəsində yetişmiş, milli ədəbiyyatımızın ən gözəl ənənələrini inkişaf etdirmiş, yeni bir dramaturgiya ədəbi məktəbini yaratmış bir şəxsiyyətdir. Milli mədəniyyət zəminəsi ilə yaşamayan, mənsub olduğu xalqın mənəvi həyatı, onun proqressiv ideyaları, əməl və arzuları ilə silahlanmayan insanların heç bir siması olmadığı kimi, heç bir yaradıcılıq siması da ola bilməz. Cabbarlı bu böyük həqiqətlə yaşayıb-yaradan bir sənətkar idi. Lakin tarix göstərir ki, öz xalqını doğrudan da sevən, onun taleyi və gələcəyi ilə ciddiyyətlə məşğul olan, həm də bir sənətkar kimi böyük istedada malik olan şəxslər öz milli mədəniyyət çərçivəsində bağlanıb qalmamış, o, eyni zamanda, ümumbəşəri ideallarn və əməllərin də tərənnümçüsü olmuş, bu yolla da öz xalqının mənəvi həyat üfüqlərini daha da genişləndirmək, dünya mədəniyyəti səhnəsində onun da mövqe qazanması uğrunda çarpışmışdır. Biz böyük sənətkarlara xas olan bu sifəti də Cabbarlının yaradıcılığında açıqca görürük. Cabbarlı yalnız Azərbaycan ədəbiyyatının gözəl ənənələrinə deyil, böyük rus ədəbiyyatının, Avropa və Şərq mədəniyyətinin də gözəl abidələrinə hörmətlə, onlardan bir sənətkar kimi, həm də məharətlə istifadə edərdi. Heç də təsadüfi deyil ki, Şekspir dramaturgiyasının bir çox gözəl xüsusiyyətlərini biz Cabbarlı sənətində görürük. Məsələn, böyük insan xarakterləri, sarsılmaz iradələrin kəskin və dəhşətli mübarizəsi, fədakarlıq və bahadırlıq kimi yalnız insana məxsus olan sifətlər, həyat və tale haqqında mənalı və dərin mülahizələr, zaman və məkan haqqında fəlsəfi düşünüş, məhəbbət və azadlıq əməlləri, ictimai həyat və şəxsiyyət problemi, tarix və həyat konfliktlərinin gərgin, bəzən müdhiş çarpışmaları kimi hələ qədim

yunan dramaturgiyasından davam edib gələn bu gözəlliklər Cabbarlı sənətində başqa bir təravət, başqa bir yenilik qazanmışdır.

Öz dövrünün əsil mənada sənətkarı olmaq üçün, hər şeydən əvvəl, o dövrün övladı olmaq lazımdır. Belə bir səadət bütün sənətkarlara nəsib olsaydı, dahilərin və böyük insan şəxsiyyətlərinin sayı çox olardı. Cabbarlı doğrudan da öz dövrünün əsil övladı olduğundan, bu dövrün əsil sənətkarı oldu. Vətənimizdə yaranmış sosialist inqilabından sonra xalqımızın iqtisadi və mədəni həyatı böyük bir intibah dövrü keçirdi. Köhnə bir dünya kökündən sarsılmağa, yeni bir dünya isə yeni-yeni çiçəklənməyə başladı. Ölkəmizdə gedən sinfi mübarizələr çox çətin və dəhşətli şəkillər aldı. Müxtəlif dünyagörüşləri, baxışları və zövqlər, müxtəlif həyat həqiqətləri baş-başa, döş-döşə çarpışmağa başladı. Bir tərəfdən sovet quruluşunun azad zəhmət, sinifsiz cəmiyyət, istismar və təhqirsiz bir dünya, əsil mənada milli azadlıq və istiqlaliyyət, böyük və kiçik xalqlar arasında mənəvi hüquq bərabərliyi kimi proqressiv və humanist əməlləri, o biri tərəfindən bütün bunlara zidd olan, öz şəxsi mənafe və hakimiyyət ehtiraslarını xalqın tale və mənafeyindən üstün tutan, "ağalıq və köləlik" cəmiyyəti məfkurələri qılınc kimi üz-üzə çarpışmağa başladı. Cəmiyyətimiz böyük fırtınalar və tufanlar keçirdi. Bir çoxları bu tufanlar içində şaşdı, fırtınalar qoynuna düşmüş gəmilər kimi öz hərəkət istiqamətini itirdi. Fəqət Cabbarlı öz xalqının və dövrünün əsil övladı olduğundan o, xalqının ürəyindən və idrakından qopub gələn qabaqcıl tərəqqipərvər ideyaları görə bildi, sosializm cəmiyyətinin ədəbiyyatımız sahəsində ilk carçılarından və bu uğurda böyük mübarizələr aparan sənətkarımız oldu.

Məncə, Cabbarlı sənətinin əsil və böyük qüdrətini də bu sənətin yüksək ideyalar, canlı fikirlər, humanist əməl və arzular sənəti olmağında görmək lazımdır. Cabbarlının ikinci böyük sifəti isə, qarşısına qoyduğu məslək və əməllərinin bədii ifadəsi üçün mahir bir qələmə, böyük sənət vasitələrinə sahib olması idi.

Onun üçüncü böyük xüsusiyyəti də bunda idi ki, yuxarıda dediyimiz yüksək ideyaları və sənət vasitələrini o, yalnız kitablarda, yaxud şüarlarda deyil, xalqımızın həyat və mübarizə səhnələrində, insanların konkret dünyagörüşü və xarakterində, bir sözlə desək, xalqımızın yaşamaq və yaratmaq nəfəsində görürdü. Məhz bu nəfəsə görə də Cabbarlı ədəbiyyatımızda sosialist realizminin banisi və ən böyük simasıdır – desək, şübhəsiz, bir həqiqəti bir daha təkrar etmiş olarıq.

Bununla əlaqədar olaraq, Cabbarlı realizminin bir çox əsas məziyyətlərindən danışmaq lazımdır.

Bu realizm, hər şeydən əvvəl, həyat və mühit həqiqətlərinin bədii sənətdəki təzahürüdür. Cabbarlının qələmə aldığı istər müsbət, istərsə mənfi insanlar, yaxud ictimai hadisələr həyatın soyuq bir şüurla dərk edilmiş fotoqrafiyası deyil, sənətkar qəlbinin və idrakının, ilham dediyimiz böyük bir qüdrətin günəşi ilə isinmiş, duyulub yaşanılmış, həm də səciyyəvi insanlar və səciyyəvi hadisələr, həqiqətlərdən bəhs edən bir sənətdir. O, insanların yaxud hadisələrin zahiri konfliktlərindən deyil, daxili və mənəvi aləmindən, insan təbiətinin daxili ziddiyyətlərindən bəhs edən, həm də cəsarətlə bəhs edən bir sənətkar idi. Cabbarlı realizminin məna dolğunluğunu və forma zənginliyini də bunda axtarmaq lazımdır. Cabbarlı həyat həqiqətlərini təsvir etdiyi vaxt onlara heç bir boya vurmadığı üçün insanların və hadisələrin əsil təbiətinə, obyektiv mənasına və məzmununa xələl gətirmir; o, sənət fırçasını və ilham pərisini öz sənətkar idrakının qadir qanadlarına tapşırır. Buna görədir ki, Cabbarlı realizmində "inandırıcılıq" dediyimiz böyük bir sənət məziyyəti bizi heyran buraxır. Bu fikrimizi daha şairanə desək, belə bir qənaətə gəlirik: biz bir tamaşaçı kimi Cabbarlının qələmə aldığı insanları seyr edirik; müxtəlif sinlər, müxtəlif qiyafələr, müxtəlif xasiyyət və dünyagörüşləri, ehtiraslar – bütün bunları ifadə edən canlı və təravətli dillər, danışıqlar və hərəkətlər... Bu müxtəlif insanlar arasında yaradılan mükalimə nə yolla gedir? Səhnədə danışan ağızlar və dodaqlardırmı? Xeyr, orda dil açıb danışan ürəklərdir! Ürək danışmayan bir yerdə həyat olmadığı kimi, sənət də ola bilməz:

"Mən elə bildim ki, mənə acıqlanacaqsınız, mən buraya gəlib sənin evində, sənin dincliyini pozmaq istəməzdim, qulluq etdiyim yerdə şirni paylayırdılar; mənə bir az alma və şirni pay vermişlər; mən uzaqda gəzirdim, oğlumu gözləyirdim. Bəlkə bayıra çıxar, dayandım, axır yoruldum, oturdum. Sonra bilmirəm nə oldu, budur, ancaq mən oğlum üçün gəlmişəm. Mənə acıqlanmayın..."

Sevilin bu lirizm və yanıqlı bir poeziya ilə dolu sözlərində bir insan və bir ana kimi təhqir olunmuş, məhkum, fəqət saf bir ürəyin sızıltıları danışır.

Yaxud: "Budur əsrlərdən bəri zavallı insanı didib çeynəyən canavar! Budur əsrlər boyu qanun adına hökmranlıq sürən qanunsuzluq! Neçin o zəngindir, mən bir köləyəm! Ana təbiətin öz yavrularına verdiyi bu yaşıl çəmənlər, geniş məhsuldar çöllər, irmaqlar, sərin sular hamısı kimin olmalıdır?.. Kiçicik könlündə diləklər çırpınan səni, gündə bir

bülbülün mahnıları ilə oxşanacaq, gündə bir çiçəyin yarpaqları ilə bəzənəcək səni, canlı bir insan ürəyini əbədi əsarət tapdağında çeynədən nədir? Nə üçün sən ancaq onun olmalısan?"

Elxanın yenə böyük bir poeziya qüdrəti ilə səslənən bu humanist sözlərində tarixin, qanun və ənənələrin cinayətləri haqqında soyuq mühakimələr cərəyanı deyil, azad həyat və azad məhəbbət amalı ilə yanıb qovrulan bir ürək, həm də bir qəhrəman və filosof ürəyi dil açıb danışır.

Biz Cabbarlı dramaturgiyasına qanad verən bu şeriyyəti onun ən gözəl bir xüsusiyyəti, daha doğrusu, onun aparıcı bir qüvvəsi, daima irəliyə, tərəqqiyə çağıran bir sənət səsi, ilham səsi kimi duymalıyıq. Cabbarlı sənətinin bu gözəl məziyyəti, yəni şeriyyəti haqqında xüsusi kitablar yazılmalıdır. Çünki əsil və böyük sənətin yolu poeziya yoludur, yəni sabaha çağırış və tərəqqi yoludur!

Biz Cabbarlı sənətindəki bu proqressiv çağırışa inqilabi romantizm adı veririk. Onun ən realistik əsərlərindən olan "Almas"dakı bir şeri xatırlayın:

"Hey sən, əski dünya, təslim ol!
Əski dünya, təslim ol!
Sənə qarşı yürüş var,
Maşınlara od buraxın,
Vuruş var ha, vuruş var!
Sıralara duraq biz,
İrəliyə, irəliyə!
Yeni dünya quraq biz!"

Həcm etibarilə bu kiçicik şeirdəki "irəliyə" irəliyə!" deyə səslənən məna yalnız "Almas" əsərinin leytmotivi deyil, məncə, bütün Cabbarlı yaradıcılığının leytmotividir.

Mən Cəfərin yaradıcılığında böyük bir realizmin təbiəti ilə həmahəng olan böyük bir romantizm də görürəm.

Öz dövrünün mədəni şüuruna geniş mənada təsir etmək, öz dövründə yaranan ədəbiyyatın inkişaf yolunu təyin etmək hər yazıçıya nəsib olan səadət deyildir. Bizim dövrümüzdə belə bir səadət Cəfər Cabbarlıya nəsib olmuşdur ki, mən bunu bir sənətkar kimi etiraf edirəm. Müasir dramaturgiyamızda Cabbarlı sənətinin böyük nəfəsi hakimdir. Bu, belə də olmalıydı. M.İbrahimov, S.Rüstəm, H.Mehdi, Sabit Rəhman, Rəsul Rza, Zeynal Xəlil kimi dramaturqlarımızı, bir də bu sözlərin müəllifini nəzərə alın, hamımızın yaradıcılığımızda Cabbarlı sənətinin məna gözəlliyi bu və ya digər şəkildə ifadə olunur, yeni-yeni təravət

və inkişaf mərhələləri keçirir. Biz bununla yalnız fəxr edə bilərik. Ədəbiyyatımızda, xüsusən, dramaturgiyamızda olan bu məna birliyini, əməllər və arzular birliyini yalnız ədəbi əsərlərin bir-birinə olan təsiri ilə izah etmək dürüst olmaz. Belə olsaydı, heç kəsin orijinal yaradıcılıq siması olmazdı, bütün əsərlər bir-birini təkrar edərdi. Həyat obrazı Sevil deyil, lakin Sevildən ayrı da deyil. O, Sevilin ictimai bir insan kimi daha inkişaf etmiş, başqa bir timsalıdır. Sevilin öz qəlbi, öz surəti, Həyatın öz qəlbi, öz surəti var; heç kəs Həyatın adını dəyişib Sevil çağıra bilməz, həmçinin Saçlı obrazı öz isməti və qəlbi ilə Alması xatırlatsa da, ayrı-ayrı bədii surətlərdir.

Vaqif öz əməlləri, böyük qəlbi və mübarizə iradəsi, fədakarlığı etibarilə Elxandır desəm, təəccüb etməyin. Lakin, yenə heç kəs Vaqifin adını Elxan çağıra bilməz. Bunlar eyni əməl və məslək eşqlərinin müxtəlif dövrlərindəki müxtəlif insanlar surətində ifadəsidir. Bəs bunların arasındakı mənəvi birlik nədən doğur? Həyat da, Sevil də, Vaqif də, Elxan da bir atanın, bir ananın övladlarıdır. Bu əsərləri yaradan insanlar da eyni atanın və ananın övladlarıdır. Demək, ədəbiyyatımızda olan bu məna birliyi xalqımızın mənəvi həyatındakı vəhdətin bədii bir formasıdır!

Bəlkə, bir çoxları mənə sual verər ki, sən Cəfərin yaradıcılığında yalnız müsbət cəhətlərini görürsən? Bəs onun bir çox çatışmayan, yaxud nöqsanlı cəhətləri yoxmudur? Mənim cavabım hazırdır: siz təsəvvür edin ki, mən bu saat mahir bir heykəltəraşın yaratdığı və “gözəllik abidəsi” adı verdiyi bir heykəl qarşısındayam. Bəlkə bu gözəl abidənin sifətindəki bir çox cizgilər də öz yerində deyil. Bəs nə üçün mən onları görmürəm? Çünki mənim bütün huş və diqqətim, bütün daxili aləmim bu “gözəllik abidəsinin” gözlərindəki, surətindəki mənaya bağlanmışdır. Bəli, bu sənətdəki ülviyyət məni özünə məftun etmişdir. Mənim fikrim və diqqətim cizgilərlə deyil, mənalarla məşğuldur. Fəqət gözəllikdə çirkinlik, yaxşılıqda yamanlıq, işıqda qaranlıq axtaranlar isə yaman gözlərdir.

Cəfər Cabbarlı dramaturgiyasındakı mübariz və qadir insan ifadələri bizi heyran qoyur. Elxanla Aqşin səhnələrinin sarsıdıcı təsirlərini xatırlayın. Elxanla Aqşin üz-üzə dayandıqları zaman elə bil ki, iki böyük dağ baş-başa gəlir, yaxud iki ümman öz sahillərini aşaraq döş-döşə gəlir. Bəs bu qüdrətli iradələrin sirri, yaxud hikməti nədədir? Məncə, böyük iradə, sahibləri böyük məslək, yaxud məqsəd adamları olur. Elxanın da, Aqşinin də iradəsinə qanad verən onlardakı məslək eşqi və məqsəd böyüklüyü idi, hər ikisi dünyanın, insanlığın gələcəyinə, müxtəlif də olsa, yollar açmaq istəyirdi.

Odur ki, biz tamaşaçılar onları seyr etdiyimiz vaxt yalnız onların hərəkətlərini, iztirab və mübarizələrini deyil, bəlkə daha çox onların izlədiyi məqsədi, o məqsədin gələcəyini də seyr edirik. Belə bir vəziyyət isə ədəbi əsərlərin uzun müddət ömür sürməsinə səbəb olur. Müasir ədəbiyyatımızın ən nöqsan və zəif cəhəti bundadır ki, biz seyr etdiyimiz insanların bugünkü halını, bugünkü mübarizə və məişət tərzlərini az-çox görürük, lakin onların sabahını, gələcəyə çağıran böyük əməllərinin, məqsədlərinin ifadəsini ədəbiyyatımızda görmürük.

Sovet adamı faşizm taununa yalnız öz süngüsü, hünəri və intizamı ilə deyil, bəlkə bu sifətlərin mənəvi bir çeşməsi olan müqəddəs əməlləri, bəşəriyyətin və tarixin gələcəyinə olan yüksək inamı, həyata olan fəlsəfi baxışı, dünyagörüşü ilə qalib gəlir ki, bütün bu sifətlərdən faşist ordusu məhkumdur. Ən böyük qalibiyyət mənəvi qalibiyyət olduğu kimi, ən yaman məğlubiyyət də mənəvi məğlubiyyətdir.

Budapeşt şəhərini hər tərəfdən mühasirəyə almış, düşmənə heç bir çıxış yolu qoymamış ordumuzun komandanlığı, o gözəl şəhərin qədim xatirələrini, incəsənət abidələrini uçurmamaq üçün, şəhərdə izafi qanların tökülməməsi üçün alman ordusuna təslim olmaq tapşırığı göndərdi. Ordumuzun bu humanist hərəkəti sovet xalqının odlar-alovlar içində belə yüksək əməllər xalqı olduğunu bir daha nümayiş etdirdi. Məqsədi çirkin, lakin dəhşətli olan faşist komandanlığı isə bütün tarix boyu davam edib gələn qaydaları həyasızlıqla pozaraq, bizim elçiləri namərdliklə həlak etdi. Bu hal isə faşizm mənəviyyatının son dərəcə pozğunluğunu, ölümə məhkum olduğunu bir daha nümayiş etdirdi.

Qoy müasir dramaturqlarımız sovet xalqının bu mənəvi qalibiyyətini, faşizmin isə mənəvi məğlubiyyətini Cabbarlıya məxsus olan bir cəsarətlə ifadə etsinlər.

"Sevil" pyesindəki Gülüş: "Mən hələ gülüşəm, böyüyəndən sonra isə qəhqəhə olacağam..." – deyir. Biz bu sözlərdə yalnız Gülüşün, yaxud azad qadınlığımızın xoşbəxt səsini deyil, bəlkə bütün xalqımızın səadətini, onun qalib iradəsini və səsini eşidirik. Məncə, Cəfər Cabbarlı sənəti bizim sovet dövrü mədəniyyətimizin qəhqəhə pilləsidir. Bu böyük nailiyyətə bircə arzu artırmaq olar ki: qəhqəhələr çoxaldığı zaman büsat və təntənə başlayır. Qoy ədəbiyyatımızın, bütün mədəniyyətimizin bugünkü və sabahkı təntənəsi möhtərəm sənətkarımız Cabbarlıya ən gözəl bir xatirə və abidə olsun. Mədəniyyət ordumuzun bu arzusunu şerimizin dili ilə belə ifadə edək:

Bir həqiqət, bəlkə canlı bir xəyal kimi
Müqəddəsdir Cabbarlının söz ülviyyəti.
Qanad gərsin üfüqlərə bir qartal kimi,
Xalqımızın böyük qəlbi, böyük sənəti!

*1944*

## BALALARIMIZ ÜÇÜN GÖZƏL ƏSƏRLƏR YARADAQ

Azərbaycan Xalq Komissarları Soveti uşaqlara gözəl nəğmələr yaratmaq üçün dövlət müsabiqəsi elan etmişdir. Bu təşəbbüs bizim şairlərimiz və bəstəkarlarımız qarşısında şərəfli bir vəzifə qoyur. Bununla əlaqədar olaraq, bugünkü uşaq ədəbiyyatımızın vəziyyəti haqqında, bir çox pedaqoji və təlim-tərbiyə məsələlərimiz ətrafında daha ciddi düşünmək, daha səmərəli işlər görmək zamanı gəlib çatmışdır.

Uşaq insandır! Onun sadə görünən oynaq, daima xoşbəxt və azad təbiətində böyük insanların bütün xassələri mövcuddur.

Düşünmək, duymaq, sevmək, küsüb-incimək, ağlamaq, gülmək, qəzəblənmək, xatırlamaq, xəyala dalmaq, ümid və arzulara bağlanmaq, yaxşılıq, hörmət – bütün insan xassələri uşaq aləmində mövcuddur.

Demək istəyirəm ki, biz uşaqla danışdığımız zaman insanla danışdığımızı, uşaq üçün yazdığımız zaman insan üçün yazdığımızı unutmamalıyıq.

## UŞAQLIQ VƏ MƏNA GÖZƏLLİYİ

İnsan həyatının ilk və gözəl mənası uşaqlıqdan başladığı üçün biz də bu məqaləmizdə ilk məsələ olaraq məna gözəlliyindən bəhs etmək istəyirik. Uşaq üçün yazılmış hər bir əsərin əsasında məna gözəlliyi yaşamalıdır. Mənası dayaz, qayə və məqsədi aydın olmayan, ötərgi hisslər və təsirlər tərənnüm edən əsərlər uşağın hafizəsində ani bir qığılcım kimi parlayıb sönür. Dediyimiz məna gözəlliyi həqiqətlə nəfəs almalıdır. Uşaq qəlbini tərbiyə etdiyimiz zaman o qəlbə həyat və təbiətin həqiqətləri ilə qanad verməliyik. Bu həqiqət o qədər zəngin, rəngarəng, mənalı və gözəldir ki, onun heç bir boyağa, rəng və uydurmalara ehtiyacı yoxdur. Mən həyat həqiqəti dediyim zaman nəzərdə yalnız həyatın, varlığın müsbət cəhətlərini, zaman və məkanın müqəd-

dəs hisslərini, əməl və arzularını – bir sözlə, kainatın romantikasını tuturam. Mən bu həqiqət dediyim aləmdə yalnız yaxşılıq və sədaqət görürəm. Fənalıq deyilən məfhumu isə həqiqət dünyasından saymıram. Çünki fənalıq müxtəlif ictimai şərait nəticəsində sonradan, həm də süni olaraq yaranmışdır. İnsan fitrətində fənalıq yoxdur. Bu yalan məfhum uşaq aləminə yabançıdır. Uşaq hər şeydə bir nəşə, bir sevinc, hər kəsdə hörmət və nəvaziş görür. Uşaq humanistdir. Onun ruhu ən xeyirxah hisslər yuvasıdır. Yazacağımız əsərlər yalnız bu xeyirxah və gözəl hissləri tərənnüm etməlidir. Bəzən bizim əsərlərimiz uşaqlarımıza müxtəlif fənalıqlar haqqında moizələr, nəsihətlər oxuyur. Çox təəssüf ki, bütün bu nəsihətlər səmərəsizdir. Nə üçün? Çünki uşaq təbiətində fənalıq yoxdur. Fikrimizi sübut üçün bir misal gətirmək istəyirəm. "İkinci il" kitabında məzmunca köhnəlmiş bir hekayə vardır. Hekayənin məzmunu budur: çalışqan uşaq bu gün dərsini hazırlayıb – sabah oynaram, deyir. Tənbəl uşaq isə bu gün oynayıb – sabah dərsimi hazırlaram. deyir! Məlum olur ki, uşaqların müəyyən bir qismi çalışqan, başqa bir qismi isə tənbəldir. Bu həqiqətdirmi? Fitrətdə tənbəl uşaq varmı? Mən: yoxdur, – deyirəm! Belə bir bölgü uşaqlıq aləminə böhtandır. Çünki hərəkət, dinləmək, maraqlanmaq, sevinib-ağlamaq, düşünüb-duymaq, inkişafa doğru meyl və həvəs bütün uşaqların təbiətindədir! Madam ki, belədir, tənbəl haradan yarandı? Əgər bir uşaq dərsə müntəzəm davam etmirsə, dərsini yaxşı hazırlamırsa, bu sifət onun tənbəl fitrətindənmi yarandı? Xeyr! Bəlkə onun təbiəti daha oynaq, daha mütəhərrik, daha qüvvətlidir. Lakin biz ona, dərs hazırlamadığına görə "tənbəl" adı vermişik. Bu "tənbəlliyin" səbəbini biz ailədə, məktəbdə, pedaqoji şəraitdə axtarmalıyıq. Bəzi hallarda məktəbə böyük həvəslə gəlmiş bir uşağı soyuq və təravətsiz dərslər, quru və cansız söhbətlər yorur, onun qəlbi və canı sıxılır. Odur ki, uşaq təbiətə qaçmağa can atır. Görünür ki, təbiətdə daha maraqlı səhnələr, əyləncələr və zövq mənbələri vardır. Bəzi hallarda isə uşaq bir çox xəstəlik və ya başqa səbəblər üzündən huş və diqqətini toplaya bilmir, dərsə, məktəbə isinişə bilmir. Lakin müəllim bu uşaq ruhunu təşrih etmədən, onun dağınıq huş və xəyalının səbəbini araşdırmadan, uşağa sadəcə "tənbəl", "zəkasız" deyə ad verir. Bu adları eşidən uşaq get-gedə məyuslaşır, həvəs və ümidləri qırılır, onun mənəvi aləmi xəzan vurmuş bir bağçanı andırır. Xülasə olaraq, tənbəllik, zəkasızlıq, yaramazlıq kimi uşaq təbiətində olmayan sifətlər ədəbiyyatımıza mövzu olmamalıdır.

## İNSAN VƏ TƏBİƏT EŞQİ

Yuxarıda dediyimiz məna gözəlliyinin əsas ruhu insana və təbiətə qarşı məhəbbətdir. Uşaq özü canlı olduğundan insan və təbiət aşiqidir. Şeir və nəğmələrimiz, hər şeydən əvvəl, təbiət və insan gözəlliyini tərənnüm edərsə, uşağın onlara qarşı meyl və həvəsi çiçəklənər, o özü də insan olmağı ilə fəxr edər. Siz sual verə bilərsiniz ki, insanların hamısı gözəl və yaxşı deyil ki? Bəs pis adamlar, istismarçılar, qəsbkarlar, oğrular və cibgirlər haqqında uşaqlara məlumat verilməsinmi? Xeyr, tələsməyin? Uşaq həyatının müəyyən dövrü gələcəkdir ki, o özü həyatda gördüyü, eşitdiyi fənalıqlarla maraqlanacaqdır. O zaman biz ona bu anlaqlar haqqında izahat verərik. Bəzən bizim yazıçılarımız yeddi-səkkiz yaşında uşağa hərbi paltar geydirir, tüfəng və patrondaş verir, onun böyründən bomba da asır, dilinə isə şüarlar verir: "Yaşasın azadlıq, yaşasın vətən, məhv olsun zalımlar və qəsbkarlar!" Bütün bunlarla biz uşaqlarımızda vətənpərvərlik və qəhrəmanlıq hissləri yarada bilmərik. Bu yolla yazılan əsərlər, şübhəsiz ki, uşaq təbiətini zorlamış olar, ona vətəni və xalqı sevdirə bilməz. Bunların əvəzində isə vətən torpağının gözəl səhnələrini, onun günəşli səhərlərini, ulduzlu axşamlarını, gözəl insanlarını həqiqi şeir dili ilə təsvir etsək, uşaq vətənpərvərlik sözünü eşitməsə də, öz vətəninə məftun olacaqdır. O, böyüdüyü zaman isə bu vətənə təcavüz edənlərə qarşı amansız olacaqdır. Ədəbiyyat uşaq şüuruna nitqlər demək yolu ilə deyil, uşaq qəlbini təbiət və insana məftun etmək yolu ilə getməlidir!

## XƏYAL VƏ ROMANTİKA

Uşaq xəyalı səyyardır. O, şıltaq bir ulduz kimi daima süzüb oynar. O, güldən-gülə, çiçəkdən-çiçəyə qonan bir kəpənəyə bənzər. Daim hərəkət uşaq təbiətinin hüsnüdür. Xəyal və romantika bu təbiətin qanadlarıdır. Uşaq xəyalı bəzən ağ buludların cərəyanına qoşulub uçur, aydınlıq gecələrdə sayrışan ulduzlar içində gəzib seyr edir, ayla batır, günlə doğur, dərin dəryalarda qəvvas kimi üzür, keçilməz ormanlardan, dağlıq və qayalıqlardan öz zərif ayaqları ilə keçir, şirlər və pələnglərlə pəncələşir. Biz bütün bu sonsuz xəyallar dünyasında qəhrəmanlıq, yüksəliş və uca arzular və əməllər görürük.

Təəssüf ki, ədəbiyyatımız uşaqların təbiətində olan bu yüksək romantika hisslərinin inkişafına kömək etməyi çox zaman unudur. Uşaqlarımız üçün romantik əsərlər yaratmaqdan ötrü ən gözəl mənbələr bizim nağıllarımız və əfsanələrimizdir.

Əfsanə sözündən qorxmaq lazım deyil, hər hansı bir əfsanə olursa-olsun, biz onda həqiqət şəfəqləri görməliyik. Çünki onu insan yaratmışdır. Bütün əfsanələr həyat və insan yaranandan sonra yaranmışdır. Biz bu əfsanələr və nağıllar aləmində işıqla qaranlığın, xeyirlə şərin, doğma ilə yadın, düzlüklə əyriliyin mübarizələrini duyuruq. Əgər bir nağılda, yaxud əfsanədə divlər də iştirak edirsə, bu əhvalatı heç bir ictimai dilə, məfkurəvi təhlilə çevirmədən, eyni ilə bakir halında uşaqlarımıza tərənnüm etməliyik. Uşaq bu dəhşətli nağılları dinlədiyi zaman öz taleyini yalnız müsbət qəhrəmanlarla bağlayır, onların yaman gününə ağlayır, yaxşı gününə sevinir. Biz uşaqlarımızı daima güldürmək, sevindirmək yolu ilə getsək, tərbiyəmiz birtərəfli olar ki, o uşaqda böyüdüyü zaman hər şey laqeyd, arsız, "əziz-xələf" deyilən, həyatın mənasında yalnız hırıltı və sadə yeyib-içmək məqsədi görən məsləksiz və əqidəsiz insanlar yaranar. Bədii söz uşaq qəlbini bahar kimi şəfəqləndirməyi bacardığı kimi, onu zülmətlərdən, tufan və fırtınalardan da keçirərək mübarizəyə, inkişaf və tərəqqiyə hazırlamalıdır. Uşaqlarımız sevinməklə yanaşı pərişan olmağa, gülməklə bərabər ağlamağa, şənlik və zarafatla yanaşı dalğınlıq və mütəəssir olmağa da alışmalıdır. Lakin bütün bu dolaşıq və mürəkkəb həyat səhnələri elə bir ustalıqla yazılmalıdır ki, nəticədə məyusluq deyilən yaman bir hiss yaranmasın. Yuxarıda dediyimiz hisslərin uşaq qəlbində inkişaf etməsinə, onun xəyal və arzularının yüksəlməsinə zəmin yaradır. Təəssüf ki, uşaqlarımıza aid romantik, bəzən həyat həqiqətindən uzaq olan xəyalı həqiqətlər tərənnüm edən əsərlərimiz yox dərəcəsindədir. Əksinə, torpaq, daş, dəmir, mədənlər, ev heyvanları, adi məişət səhnələrinə aid əsərlərə, həm də heç bir xəyal və arzuya dəvət etməyən əsərlərə daha çox təsadüf edirik ki, onlarda həyat və həqiqət dediyimiz şeylər bəzən olduqca bayağı, qaba və quru bir halda təsvir olunur. Ədəbiyyat uşaq xəyalının daima torpağa, adi vərdiş və hərəkətlərə bağlayıb saxlarsa uşaq hər şeyə, hər kəsə "utilitar" sadə mənfəət nöqteyi-nəzərindən baxmağa adət edər; o özünü bir insan olaraq bütün varlıqdan daha yüksəklərə qalxmaq kimi böyük bir qüdrətdən və qanaddan məhrum hiss edər. Siz güman etməyin ki, mən uşaq ədəbiyyatımızı həqiqi həyat zəminəsindən ayırmaq istəyirəm. Xeyr!

Mən bu zəminəyə insan və həyat dediyimiz aləmə qanad vermək, onu adi halından daha yüksək, daha parlaq bir halda görmək istəyirəm. Əgər məqsəd budursa, yaşasın xəyallar, yüksək fantaziyalar – deməyə də haqqımız vardır! Lakin bəzi şairlərimizdə insaf yoxdur. Onlar həyat dedikləri zaman ritorika, qansız və cansız rəqəmlər, zövqsüz və quru səhnələr yaradaraq uşaqlarımıza əzbərlədirlər:

"Uşaqlar! Ölkəmizin
Canıdır neft və benzin".

Nə üçün? Şair izahat verir:

"Gəmiyə, parovoza,
Fabrikaya, zavoda
Neftimizdir can verən,
Qüvvə verən, qan verən!
Neftdən olur yağ, benzin,
Neftdən olur kerosin,
Bütün avtomobillər
Benzinlə yol gedirlər,
Traktor – kerosindən,
Təyyarə də – benzindən
Qüvvət alır, güc alır.
Neftlə ölkə ucalır".

Şeir və sənət adına böhtan olan belə xaltura bizim balalara nə kimi bədii bir zövq verər? Məgər ölkəmizin təbii sərvətlərini bu yoxsul dillə, bu soyuq və cansız bir ürəklə təsvir edən şairləri vicdan məhkəməsi qarşısına çəkmək olmazmı?

Siz hələ ifadələrdəki 7-8 yaşlı uşaq beyninə sığışmayan "yaşayış başqalaşmış", "köhnə kənd", "təzə kənd", "köhnə şəhər", "təzə şəhər" mətləblərinə diqqət yetirin. Yaxud:

"Kolxozçunun üzünə
Gülümsər gözəl bir yaz.
İşıq gəlmiş gözünə
Çəkilmiş bulud, ayaz".

– Müəllim! Bulud, ayaz haraya çəkilmişdir?

Müəllim cavab verir: – bala, bu bulud, ayaz sən deyən bulud, ayazdan deyil! Bu sözlər köhnə vaxtdakı əsarət, cəhalət, istismar mənasındadır. Başa düşdün? Uşaq isə başa düşmədiyindən ya əsnəyir, ya da müəllimə hörmət üçün "bəli" deyir.

## VƏTƏNPƏRVƏRLİK VƏ GƏNCLİK

İnsan hissləri içində ən müqəddəs, əbədi, tərəqqi və inkişafa təkan verən amillərdən biri, bəlkə ən mühümü vətənpərvərlikdir. Xalq eşqi, vətən məhəbbəti insanın həyat nəfəsidir desək, biz ömrün məqsəd üçün yarandığını bir daha dərk edərik. Öz arxasında xalqın, vətən torpağının qüdrətini, onun həyat və mübarizə qabiliyyətlərini dərk edən bir qəhrəman döyüş meydanında yorulmaz, odlar, alovlar içində yansa belə, vətən torpağının gələcəyi, şərəf və şöhrəti ona böyük təsəlli olar, o, həyatın da, ölümün də mənasından razı qalar. Vətən eşqindən ilham alan bir şair ömrü boyu bəxtiyardır. Vətən torpağı, xalqımızın mənəvi həyatı tükənməz bir xəzinədir ki, onun bir çox inciləri hələ də kəşf edilməmişdir. Hər hansı bir qələm sahibi: kim üçün yazıram? – deyə özünə sual verdiyi zaman qarşısında kamala yetmiş, öz tarixinin, öz varlığının qədrini bilən bir xalq gördükdə qartal qanadları ilə uçar, onun vətəndaşlıq vüqarı şeir və sənət ilhamına yelkən taxar, içindən əbədi olaraq "Yarat! Yarat!" – deyə bir səs gələr.

Madam ki, insan ömrünün ən böyük zinəti, onu yaşadan ən qadir qüvvə vətənpərvərlik hissidir, bu hiss bugünkü körpələr nəslimizin təlim və tərbiyəsinin əsas ruhu, çarpan ürəyi, düşünən beyni olmalıdır. Bu işdə bədii sözün, incəsənətin xidməti böyük və zəruridir. Uşaqlıq aləmində vətən, yaxud vətənpərvərlik məfhumları ibtidai və təbii bir haldadır. Onun şüurunda bütün anlaqlar mücərrəd haldan uzaq olduğu kimi, vətən məfhumu da mücarrəd deyildir.

Uşaq ədəbiyyatı balalarımıza vətənpərvərlik hissləri aşıladığı zaman onların təbiətinə uyğun olmayan mücərrəd və ümumi təsvirlərdən, sözlər və ifadələrdən uzaq olmalıdır. 11–12 yaşına qədər olan uşaqları nəzərdə tutsaq, onlarda vətən məfhumu belə bir mənzərə alar: doğma kənd, öz həyətimiz, tanış ağaclar, evimiz, eyvanımız, nənəmin nağıl söylədiyi zamanlar, bizim biçənək, yaxud zəmi, arx, yaxud kəhriz başı, ata-ana nəvazişi, qardaş-bacı, qohum-əqrəba, tanışlar, dostlar, yaşıl

yamaclar, yaxın dağlar, meşələr – bir sözlə, uşağın yaşadığı ilk mühit, ilk abi-hava. Bütün bunlar uşaq hafizəsində, onun ruhunda nə qədər doğma və müqəddəsdir. İnsan bütün ömrü boyu bu ilk təəssüratı unutmur. Şeir və sənət bu mühiti təsvir etdiyi zaman, onun bütün təravət və qüdsiyyətini, isti-soyuğunu, yaz və qışını, qəm və nəşəsini uşaq qəlbi ilə həmahəng, onun arzu və istəklərinə uyğun bir halda tərənnüm etməlidir. Uşaq təsəvvürü mürəkkəb və dolaşıq səhnələri, təsvirləri həzm etmədiyindən, sadəlik və təbiilik, yalnız ürəkdən qopan həyəcanlarla yazılan əsərlər həqiqi uşaq ədəbiyyatı adlana bilər. Uşaq gənclik yaşına dolduğu zaman, özünü vətəndaş kimi anladığı zaman, ondakı vətən məfhumu, xalq məfhumu genişlənir, artıq bütün ölkə, mənsub olduğu bütün xalq haqqında mülahizələr yürüdür. Bu mülahizələrin nə qədər doğru, dürüst olduğu bu və ya digər gəncin vətən haqqında aldığı məlumatlardan asılıdır. Odur ki, ədəbiyyat gəncliyimizə də vətən haqqında ümumi deklarasiyalar, nitqlər deyil, bədiiləşmiş məlumatlar verməlidir. Etiraf etmək lazımdır ki, bugünkü gəncliyimiz xalqımızın, yaşadığımız torpağın varlığını, onun böyük tarixini, gözəl xüsusiyyətlərini, təbii sərvətlərini, onun gözəl insanlarını istənilən dərəcədə bilmir. Lakin bütün bunları bilmədən vətəni sevmək, vətənpərvər olmaq sadəcə bir kortəbiilik halında meydana çıxır ki, ona şüurlu bir məhəbbət, idraki bir vətənpərvərlik adı vermək olmaz! Yaşadığımız Böyük Vətən müharibəsi şəraiti bir daha sübut etdi ki, ən çox qəhrəmanlıq və fədakarlıq göstərən insanlar – idrak və kamalca daha çox inkişaf etmiş, vətən və xalq məhəbbətinin mənəvi nemətləri ilə yaşayan, ana torpağın azadlıq və şərəfini öz şəxsi şərəfindən, şəxsi mənfəətindən üstün tutan insanlar oldu.

Şeir və sənət vətəni tərənnüm etdiyi zaman vətən sözünün böyük mənası qarşısında məsuliyyət hiss etməlidir. Şairlərimiz uşaqlarımıza və gənclərimizə vətən torpağının müəyyən səhnələrini, hadisə və insanlarını, onun zəngin tarixini göstərmək əvəzinə çox zaman ümumi sözlərlə kifayətlənirlər. Misal üçün, birinci sinif kitabındakı Azərbaycana həsr edilmiş “Bizim ellər” şerini götürək:

Bizim eldə hər çəmən,
Bənzəyir al məxmərə,
Quşlar dastan söyləyir
Rəngbərəng çiçəklərə,
Al-əlvan çəmənlərdə
Uçuşur kəpənəklər,

Gülümsəyir qəlb açan
Zərif güllər, çiçəklər,
Nə qədər sevimlidir
Bizim yaşıl meşələr,
Şəfəq rəngli lalələr,
Ətirli bənövşələr.

Şübhəsiz ki, belə nəzmlə, ürəksiz və həyəcansız yazılmış şeirlər uşaqlara bədii zövq vermədiyi kimi, onlara vətən haqqında doğru təsəvvür də verə bilməz. Çünki yaşıl meşələr, bənövşələr, kəpənəklər, çiçəklər, lalələr, çəmənlər bir çox başqa ölkələrdə də vardır. Ancaq şairin "al məxmər"ə bənzətdiyi çəmən heç bir ölkədə yoxdur. Bütün bunların əvəzinə biz Azərbaycanın Muğan düzü, Şah dağı, Göy gölü, tarixi qəhrəmanları, xüsusən gözəl əfsanələri və abidələrinə, Bakı kimi şərəfli bir şəhərə aid ayrı-ayrı nəğmələr, şərqilər, iri şeirlər və dastanlar yaratsaq, gəncliyimizə daha çox xidmət göstərmiş olarıq. O vaxt onlar öz vətəninin qüdrətini, sərvət və tarixini doğrudan da tanıyar, onlara məftun olub pərəstiş edər.

Bununla əlaqədar olaraq, uşaqlar və gənclərimizi səyahətlər, gəzintilər vasitəsilə də yaşadığımız torpağın nemətləri, xalqımızın tarixi ilə tanış etmək lazımdır. Bu işdə müəllimlərin, təşkilatlarımızın xüsusi təşəbbüsləri meydana çıxmalıdır. Bu təşkilatlar gənclərimizi qədim qalalara, saraylara, böyük insanlarımızın məqbərələrinə, müxtəlif muzeylərə, torpağımızın ən məşhur və tanınmış yerlərinə səyahətə aparmaqla, onlara elmi məlumatlar əsasında tarixi və ictimai hadisələrdən, xalqımızın keçmiş olduğu inkişaf yollarından, bu və ya digər dahinin, qəhrəmanın həyat və mübarizəsindən, memarlıq, heykəltəraşlıq, rəssamlıq – xalqımızın bütün yaradıcılıq qabiliyyətlərindən əyani vasitələrlə məlumat verməlidirlər. Bu səyahətlər nəticəsində balalarımızın hafizəsinə nəqş olunmuş gözəl xatirələr, dadlı söhbətlər və elmi məlumatlar onların xatirində bütün həyat boyu qalacaqdır.

## MİLLİ VÜQAR VƏ GƏNCLİK

Vətənpərvərlik dediyimiz zaman, onun ruhunu təşkil edən mühüm hisslərdən biri, bəlkə ən çox ömür sürəni milli vüqar hissidir.

Mənsub olduğu xalqın varlığı ilə fəxr etməyən, onun eşqini müqəddəs bir məşəl kimi öz qəlbində yandırmayan bir insan, öz vətəndaşlıq

haqqını dərk edə bilməz, ona vətənpərvər demək də gülünc olar. Böyük proletar inqilabından sonra yaşadığımız sosializm şəraitində hər xalqın maddi və mənəvi həyatı tərəqqi dövrü keçirir. Bütün xalqların yaşamaq və yaratmaq qabiliyyətləri yenidən çiçəklənir, tarixdə misli görünməmiş bir sürətlə, həm də ilhamlı bir sürətlə tərəqqi və inkişaf edir.

Lakin sosializm dövrünə zəminə olan, onun yaradılmasına tarixi şərait hazırlamış xalqımız öz keçmişinin şərəfli və şanlı səhifələri ilə fəxr edir. Bu iftixar hissi, xalqımızın bugünkü yaradıcılığına ilham verdiyi kimi, onun gələcək əməl və ideallarına da qanad verir. Danteni, Şekspiri yaradan xalqlar dünya mədəniyyəti bağçasında vüqarla gəzdiyi kimi, Nizamini, Füzulini yaradan bir xalq da dünya mədəniyyəti xəzinəsinə verdiyi bu solmaz incilərlə, öz dühası və istedadı ilə fəxr etməyə haqlıdır. Odur ki, bizim tarix və ədəbiyyat dərslərimiz, bütün təlim və tərbiyəmiz xalqımızın varlığını sadəcə ardıcıl bir şəkildə keçmək deyil, onun mənəvi həyatını böyük vüqar və iftixar hissi ilə tərənnüm etməlidir. Bu o deməkdir ki, orta yaxud ali təhsilli bir gənc Vaqifin böyük bir şair olmağını, Cavanşirin böyük bir qəhrəman olmağını öyrəndiyi zaman, onların azərbaycanlı olmaqları, Azərbaycan torpağında yaranmaları ilə fəxr etməlidir. Gənclərimizə bu müqəddəs hissi, idrak və mərifəti aşılamaq işində müəllimlərimizin xüsusi rolu, təşəbbüs və qayğısı olmalıdır. Öz doğma xalqını anlayan, onu sevən, o xalqdakı qəhrəmanlıq, fədakarlıq, yüksək əməllər və bütün insani sifətləri dərk edən bir gənc başqa xalqları da sevəcək, anlayacaqdır. Çünki o insani sifətlər bütün xalqlara məxsusdur. Lakin yaxşılıq və həqiqi xalq sifətlərini öz yurdunda anlamayan, öz ibtidai tərbiyəsində görməyən bir şəxs öz xalqının qədrini bilmədiyi kimi, başqasının da qədrini dərk etməkdən məhrum olacaqdır. Sosializm şəraiti insanlara məxsus olan milli vüqar hissinin üfüqlərini qat-qat genişləndirmişdir. Məfkurə ilə silahlanmış bir insan – mən öz xalqıma nə dərəcədə xidmət edirəm – sualı ilə yanaşı, bütün insanlığa da nə dərəcədə xidmət edirəm sualını verir. Belə bir halda o insan öz xalqının bütün dünya tarixində daha böyük şöhrət tapmasına, daha çox hörmət qazanmasına da xidmət etmiş olur. Xülasə olaraq, əsrimizin gənc insanı bütün dünyanı, bütün bəşəriyyəti dərk etmək üçün yaşadığı torpağı, mənsub olduğu xalqı dərk etməli, yalnız bu yolda da insanlıq dərəcəsinə yüksəlməli, bütün xalqların mənəvi həyatının inkişafında iştirak etməlidir.

Bugünkü müqəddəs xalqlar dostluğu məfhumuna da biz milli vüqarımızın bir parçası kimi baxmalıyıq. Çünki bəşəriyyəti vəbalardan, cinayət və təcavüzlərdən mühafizə edən, istiqbalımıza həyat zəminəsi yaradan amillərdən biri olan bu xalqlar dostluğunun yaranmasında bizim xalq da məşəqqətlərə, zülmətlərə sinə gərmiş, minlərcə gözəl insanı qurban vermiş, öz maddi-mənəvi varını əsirgəməmişdir. Bəli, yüz illər keçdikdən sonra Şərq aləmində ilk dəfə olaraq sosializm inqilabını yaradan, məhkumluq və köləlik zəncirlərini qıran hansı xalq olmuşdur? – deyə sual verilərsə, bizim nəvə və nəticələrimizin "Azərbaycan" – sözünü vüqarla deyəcəklərini indidən dərk etmək qanuni bir haldır. Ədəbiyyatımız bu vüqar hisslərini indiki gənclərimizə aşılamaqla xalqımızın gələcəyinə də xidmət etmiş olur. Çünki gəncliyin taleyi ilə məşğul olmaq, xalqımızın istiqbalını, o istiqbala gedən yolları indiki anlaq və şüurumuzun günəşi ilə işıqlandırmaq deməkdir!

"Vətən qoynunda bəslənmiş əməllər, arzular şəksiz,
Vətənsiz, yurdsuz insanlar yaşar aləmdə məskənsiz".

## MƏSLƏK EŞQİ VƏ GƏNCLİK

Əsil mənada vətəndaş olmaq – məslək və əqidə sahibi olmaqdır! Elmin, mədəniyyətin bütün nailiyyətləri müəyyən məqsəd və əqidəyə xidmət etdiyi zaman elm, mədəniyyət özü də hər gün inkişaf prosesləri keçirir. İnsan ixtisasları müxtəlif olsa da, onların hamısının qayəsi birdir: həyatı gözəlləşdirmək! Mühəndis dəmiryol çəkdiyi zaman, aqronom əkin tarlalarında çalışdığı vaxt, müəllim dərs keçdikdə, rəssam gözəl lövhələr yaradırkən öz sinəsində alovlanıb yanan bir məslək eşqi hiss edir: "Mən insan həyatını gözəlləşdirirəm, xalqıma, Vətənimə xidmət edirəm" – deyərək, özünün məslək adamı olması ilə fəxr edir! Bu anlaq, bu iftixar hissi olmadan heç bir səmərəli zəhmət, xalqa, vətənə həqiqi xidmət yarana bilməz. Əsrimizin gənc insanı həyata, varlığa, insan taleyinə qabaqcadan təyin edilmiş düsturla baxmamalıdır. Çünki ictimai həyat o qədər mürəkkəb və canlıdır ki, o heç bir düstura, ölçü və siqlətə sığışa bilməz. Bir də həyat haqqında olan bütün düsturlar həyatın hərəkət və inkişaf qanunları təsiri ilə daima dəyişməyə məcburdur!

Xülasə olaraq: məslək adamı olmaq – cəsarətli, təşəbbüslü, daima düşünüb-daşınan bir yaradıcı olmaqdır! Bu yol günün gənc insanından böyük cəsarət, iradə, mətanət, ustalıq və bacarıq tələb edir.

Öz məsləki uğrunda odlardan və alovlardan keçən, həyatın şəxsi mənasını məslək vüqarına qurban verən insanların xatirəsi tarix üçün daima əziz olmuşdur. Yer kürəsinin fırlanmasını sübut edən Qaliley ölüm cəzasına məhkum edildiyi zaman son nəfəsində: "Mən yer fırlanmır desəm də, o fırlanır" kimi qısa və mənalı cavabı ilə inandığı elmi həqiqəti can qorxusuna, can qeydinə qurban vermədi. Böyük Azərbaycan şairi Nəsimini diri-diri soyduqları zaman ona istehza ilə: "Rəngin niyə saralmışdır" deyənlərə: "Günəş batdığı vaxt rəngi saralar" cavabını vermişdi. İnsan iradəsinin bu böyük günəşini yaradan yalnız məslək eşqi olmuşdur. Bəşəriyyət tarixində bu kimi hadisələrə çox təsadüf olunur. Bizim tarix və ədəbiyyatşünaslıq dərslərimiz belə hadisələr üzərində xüsusi dayanaraq, fədakar məslək insanlarına gənclərin qəlbində xüsusi ehtiram və məhəbbət oyatmalıdır.

Sosializm inqilabı tarixini, bolşeviklər partiyasının keçmiş olduğu mürəkkəb mübarizə və qəhrəmanlıq tarixini vərəqlədiyimiz zaman məslək eşqi dediyimiz məfhumun ən bariz və ən parlaq nümunələrini görürük. Bu mübarizə tarixində böyük iradə sahiblərinə, fədakar və qəhrəman oğullara, xalqımızın azadlıq və səadəti uğrunda öz canını qurban vermiş insanlara, böyük filosoflara, alimlərə, müdrik qocalara, istiqanlı gənclərə təsadüf edirik!

Bu nöqteyi-nəzərdən Azərbaycan, xüsusən Bakı şəhərinin tarixi çox zəngin və əzəmətlidir. Biz gəncliyimizi məslək insanı olmağa, məslək aşiqi olmağa dəvət etdiyimiz zaman bolşeviklər nəslinin tarixdə yaratmış olduğu mübarizə ənənələrinin bədii ifadəsini verməliyik. Bizim qəhrəmanlıq tariximizi keçən müəllimlərimiz tarixi və ictimai hadisələrdə bu və ya digər qəhrəmanın fəaliyyətindən bəhs etdiyi vaxt onları yalnız siyasi və ictimai bir xadim kimi göstərməklə kifayətlənməyərək, o qəhrəmanların müxtəlif həyat səhnələrindən, ayrı-ayrı səciyyələrindən, zövqlərindən, adət və məişət qaydalarından, hər birinin yaşamış olduğu iztirab və sevinc zamanlarından canlı və təravətli söhbətlər etməlidirlər. Bu surətlə əsil xalq varlığını, ən humanist arzu və əməlləri parlaq ifadə etmiş olarıq. Bu işdə bizim bədii ədəbiyyatımız xüsusi rol oynamalıdır. Yaxın keçmişimizdən və müasir həyatımızdan dərindən duyulub-düşünülməmiş, canlı bir ilham, mənəvi bir

həyəcanla yazılmamış əsərlər xalqın ümumi ehtiram və məhəbbətini qazana bilmir.

Ədəbiyyatımız müasir insanlarımızın qabaqcıl fəlsəfi anlaqları, onların həyat və insan taleyinə olan humanist baxışı, onlardakı xeyirxah hisslər, tərəqqipərvər əməllər, yüksək və sarsılmaz mübarizə iradəsi ilə qanadlanmalıdır. Bu isə yazıçıdan böyük zəhmət, alovlu bir ilham, mədəniyyət, qəhrəmanlıq məfhumuna qarşı məhəbbət, sonsuz fəzalar qədər yüksək olan bir romantika, bir də bu şərtlərin çarpan ürəyi olan həyat eşqi tələb edir. Biz cəsarətlə etiraf etməliyik ki, bolşevizm məktəbinin ən gözəl ocaqlarından biri olan Bakı və Azərbaycanın inqilablar tarixindən dillərə düşəcək, zərbi-məsəl olacaq uzun ömür sürən əsərlərimiz azdır. Bu etirafın ziddiyyətini duymaq lazımdır.

## MƏHƏBBƏT VƏ GƏNCLİK

Sosializm dövründə tərbiyə almış, mübarizə və imtahanlardan çıxmış gəncliyimiz ən humanist, tərəqqipərvər məfkurə ilə silahlanmış əməllərə qanad verən, onları yaşadan insan mənəviyyatındakı ən nəcib, gözəl hisslərdir. İnsana məxsus olan bu sifətlərin ən müqəddəsi məhəbbətdir. Heç də təsadüfi deyil ki, min illərdən bəri davam edib gələn bədii ədəbiyyat aləmində məhəbbət məfhumu ən böyük sənətkarların qələminə şöhrət vermişdir. Müasir ədəbiyyatımızın ən nöqsanlı cəhətlərindən biri də məhəbbət kimi müqəddəs, bütün insanlığı daima düşündürən və yaşadan bir amil haqqında dillər dastanı olacaq əsərlərin yaradılmamasıdır.

Məhəbbətin nə olduğuna aid bir çox tərif vermək olar. Lakin iki sözlə, məhəbbət – insandır desək, onun əzəməti gözümüz qarşısında canlanar. Hər insan gənclik yaşına dolduğu zaman sevir, sevilir. Sevib-sevilmək mənəvi bir ehtiyacdır. O, ailə həyatının canlı ürəyidir.

Məhəbbətin hakim olduğu ürəklər yağışdan sonra açılmış şəffaf və ləkəsiz bir yaz səmasını andırır ki, orada yalnız aydınlıq, al-əlvan şəfəqlər, təravət və qüdsiyyət görünür. Məhəbbət insan qəlbini süzgəcdən keçirir, ötərgi və zərərli hisslərdən təmizləyir, yaşamağın mənasını gözəlləşdirir, insanı xeyirxah olmağa, alicənab və nəcib olmağa

dəvət edir. Əksinə, məhəbbətdən məhrum olan ürəklərdə yalan və böhtan, xəyanət, qansızlıq, hiylə və həsəd, kin və paxıllıq hissləri yuva salır ki, əsrimizin "Əhrimən"i olan faşistlər buna ən canlı bir misaldır. Onlar doğrudan da məhəbbət hissindən məhrum olmuş rəzillərdir.

Əsrimizin gənc insanı öz qəlbində məhəbbət məşəli yandırmaqla, bu insanlıq şərəfi ilə fəxr etməlidir.

Nəsillərdən nəsillərə keçib gələn "Leyli və Məcnun" dastanını xatırlayaq. Bu dastana təzə bir əfsanə kimi baxanlar cahildir.

Eşq – qüdsiyyətdir. Qüdsiyyətin isə sonu olmadığından bəlkə də zahirən əfsanə kimi görünsün. Sadə gülüşlər, zarafatlar və əyləncələr eşq adlanmaz. Məhəbbət – mənəvi həyatın cövhəridir. Məcnuna sadə bir qız qurbanı, yaxud göz-qaş qurbanı kimi baxan dayaz düşüncəli gənclərimiz də yox deyildir. Məcnun saf əməllər, arzular, xəyallar dünyasının rəmzi olan müqəddəs bir eşq qurbanı oldu. Bu, bir "əfsanə" qurbanı olsa belə, insan xəyalının doğmaca bir övladıdır. Demək, məhəbbət xəyala, qəlbə qanad verir, onların hüdudsuz bir aləmdə uçmalarına, həm də ürək deyə uçmalarına qüdrət verir. Belə isə biz ürəklərimizə – sevən, duyan; həyəcanlar və təlatümlər keçirən ürəklərimizə minnətdar olmaqla, o ürəkdə yaşayan məhəbbət bağçasını tufanlardan hifz etməliyik. Qələmlərimiz gənclərimizə humanizm və qəhrəmanlıq duyğuları aşıladığı zaman məhəbbət sözünə fəxri bir məna verməlidir. İnsan öz zəhməti, hünəri ilə, bilik və kamalı ilə fəxr etdiyi kimi, öz ürəyi, eşqi ilə fəxr etməlidir.

Məhəbbətin qüdrəti basılmazdır. Onu heç bir top gülləsi, ordu hücumu fəth edə bilməz. Məhəbbət qəhrəmanlığın anasıdır. O, insanın yaşamaq və yaratmaq qabiliyyətini, kamal və iradəsini çiçəkləndirir. Qorxma! Zülmətləri şimşək kimi yarıb keç! – deyir. "Eşq Fərhada dağı çapdırdı" – deyən xalqımız eşqin qəhrəmanlıq fəlsəfəsini ifadə etmişdir. Məhəbbətlə qılınc çalan bir qəhrəmanın, məhəbbətlə külüng vuran bir fəhlənin, məhəbbətlə düşünüb yaradan bir alimin hünəri qəhrəmanlıqdır. Bədii söz ustalarımız gənclərimiz üçün gözəl və nəcib insan hisslərinin beşiyi olan məhəbbət dastanları yaratsınlar.

"Məhəbbət! Ömrü sevdasız yaşatmaq bir cinayətdir,
Gözəllik – canlı bir sənət, əzəldən ömrə zinətdir!"

*1944*

## BƏDİİ HƏQİQƏT ADINDAN

Mən yoldaş Prokofyevin "İnsan" pyesinə yazdığı rəylə tanış oldum.

Əvvəla, demək istərdim ki, yoldaş Prokofyevin rəyi mənim nəzmlə qələmə aldığım pyesin kobud sətri nəsr tərcüməsi ilə tanışlıq əsasında yazılmışdır. Halbuki bu tərcümə nəinki poeziyamın, hətta əsərimin fəlsəfi xəttinin mahiyyətini də ifadə edə bilmir. Pyesin ideyasını, qəhrəmanlarımın xarakterini, idrakı və mənəvi əhvalını, ictimai və fərdi xüsusiyyətlərini, onların dünyagörüşü və mənəviyyat qayğılarını mütləq mənim poeziyamda axtarmaq lazımdır. Daha hörmətli rəyçinin özünə rəva gördüyü kimi təhriflərlə dolu kobud nəsri tərcümədə yox. Ona görə də bu rəyi nəinki mükəmməl, hətta, ümumiyyətlə, ədalətli və elmi-tənqidi iş hesab etməyə mənim heç bir mənəvi əsasım yoxdur.

Əlavə edim ki, rəy yaradıcı şəkildə düşünən adam tərəfindən deyil, müəllifin və ya onun qəhrəmanlarının qəlbinə girmək, onun öz mənəvi dünyasından, xarakterindən, ancaq ona xas olan idrak və qəlb vəziyyətindən çıxış edərək bu və ya digər personajı Bütöv Obrazlar Sistemi kimi qiymətləndirmək əvəzinə, "nəzəri öyüd verməyə" həvəskar adam tərəfindən yazılmışdır. Elə buna görə də yoldaş Prokofyev öz ağlına gələnləri (bədii əsasdan məhrum) nəinki pyesin personajlarına, hətta onun müəllifinə də aid etməyə məcbur olur. Çətin ki, yoldaş Prokofyevin bu bədii məfkurə cəhətdən kasıb, lakin siyasi frazeologiya ilə zəngin öyüd-nəsihətinə iyirmi illik olsun ki, qibtə edilməyən yaradıcı təcrübəyə malik bir sənətkarın ehtiyacı ola.

İndisə yazılmış rəyin ayrı-ayrı məqamları üzərində dururam.

Yoldaş Prokofyev məni zaman və məkan daxilində olmayan mücərrəd ağıl və həqiqət "axtarıcılığında" ittiham edir. Sual verir: doğrudanmı, müəllif başa düşmür ki, kamalın qələbəsi kommunizmin qələbəsidir. Mən hörmətli yoldaş Prokofyevlə tam razıyam. Amma əsər onun diktəsilə yazılmayıb və o, həqiqətənmi mənim əsərimdə bütün əməyimin arxalandığı işıqlı nöqtəni axtarıb tapmaq bacarığından məhrumdur?

"Parla, kommunizm, parla əbədi –
kamalın təntənəsi,
həyatın sevgisi və mənası,
Sənin gözəl ulduzun bərq vurur,
Sənə şöhrət yaraşır.
Sən həqiqətsən, sən gələcəksən".
(Sətri tərcümə).

Mən yuxarıdakı sitatı əbəs yerə gətirmədim. Əsər filosof Şahbazın "ağlın qələbəsi" fəlsəfəsinə – əsərdə müstəqil obraz olmaqdan çox ata – filosofun simvolik davamı və daha doğrusu, proobrazı olan kiçik Şahbaz tərəfindən davam etdirilən fəlsəfəyə məhz bu inamla, bu əminliklə bitir.

Daha sonra yoldaş Prokofyev məni gələcək kommunist cəmiyyətinin utopik təsvirində günahlandırır və bu səbəbdən də məni Tomos Moorla və onun fəlsəfəsilə qovuşdurur.

Gələcək cəmiyyət mənim tərəfimdən romantik poeziya dili ilə təsvir edilir. Bu, bəzi oxuculara utopik və idillik görünə bilər. Əslində mən təkid edirəm ki, həmin cəmiyyətdə "qılınclar, oxlar, nizələr olmayacaq, ağır toplar pas atacaq, cəmiyyətdən sərhədlər, qanlı müharibələr və antaqonist qüvvələr yox olacaq, bəşəri sevginin və kamalın yaradacağı cənnətdə insanlar al geyinib həyatın baharından keçəcək".

Bu, utopiya deyil, sosial haqsızlığa yol verilmədiyi, bütün dövlətlər və ictimai idarəetmələr arasında sərhədlərin itdiyi, insanın insan, millətin millət tərəfindən zorakılığa, alçaldılmağa məruz qalmadığı, azadlığın, vicdanın, ağlın, qurucu əməyin və yaradıcılığın qələbə çaldığı cəmiyyətə xas olan həqiqətin poetikləşdirilməsidir.

Hörmətli rəyçi başa düşməlidir ki, mənim poeziya ilə ifadə etdiyim sözlər kommunizm haqda elmi traktat deyildir. Müasir insanlığın bütün ən yaxşı zəkalarının can atdığı həqiqətin poetik şəkildə dərk edilməsidir. Müəyyən məqamlarda gələcəyi təsvir edərkən dərd, əzab, məşəqqət və s. olmayacaq dedikdə bəzən idillizmə vardığımı mən inkar etmirəm. Bu, əlbəttə ki, real deyildir. Nə qədər ki, insan və dünya var, iztirab və mübarizə qayğıları da, cəmiyyətimizdəki ziddiyyətlər kimi, insanlıqla təbiət arasında ziddiyyətlər də olacaq. Amma soyuq mühakimənin hesabdar gəlir-çıxarı ilə poeziyanın heç bir əlaqəsi yoxdur. Bax, buna görə də yazıçıdan gerçəkliyin, ələlxüsus da təsəvvür etdiyimiz gələcəyin gerçəkliyinin təsvirində statistik dəqiqlik tələb etmək olmaz. Daha sonra yoldaş Prokofyev mənim qəhrəmanım Şahbazı bizim müasir filosoflar üçün xarakterik olan bitkin marksist yox, idealist hesab edir. Əvvəla, mən Şahbazın simasında kamil marksist obrazı yaratmaq məqsədi izləməmişəm. Heç, nə mövcud pyesin müəllifi, nə də hörmətli rəyçi özü belə bitkin marksistdir. İkincisi, Şahbaz əsla bir əsas vermir ki, rəyçi onu belə ağına-bozuna baxmadan imdadsız idealist, həyatdan, mübarizədən, yaşadığı epoxanın gerçəkliyindən uzaq düşmüş obraz kimi təqdim etsin.

Sübut üçün əsərdən Şahbaz obrazına bilavasitə aid olan bir sıra misallar gətirmək istəyirəm. Şahbazla sevimli arvadı Səhər arasındakı dialoqda aşağıdakı səhnə cərəyan edir.

Şahbaz:

Bizi görürsənmi, yaman dardayıq,
26-lar tək zindanlardayıq.

Səhər:

Cəllada baş əymə babaların tək.

Şahbaz:

Sağ ol! Dağa döndü sinəmdə ürək.
De, uşaq necədi, məni anırmı,
Ata həsrətiylə qəlbi yanırmı?

Səhər:

Ana qoynundadır, qalma nigaran,
Həyata öyrədir onu da zaman.
Əsərini qurtar... gözləyirik biz,
Oxusun gələcək nəsillərimiz.

Şahbaz:

O yarımçıq qalır, tez ölürəm mən.

Səhər:

Ya oğlun tamamlar, ya da öz nəvən.

Şahbazın və Səhərin dili ilə deyilən bu sözlər faşist cəlladlarının caynağında olan qəhrəmanımızın düşüncə və həyəcanlarını ifadə edir. Bu dialoqdan aydın görünür ki, Şahbaz öz fikir və hissləri ilə, həyatla, arvadıyla, Vətənlə, onun mərd xəlqi duyğularıyla, bizim sosialist Vətəni uğrunda şəhid olmuş sələflərinin, bolşevizmin haqq işi uğrunda həlak olanların inqilabi ənənələri ilə üzvi surətdə bağlıdır. Elə buna

görə də Şahbaz satılan həyatı yox, qəhrəmancasına ölümü qəbul edir, mənəviyyatca faşist cəlladlarına təslim olmur. Qəhrəmanın ölümqabağı sözlərini xatırlayaq:

Şahbaz:

Mən yenə yaşasın, deyirəm, həyat!

Bəli, o da bizim milyonlarla qəhrəmanlarımız kimi gələcəyin övladları və onların qurucularından biri olaraq, mərdanə ölümü Həyat naminə qəbul edir.

Bu və ya digər bir çox keyfiyyətləri onun psixologiyasının və dünyagörüşünün realist və materialist əsasları xilası üçün mücərrəd ağlın və mücərrəd vicdanın gücünə inandığı mərhələsində idealist fəlsəfə qalıqlarından da azad deyildir. Lakin müharibə prosesində əmin olur ki, gələcəyi qanlı aqibətdən biz ancaq qılıncın və ağlın birgə gücü ilə xilas edə biləcəyik. Gənc filosof inanır ki, gücə qarşı ancaq idrak günəşilə nurlandırılmış gücü qoymaq lazımdır. Bu nəticəyə onu sovet həqiqətindən doğan hiss və düşüncələri gətirib çıxardır. Hamıya məlumdur ki, faşizm də böyük qüvvəyə malik idi. Lakin bu qüvvə məhz bəşər tarixinin obyektiv gedişinə zidd olmaq mənasında idrakdan məhrum olduğuna görə əzildi. Biz isə ona görə qalib gəldik ki, müasir tarixin obyektiv yürüşündən doğan qüvvəyə, həmin möhtəşəm idraka malik idik.

Biz görürük ki, bütün pyes boyu Şahbazın varlığında materialist başlanğıcla qismən idealist baxışlar arasında daxili mübarizə gedir. Bu, realizmin ədəbiyyatdakı yoludur. Hər bir şəxs, istər filosof olsun, istərsə sıravi, cəmiyyətdə yalnız xarici qüvvə və xarici ziddiyyətlərlə mübarizədə inkişaf etmir, habelə öz psixologiyasının, mənəviyyatının, hətta ideologiya və dünyagörüşünün ziddiyyətləri ilə mübarizədə inkişaf edir.

Mən filosof deyiləm və bir çox fəlsəfi məsələlərdə fəlsəfə bilicilərilə mübahisə edə bilmərəm. Amma mənə elə gəlir ki, heç bir kəsin mənəvi aləmində mütləq təmiz şəkildə ideologiya mövcud deyildir. İnsanın ideoloji inkişafı onun daxili ziddiyyətlərinin mübarizəsi yolu ilə gedir.

Əgər mən Şahbazın hər bir adama xas olan qüsurlarına göz yumub onu bütün daxili keyfiyyətləri ilə “kamil şəkildə” göstərsəydim, canlı insan obrazı yox, daxili mübarizədən məhrum, bayağılaşdırılmış materialist bir ehkam alınardı. Xarici cizgilərdən, titul və rütbələrdən daha artıq, insan qəlbinin mürəkkəbliklərilə təmasda olan bir şair kimi bu, mənə daha çox aydındır.

* * *

Yoldaş Prokofyev elə hesab edir ki, qədim Azərbaycan filosofu Zərdüştün Hörmüz və Əhrimənin timsalında xeyirlə şərin mübarizəsi fəlsəfəsi bizim zəmanə üçün köhnəlmişdir.

Birincisi, demək istəyirəm ki, müasir adam kimi, sovet yazıçısı kimi, Zərdüştün fəlsəfəsini özünün yüksək humanizminə görə bizim dövr üçün köhnəlmiş hesab etmirəm.

İkincisi, bir milli adam kimi ənənəvi olaraq öz psixologiyamızda çoxəsrlik milli ideologiya, fəlsəfə və habelə psixologiya və mənəviyyatın nəcibliyini daşıyır və yaşayıram. Amma bu mənə nəinki marksizmi qavramağa mane olmur, əksinə bir milli adam kimi marksizmin humanizmini və insaniliyini bütün təzahürləri ilə mənimsəməyə kömək edir. Mən xalqımın hətta nə vaxtsa əfsanəvi və utopik formada mövcud olmuş bütün gözəl ideallarını daha yaxşı görə bilirəm. Bu, keçmişə qayıtmaq deyildir. Yüksələn, döyüşən yeninin mühitində keçmişin dərk edilməsidir.

Əlavə edim ki, heç bir xalq marksizmin-leninizmin idrak edilməsinə öz milli ideologiya və fəlsəfə tarixindən kənarda gəlib çıxmayıb. Marksizmin möhtəşəmliyi, onun hər şeyi əhatə edən gücü də elə bundadır ki, onda hər bir xalq ayrılıqda elmi kəşflər edir, özünün həyat və mübarizəsində irəliyə yönəlmiş humanist məqsədlərini müəyyənləşdirir. Belə olan halda, qoy hörmətli rəyçi icazə versin ki, milli adam olan mən marksizmi ona xalqımın tarixini, ideologiya və mənəviyyatını da daxil etməklə öz şəxsi və milli hisslərim mühitində anlayım və sevim.

Üçüncüsü, əgər mən müharibəni yaşamasaydım, bəlkə də təfəkkürümdə xeyir və şər fəlsəfəsi doğulmazdı. Onda ki, faşizm şəri bizi təhdid etdi, ölümlə hədələdi, onda biz – bütün bizim partiya, dövlət və ictimai mətbuatımız hamılıqla dedi: "Faşizm insanlığa ölüm gətirir, faşizm şərin daşıyıcısıdır, faşizm zəkanı məhv edir, o, İnsan həqiqətini rədd edir. İdrak və həqiqətdən məhrum qara qüvvələrin qələbəsini elan edir".

Aydındır ki, çox qanuni olaraq, hər birimizin təfəkküründə şərə qarşı mübarizə fəlsəfəsi belə bir tarixi dövrdə doğuldu. Başlıcası, mücərrəd formada deyil, konkret olaraq ucalan sosializmlə qürub edən faşizmin mübarizəsi formasında təzahür etdi.

Əbəs deyildir ki, qəhrəmanı faşist filosofu ilə özünün ideya mübarizəsində Hitleri müasir Əhrimən, "şərin daşıyıcısı" adlandırır.

Bundan sonra Şahbazı keçmişə qayıtmaqda ittiham etməyə mənim heç bir haqqım yoxdur. Baxmayaraq ki, bizim indiki və gələcək həyatımızın daha dərindən öyrənilməsi məqsədilə yeri gəldikcə fikrən keçmişə qayıtmaq heç pis olmazdı.

* * *

Yoldaş Prokofyev habelə fikirləşmədən və əsassız olaraq məni passifizmdə – hər cür müharibə və müqaviməti rədd edən fəlsəfədə günahlandırır.

Biz isə Şahbazın və başqa qəhrəmanların dilindən mütərəqqi müharibələrin vacibliyi barədə aşağıdakı mühakimələri eşidirik. Məsələn, Şahbaz deyir:

..Birləşsə qılıncla kamal,
Bu qanlı günləri görməz istiqbal.

Göründüyü kimi, o nəinki müharibəni inkar edir, əksinə, imperialist müharibəsinə qarşı bizim zəka günəşilə işıqlaşmış qılıncımızı qoyur. Yoldaş Prokofyevin fikrincə, passifizm budurmu?

Eləcə də pyesdə qəhrəmanlardan biri olan şair Cəlalın ordumuz qarşısındakı çıxışından bu alovlu sözləri eşidirik:

Yaz da, yay da getdi, ay da, il də dolandı,
Unutmadıq, unutmayaq içdiyimiz o andı!
Toy duvağı açılmamış gəlinlərin naləsi,
Dağ döşündə yaz çiçəyi, son baharın laləsi
İntiqama dəvət edir hər qəhrəman ürəyi,
Zülmətlərə məşəl olsun azadlığın diləyi.
Haydı, dostlar! Yerin qəlbi hiddətlə bağırır,
Vətən bizi şərəf deyə döyüşlərə çağırır!...

Sitatdan göründüyü kimi, bizim şair-qəhrəman ordumuzu və xalqı müharibəyə müqavimət göstərməyə yox, əksinə, ümumxalq müharibəsi yolu ilə faşist cəlladlarını məhv etməyə çağırır. Passifizm, bizim hörmətli rəyçinin fikrincə, budurmu? Hətta otuz il keçəndən sonra belə – gələcəkdə pyesimin əsas qəhrəmanlarından olan general İslam qısa və yığcam şəkildə belə deyir:

İslam:

Yox, qızım, yaralı əsgər soyunmaz.
...Qılıncı belimdən aça bilmərəm.

Mən əsərdən xeyli belə misallar gətirə bilərəm. Lakin belə hesab edirəm: bu misallar özü də kifayət edir ki, əsərin yazıçı-passifist tərəfindən deyil, lazım gələrsə, dünya imperializminə qarşı hər cür mütərəqqi müharibədə süngü və qələmə, əgər bunu tarix tələb edərsə, fəal mübarizə aparmış və aparan materialist-marksist yazıçı tərəfindən yazıldığını sübuta yetirsin.

Əslində yaradıcılığımda olmayan ziyadə "izm"lərdə məni ittiham etməyi yoldaş Prokofyevə məsləhət görməzdim. Bu, mənə nə vaxtsa nənələrimizin biz uşaqları müxtəlif cin və şeytanlarla, bu cür başqa uydurma əcinnələrlə qorxutmasını xatırladır.

Sonda mən bütövlükdə "İnsan" pyesi haqda bir neçə söz demək istərdim. Mən Böyük Vətən müharibəsindən fəlsəfi dram yazmağa çalışmışam. Həmin dramda müharibənin zahiri formasını deyil, zəmanənin ruhunu, iki bir-birinə zidd olan dünyagörüşün, ideoloji istiqamətin və mənəviyyatın mübarizəsini, bu mübarizədə sovet ideologiyasının və mənəviyyatının üstünlüyünü, eləcə də imperialist faşist ideologiya və mənəviyyatının məhvə məhkumluğunu göstərmək istəmişəm.

Mənim məqsədim olduqca böyük və mürəkkəb idi. Amma yaradıcı vicdanımın obyektiv səsinə qulaq assaq, düşünürəm ki, "İnsan" pyesində qarşıya qoyduğum məqsədin əsasən öhdəsindən gəlmişəm. Bunlarla yanaşı, bəzən idealizmə qədər varan artıq romantika da az deyildir: pyesin müsbət qəhrəmanları realist xüsusiyyət və hərəkətləri ilə uyuşmayan bir şəkildə ziyadə poetikləşdirilmişdir.

Məlum məsələdir ki, gələcək əsərlərimdə çalışacağam ki, bizim gerçəkliyi əsla ehtiyac olmayan hər cür poetik və fantastik bəzəmələrsiz təsvir edim. Lakin, təkrar edirəm, mənim yaradıcı işim olduqca mürəkkəb və çətin işdir. Bu yol məni ədəbiyyatda yaradıcılıq risqinə sövq edən böyük bədii ümumiləşdirmələr yoludur. Bu yolda nəinki əsaslı bədii, həm də ideoloji yanılmalar da ola bilər.

Hər halda, mən öz ilhamıma minnətdaram ki, yaradıcılığımda baş verən bütün səhvlərimlə və uğursuzluqlarımla bərabər, o, sənətimin canını təşkil edən ideya və mübarizədə gözəlliyi və insanpərvərliyi əxz etdiyim xalqımın və partiyamın qarşısında o məni heç vaxt tək buraxmayıb.

*1946*

# [SSRİ YAZIÇILARI İTTİFAQI İDARƏ HEYƏTİNİN X PLENUMUNDA ÇIXIŞI]

Yoldaşlar, biz tarixi günlərdə – şanlı sovet silahının alman imperializmi üzərində qələbəsi, təntənəsi günlərində Vətənimizin hər tərəfindən bu plenuma toplaşmışıq. Bizim qələbə bayrağımız Berlin üzərində qürurla dalğalanır. Ürəklərimiz yalnız sovet silahının müzəfferiyyəti üçün deyil, bizim yüksələn dünyagörüşümüzün, insanpərvər, nəcib, eyni zamanda, prinsipial və ardıcıl sovet məfkurəmizin – sosializm ölkəsi məfkurəsinin qələbəsi üçün qürur və səadət hissi ilə dolub daşır, qəlbimiz bütün kiçik və böyük xalqların səadəti və qardaşlığı üçün fərəhlə, qürurla döyünür. Avropada faşizm əsarətindən azad edilmiş bütün xalqlar bizim qəhrəman əsgərlərimizə, bizim böyük cəngavər xalqımıza xeyir-dua oxuyur, xoşbəxtlik arzu edirlər.

Biz illər və əsrlər keçəndən sonra da müxtəlif dillərdə danışan bütün xalqların gələcək nəsillərinin bütün bəşəriyyətin xilaskarını dərin minnətdarlıq hissi ilə xatırlayacağını indidən görürük. Bu, şair xəyalı deyil, həyatın böyük həqiqəti və insan həqiqəti inkişafının obyektiv gedişidir, bunu yalnız kor zehinlə doğulan adamlar, insan cəmiyyətinin qüdrətli və hər şeyə qalib gələn yaradıcı qüvvələrinə inamını itirmiş adamlar irəlicədən görməyə bilərlər.

Bəli, biz insana inanırıq, insan da bizə inanır. Biz insanı milliyyətindən və irqindən asılı olmayaraq sevirik. Biz onun ləyaqətini yüksəldirik və o bizim qəhrəmanlar qanı ilə boyanmış bayrağımızdan möhkəm yapışır, bu şanlı bayrağın yenilməz, canlı dayağı olur. Bizim bayrağımız öz həyatını həyatın təntənəsi uğrunda mübarizədə qurban vermiş qəhrəmanların müqəddəs qanı ilə boyanmışdır. Bizim qəhrəmanlar yer kürəsində insan zəkasının, yaradıcı əməyin, vicdan azadlığının təntənə çalacağı, yalan, riya, məkr, zorakılıq və qan hərisliyi yox olacağı o aydın səhər naminə canlarından keçmişlər.

Biz məhz bu aydın səhər uğrunda mübarizə etmişik və mübarizə edəcəyik.

Madam ki belədir, gəlin, müharibədən sonrakı dövrdə yaradacağımız ən böyük əsərimizə “Bəşəriyyətin səhəri” adını verək.

Xahiş edirəm məni düzgün başa düşəsiniz, elə başa düşməyəsiniz ki, guya bu şüarla mən heç olmasa cüzi dərəcədə həqiqi həyatdan uzaqlaşmaq istəyirəm.

Xeyr. Bu o deməkdir ki, biz öz dövrümüzün qəhrəmanlarını yalnız bugünkü vəziyyətlərində deyil, sabahkı vəziyyətlərində də göstərməliyik, çünki o, Vətən müharibəsi cəbhələrində öz qanını axıtmışdır, çünki o yalnız bugünkü əziyyəti ilə yaşamamış, fikrən, xəyalən irəliyə, gələcək illərə uçmuşdur. Bizim bugünkü əsgərin və döyüşçünün böyüklüyü, əzəməti məhz bununla fərqlənir ki, biz yalnız öz şəxsi həyatımız və subyektiv mənafeyimiz uğrunda deyil, həm də dünya miqyasında olan mənafelər uğrunda mübarizə edirik. Demək, sovet qəhrəmanı, hər şeydən əvvəl, dünya miqyasında yüksəlmiş insandır. O öz böyük ideallarıvə irəliyə doğru can atması ilə zaman və məkan üzərində yüksəlir!

Söhbət bizim günlərin hadisələrini filosofcasına ümumiləşdirməkdən gedir, bizim insanın daxili aləmini, onun mənəvi həyatının bütün mürəkkəbliyini filosofcasına açıb göstərməkdən gedir.

Mən Azərbaycan şəraitində məhz belə bir ədəbiyyat uğrunda həm yaradıcılıq mübarizəsi, həm də nəzəri mübarizə aparıram. Mən əminəm ki, qələm dostlarımın – müasirlərimin bəzisi səsimi eşidəcəkdir. Mən buna da əminəm ki, "adi adamlar" haqqında "adi ədəbiyyat" şüarını ortaya atan yazıçılar mənim səsimi heç vaxt eşidə bilməyəcəklər. Bu, düz konsepsiya deyildir, bundan daha pis – saxta və uydurulma konsepsiyadır, çünki xalqı adi və qeyri-adi adamlar dəstəsinə ayırmaq olmaz.

Mənim anladığıma görə, xalq məhz bir xalq kimi mövcuddur, xalq bütün böyük və kiçik mənafeləri, bütün çoxcəhətli və əlvan mənəvi aləmilə "adi" və "qeyri-adi" adamların vahid bürcü və vahid harmoniyası ilə, bu adamların daim irəliyə can atmaq arzusu ilə yaşayır və tərəqqi edir.

Lakin elə yazıçılar var ki, onlar xalq ruhunun bu vahid harmoniyasını dərk edə bilmir və buna görə böyük ümumiləşdirmələr səviyyəsinə qalxa bilmirlər. Mənim zənnimcə, böyük sənətin qüdrəti onun böyük, yalnız böyük ümumiləşdirmələrinin qüvvəsindədir.

"Adi ədəbiyyat" cəbhəsinə mənsub olan yazıçılar öz mənəvi yoxsulluqlarını müxtəlif uydurmalarla pərdələməyə cəhd etməsəydilər, "adi" adamlar üçün, "kiçik" adamlar şərəfinə ədəbiyyat yaratdıqlarını iddia etməsəydilər, dərd yarı olardı. Onlar kimi "adi" adam hesab edirlər?

Azərbaycanlı təyyarəçi Məzahir Abbasov heç bir zaman akademiya bitirməmişdi, onun hətta ali təhsili də yox idi, lakin o, vətən naminə Leninqradın yaxınlığında təkcə bir hava döyüşündə 7 düşmən təyyarəsini vurub salmış, 17 yara almış, o cümlədən üç ağır-öldürücü yara və

bütün bunlara baxmayaraq, öz sevimli təyyarəsini xilas edib yerə enmişdir. O həlak olmuşdur, lakin ölümə qalib gələrək həlak olmuşdur.

Mənim nəzərimdə kiçik insan yoxdur, yalnız kiçik sənətkarlar vardır.

Belə yazıçıların ixtiyarına, sərəncamına bütöv bir dərya versən, onlar sənə bircə damla qaytararlar...

Biz cəmiyyətimizin hər bir zərrəsində xalqımızın əzəmətini açıb göstərməliyik. Bizim qabaqcıl ədəbiyyatımızın konsepsiyası, o cümlədən mənim konsepsiyam belədir.

Sovet məfkurəmizin üstünlüyündən danışarkən biz, bəziləri düşündükləri kimi, mücərrəd anlayışlara əsaslanmamalıyıq, biz bu məfkurənin tərkib hissələrinə də diqqət verməliyik.

Bizim sovet məfkurəmizin üstünlüklərindən biri də Sovet İttifaqı xalqlarının dostluğu ideyasıdır. Bu dostluq həmişə sovet ədəbiyyatının ən gözəl mövzularından biri olmuşdur. Həyatımızda xalqlar dostluğu əbədi olduğu kimi, bu mövzu da əbədidir. Biz ümumi düşmənimizə məhz alman faşistlərinin alçaq irqçiliyinə qarşı xalqlarımızın birliyi və məfkurə dostluğu sayəsində qalib gəldik. Bu dostluq bayrağı tufanlar və alovlar içindən keçmiş, çətin vuruşmalardan qalibiyyətlə çıxmışdır. Dostluq mövzusu indi ədəbiyyatda yeni və xüsusi bir qüvvətlə səslənir.

Bizim sovet ədəbiyyatında elə bir monumental əsər vardırmı ki, orada mərkəzi obraz kimi, bütün əzəməti ilə xalqlarımızın dostluğu mövzusu işlənmiş olsun? Təəssüf ki, belə bir monumental əsər nə rus ədəbiyyatında, nə də başqa milli ədəbiyyatlarda hələ yaradılmamışdır, halbuki belə əsər xalqlarımızın dostluğunu, bu dostluğun romantikasını bütün dünyaya nümayiş etdirə bilərdi.

Lakin bu sahədə şeirdə də, dramaturgiyada da, nəsrdə də dövlətimizin tarixi boyu əldə edilmiş gözəl yaradıcılıq təcrübəsi bizi bu şərəfli mövzunun – xalqlar dostluğu və qardaşlığının əzəmətli obrazını yaratmağa çağırır.

Dramaturgiyamız haqqında bir neçə söz demək istəyirəm. Poqodin yoldaş dramaturgiya haqqında məruzəsində bir çox yaxşı və faydalı məsələlərdən danışdı. Lakin mən bir prinsipial məsələdə onunla mübahisə etmək istəyirəm. Poqodin yoldaş milli dramaturgiyanın mövcud olması haqqında bir kəlmə danışmadı. Mənə belə gəlir ki, biz bunsuz ötüşə bilməyəcəyik. Mən çox minnətdaram ki, o, milli dramaturgiya haqqında danışmadığına bununla bəraət qazandırır ki, bu dramaturgiyanı bilmir. Mən bunu başa düşürəm, lakin tələb edirəm ki, o, bunu bilsin.

Mən bunu Poqodindən bir məruzəçi olması etibarilə deyil, bizim ən yaxşı dramaturqlarımızdan biri olması etibarilə tələb edirəm. O, bizim milli dramaturgiyamızın heç olmazsa görkəmli əsərlərini bilməlidir. Bunsuz biz bir-birimizi başa düşmərik. Əgər biz doğrudan da bir-birimizi sevir və bir-birimizə qardaş kimi, dost kimi hörmət bəsləyiriksə, biz bir-birimizi yaradıcılığımızdan çıxaraq sevməli və qarşılıqlı hörmətlə yaşamalıyıq. (*Alqışlar*)

Yazıçıların və teatrların qarşılıqlı münasibətləri haqqında bir neçə söz.

Mən həmişə bu rəydə olmuşam ki, yazıçı-dramaturq teatra öz zamanının qabaqcıl məfkurəsi ilə gəlməlidir, teatr aləmini, hər şeydən əvvəl, məfkurə cəhətdən istiqamətləndirməlidir. Bizdə dramaturgiyamızın inkişafına bir çox cəhətdən kömək edən gözəl teatrlar, gözəl rejissorlar və aktyorlar vardır. Bunu inkar etmək olmaz. Lakin onların arasında həmişə "biz bu pyesi özümüz düzəltmişik" deyə lovğalanan adamlar da az deyildir. Onların heç bir zaman mərdliyi çatmır ki, bir dəfə də bu sözləri desinlər: "Biz filan pyesi korladıq, məhv etdik, müəllifi, onun yaradıcılıq niyyətini başa düşmədik".

Mən Azərbaycan dramaturgiyası haqqında bir neçə söz demək istəyirəm. Bilirsiniz ki, bayrağı bu gün də Azərbaycan dramaturgiyası üçün parlaq nümunə olan mərhum Cəfər Cabbarlının səhnəyə gəlməsi ilə, o zamandan dramaturgiya bizdə bütün Azərbaycan ədəbiyyatının ən fəal janrı olmuşdur. Demək olar ki, ən yaxşı yazıçı qüvvələri dramaturgiya əsərlərinin yaradılmasında iştirak edirlər. Bu, əsas etibarilə müsbət hadisədir. Lakin bunun mənfi cəhəti də vardır. Bəzi hallarda yazıçı daxili yaradıcılıq tələbatına görə, daxili mənəvi tələbdən çıxış edərək dram yazmır, yalnız modaya və müxtəlif başqa mülahizələrə görə dramatik əsər yazmağa girişir.

Lakin mən başqa məsələdən, yəni bu dramaturgiyadakı bəzi təhlükəli cəhətlərdən danışmaq istəyirəm. Mən bunu bir də ona görə demək istəyirəm ki, nədənsə, bizim Ümumittifaq plenumlarımızda biz yalnız nailiyyətlərdən danışmağa adət etmişik. Bəs nöqsanlarımızdan harada danışaq?

Bizim dramaturgiyamızda indi ailə həyatı mövzusu, sədaqət və ümumiyyətlə əxlaq mövzusu üstün yer tutur. Mirzə İbrahimov müharibənin birinci ilində "Məhəbbət" pyesini yazırkən bu tema Azərbaycan dramaturgiyasında çox gözəl səsləndi. Mən bu tamaşaya zövqlə baxırdım, çünki dramaturq mövzuya yüksək əxlaq və ideya mövqeyindən

yanaşmışdır. Belə bir pyes yazmaq üçün onda daxili, mənəvi bir tələbat var imiş. Lakin eyni mövzu səhnədə üç-dörd əsərdə təkrar olunduqda nəinki sənət tapdalanmış yolla, təkrarlama yolu ilə getməyə başlayır, repertuar özü də yoxsullaşır.

Tutaq ki, birisinin həyat yoldaşı ağıllıdır, gözəldir, əri cəbhədədir, özü də çox müsbət adamdır, aydın zəkası, gözəl qəlbi var. Arxada qalmış həyat yoldaşına pozğun bir adam məhəbbət elan edir. Qadın öz namusunu qoruyur, müəllif isə bunu bir qəhrəmanlıq hünəri kimi qələmə verir. Halbuki burada heç bir qəhrəmanlıq yoxdur, bu, ananın və nəhayət həyat yoldaşının borcudur. Qadın hətta ərdə olmasa da, özünü fırıldaqçıdan qorumalıdır.

"Nizami" kimi gözəl əsərin müəllifi olan Mehdi Hüseyn "İntizar" pyesini yaratmışdır. Pyesin bütün münaqişələri nədən ibarətdir? Oradakı insanlar müsbət insanlardır, onların hər birinin qarşısında təmiz ürəkləri, səmimiyyətləri üçün ehtiramla baş əymək olar. Lakin onların hamısı elə bir vəziyyətə düşüblər ki, bir-birinə istəmədən xəyanət edirlər, istəmədən bir-birini sevməməyə başlayırlar, başqa sözlə desək, bu pyes "müsbət insanların faciəsidir". Özünüz görürsünüz ki, bunlar hamısı nə qədər saxtadır, uydurmadır, bunlar hamısı necə süni surətdə düzəldilmişdir.

Tənqidi realizmin belə bir təhlükəsini mən bizim nəsrimizdə də görürəm.

Mən qətiyyətlə deyirəm ki, Azərbaycan ədəbiyyatı ümumsovet ədəbiyyatının qabaqcıl dəstələrindən biridir, onun haqqında geniş danışmaq lazımdır, lakin bu söhbətdə nöqsanları və səhvləri ört-basdır etmək, tərifləmək meyli olmamalıdır, çünki belə bir hərəkət bizim tərəfimizdən öz ədəbiyyatımıza hörmətsizlik olardı.

Mən Süleyman Rəhimovun vətəndaş müharibəsi dövründən yazdığı "Şamo" romanını, yaxud onun "Qardaş məzarı", "Torpağın səsi" əsərlərini oxuyarkən öz müasirlərimin ağrı və iztirablarını, yüksək ideya və hisslərini görürəm. Obıvatel adamların, fırıldaqçıların, xırda hisslərlə yaşayan xudpəsəndlərin, pozğunların təsvirinə həsr olunmuş "Qüdrətov" "Paxıl", "Mehman" kimi əsərlərini oxuduqda isə mən Rəhimova hörmət bəsləyə bilmirəm, həm də ona görə yox ki, bu əsərlərdə işıq yeri, aydın bir guşə yoxdur, ona görə ki, bu əsərlərdə poeziya yoxdur, bizim zəmanəmiz isə yüksək mənəviyyat zəmanəsidir. Və ədəbiyyatımızda aparıcı tema məhz zəmanəmizin poeziyası, onun ruhu olmalıdır. Məhz buna görə mən belə hesab edirəm ki, biz bəzi yazıçılarımızın əsərlərinə,

xüsusilə istedadlı yazıçılarımıza tənqidi yanaşmalıyıq, çünki ölkəmiz onlardan böyük, ciddi əsərlər tələb edir.

Yazıçı əməyi haqqında bir neçə söz. Burada yoldaşlar yazıçı əməyi haqqında çox danışdılar, bu barədə hörmətli Nikolay Semyonoviç Tixonovun məruzəsində də çox gözəl sözlər deyilmişdir.

Mən də bir neçə söz əlavə edərək demək istəyirəm ki, həqiqi yaradıcılıq əsil hünərdir. Risqsiz və fədakarlıqsız, ümumiyyətlə, heç bir hünər ola bilməz. Biz öz yuxusuz gecələrimiz bahasına, bəlkə də vaxtından əvvəl ağaran saçlarımız bahasına yaratmalıyıq, nəyin bahasına olursa-olsun, ancaq yaratmalıyıq.

Dünya ədəbiyyatının bütün böyük əsərləri, hər şeydən əvvəl, uzun illər boyu göstərilən səyin meyvəsidir, nəhəng insan əməyinin məhsuludur. Rustaveli, Nizami və Puşkin məhz belə yaratmışlar.

Bizim müasir yazıçılarımızda bir nöqsan var: (doğrudur, bəlkə də bu elə ciddi nöqsan deyildir ki, haqqında danışmağa dəysin), biz bir ay və yaxud iki ay qəzetlərdə, ya jurnallarda imzamızın görünməməsinə dözmürük. Yazıçı əməyi onun ideyalılığı ilə qiymətləndirilməlidir.

Burada İsbax yoldaş yeni başlayan bir cəbhəçi yazıçının sözlərini oxudu. Bu cəbhəçi yazıçı deyir ki, mənim Puşkinlə məşğul olmağa vaxtım yoxdur, çünki mən düşmənə qarşı əks həmlələrdə iştirak edirəm. İsbax unutmuşdur ki, Puşkin heç bir zaman böyük ictimai konfliktlərdən kənarda dayanmamışdır, o ömrü boyu bütöv bir ictimai dövlət quruluşuna qarşı hücumlar etmiş, əks həmlələr etmişdir. Xeyr, bizə icazə verilir ki, səngər qazmasına girək, silaha sarılaq, qəzetdə və jurnalda işləyək, məruzələr edək, bütün qüvvələrimizlə xalqımıza kömək edək. Lakin bizə bir şey qadağan edilmişdir – həqiqi yazıçı olmaya bilmərik. Sən harada olursan, ol – səngər qazmasındamı, cəbhədəmi – sən hər yerdə öz yazıçı mənəviyyatınla ümumxalq işində iştirak etməlisən, öz yazıçı taleyini xalqımızın taleyi ilə bağlamalısan. Öz həqiqi vəzifəsini başa düşmüş yazıçılar həmişə bir sənətkar kimi udmuşlar. Bu cəhətdən bizim şairlərdən Əhməd Cəmil, Sarıvəlli və başqaları xarakter nümunədirlər. Mən qeyd etmək istəyirəm ki, bizim ən yaxşı lirikimiz Məmməd Rahim müharibə illərində çox böyük milli poetik simaya çevrilmişdir. Onun haqqında bundan sonra yalnız Azərbaycanın hüdudları daxilində danışmaq olmaz.

Şeir sahəsində mən istərdim ki, Surkov öz məruzəsində insan fikri və hisslərinin geniş üfüqləri üzərində öz qüdrətli qanadları ilə pərvaz etməli olan böyük, yüksək sosializm poeziyası haqqında danışaydı. Poe-

ziya haqqında onun öz dili ilə danışmaq lazımdır, yəni yüksək insan ehtirasları və böyük zəka dili ilə danışmaq lazımdır. Çünki ümumiyyətlə poeziya və xüsusən sosializm poeziyası insan meylləri və ideallarının ifadəsinin ən yüksək pilləsidir.

Mən Surkov yoldaşın məruzəsində böyük rus xalqının və SSRİ-nin başqa xalqlarının qabaqcıl poetik fikrinin necə nəfəs aldığını, necə yaşadığını eşidib öyrənmək istərdim. Mən Tvardovskinin, Simonovun, Svetlovun, Tixonovun, İsakovskinin, Dolmatovskinin və bir çox başqalarının hansı arzular və niyyətlərlə yaşadıqlarını, nə yaratdıqlarını bilmək istərdim. Lakin, nədənsə, Surkov müvəffəqiyyətsiz şeirlərin təhlilinə və yeni başlayan gənc şairlərə olduqca çox diqqət verdi. Gəlin, həqiqəti deyək ki, ədəbiyyatda və poeziyada kütləvi axın gözəl şeydir, bunu bizim zəmanə yaratmışdır. Lakin böyük sənət hamı tərəfindən yaradılmır. Və xalqın böyük şairləri haqqında danışmadan, yaxud onlar haqqında az danışaraq böyük bir xalqın poeziyası haqqında danışmaq olmaz. Mən buna əminəm. Mən Antokolskinin "Oğul" poemasını oxuyarkən, keçən plenumda qeyd etdiyim kimi, bu poemada böyük müdrik filosofanə poeziyanın başlanğıcını gördüm. Antokolskini mən buna görə sevirəm.

Mən Tvardovskini, onun poemasını və "Ölüm və əsgər" adlı son parçasını oxuyarkən vəcdə gəldim, bu əsərlər mənə yetkin şair müdrikliyini xatırladır. Bunu alqışlamamaq və Puşkini gözləyərək yaşamaq olmaz. Puşkin böyük və qüdrətlidir, o, həmişə bizim müəllimimiz olaraq qalacaqdır, rüşeymləri inkişaf etdirməyə çalışmaq lazımdır, o zaman Puşkin özü bizə sağ ol deyər. Sahildə dayanıb havanın nə vaxt yaxşı olacağını gözləmək lazım deyildir.

Belə poeziya bizim milli respublikalarda vardır. Bu poeziya haqqında da danışmaq lazım idi, insanları və əsərləri sadalamaq deyil, yaradıcılıq nöqteyi-nəzərindən danışmaq lazım idi ki, xalqımızın və poeziyamızın ruhu görünsün, rus və Avropa oxucusu bizim şerimizi bilsin və bu şerin vasitəsilə xalqımızın indiki keçmişdəki ruhunu öyrənsin...

Yoldaşlar, sözümü qurtararaq mən demək istəyirəm ki, Bakıdan Moskvaya gəldiyim dörd gün ərzində mən daim şairanə bahar duyğularımla yaşamışam. Bütün həyatımda heç bir zaman mən bahardan bu qədər zövq almamış, onu bu qədər sevməmişəm. Yaşıl çəmənlər, ucsuz-bucaqsız əlvan tarlalar, uca dağlar... Onlar elə əzəmətli idilər, mənim nəzərimdə elə romantik qüvvə ilə yüksəlirdilər ki! Mən ömrümdə təbiəti və baharı belə sevməmişəm, halbuki həmişə onlara pərəstiş etmişəm.

Bu hisslər məndə ona görə oyanmışdı ki, təbiətimizin və Vətənimizin əzəmətli gözəlliklərində mən bizim qalib insanın qürurunu görürdüm! Sanki bütün təbiət bizim qürurumuzun təntənəsi ilə parlayırdı.

Mən belə düşünürəm ki, müharibədən sonrakı dövrdə ədəbiyyatımızın əsas vəzifəsi qələbəmizin obrazını, həm də yalnız bugünkü qələbəmizin deyil, bizim mənəvi aləmimizin, məfkurəmizin və əxlaqımızın bütün qara və mürtəce qüvvələr üzərində sabahkı qələbəsinin obrazını yaratmaqdır.

*1945*

## AZƏRBAYCAN ƏDƏBİYYATININ GƏLƏCƏK VƏZİFƏLƏRİ

Yoldaşlar! Mənim məruzəm Ümumittifaq Yazıçılar İttifaqının X plenumunun yekunları və Azərbaycan ədəbiyyatının gələcək vəzifələri haqqında olmalıdır. Lakin bu geniş və mürəkkəb məsələləri bir məruzəyə sığışdırmaq mümkün olmadığından, mən istər plenum, istərsə ədəbiyyatımızın bir çox xarakterik cəhətləri haqqında, şəxsən məni bir sənətkar kimi daha çox düşündürən məsələlər haqqında danışacağam. Ümidvaram ki, çıxışda bulunacaq başqa yoldaşlar da ədəbiyyatımızın, ümumi yaradıcılıq inkişafımızın aktual və zəruri məsələləri haqqında öz mülahizələrini söyləyəcəklər.

* * *

Ümumittifaq Yazıçılar İttifaqının plenumunda əsasən dörd məruzə oldu. Siz, bu məruzələri mətbuat səhifələrində oxuduğunuzdan, mən onların məzmunu haqqında danışmayacağam, bəlkə bir çox diqqətəşayan məqsədləri haqqında danışmaq istəyirəm.

Bütün plenum iki böyük şüar altında keçdi:

I. Yeni insan və onun bədii ədəbiyyatda əks olunmağı. Bunu başqa sözlə desək, sovet həqiqəti və qalib gələn sovet ideologiyasının ədəbiyyatımızda bədii ifadə məsələsi.

II. Yüksək sənət uğrunda mübarizə – yaşadığımız əsrin – qəhrəmanlıq və fədakarlıq əsrinin şərəfinə monumental əsərlər yaratmaq, geniş əhatəli, yüksək sənət lisanı ilə yazılmış bədii lövhələr yaratmaq, gələcək nəsillərə bizdən yadigar qalacaq əsərlər yaratmaq!

## MÜHARİBƏ VƏ ƏDƏBİYYATIMIZ

Mən bu məruzəmdə ədəbiyyatımızın nöqsanlı cəhətlərindən, onun qarşısında duran vəzifələrdən daha çox danışmağımızı məsləhət görürəm.

Söhbət ədəbi həyatımızı qəlblə sevmək, onun xüsusən müharibə dövründə əldə etdiyi böyük və tarixi nailiyyətləri ilə yaşamaq, yaradılmış gözəl bir zəminə üzərində quracağımız yeni abidələrdən gedir...

Müharibə dövrünün Azərbaycan ədəbiyyatı öz tarixi rolunu şərəflə ifa etdi, o, xalqa və vətənə olan sədaqətini nümayiş etdirdi, bütün xalqımızla birlikdə müsəlləh bir əsgər kimi cəbhələrə atıldı, imtahanlar verdi, döyüş meydanlarında bərkidi və boy atdı. Öz ilhamını daima xalq həyatından, xalq mübarizəsindən alan ədəbiyyatımızın gələcəyi böyükdür. Şeirlərimizi, hekayələrimizi oxuya-oxuya hücuma keçən əsgərlərimizin qəlbinə bədii söz ilham və qüdrət verdi, onları xariqələr yaratmağa çağırdı.

Vətən müharibəsi ədəbiyyatımıza zəngin, rəngarəng mövzular, yeni təravətlər, fikirlər və hisslər, yeni insanlar, qəhrəmanlar gətirdi. Ədəbi mühitimizin ciyərləri böyüdü, aldığı həyat və mübarizə nəfəsi daha da genişləndi, o nəfəs yüksəliş və qalibiyyət nəfəsi oldu.

Şerimizdə olan mücərrəd fikirlər, məfhumlar və hissləri konkret insan surətləri, hadisələr, konkret hisslər və həyəcanlar əvəz etdi. Sənət və söz ustalarımızın bağçaları yeni-yeni güllərlə bəzəndi. M.Rahim "Əntərə" şerində öz ölümündən sonra belə, düşmənlərinə qalib gələn qəhrəmanlarımıza abidə qurdu. S.Rüstəm "Ana və poçtalyon" şerində sadə bir insanın daima xeyirxahlıqdan, şad xəbərlər gətirməkdən zövq alan alicənab təbiətini kəşf etdi.

M.Dilbazi "Günəş" poeması ilə çocuqluq və gəncliyimiz üçün ilahi bir dostluq tərənnüm edən gözəl və nəcib bir əsər yaratdı.

Osman Sarıvəlli "Gətir, oğlum, gətir" şeri ilə xalqımızın, kəndimizin böyük idrak və qəlb xəzinəsindən bəhs edən mənalı və sənətkarlıqla yazılmış bir əsər yaratdı.

R.Rza romantik bir qəlblə yazdığı "İntiqam" şeri ilə insanları, yerləri və göyləri, dağları və daşları belə intiqama, faşist cəlladların başına od yağdırmağa çağırdı.

Ə.Cəmil "Ay nənə, bir nağıl de!" şeri ilə insanı heyran qoyan axıcı bir lirika yaratdı, müharibəni qocaların və körpələrin həyəcanları, əhvali-ruhiyyəsi vasitəsilə bizə göstərdi.

R.Nigar "Uğur olsun" şeri ilə öz ərlərini, qardaşlarını Vətən müharibəsi cəbhələrinə yola salan qızlarımızın, gəlinlərimizin mərd qəlbini, alicənab təbiətini nəğmə dili ilə tərənnüm etdi.

Z.Xəlil vətən şərəfi uğrunda qəhrəmanlıqla həlak olmuş rus qızının xatirəsinə "Tatyana" adlı ilhamlı bir poema yaratdı.

Vətən müharibəsi iştirakçılarından, istedadlı gənclərimiz Ənvər Əlibəyli "Bu qan kimin qanıdır" şeri ilə, Zeynal Cabbarzadə "Komsomol dəftərçəsi" şeri ilə, Novruz Gəncəli "Namus" poeması ilə şerimizə yeni hisslər, zövqlər gətirdilər. Misal çəkdiyim əsərlər indiki şeir xəzinəmizin nadir inciləri olsalar da, xəzinəmiz bunlardan yüz qat zəngindir!

Şerimizin indiki vəziyyətini, şairlərimizin yetkin sənətkarlıq qabiliyyətini nəzərə alsaq, bu gözəl zəmanənin böyük və ölməz abidələrini, daha vüsətli, daha dolğun, epik ümumiləşdirmələr yolu ilə gedən şeir dastanlarımızı yaratmaq zamanı gəlib çatmışdır. Gəlin, əsrimizin "İskəndərnamə"sini, "İliada"sını yaradaq! Yarada bilmərikmi? Mən əminəm ki, uzun zəhmət, böyük sənət eşqi hər şeyi yaratmağa qadirdir.

Müharibə dövrünün şeir nailiyyətləri bu və ya digər şəkildə bizim nəsrimizə də aiddir. Nəsrin tematikası, məzmun və forması zənginləşdi. Nasirlərimiz də öz qələmlərini süngüyə çevirdilər. Hələ müharibənin ilk günlərində "Torpağın səsi", "Medalyon" əsərləri ilə S.Rəhimov mübariz ruhlu, xeyirxah, xalqımızın qəhrəmanlıq və humanizmini ifadə edən bir nəsrin yaranmağını vəd etdi. Çox təəssüf ki, onun başladığı bu doğru yolun axırı "Şərbətalı", "Qüdrətov", "Üzsüz qonaq", "Su ərizəsi" kimi əsrimiz üçün xarakterik olmayan, yüksək və mübariz sənətimizin təbiətindən uzaqlaşan, sosializm həqiqətinin əsil və gözəl varlığından deyil, ötərgi hallardan, yalnız fənalıq və mənəvi pozğunluq törədən insanlardan danışan hekayələr cərəyanına çevrildi.

Mir Cəlalın "Açıq kitab" romanı isə həyatın həqiqətini təhrif edən, süni surətdə tənqidi realizmi diriltmək istəyən, ictimai konfliktləri şəxsi konfliktlərlə əvəz edən, əsrimizin müsbət insanlarını qolsuz, qanadsız, mənfilərini isə hər yerdə qalib və hakim göstərən bir yazıçının xətasıdır. Onun yazmış olduğu "Vətən yaraları" hekayəsi isə müsbət bir rol oynadı. Biz o haqda cəbhələrdən belə məktublar aldıq. İstər S.Rəhimovun, istərsə də Mir Cəlalın son zamanlarda aludə olduqları "mənfilər dünyası" hekayə və romanları ilə, yaxud onların "həyatı tənqid etmək, qamçılamaq" nəzəriyyəsi ilə barışmaq olmaz. Bu yol nəsrimizi sosializm realizmi zəminəsindən ayırıb, tənqidi realizm təhlükəsinə

aparıb çıxara bilər. H.Mehdinin "Moskva" oçerki, "Odlu qılınc" hekayəsi, M.Ənvərin "Analar yollara çıxdı", İ.Əfəndiyevin "Sən ey qadir məhəbbət!", Əbülhəsənin "Sahildə" və başqa yazıçılarımızın bu növ hekayələrində biz xalqımızın gözəl və nəcib mənəviyyatını oxuyuruq, özümüzlə və gələcəyimizlə fəxr edirik.

"Dumanlı Təbriz", "Qılınc və qələm", "Gənc çekistlər" kimi romanlar yaratmış ədibimiz M.S.Ordubadidən biz qəhrəmanlıq və qalibiyyət əsrimizin pafosunu, mübariz ruhunu ifadə edən romanlar gözləyirik.

* * *

Dramaturgiyamıza gəlincə, burada iki xəttin baş-başa toqquşmasını açıq və aydın görürük. Birinci xətt C.Cabbarlı tradisiyasıdır ki, burada sosializmin qalib həqiqətinin təntənəsi, mənfi insanların, ölüb getməkdə olan siniflərin və ictimai zümrələrin mənəvi məğlubiyyəti realist və inandırıcı bir sənətlə ifadə olunur. Bu sənət bizi yüksəldir, gələcəyə, inkişaf və mübarizəyə çağırır. İkinci xətt isə məişət və əxlaq pozğunluğu, iradəsizlik və əqidəsizlik yolu ilə "mənfilər kainatı" yaratmaq yoludur.

M. İbrahimov "Məhəbbət" əsərini yazdığı zaman bizi bir cəhətdən sevindirdi ki, o, bu məsələyə daxili bir zərurət nəticəsində toxundu, "yeni ailəmizi, köhnə ailələrimizin yaxşı tradisiyaları üzərində qurmaq" problemini cəsarətlə irəli sürdü. O, həyatı birtərəfli, yalnız "pozğunlar həyatı" kimi göstərmədi. Biz o əsərdə şərəfsizlərə qarşı, xalqımızın namus və şərəf səsini eşidirik, axırıncının qalib gələcəyinə inanırıq. Lakin çox təəssüf ki, Mirzə dramaturgiyasında müsbət insanlar mənfilərə nisbətən səthi və dayaz təsvir olunur. Məişət və ailə pozğunluğundan təkrar-təkrar bir neçə əsər yazılmışdır. "Vəfa", "İntizar", "Aşnalar" və başqaları... İş o yerə gəlib çıxmış ki, biz bu əsərlərə baxdığımız zaman işıq yeri, qurtuluş yolu görmürük. Onlarda yeni əxlaq, yeni insan yoxdur. Hətta müsbət adamlar belə iradəsizlik üzündən məişət və həyat pozğunluğuna tabe olurlar. Bu yol bizim mübarizə və qəhrəmanlıq dövrümüzü ifadə edən, yeni və qalib insanı, onun məfkurə və əxlaq normalarını tərənnüm edən dramaturgiyamızın yolu deyil, əksinə, insanları və həyatı iyrənc göstərən, həyatda xeyirxahlıq və gözəlliyi ört-basdır edən, bədii qüvvətə sahib olmayan, bəzi hallarda isə ilhamsız və balıq kimi soyuq bir qanla yazılmış əsərlər yoludur. Tənqidimiz bu əsərlərə möhkəm atəş açmalıdır.

## XEYİRLİ VƏ MƏNALI GÜLÜŞ

Gülmək və sevinmək insan təbiətinin zəruri bir ehtiyacıdır. Oxucularımızın və tamaşaçılarımızın gülməyə, bədii istirahətə haqqı var. Lakin o nəyə gülməlidir və necə gəlməlidir? Bu sual ətrafında gedən mübahisələr təsadüfi deyil. Çünki gülüş haqqında olan rəylər müxtəlifdir. Bəzi yazıçılar tamaşaçıları səs-küylə, qışqırıqla güldürmək, uğundurmaq istəyir. Məncə, bu gülüş çox səthi və mənasız bir gülüşdür. Dramaturq və aktyor tamaşaçıya qəsdən, zorla, "mütləq gülməlisən!" deyə yanaşdığı zaman əsərin süniliyi meydana çıxır. Məncə, gülüş hər şeydən daha çox təbiilik tələb edir ki, nə dramaturq, nə də aktyor təlxəklik məktəbi yaratmamalıdır. Eybəcər səslər çıxarmaqla, bəzən ədəbsiz sözlər yazmaqla, yaxud səhnədə göz-qaş oynatmaqla, yekəqarınlar, uzunburunlar yaratmaqla əldə edilən gülüşlər sirk gülüşlərindən daha ucuz, daha mənasız olur.

Biz dramaturgiyamızda mənalı gülüş uğrunda mübarizə etməliyik.

Tamaşaçı mənfi insanları seyr etdiyi zaman, hər şeydən əvvəl, onların mənəvi yoxsulluğuna, şüur və qəlb fəlakətinə gülməlidir. Bizi güldürən vəziyyətlər və təbiətlər olmalıdır. Biz güldüyümüz zaman düşünməliyik, dərs almalıyıq, öz daxili aləmimizdə olan bir çox zəif cəhətlərə də dərindən gülsək, bu hal bizim inkişafımıza kömək edər. Məncə, biz Sabit Rəhmanın dediyi anbar oğrularına, cibgirlərə yox, məslək və vicdan oğrularına, mənsəbpərəstlərə, qorxaqlara, bütün ömrünü təşəbbüssüz keçirən, heç bir cəsarət və mərdlik göstərməyən, həyatın mənasını "mədə güzəranı" kimi düşünən insanlara, atalıq, dostluq, yoldaşlıq hisslərindən məhrum insanlara, öz sərçə başı ilə "fatehi-dövran" olmaq istəyən təbiətlərə, özünü "dünyanın ağası" eləmək iddiası ilə meydana atılmış faşist quldurların sönük təbiətinə gülsək, yaxud vəzifəsi böyüdüyü zaman öz yaxın dostlarını belə saymayın, öz qoca ata-anasını belə köməksiz qoyan, bəzən də xalq və vətən qeyrətindən məhrum cənablara gülsək, həm də ifşa yolu ilə gülsək, daha xeyirli, daha mənalı bir gülüş olmazmı? Xəsis təbiətlərə, xəsis başlara gülsək, daha gözəl olmazmı?

Mən komediyadan mənalı gülüş tələb etdiyim zaman heç bir "fəlsəfə" və "filosofçuluq" niyyəti güdmürəm. Çünki komediya janrı dram yaxud faciə deyil, komediya hər zaman bizi düşündürməyə də bilər. Lakin o bizə gözəl hisslər, yaxşı zövqlər bağışlasa, biz qışqırıq salıb gülməsək də, əsər öz arzusuna çatmış olar. Biz müsbət insanlarımız

haqqında da komediyalar yarada bilsək, onları daha çox sevmək məqsədi ilə yaratmalıyıq. Məgər həyatımızda öz xasiyyəti, təbiəti, məişət tərzi etibarilə, danışıq və rəftarı ilə bizi güldürən, lakin müsbət insanlarımız azmıdır? Məncə, bunlar haqqında da komediya yaradılmalıdır! Sovet komediyası janrını yaradan, bu sahədə bir çox müvəffəqiyyətli addımlar atmış S. Rəhman yoldaş artıq tamaşaçılarımızı zahiri gülüşlərə deyil, dəruni və mənalı gülüşlərə çağırmalı, vəziyyətlər və təbiətlər komediyası uğrunda öz mahir qələmini işlətməlidir.

## DRAMATURGİYA VƏ TEATR

Hər qabaqcıl teatrın mədəniyyət və yaradıcılıq səviyyəsini göstərən ən böyük amil dramaturgiyadır. Böyük dram əsəri olmadan böyük rejissor və aktyor yaradıcılığı da ola bilməz. Hər kəsin bildiyi bu sadə həqiqəti bir daha xatırlamaq ehtiyacı bu gün bir zərurət olmuşdur. Çünki dramaturqla teatrın qarşılıqlı əlaqəsi haqqında hələ də həll olunmamış bir çox mübahisəli məsələlər var. Dramaturgiya müasir Azərbaycan ədəbiyyatının ən fəal bir ədəbi növü olmuşdur. Demək olar ki, bütün qabaqcıl yazıçılarımız bu sahədə öz qələmlərini sınaqdan keçirirlər. Bu sınaq bəzi hallarda gözəl nəticələr verirsə, bəzi hallarda da pis nəticələr verir desək, səhv etmərik. Nə zaman ki, yazıçı səhnə əsərini daxili bir zərurət və ilham nəticəsində yazır, o əsər teatr sənətini yüksəldir, rejissorlarımıza və aktyorlarımıza ilham verir, onların yaradıcılıq meydanını genişlədir. Əksinə, ilhamsız, qayə və məqsədi kiçik əsərlər, modaya görə, ya başqa mülahizələrə görə yazılmış əsərlər isə teatr səhnəsini ilhamsız, soyuq və cansız hərəkətlər meydanına çevirir.

Dramaturq teatra onun arxasında gizlənmək üçün, ona süni bir yamaq olmaq üçün deyil, bəlkə öz əsrinin qabaqcıl bir mütəfəkkiri kimi gəlməli, teatrın bədii zövqünə, sənət və məfkurə xəttinə istiqamət verməlidir.

Dramaturgiyamız və səhnəmizin əsas inkişaf xətti və üslubu: əsrimizin nəhəng hadisələri, böyük qəhrəmanlıq pafosu, sosializm həyatının və insanlarının monumental surəti, həm də yüksək sənət dili ilə ifadə olunmuş həyat həqiqəti olmalıdır. Təəssüf ki, bu həqiqət bir çox əsərlərimizdə çox xırdalaşır, gözəl insanlar, böyük başlar əvəzində, çox zaman xırda başlar, zövqü kor, qəlbi sönük insanlar, məqsədsiz və məsləksiz adamlar meydan tapır. Tamaşaçı onları dəfələrlə seyr etdiyi

zaman öz böyük əsrini və müasirimiz olan gözəl insanları unudur, bəlkə də "həyat bumudur?" deyə öz-özünə sual da verir.

Bugünkü dram teatrımızın nəzəri səviyyəsinin azlığı nəticəsində yaranmış repertuar hərc-mərcliyi, teatrımızı öz yaradıcılıq simasını itirə bilmək təhlükəsi qarşısında qoymuşdur. Teatrımız dramaturqlarımızla əlbir çalışmaq kimi başladığı xeyirxah bir işi həddindən artıq güzəştə getmək, səhnənin yüksək tələblərini unutmaqla əvəz etdiyindən rejissorluq və aktyorluq sənətimiz böyümür, çox zaman da yerində sayır. Müqəssir kimdir? Birinci növbədə səhnəyə xırda fikirlər və xırda hisslər gətirən yazıçılardır. İkinci növbədə, bəlkə daha çox müqəssir bu kimi dram əsərlərinə meydan verən, hətta bəzən onları bayraq etmək istəyən teatrın bədii rəhbərləridir.

Sovet həqiqətindən yazılmış bütün müasir dram əsərlərimizdə (C.Cabbarlıdan başqa) ümumi bir xəstəlik var: mənfi insanlar daha kamil xarakterə, daha canlı həyat və hərəkət məziyyətlərinə sahib olduqları halda müsbət insanlarımızın əql və zəka aləmi, xeyirxah və nəcib hissləri, əməl və arzuları kölgədə buraxılır, onların bədii surəti əsil həyatdan qat-qat zəif və sönük çıxır. Teatrımız və dramaturgiyamız bu böyük və ciddi nöqsanın köklərini araşdırmalıdır, səhnəmizdən bizi gələcəyə çağıran, xalqımızın idrak və şərəfini yüksəldən insanlarımızın qadir və qalib səsi gəlməlidir!

## BİZ VƏ TARİXİ KEÇMİŞİMİZ

Hər insan, hər şeydən əvvəl, özünə məxsus tarixi olan, özünə məxsus tradisiyalar və milli xüsusiyyətlərə sahib olan konkret bir xalqın övladıdır. Sosializm insanı da müəyyən bir xalq tarixinin həyat zəminəsində yetişmiş, inkişaf yolları keçərək özünün bugünkü yüksək vəziyyətinə gəlib çıxmışdır. Müasir ədəbiyyat xalq idrakından, xalq mənəviyyatından danışdığı zaman, onun mənəvi keçmişinə böyük bir hörmət və məhəbbətlə yanaşmalı, tariximizin həyat və mübarizə səhifələrini ilham və ürəklə vərəqləməlidir. Tarixə "olub keçmiş şeylər", "çağırılmış bayatılar" kimi baxanlar idrak və zövqü məhdud insanlardır. Lakin biz tarixin uzaqlarına getdiyimiz zamanlarda belə, yenə öz əsrimizin övladı olduğumuzu unutmamalıyıq. İnkişaf yalnız qabağa, irəliyə getməkdir. Odur ki, biz keçmişimizin həyat və qəhrəmanlıq dünyasını dərk etməklə, o böyük mənəviyyat aləminin ən humanist, mübariz,

xeyirxah və nəcib insanlarını bugünkü yüksəliş və intibah dövrümüzə kömək edəcək cəhətlərinin bədii lövhələrini yaratmaqla babalarımıza rəhmət oxumağı da bacarmalıyıq. Yazıçı dühası mənsub olduğu xalqın mənəvi aləmi ilə məşğul olduğu vaxt bu aləmi çərçivəyə alınmış məhdud bir məkan və zaman mənasında düşünə bilməz. Bu hal yaradıcının düha meydanını daraltdığı kimi, xalqın, həm də qocaman bir xalqın həyat və mübarizə tarixini də məhdudlaşdırmış, daha doğrusu, təhrif etmiş olar. Xalq tarixi küll şəklində yaşanılmalıdır! Xalq əfsanələri, nağılları sahəsində belə, biz əsrimizin qabaqcıl ruhu ilə səsləşə bilən əsərlər yaratmalıyıq. Xalq əfsanələrinə soyuq bir nəzərlə baxan yazıçılar unudurlar ki, bütün əfsanələr xalq dühasının məhsuludur. Hər əfsanədə xalqın real həyatı, şüur və zövqləri, onun gələcəyə olan inam və arzuları əks olunmuşdur ki, onların bir çoxu indi də arzu olaraq, həm də yüksəliş arzusu olaraq qalır. Biz öz əsrimizin əfsanəvi qəhrəmanlarının surətini əfsanəvi bir qüdrətlə, bir dillə yaratsaq, günahmı olar? Bunu yalnız bacarmaq lazımdır! Yüksək sənət dili üçün standart forma yoxdur. Sənətin məna üfüqləri sonsuz olduğundan onun formaları da sonsuz və heç bir məngənəyə, hüdud çərçivəsinə sığışa bilməz. Ən böyük realist olan Qorkinin “Qız və ölüm” poeması əfsanə ruhu ilə yazılmamışmı? Lakin Qorki əfsanəsi bizi inandırır, çünki o əsər, ədibin realistik həyat anlaqlarından, müşahidələrindən doğulmuşdur!..

## KAMAL VƏ SƏNƏT

Hələ üç il bundan qabaq keçirdiyimiz ədəbi konfransı xatırlayın. Mən o vaxt “Ədəbiyyatımızın kamal tacına yeni incilərlə zinət verək” demişdim. Bu, şüar deyildi. Bir sənətkar qəlbindən qopan böyük bir arzunun kiçicik ifadəsi idi. Mən bütün əsərlərin, hər şeydən əvvəl, məna gözəlliyi qarşısında pərəstiş etməyə adət etmişəm. Çünki heç bir gözəlliyin ömrü məna gözəlliyinin ömrü qədər uzun ola bilməz. Çox təəssüf ki, mənim bir çox müasirlərim o vaxt səsimə səs vermədilər, böyük sənət uğrunda aparılan mübarizəni “ali ədəbiyyat” yaratmaq meylinə doğru sürükləmək istədilər. Onlar mənim öz yaradıcılığımı da “mücərrəd fəlsəfələr” cərəyanı kimi qələmə verməyə çalışaraq, Səməd Vurğun “realist ədəbiyyatı” sevmir, yaxud anlamır, dedilər.

Lakin bu gün mən çox şadam ki, ədəbiyyat ordumuzun əsas komandirləri – qabaqcılları ədəbiyyatımızın kamalı, məna hüsnü, onun

nəsildən-nəslə keçə biləcək tradisiyaları uğrunda mübarizə aparırlar, artıq mən də yalnızlıq həyəcanları keçirmirəm.

Əsrimiz böyük mənalar əsridir. Belə bir əsrin ədəbiyyatı da mənalar ədəbiyyatı olmalıdır. Xalqımızın əsil gözəlliyi də onun həyat və mübarizəsindən doğan proqressiv mənalardır. Biz xalqımızın yüksək şüurunu, tarixə və istiqbala olan nikbin baxışlarını, onun inqilabi dünyagörüşünü bədii sözlə kəşf etməliyik. Ədəbiyyatda böyük mənalar yaratmaq üçün böyük təbiətlər yaratmaq lazımdır. Bu heç də o demək deyil ki, hamını alim kimi, filosof kimi danışdırmaq lazımdır. Xeyr, insanın təbiət zənginliyi onun danışdığı sözlərlə deyil, o təbiəti yaradan əql, zəka, dərin hisslər, zövqlər, həyat və dünya təcrübələri, onun arzu və əməlləri, xəyal və həyəcanları, iztirab və nəşələrinin məcmusu kimi – bir sözlə, onun "həyat və mübarizə kitabı" kimi təsvir olunmalıdır. O vaxt biz sözlərin mənasına deyil, həyatın və insan təbiətinin mənasına pərəstiş etmiş olarıq.

## SOVET MƏFKURƏSİ VƏ BƏDİİ ƏDƏBİYYAT

Biz alman faşizmi ilə apardığımız dörd illik böyük bir müharibədən qalib çıxdıq. Bu qalibiyyət nəinki bizim müasir nəslimizə, bəlkə gələcək nəsillərimizə də şərəf və şöhrət çələngi bağışladı. Heç şübhəsiz ki, bizim balalarımız və nəvələrimiz gələcəkdəki qansız, qurbansız, azadlıq və səadət dünyasında öz qəhrəman babalarını yad etdikdə vüqar və iftixarla yaşayacaqlar. Dünyanın bütün xalqları, müxtəlif millətlərə və dillərə məxsus insanlar bizim qəhrəmanlıq abidəsi olan "Böyük Vətən müharibəsi" tarixini vərəqlədiyi zaman sovet xalqlarının sarsılmaz iradəsi, böyük və yüksək humanizmi, onların qəlbində məşəl kimi alovlanan vətən və məslək eşqini, insana hörmət və məhəbbət duyğularını ehtiramla yad edəcək, bəşəriyyəti iyirminci əsrin taunundan xilas etmiş olan sovet insanını dönə-dönə alqışlayacaq, müxtəlif dilli rübablarda tərənnüm edəcəklər... Sovet insanının bu böyük istiqbalı bir şair xəyalı deyil, bəlkə müasir insan cəmiyyətinin obyektiv inkişafından doğan bir həqiqətdir. Bu həqiqətə inanmaq sönməz bir ilham sahibi olmaq deməkdir!

Nə üçün sovet insanı faşizm kimi ən rəzil və ən dəhşətli bir düşmənə qalib gəldi? Bu gün sovet ədəbiyyatının qarşısında duran əsas

sual da budur. Ədəbiyyat bu yeni sovet insanının ona məxsus olan məziyyətlərini sənətin obyektiv lisanı ilə ifadə etməlidir. Məncə, sovet insanının, bizim qəhrəmanların əsas məziyyəti onların, hər şeydən əvvəl, yüksək məslək adamları olmağındadır. Bu qəhrəman özünün tarixdə oynadığı proqressiv rolu ilə fəxr edir. O dərk edir, eyni zamanda inanır ki, ədalət uğrunda, xeyirxahlıq və nəcib insan əməlləri uğrunda mübarizə edən bir qəhrəmana dünyanın ən gözəl insanları səs verəcək, onun zəfər bayrağı hər yerdə və hər zaman alqışlanacaqdır. Belə bir idrak bizim qəhrəmanlara ilham verən ən böyük amillərdən biri olmuşdur. Çünki adi qarətçilik, talançılıq kimi məhdud bir məqsədə xidmət edən orduların qəlbi sönük, fikri yoxsul olduğundan, onların hərəkət və qəhrəmanlıq meydanı da məhdud və dar olur, onların iradəsini böyük zəfərlərə doğru aparacaq mənəvi bir qüdrət olmur. Sovet insanının mənəvi yoxsulluğu ədəbiyyat və sənətimizdə öz bədii ifadəsini tapmalıdır. Faşizm ordusu və faşizm dövlət quruluşunun ölümünə səbəb olan əsas amillərdən biri onların insan və xalqlar şərəfini tapdalayan "irq" nəzəriyyəsi oldu. Lakin azad xalqlar dostluğunun övladı olan sovet qəhrəmanı isə bütün dünyada əsil demokratiya, xalqlar və ölkələr dostluğu, hüquq bərabərliyi, iqtisadi və ictimai azadlıq kimi öz humanist xasiyyətləri ilə şöhrət tapdı, qabaqcıl bəşəriyyətin hörmət və məhəbbətini qazandı. Bizim insan odlar və alovlar içində yalnız öz şəxsi və subyektiv mənafeyini güdmək deyil, bəlkə bütün insanlığı faşizm taunundan xilas etdi, bir çox ölkələrə və xalqlara yenidən həyat verdi, nəfəs verdi, onların gələcəyini də qansız, ölümsüz, xəyanət və zülmsüz bir dünyaya çağırdı. Siz görürsünüz ki, sovet qəhrəmanı ictimai bir insan olaraq yüksək bir idrak, humanist bir mənəviyyat sahibidir. Odur ki, ədəbiyyatımız və teatrımız bu yeni insanın bədii surətini böyük ilham və məharətlə yaratmalı, onun həyatında olan gəldi-gedər nöqsanları, yaxud ən adi müsbət cəhətləri göstərmək əvəzinə, onun məfkurə və əxlaq normalarının realistik və həqiqi abidəsini yaratmaq uğrunda mübarizə aparmalıdır. Biz ədəbiyyat və teatrımızda sovet insanına baxdığımız zaman fəxr etməliyik, biz özümüz də o insanla nəfəs almalı, onunla birlikdə mübarizə odlarından keçməli, onunla duyub-düşünməli, nəhayət, onunla birlikdə böyüməli, yüksəlməli, ən nəcib və yüksək bir həyata, böyük bir istiqbala doğru hərəkət etməliyik.

*1945*

# GƏLƏCƏK KİTABLAR

Mən "İnsan" adlı beşpərdəli böyük mənzum dram üzərində işləyirəm. Pyes Bakıda, Azərbaycan Dövlət Dram Teatrı səhnəsində tamaşaya qoyulmalıdır.

Pyesdə hadisələr iki əsas süjet xətti ilə inkişaf edir. Birinci xətdə mən poetik formada sovet xalqının mənəvi-siyasi əzəmətini, xalqımızın qəhrəmanlığını, onun insanpərvərliyini və insan zəkası qələbəsinə dərin inamını göstərmək istəyirəm. İkinci və bundan heç də az əhəmiyyətli olmayan süjet xəttində mən Sovet İttifaqı xalqlarının mənəvi birliyini və xüsusilə Azərbaycan və rus xalqları arasındakı dostluğu göstərəcəyəm. Mən bu mövzu üzərində xüsusi bir səy və məhəbbətlə işləyirəm.

Pyesdəki hadisələr Böyük Vətən müharibəsi günlərində başlayır və 30-40 il sonra da davam edir. Bu, mənə imkan vermişdir ki, nəsillərin bir-biri ilə əlaqəsini göstərim.

Pyesin əsas qəhrəmanı gənc filosof Şahbaz özünə məxsus keyfiyyətləri olan romantik bir simadır. O, vuruşmada həlak olarkən belə ən çox buna görə əzab çəkir ki, böyük fəlsəfi əsəri bitməmiş qalacaqdır. Lakin otuz il keçdikdən sonra onun əsərini atasının adını daşıyan kiçik oğlu başa çatdırır.

"İnsan" mənim dördüncü mənzum dramımdır. Bu əsər üzərində işləmək mənə böyük zövq verir, çünki tarixi mövzularda yazdığım əvvəlki üç əsərimdən fərqli olaraq, burada mən ilk dəfə öz müasirlərimin obrazlarına müraciət etmişəm və onların nəvələrini göstərməyə çalışmışam.

Pyes üzərində işləməklə bərabər, mən eyni zamanda bir ildən artıqdır ki, "Bakının dastanı" adlı mənzum epopeyanı yazıram. Poemada mən respublikamın və xalqımın paytaxtı olan Bakı şəhərini tərənnüm etmək istəyirəm, onun qədim tarixini, Azərbaycan xalqının keçmişdəki iztirablarını və sevincini, onun ideallarını və arzularını göstərmək istəyirəm.

Poemada Bakının özünə məxsus əlvan və gözəl təbiətinin təsvirinə mən xüsusi diqqət verirəm. Bir çoxları elə bilirlər ki, Bakı tozlu bir şəhərdir. Onun saysız-hesabsız neft buruqları meşəsinin arxasında çox vaxt əsas qüvvəni – bütün maddi nemətləri yaradan xalqın qəlbini və ruhunu görə bilmirlər. Bakı haqqında belə yanlış təsəvvürləri yox etmək lazımdır. Mən Bakını ümumiyyətlə bütün Azərbaycanın obrazı kimi təsvir edirəm.

Poemanın beş min misraya yaxın böyük hissəsi artıq çap olunmuşdur. Onu 1946-cı ildə qurtaracağıma ümid edirəm. Poema cəmi on min misraya yaxın olacaqdır. Əsərin tərcüməsi üzərində şairə və mənim dostum A.Adalis məhəbbətlə işləyir.

Moskvada Azərbaycan ədəbiyyatı və incəsənəti ongünlüyündə moskvalıları öz poemamdan parçalarla tanış edəcəyəm.

*1945*

## BÖYÜK BƏSTƏKAR

Azərbaycan xalqının doğma oğlu, böyük bəstəkarımız Üzeyir Hacıbəyovun anadan olmasından 60 il keçir. Bu 60 illik ömrün tam 40 ili bəstəkarımızın böyük səmərələr və bəhrələr vermiş yaradıcılıq illəri olmuşdur. Tam 40 il gecəli-gündüzlü, yorulmaq bilmədən, ilhamla yaşayan və yaradan bir bəstəkar ürəyinin zərif telləri, bir sənətkar ilhamının əzəmətli rübabı qəhrəman xalqımızın mənəvi varlığını, onun müqəddəs əməl və arzularını, sevinc və iztirablarını, həyat və mübarizə eşqini böyük bir məharət və məhəbbətlə tərənnüm etmişdir.

Hər xalq öz ictimai tarixinin gözəl səhifələri ilə, insan mədəniyyətinin xəzinəsinə bəxş etdiyi incilər, hədiyyələr, yetirdiyi böyük şəxsiyyətlər və dühalarla qanuni olaraq fəxr edir.

Biz, müasir azərbaycanlılar xalqımızın, milli mədəniyyətimizin parlaq bir dövründə yaşadığımız zaman bir çox elm, fəlsəfə, ədəbiyyat və incəsənət, dövlət və siyasət adamlarımızın siması ilə fəxr edirik. Onların surətində sosializm mədəniyyətimizin yaradıcılarını, fədakar qəhrəmanlarını görürük. Müasir Azərbaycan mədəniyyətinin ən görkəmli və qabaqcıl bir siması olan Üzeyir Hacıbəyovun adı ilə bütün xalqımız fəxr edir.

Öz şəxsi taleyini xalqın taleyi ilə səmimi bağlayan, öz yaradıcılıq və həyat qabiliyyətlərini xalq səadəti, xalq şərəfi uğrunda sərf edən insanlar xalqın əbədi məhəbbət və hörmətinə nail olurlar. Böyük bəstəkarımız Üzeyir Hacıbəyov da nəinki Azərbaycan xalqının, bəlkə bütün sovet xalqlarının hörmət və məhəbbətini qazanmış məşhur bir sənətkardır. Hələ neçə min il bundan qabaq dünyanın böyük şeir dühası, ölməz "İliada" və "Odisseya" dastanlarının yaradıcısı Homer məşhur "Odisseya" əsərində musiqinin ecazkar qüdrətindən, onun insan mənəviyyatına olan xeyirxah təsirindən bəhs edərək demişdir ki, mən

insanların ən mənalı vaxt keçirmələrini onda görürəm ki, "Bütün ariflər öz mənsəb və rütbələrindən asılı olmayaraq, sıra ilə əyləşib, böyük bir ehtiram və diqqətlə öz müğənnilərinə, bəstəkarlarına qulaq assınlar".

Biz bu gün fəxr edirik ki, Homerin o zaman hələ ideal halında arzu etdiyi yüksək sənət və ilham aşiqi olan bu cəmiyyətin övladlarıyıq. Üzeyir isə bu böyük xalq məclisinin hörmət qazanmış qüdrətli bir müğənnisi və bəstəkarıdır.

Azərbaycan opera sənətinin banisi və atası sayılan bəstəkarımızın həyat və yaradıcılığı xalqımızın inkişaf tarixinin böyük ictimai hadisələr və ictimai inqilablar dövrünə təsadüf etdi. 1905-ci il inqilabı dövründə ölkəmizdə gedən siyasi və ictimai toqquşmalar, gərgin sinfi mübarizə tarixi, paytaxtımız Bakı şəhərinin tarixə yazdığı inqilabi qəhrəmanlıq səhifələri bütün xalqımızın ictimai şüurunda böyük bir dönüş yaratdı. O zamankı mütləqiyyətə, kapitalizm və feodalizm cəmiyyətinin amansız qanunlarına qarşı, ictimai ədalətsizlik və haqsızlığa qarşı əməkçi xalqın qəzəb və kin dalğaları bir ümman kimi təlatümə gəldi. O vaxt Üzeyirin adi müəllim sifəti ilə çalışdığı Bibiheybət mədənlərində al bayraqlı barrikadaların "azadlıq və istiqlaliyyət" şüarlarının dalğaları nəinki bütün Qafqazda və Cənubi Rusiya şəhərlərinə, eləcə də İran, Əfqanıstan, hətta uzaq Hindistanın Bombey şəhərinə kimi yayıldı. Bakının inqilab sədaları bir çox Şərq ölkələrinin ictimai və siyasi şüurunda böyük bir dönüş yaratdı. O dövrdən başlayaraq Azərbaycan xalqı içərisindən Molla Nəsrəddin, Sabir, N.B.Vəzirov, Ə.Haqverdiyev, M.S.Ordubadi, A.Səhhət, A.Şaiq, Süleyman Sani Axundov və başqaları kimi demokratik Azərbaycan ziyalılarının qüdrətli bir axını yarandı. Bu böyük qələm sahibləri çar mütləqiyyətinin sönük varlığını, kapitalistlərin və mülkədarların zülmünü, cəhalət və nadanlığın zülmət kabusunu böyük bir nifrət ehtirası ilə qamçılamağa başladılar. 1905-ci il ərəfəsində yaranmış demokratik Azərbaycan ziyalılarının məşhur simalarından biri də Üzeyir Hacıbəyov oldu. O, ictimai həyatımızın mübarizə səhnəsinə böyük bir bəstəkar, həm də istedadlı bir dramaturq kimi atıldı.

Onun ilk operası məşhur "Leyli və Məcnun" 1908-ci ildə, yəni ən dəhşətli və amansız irtica illərində tamaşaya qoyuldu.

XII əsrdə Nizami Gəncəvinin, XVI əsrdə isə Füzuli qələminin qüdrəti ilə bütün dünyada şöhrət qazanmış bu qədim ərəb əfsanəsi XX əsrdə Üzeyir Hacıbəyovun musiqi fırçası ilə bir daha şöhrətləndi.

Bütün Qafqaz və Şərq xalqlarının dillərində dastan oldu. Füzuli şerinin əzəmət və romantikası Üzeyir musiqisinin qanadlarında bir daha ucaldı, əngin üfüqlər açdı. Üzeyirin "Leyli və Məcnun" operasının yaranması heç də təsadüfi deyildi. "Azad şəxsiyyət və azad məhəbbət" problemi min illərdən bəri davam edən sinifli cəmiyyət tarixində ən böyük sənət dühalarını düşündürən bir mövzu, həm də ümumbəşəri bir mövzu olmuşdur. "Leyli və Məcnun" operası azad fikir, azad eşq uğrunda faciələr keçirən, fəlakətlərə düçar olan insanlığın, o cümlədən Azərbaycan xalqının o zamankı mənəvi məhkumluğunu rübabı bir musiqi dili ilə tərənnüm etdi, humanizmi təhqir edən sinifli cəmiyyət ənənələrini qamçıladı. Üzeyir bu dastanın yüksək əməllərinə və arzularına Azərbaycan xalq musiqisinin əzəmət və cəlalı ilə yeni bir təravət gətirdi, onu XX əsr insanlarının zövqünə uyğun, mənəvi tələb və həyəcanlarına müvafiq bir ahənglə yenidən yaratdı. İstər Məcnunun, istərsə də Leylinin ürəkyaxıcı ariyalarını dinlədiyimiz zaman biz onların əynində gördüyümüz ərəb qiyafələrini unutduğumuz kimi, hadisənin də ən qədim ərəb mənşəyini unuduruq. Çünki onların ağzından eşitdiyimiz doğma səslər, doğma avazlar, heyratilər, şikəstələr və bayatılar Leylini və Məcnunu bizə Azərbaycan oğlu və Azərbaycan qızı kimi təqdim edir. Odur ki, "Leyli və Məcnun" dastanının istər bədii söz mətni, istərsə də musiqisi tam mənası ilə Azərbaycan xalqının orijinal mənəvi məhsuludur, onun milli şeir və musiqi mədəniyyətinin gözəl bir incisidir.

O, artıq sadə bir ərəb əfsanəsi deyil, Füzuli şerinin və Üzeyir Hacıbəyovun musiqi lisanının yaratdığı tam mənası ilə orijinal, Azərbaycan xalqının fikir və ürək məhsuludur.

1909-cu ildə Üzeyirin "Şeyx Sənan" operası, "Rüstəm və Söhrab", "Ər-arvad" və "O olmasın, bu olsun" musiqili komediyaları, 1912-ci ildə "Şah Abbas və Xurşidbanu", "Əsli və Kərəm" operaları, 1914-cü ildə isə məşhur "Arşın mal alan" musiqili komediyası tamaşaya qoyuldu.

Biz müəllifin "O olmasın, bu olsun" yaxud "Arşın mal alan" komediyalarına baxdığımız zaman onun nəinki mahir bir bəstəkar, həm də çox mənalı, həyat və insanların ruhunu təşrih edən istedadlı bir dramaturq olduğunu da görürük. Molyer və M.F.Axundovun komediya qüdrəti ilə səslənən "Məşədi İbad" operettası o zamankı ədəbiyyatımızın hakim üslubu olan tənqidi realizm ruhunda yazılmış bir əsərdir. Orada təbiəti xəsis, xalq və vətən mənafeyindən məhrum, mənəvi yoxsulluğun bariz nümayəndəsi olan məşədi ibadlar, pulun və cibin hakim

olduğu çirkin bir cəmiyyət məharətlə ifşa edilir, onların gülünc siması musiqili komediya vasitəsilə ifadə olunur! Həmin əsərdə qəzetçi Rza, “intelligent” Həsən simasında osmanlı dili və başqa xarici dillər təsiri ilə öz ana dilindən uzaqlaşmış, öz xalqının həyat və tarixinə təhqirlə baxan, satqın və şərəfsiz burjua ziyalıları məharətlə ifşa edilir.

Bu ideya Molla Nəsrəddinin məşhur “Anamın kitabı” əsərində inkişaf etdirilir, daha yüksək bir dramaturji formaya salınır.

Üzeyirin inqilaba qədər yazmış olduğu bu əsərlər xalqımızın ictimai şüur oyanışında, köhnə dünya və köhnə əxlaqın sarsıdılması uğrunda nəinki Azərbaycan şəraitində, bəlkə bütün Yaxın Şərq aləmində inqilabi və mütərəqqi bir rol oynamaqla, musiqili komediya janrı olaraq birinci dəfə Azərbaycanda, Üzeyir qələminin qüdrəti ilə yaradıldı!

Bu əsərlərin istər yaradılışında, istərsə də tamaşaya qoyulması uğrunda müəllif bir çox məşəqqətlərə, iztirablara sinə gərdi. Çar mütləqiyyətinin ağır illərində nə dövlət, nə də milli burjuaziya tərəfindən heç bir maddi və mənəvi kömək görməyən bəstəkarın milli opera yaratmaq təşəbbüsləri hər yerdə təqib olunub, mütrəce və qaragüruhların hücumlarına rast gəlirdi. O zamanın “İqbal” qəzetində bir nəfər yazırdı: “İştə drama və sairə faciələr bu qədər millətə mənəvi mənfəət verirkən, onları operaya və operettaya öyrətmək bir dürlü bizi məmnun edəmiyor. Söz yox ki, Hacıbəyov cənablarının əsərləri məslək və fikrialidən xali deyildir. Lakin, biz müsəlmanlarda hələlik elə nazik baş yoxdur ki, o məslək və ideyanı çalğı lisanında əxz eləyə bilək.

...Yoxsa iki il də bu halla gedərsək, teatrlarımıza yüzdən beş nəfər də gələn olmayacaqdır”.

Bu kütbaşların, yoxsul təbiətlərin hakim olduğu bir dövr, üfüqlərini qara zülmət sarmış bir dünya sənətkarın böyük iradəsini qıra bilmədi, onun yaratmaq eşqini söndürə bilmədi. Çünki Üzeyir öz xalqının günəşli-gündüzlü sabahına, onun böyük istiqbalına inanırdı, xalqın azadlıq və qurtuluş gününü səbirsizliklə gözləyirdi...

Son 25 il müddətində Üzeyirin Azərbaycan musiqi mədəniyyətinin inkişafında göstərdiyi böyük xidmətləri hamıya məlumdur. Mən isə bu zəngin xəzinənin bir çox daha böyük inciləri haqqında danışacağam.

1937-ci il 30 aprel günü – “Koroğlu”nun ilk tamaşası bütün mədəniyyətimizin tarixi bir bayram günü oldu. Bəstəkarımızın uzun illərdən bəri topladığı yaradıcılıq təcrübələri, onun yüksək musiqi mədəniyyəti yeni və böyük bir qüdrətlə səsləndi. “Koroğlu” operası Şərq və Avropa

musiqi mədəniyyətinin ən böyük nailiyyətlərini özündə təcəssüm etdirən, bütün mədəni ölkələrin mənəvi tələbinə cavab verən, Azərbaycan musiqi mədəniyyətinin yüksək bir zirvəsi oldu.

Operanın mürəkkəb və zəngin simfonik quruluşu, milli musiqi alətlərimizlə Avropa musiqi alətlərinin həmahəng bir dillə danışması, vokal musiqi sənətinin inkişafı üçün yazılmış klassik ariyalar, kütləvi və qəhrəmanlıq səhnələrini ifadə edən mürəkkəb və həyəcanlı musiqi nömrələri, iki-üç səsli xor sənətinin gözəl nümunələri və bütün bunların vahid bir ahəngi Üzeyir sənətinin yüksək mədəniyyətini nümayiş etdirdi.

"Koroğlu" operası bütün Şərq xalqları arasında qədimdən şöhrət tapmış Azərbaycanın qəhrəmanlıq dastanına yeni bir təravət və cəlal gətirdi. Üzeyir tarixi hadisələrə və tarixi şəxsiyyətlərə müraciət etdiyi zaman öz yaşadığı əsrə, bu dövrün mənəvi tələblərinə sadiq qalan, bizi keçmişə deyil, sabaha, yalnız gələcəyə çağıran bir sənətkardır. Odur ki, biz "Koroğlu" operasında 400 il bundan qabaqkı hadisələrə və insanlara baxdığımız zaman öz əsrimizin də nəbzini duyuruq, öz müasir insanlarımızın da yüksək əməllərini, coşqun vətənpərvərlik hisslərini, məhəbbət və qəhrəmanlıq sifətlərini gözəl və şairanə bir musiqi lisanı ilə dərk edirik, ürəyimizdəki həyat və insan qüdrətinə olan eşq və humanizm bir daha qol-qanad açır.

"Koroğlu" operası musiqi və opera sənətimizin mükəmməl bir abidəsidir ki, o, nəsillər boyu yaşayacaqdır!

Üzeyir yaradıcılığı çox zəngin və hərtərəfli inkişaf etmiş bir yaradıcılıqdır. Biz burada musiqili komediyalar, operettalar və böyük operalarla yanaşı, bir çox başqa janrlar da görürük. Üzeyirin bir çox kantataları öz musiqi sənədlərinin həcmi və təsiri etibarilə bir opera qədər qüdrətə malikdir.

Onun 1935-ci illərdə milli çalğı alətlərimizdən notlu bir orkestr yaratması, bu orkestr üçün yazdığı 1-ci və 2-ci simfoniya adlı əsərləri tarixi bir rol oynadı. "Rədd olsun tar və kamança!" deyən, Azərbaycan xalqını öz milli musiqi mədəniyyətindən məhrum etmək istəyən bir çox şərəfsiz və satqın xalq düşmənlərinin kütbaş nəzəriyyələrinə qarşı Üzeyir ilk dəfə milli musiqi alətlərimizin notlu orkestrini yaratdı. O, nəzəri və əməli olaraq, tar-kamança, tütək, yastı balaban, qoşa zurnalar vasitəsilə simfonik əsərlərin ifa olunmasını sübut etdi.

Azərbaycan xalq çalğı alətlərinin müasir musiqi lisasını ifadə etməsini, heç də Avropa musiqi alətlərindən geri qalmadığını nümayiş

etdirdi. Üzeyirin bu notlu orkestr təşəbbüsü bütün Şərq aləmində yeni və mədəni bir ixtira oldu.

Avropalıların romans dediyi musiqi janrı əvəzində Üzeyir Azərbaycan musiqisində "qəzəl" janrını yaratdı. Nizaminin "Sənsiz" və "Sevgili canan" sözlərinə yazılan mənalı musiqi qəzəl janrının ilk gözəl nümunələridir.

Üzeyir yaradıcılığında insan qəlbini mehriban bir ana nəvazişi ilə oxşayan lirik nəğmələr olmaqla, insanı mübarizəyə çağıran, ona həyat və mübarizə iradəsi aşılayan marşlar da az deyildir. Bizim qəhrəmanlıq eposlarımızın xalq musiqisi əsasında Üzeyirin yeni yaratmış olduğu "Cəngi" adlı bir janr da diqqətəşayan bir hadisədir. Üzeyir bu janrı yaratmaqla yaşadığımız qəhrəmanlıq əsrinin ruhunu verir, sosializm musiqi mədəniyyətində qəhrəmanlıq ruhunun hakim qüvvətini bir daha qeyd edir.

Üzeyirin musiqişünaslıq elmi sahəsindəki nəzəri əsərləri də bizim musiqi mədəniyyətimizin inkişafında böyük rol oynadı. Onun son zamanlar yazmış olduğu "Azərbaycan musiqi ladlarının əsasları" adlı elmi əsəri bütün sovet musiqişünasları tərəfindən təqdir edilir.

Üzeyir bu əsəri ilə Azərbaycan musiqisinin yalnız Azərbaycana məxsus olan milli əsaslarını elmi surətdə sübut etməklə, Azərbaycan musiqisini İran və başqa Şərq musiqisindən seçə bilməyən, bəzən də bizim böyük musiqi sərvətlərimizi başqa xalqların hesabına yazan savadsız alimlərin puç nəzəriyyəsini alt-üst etdi, Azərbaycan milli musiqisinin tam orijinallığını və müstəqil bir musiqi olduğunu sübut etdi.

Bir neçə söz də Üzeyir sənətinin daxili məna gözəlliyindən:

Hər bir musiqi əsərinin varlığı, onun insanlara göstərdiyi emosional təsirlə ölçülür. Musiqi insanların şüurundan çox qəlblərinə, duyğularına təsir bağışladığından musiqi lisanından, hər şeydən əvvəl, təbiilik və ürək çırpıntıları tələb olunur. Üzeyir sənəti soyuq bir şüurun, formal bir texnikanın məhsulu deyil, hadisələri yaşamış, insan taleyini duyub-düşünmüş, sevinclər və iztirablar keçirmiş böyük bir ürəyin məhsuludur. Biz onu dinlədiyimiz zaman real həyat və mübarizə simfoniyalarını dinləyirik. Bu həyat boyasız, sadə və təbiidir. İnsan həyatı öz daxili ziddiyyətləri, mürəkkəbliyi və incəliyi ilə ifadə olunur. Səadətin fəlakətlə qarşılaşmasını, xeyrin şər ilə mübarizəsini, dəhşətli və gərgin səhnələrini, nəhayət humanizmin zəfərini, idrak və insanlığın qalibiyyətini görürük. Üzeyir sənəti həyat və insanı təsdiq edir. Üzeyirin realizmi hadisələri və insanları natura halında deyil, yüksək bir romantik

üslubda ifadə edir; cəmiyyətin bugünkü halını təsvir etdiyi zaman biz sabaha, gələcəyə doğru gedirik, daima yüksəlir və kamilləşirik.

Hər sənət əsərinin çarpan ürəyi saf və səmimi bir ilhamdır. İlhamsız yazılan bir əsər məhəbbətsiz bir ailə kimi sönükdür. Ən böyük xoşbəxt sənətkarlar öz ilhamını xalq mənəviyyatından, onun yüksək əməl və arzularından alırlar. Üzeyir də belə bir sənətkardır. "Koroğlu" operasının da əsil qüvvəti və məziyyəti xalqımızın mənəvi həyatından alınan böyük bir ilhamdır.

Azərbaycan xalq musiqisinin böyük və zəngin xəzinəsi daima Üzeyir yaradıcılığı üçün ilham mənbəyi olmuşdur. Azərbaycan xalqının musiqi zövqü çox qədim bir tarixə malikdir. Hələ miladdan bir neçə əsr əvvəl yaşamış Aristotel bizim ulu babalarımız midiyalıların zəngin musiqi mədəniyyətinə, musiqi zövqünə sahib olduqlarını onların içərisindən yetişmiş, yüksək peşəkar müğənnilərin varlığını qeyd edir.

Üzeyir musiqisini dinlədiyimiz zaman biz bəzən qaşlarımızı çatıb loğman kimi düşünürük, bəzən həyat və insan eşqinə odlardan, alovlardan keçən qəhrəmanlar oluruq. Bəzən ürəyimizümman kimi təlatümə gəlir, bəzən də sakit və nurlu bir yaz səhəri kimi açılırıq, özümüzdə dağlarda külünglər çalan fərhadlar qüdrəti hiss edirik, xəyalımız göylərə uçduqca yaşadığımız ana torpağı, onun yaratdığı insan adlı böyük neməti daha çox sevirik, öz varlığımız və tariximiz ilə fəxr edirik.

Üzeyir sənətinin dili bütün xalqlar üçün aydındır. Avropa musiqi mədəniyyətinin, xüsusən böyük və xeyirxah rus xalqının zəngin musiqi mədəniyyətindən məharətlə istifadə edən bu sənətkar bütün sovet xalqları üçün əziz və doğmadır.

Heç də təsadüfi deyildir ki, Üzeyirin "Arşın mal alan", "Koroğlu", "Əsli və Kərəm", "Şah Abbas və Xurşidbanu" kimi əsərləri dünyanın əsas dillərinə tərcümə edilmişdir. Bu əsərlər rus, gürcü, fars, fransız, alman, ingilis, tatar, tacik, uyğur, kürd, ləzgi, belorus, yəhudi, qazax, Ukrayna, qırğız və başqa dillərə tərcümə edilmişdir.

Azərbaycan Sovet himninin müəllifi Üzeyir Hacıbəyov bu himndə qəhrəman xalqımızın şərəfli keçmişini, onun xoşbəxt halını və istiqbalını canlı sənət dili ilə romantik bir üslubda tərənnüm etdi! Bu böyük şərəfə nail olmuş sənətkarımızın üzərində çalışdığı "Azərbaycan" adlı simfoniyasını xalqımız ürək çırpıntısı ilə gözləyir!

Üzeyir sənəti kamala yetmiş bir sənətdir. Lakin insan kamalının hüdudu olmadığı kimi, sənət və yaradıcılığın da hüdudu yoxdur.

Biz qalib bir cəmiyyətin – sosializm dünyasının sənətkarıyıq. Dünyanı titrədən dəhşətli bir müharibədən qalib çıxan Vətənimizin istiqbalı çox böyükdür. Biz bu böyük istiqbalımız eşqinə, bütün qabaqcıl bəşəriyyətin şüuruna qida verən sovet məfkurəsi eşqinə yeni xariqələr yaratmalıyıq!

Biz əminik ki, şanlı yubiley sahibimiz gələcəyin böyük sənət abidələrini yaratmaq işində də bayraqdar bir sənətkar olacaqdır... Öz xalqının tarixini və şanlı istiqbalını dərk edən Azərbaycan sənət ordusu bütün Şərq xalqlarının azadlıq bayraqdarı olan Azərbaycan xalqının mədəniyyət və incəsənətinin daha böyük, daha ölməz abidələrini yaradacaqdır! Eşq olsun qalib sovet məfkurəsinə, qalib sovet incəsənətinə!

Şanlı yubiley sahibinə uzun ömür və cansağlığı arzu etməklə deyirik:

Qartal kimi qanadlanıb fəzaları aşarsan,
Bir ülviyyət aləminin qucağında yaşarsan.
O aləmin zinətidir ayın, günün camalı,
Rübabında qanad açır insanlığın kamalı...
Zaman görmüş, dünya görmüş müqəddəs bir vətənin
Övladısan! Şərəfindir, şöhrətindir bu sənin.
Ah, dil açıb danışdıqca yaratdığın nəğmələr,
Günəş kimi bayraq çəkdi xəyalıma min səhər.
Bir səhər ki, onun hüsnü şeir qədər gözəldir,
Yaratdığın o gülşənlər, o çəmənlər gözəldir.
Gözəlliyin heykəlidir sənətində canlanan,
Vətən mülkü alqış deyir bu sənətə hər zaman!
Dil açdıqca rübabının o mənalı telləri,
Ürəyimdə min ney tutur Azərbaycan elləri...
Nəğmən gəzir çəmənləri gözəllərin dilində,
Sevdasına qanad verib bülbülün də, gülün də!
Nə zaman ki ümman olub dalğalanır ürəyin!
Mən duyuram mənasını min müqəddəs diləyin!
Sən ki, həyat aşiqisən... qoy bu eşqin var olsun,
Nəsillərdən-nəsillərə adın yadigar olsun.
Qartal kimi qanadlanıb fəzaları aşarsan.
Bir ülviyyət aləminin qucağında yaşarsan.
O aləmin zinətidir ayın, günün camalı,
Rübabında qanad açır insanlığın kamalı.

*1945*

## [“VƏTƏN SƏSİ” KİTABINA MÜQƏDDİMƏ]

Vətən səsi! Bu iki sözdə nə qədər böyük bir qüdrət, yenilməz bir vüqar vardır! Vətən səsi – el səsidir! O səs bizə bir zaman beşiklərimizdə layla çalardı. İndisə, o səs bizə cəbhələr boyunca komanda verir. İrəli, qəhrəman oğullarım, irəli! Hərami nəslinin daşını daş üstə qoymayın! Azadlıq və səadətin beşiyi olan sosialist Vətənimizdən faşist quldurlarının ayağını tamam kəsin! Son qalibiyyət bayrağını Berlin üzərində sancana qədər irəli! Vətən uğrunda irəli!

Bu – Vətən səsi, Vətən əmridir!

Vətən öz qəhrəman oğullarını sevir, onları alqışlayır. Şeir də, şair də qəhrəmanlar dostudur. Qəhrəmana məhəbbət və hörmət, qorxağa və namərdə nifrət hissi Azərbaycan şerinin humanist ruhudur.

Qəhrəmanlıq və şeir bir cüt bacıdır. Şerin qəlbi məhkumiyyət sevməz. O, xalqımızın böyük ruhu kimi bütün qəsbkarlara qarşı amansızdır! Biz Azərbaycan yazıçıları, sizə – Vətənimizin mərd oğullarına müraciətlə deyirik: – Bizim “Vətən səsi” adlanan bu kiçik hədiyyəmizi qəbul edin!

Şairimiz Osman Sarıvəlli gözəl deyir:

Şeir –ölkəmizin məğrur səsidir,
Şairin ən böyük hədiyyəsidir!

Biz bu ədəbi məcmuəmizi şanlı və müzəffər ordumuza – azadlıq və səadət ordusuna bağışlayırıq! Siz bu kitabçada bizə ilham verən Azərbaycan oğullarının qəhrəmanlıq səhifələrini, onların nəcib duyğularını və böyük əməllərini oxuyacaqsınız! Biz sovet yazıçıları xoşbəxtik ki, böyük bir tarixin – qəhrəmanlıq tarixinin şahidi oluruq, öz ilham xəzinəmizi mərd oğullarımızın qanı ilə yaradılmış hünərlərlə zənginləşdiririk! Lakin bizim sizə – qəhrəman ordumuzun hər nəfərinə böyük borcumuz var! Biz hələ də sizin adınıza – göstərdiyiniz fədakarlıq və igidliyə layiq ölməz əsərlər yaratmamışıq.

Lakin bir həqiqət də var ki, yazıçılarımızın ürəyindən qopmuş bu kitabın sətirlərində siz yaranmaqda olan böyük qəhrəmanlıq dastanlarının başlanğıcını oxuyub sevinəcəksiniz. Biz buna çox şadıq. Azərbaycan yazıçıları XX əsrin “İskəndərnamə”sini yaradacaqlar!

Bu böyük dastan bizim müqəddəs Vətən müharibəsi dövründə Koroğlu nərəsi çəkən Azərbaycan xalqının vətən səsi, el səsi olacaqdır! O qüdrətli səsin dalğaları zamandan-zamana, nəsildən-nəslə keçəcəkdir!

Var olsun qələm və süngümüzün vahid səsi – vətən səsi!

*1945*

## "NÜŞABƏ" BARƏDƏ

Yoldaşlar, əsər çox möhtərəm, hamımızın sevdiyimiz ədib, müəllimimiz Şaiq tərəfindən yazılmışdır. Ona görə, şübhəsiz, hamımız bu əsərə qarşı çox böyük hörmətlə yanaşmalıyıq. Amma əsər "İskəndərnamə"yə mülhəm olduğundan tarixin gözəl bir səhifəsini təsvir edir. Abdulla Şaiq gözəl şair ilhamı ilə tarixi çox gözəl verir.

Bizim teatrımızda əsərin istər quruluş və başqa sahələrinə çox böyük zəhmət çəkilmişdir. Çox zəngin quruluş verilmişdir. İskəndər kimi böyük bir şəxsiyyətin xüsusi tarixi vardır. Mənə elə gəlir ki, daha yaxşı olardı ki, İskəndəri Nüşabə qılınc gücü ilə yox, ağıl gücünə qaytarsın. Mən də Nizaminin əsərlərindən "Fərhad və Şirin"i yazdıqda bəzi məsələlərdə uduzdum. Nizaminin bir çox həqiqətlərindən kənar getdim. Nüşabə də İskəndəri məcbur edir. İskəndərin əsas məqsədi qəsbkarlıq olmur.

Nüşabə İskəndəri bu cür adla qaytarmasın, ölkəni qırğına verməsin deyə onu məğlub etməlidir. O zaman daha ağıllı hökmdar olardı.

Mən istərdim ki, səhnədə Aristotelin adı dəyişilsin. Bunu vermək lazım deyil. Bu, Aristotel səhnəyə gəldikdə heç olmasa, filosof obrazı nəzərə çatdırılsa, yaxşı olar. Bu adam böyük filosof olub, gələndə gərək tamaşaçılar hiss etsinlər ki, doğrudan da o, filosofdur.

İskəndərin belə ağıllı olması ondadır ki, həmişə belə filosoflarla durub oturmuşdur. Bu təsisatları görmək lazımdır.

Gəncə xanı ilə Şəki xanı nə iş görürlər? Bunların heç bir funksiyası yoxdur və heç də təsadüfi deyildir ki, bunlar əvvəl görünürlər. Guya, bunlar müharibədə iştirak etmişlər. Heç olmasa, bunların bir-iki yerdə hərəkəti görünmüş olsa, o zaman bilmək olar ki, bunlar, doğrudan da, bir iş görmüşlər.

Mənə belə gəlir ki, bu səhvləri düzəltmək olar, ancaq əsər qurtarmış əsərdir. Tamaşaya qoyulmalıdır. Əsər üzərində böyük zəhmət çəkilmişdir. Nüşabə portret qarşısında and içən zaman çalınan musiqi çox gözəldir.

*1946*

## [SOVET YAZIÇILARI İTTİFAQI İDARƏ HEYƏTİNİN XI PLENUMUNDA ÇIXIŞ]

Yoldaşlar! Partiyamızın Mərkəzi Komitəsinin sovet ədəbiyyatı haqqında tarixi qərarı və Jdanov yoldaşın məruzəsi bütün sovet ədəbiyyatının məfkurəvi-bədii həyatında ciddi dönüş əmələ gəlməsinə səbəb oldu. Sovet ədəbiyyatının yüzlərlə nümayəndəsi, o cümlədən Azərbaycan yazıçıları da öz məfkurəvi və fəlsəfi dolğunluğu ilə dövrümüzün ən qabaqcıl ədəbiyyatı olan sovet ədəbiyyatının əhəmiyyətini və tarixi vəzifəsini yenidən və daha dərindən dərk etdilər.

Mərkəzi Komitənin qərarı sovet yazıçılarının vətən qarşısında borclarını daha artıq məsuliyyətlə yerinə yetirmələri işində həqiqətən böyük və faydalı rol oynadı. Çünki bu işin sosializm cəmiyyəti quruluşunda şərəfli mövqeyi və əhəmiyyəti vardır. Biz Azərbaycan yazıçıları MK-nın qərarından ilham alaraq, sovet ədəbiyyatının prinsipial və mühüm müasir məsələlərindən biri olan ədəbiyyatın partiyalılığı məsələsini, bu ədəbiyyatın xalqlar və ədəbiyyat tarixində bu vaxta qədər misli görünməmiş əsil xəlqiliyini daha dərindən başa düşdük. Bizə bir daha aydın oldu ki, ədəbiyyat, cəmiyyətin düşüncəsində və iqtisadiyyatında ictimai-tarixi dönüşlər əmələ gətirən qabaqcıl məfkurələrlə silahlanmasa, böyük ədəbiyyat yaratmaq olmaz.

Avropa ölkələrinin çürüməkdə olan müasir burjuaziya mədəniyyətinə xas olan məfkurəsizliyə, qeyri-siyasiliyə, fərdiyyətçiliyə və estetçiliyə bizim sovet ədəbiyyatında yer ola bilməz və olmamalıdır.

Azərbaycanın ədəbiyyat ordusu sovet ədəbiyyatının məfkurə aydınlığı və yüksək məqsədi uğrunda mübarizə apararaq, Azərbaycan yazıçılarının yaradıcılığını tənqidi surətdə yenidən nəzərdən keçirdi, sovet ictimaiyyəti üçün səciyyəvi olmayan hadisələrin və adamların təsvirinə həddən artıq meyl edənləri kəskin tənqid atəşinə tutdu.

Biz, poeziyamızda mənasız sevgi lirikasına qarşı mübarizə apardıq və beləliklə, ölməz Nizamidən başlayıb gələn Azərbaycan milli poeziyasının real ənənələrini, mübariz ruhunu, həqiqi xəlqiliyini daha da inkişaf etdirdik.

Uzaq tarixi mövzulara həddən artıq aludə olan, buna görə də zəngin və qüdrətli sosialist varlığımızın bədii ifadəsindən kənarda qalan dramaturq və nasirlərimiz tənqid edildi.

Nəticədə məfkurə və yaradıcılıq nöqteyi-nəzərindən düzgün istiqamətə düşən Azərbaycan yazıçıları diqqətəlayiq müvəffəqiyyətlər əldə etdilər. Mən ÜİK(b)P MK-nın qərarlarından sonra yazılan Azərbaycan ədəbiyyatının səciyyəvi əsərləri haqqında qısa da olsa danışmaq istəyirəm.

Son zamanlar yeni və böyük əsərlər yazılmışdır ki, bunlardan xüsusilə Əbülhəsənin "Müharibə" romanını ayrıca qeyd etmək lazımdır.

Bu əsərdə böyük rus xalqının şanlı oğulları ilə çiyin-çiyinə Sevastopolun qəhrəman müdafiəsində iştirak edən azərbaycanlı döyüşçülərdən danışılır. Yazıçı öz qəhrəmanlarını artıq mürəkkəbləşmiş, səciyyə etibarilə hazır bir şəkildə təsvir etmir. Əksinə, onların inkişaf prosesində necə müəyyənləşdiklərini, tədricən dəyişdiklərini göstərir. Buna görə də romanın surətləri canlı və inandırıcıdır, sünilikdən uzaqdır. Baş qəhrəman Tapdıq surəti yüksək bədii qiymətə malikdir. Namuslu, zəhmətsevən Tapdıq hərbi biliyə tez yiyələnir, vzvod komandiri olur. Bu qəhrəmanla yanaşı, yoldaşlarının "rus Mahmud" deyə çağırdıqları bir serjant da diqqəti cəlb edir. Bakı neftçisinin oğlu Mahmud bu təxəllüsü öz tələbkarlığına, əla intizamına görə qazanmışdır. Mahmud uşaqlıqdan ruslarla dost olmuş, onların yaxşı xasiyyətlərini mənimsəmişdir. O, cəbhədə də bu dostluğu möhkəmləndirməkdə davam edir. Hər şeyi bilmək istəyən bacarıqlı gənc hərbi sənəti böyük həvəslə öyrənir, şücaət göstərir, komandirlik rütbəsi alır, yaxşı hörmət qazanır.

Əbülhəsənin yaradıcılığına məxsus olan beynəlmiləlçilik ruhu, ölkəmizin xalqları arasındakı qardaşlıq mövzularına meyl hissi bu romanda öz parlaq ifadəsini tapmışdır. Azərbaycanlı döyüşçülərin surətləri ilə yanaşı, rusların da surətləri müvəffəqiyyətlə yaradılmışdır.

Partiyamızın Mərkəzi Komitəsinin ədəbiyyat və incəsənət haqqındakı tarixi qərarlarına Mehdi Hüseyn öz yeni "Ürək" povesti ilə cavab verdi. Povestin "İnqilab və mədəniyyət" məcmuəsində dərc edilən birinci hissəsində Mehdi Hüseyn, Böyük Vətən müharibəsi illərində Azərbaycanın kənd əməkçilərinin, işçilərin vətən qarşısında öz borclarını dərindən dərk edərək, qəhrəmancasına çalışdıqlarını, xalqa və partiyaya sədaqətlə xidmət işində necə parlaq nümunələr göstərdiklərini bizə nəql edir.

Axır zamanlar yaradılmış qiymətli əsərlərdən biri də Sabit Rəhmanın "Arzular" povestidir. Bu povest həm Azərbaycan nəsrində, həm də Sabit Rəhman öz yaradıcılığında yeni bir hadisədir. Mərkəzi

Komitənin ədəbiyyat və incəsənət haqqındakı qərarlarından sonra Sabit Rəhmanın öz keçmiş səhvlərini aradan qaldırmağa çalışmış və bu sahədə bəzi müvəffəqiyyətlər əldə etmişdir.

Ənvər Məmmədxanlının "Şərqin səhəri" adlı yeni tarixi romantik dramı Azərbaycanda Sovet hakimiyyətinin qurulduğu illərdən bəhs edir. Müəllif Azərbaycan xalqının öz azadlığı uğrunda gərgin mübarizəsinin mürəkkəb hadisələrini göstərir. İnqilabi mübarizələrdə tərbiyə edilən Bakı proletariatı əsərin mərkəzində durur.

Ənvər Məmmədxanlı inqilabi mübarizənin qızğınlığını romantik təsvirlərdə verir. Onun pyesində həm daxili düşmənlərlə – müsavatçılar və kapitalistlərlə, həm də xarici düşmənlərlə – yadelli imperialistlərlə aparılan mübarizə göstərilmişdir. Bu əsər öz ruhu etibarilə bir çox hallarda müasir həyatımızla səsləşir.

Gənc nasir İlyas Əfəndiyev "İşıqlı yollar" pyesində maraqlı surətlər yaratmışdır. Əsərdəki hadisələrin əsas inkişaf xəttini, iki mədən arasındakı sosializm yarışı, neftçilərin gündəlik əmək fəaliyyətlərinin bədii ifadəsi təşkil edir. Müəllif əməkçilərin zəhmət birliyini böyük məhəbbətlə və hərarətlə təsvir edir, onların zəhmətini parlaq və real boyalarla göstərir.

Demək lazımdır ki, neftçilərin həyatı və işi son zamanlar bir çox şair və nasirlərimizin diqqətini getdikcə daha artıq özünə cəlb etməyə başlayır. Mehdi Hüseyn, Ənvər Məmmədxanlı, İ.Qasımov Bakı neftçiləri haqqında yazdıqları kino-ssenarilər üzərində böyük həvəslə çalışırlar.

Yazıçılarımızdan Ə.Sadıqov Sosialist Əməyi Qəhrəmanı Bəsti Bağırova haqqında, Məmməd Əkbər, Süleyman Vəliyev adlı-sanlı neft ustaları haqqında yeni oçerklər yaratmışlar. Bu onu göstərir ki, son illərdə ədəbiyyatımızda kiçik yer tutan oçerk növü indi artıq inkişaf etməyə başlamışdır.

İstedadlı dramaturq Mirzə İbrahimov hazırda "Aylar" adlı yeni dram üzərində çalışır. Müəllif bu pyesdə kənddə işləyən sovet müəlliminin məfkurəvi-mənəvi simasını təsvir edir və bunlar da həyatımızın dəyişən sosializm quruculuğu sahəsində sovet ziyalılarının tarixi rolunu göstərir.

Süleyman Rüstəm Mingəçevir quruculuğu haqqında romantik poemasını qurtarmaq üzrədir. Şair xalqlarımız arasındakı dostluğu, respublikamızın iqtisadi və mədəni simasını dəyişəcək nəhəng quruluşun başa çatdırılması üçün çəkdikləri gərgin zəhməti xüsusi bir məhəbbətlə tərənnüm edir. Məmməd Rahim Leninqradın müdafiəsində faşist

qaniçənləri ilə mübarizədə qəhrəmancasına həlak olmuş H.Əliyev haqqında yazdığı poemanı qurtarmışdır. M.İbrahimov Oktyabr inqilabının 30 illiyinə "Təbrizin səhəri" adlı romanını qurtaracaqdır...

Görkəmli yazıçı Süleyman Rəhimov "Saçlı" romanının üçüncü hissəsini qurtarmışdır. Müəllif, ÜİK(b)P MK-nın ədəbiyyat haqqındakı qərarları nöqteyi-nəzərindən öz yaradıcılıq nöqsanlarını bir daha gözdən keçirmişdir.

Mərkəzi Komitənin qərarlarından sonra Azərbaycan ədəbiyyatında yaranan əsərlərin tam olmayan siyahısı belədir. Mən Azərbaycan yazıçılarının bu əsərləri haqqında ona görə danışmağa məcbur oldum ki, Fadeyev yoldaşın çox böyük və məzmunlu məruzəsində ÜİK(b)P Mərkəzi Komitəsinin qərarlarından sonrakı Azərbaycan ədəbiyyatından qətiyyən bəhs edilmədi.

İndi də Azərbaycan ədəbiyyatı və tarixinin nəzəri cəhətdən işıqlandırılmasına dair bəzi məsələlərdən danışmaq istəyirəm.

Bəzi skeptiklər var ki, onlar bizim ədəbiyyatımızda yalnız kəsirlər və çatışmayan cəhətlər axtarırlar. Onlar bu kəsirləri az qala mikroskopla axtarıb tapmağa çalışır, bunun üçün bacardıqlarını əsirgəmirlər. Lakin onlar Azərbaycan milli ədəbiyyatının parlaq və müsbət cəhətlərini, sovet ədəbiyyatı xəzinəsinə daxil olan ayrı-ayrı pyesləri, şeir və nəsr əsərlərini adi gözlə görməkdə çox çətinlik çəkirlər, demək olar ki, görə bilmirlər. Unutmayaq ki, həyatın irəli hərəkətini və inkişafını təmin etmək üçün onun bütün parlaq və yaxşı cəhətlərini nəzərə alıb təsdiq etməklə bərabər kəsirli və kölgəli cəhətlərini də aşkara çıxarmaq lazımdır.

"Literaturnaya qazeta"nın 14 iyun 1947-ci il tarixli nömrəsində Skosırev yoldaşın "Elmi əsası olmayan bir məsələ" adlı məqaləsi dərc edilmişdir. Müəllif Nizami dövrünü Azərbaycan milli mədəniyyətinin qızıl dövrü adlandıran M.İbrahimov yoldaşla mübahisə edir. Skosırev "qızıl dövr" ifadəsi ilə razı deyil. Məgər İbrahimov yoldaşın məqaləsinin əsas mahiyyəti bundanmı ibarətdir? Bilmərrə və qətiyyən yox! İbrahimov deyir ki, XII əsr Azərbaycan mədəniyyəti tarixində həqiqətən böyük dövr olmuşdur. O, bəşəriyyətə Nizami, Xaqani, Fələki, Məhsəti xanım və başqa bu kimi bədii təfəkkürün dahi sənətkarlarını vermişdir. XII əsr Azərbaycanın ilk çiçəklənmə dövrüdür. Bəs Skosırev yoldaş Nizami dövrünü və Azərbaycan xalqının XII əsrdəki vəziyyətini necə xarakterizə edir?

Skosırevin sözlərinə görə: “Azərbaycan xalqı, demək olar ki, başdan-başa savadsız, dilənçi və hüquqsuz idi. O, şirvanşahların yadelli hökmranlığı altında idi və onun milli mədəniyyəti tapdalanmışdı. Azərbaycanın ən böyük şairi Nizaminin öz əsərlərini doğma Azərbaycan dilində deyil, xalqına yad bir dildə, işğalçıların və saray əyanlarının dilində yazmağa məcbur olması buna ən yaxşı misaldır”.

Sual olunur, əgər belə isə bəs Nizami hansı bir zəminə üzərində öz böyük əsərlərini yaratmışdır? Skosırevin iddiasına görə başdan-başa savadsız və dilənçi bir xalq necə oldu ki, Nizamini yaratdı? XII əsr Azərbaycan mədəniyyətindən danışarkən Skosırevə bu qara boyalar nə üçün lazım olmuşdur? Budurmu keçmişə tənqidi münasibət? Məncə, bu, tarixi həqiqəti təhrifdən başqa bir şey deyildir.

İkinci: o təsdiq edir ki, şirvanşahlar yadelli işğalçılar idi. Skosırevin bu uydurmasını və elmə zidd olan iddiasını tənqid etməyə belə dəyməz. XII əsrdə Azərbaycanda iki müstəqil dövlət var idi – Şirvanşahlar dövləti və İranın bir hissəsini özünə tabe edən Eldəgizlər dövləti. Bu dövlətlərin siyasi möhkəmliyi ölkənin böyük mədəni yüksəlişi üçün imkanlar yaratmışdı. Azərbaycan SSR Elmlər Akademiyası, sovet alimləri və bütün Azərbaycan ziyalıları Azərbaycanın XII əsr dövlət tarixinə aid olan bu iddiaları təsdiq edirlər. Axsitan şahın təhrikilə Nizaminin İran dilində yazıb-yaratması bəzi yoldaşları təəccübləndirir. Bundan o nəticəni çıxarırlar ki, guya Axsitan Azərbaycan hökmdarı deyil, yadelli idi. Əlbəttə, bu doğru deyildir. Azərbaycan hökmdarı olan Axsitan qədim bir ənənənin əsiri idi. Bu ənənə də ondan ibarət idi ki, fars dili saray dili olmaqdan başqa, demək olar ki, bütün Şərq ölkələrinin ədəbi dili idi. Axsitanın Nizamini fars dilində yaratmağa məcbur etməsi səbəbini bu nöqteyi-nəzərdən izah etmək lazımdır. Skosırev öz məqaləsində Nizaminin fars dilində yazmasını əsas tutaraq, Azərbaycanın XII əsrdəki böyük mədəniyyətini, demək olar ki, inkar edir. Bu, məsələyə marksistcəsinə yanaşmaq deyil, çünki əyan, yaxud ağaların saray dili, şahların və sultanların dili bu və ya başqa xalqın milli mədəniyyətini və ədəbiyyatını qiymətləndirmək işində heç bir zaman əsas şərt olmamışdır. Mədəniyyət və ədəbiyyat həmişə xalqın dühası, həyatı, mübarizəsi, quruculuq qabiliyyəti ilə yaranmış və yaranır. Azərbaycan xalqı da yüz illərlə bundan əvvəl işğalçılara və o zaman hakim dil olan fars dilinə zərbələr endirərək, öz qədim mədəniyyətini yaratdı.

Demək, ədəbiyyata dair elmi fikrimiz sahəsində və milli ədəbiyyat tariximizi işıqlandırmaqla məşğul olan tənqidimizin işində hələ hər şey öz qaydasında deyildir.

Tərəqqipərvər demokrat xadimlər haqqında əsərlər yaradılması məsələsini, xüsusilə xalqlarımızın ən yaxşı nümayəndələrinin rus ədəbiyyatı və mədəniyyətinə istinad etmələri məsələsini ortaya atan Fadeyev yoldaşın qiymətli təklifi ilə mən də şərikəm. Bu böyük və xeyirli məsələ Sovetlər İttifaqında yaşayan bütün xalqların ədəbiyyatına aiddir.

Azərbaycan yazıçıları bu sahədə çalışmış və çalışırlar. Cəfər Cabbarlı "1905-ci ildə" dramında Bakı proletariatının inqilabi hərəkatını azərbaycanlıların, rusların, gürcülərin və başqa xalqların dostluğu kimi tərənnüm etmişdir. Bu dram sizə məlumdur. Ordubadinin "Dumanlı Təbriz" romanı İranda inqilab hərəkatına həsr olunmuşdur. Müəllif rus inqilabının bu hərəkata olan təsirini böyük bir qüvvə ilə ifadə etmişdir. "Vaqif" pyesində mən tarixi dəlillərə əsaslanaraq, XVIII əsrin ən böyük şairi Vaqifi təsvir etmişəm, həm şair, həm də böyük dövlət xadimi olan Vaqif Türkiyəyə, İrana deyil, Rusiyaya istinad edirdi. M.F.Axundovun həyatına həsr edilmiş "Səbuhi" kino-filmində Puşkinin ölümü münasibətilə yazılmış poemanın müəllifi, Şərqin ilk filosof-materialisti M.F.Axundovun rus mədəniyyəti və ədəbiyyatına istinad etdiyi, onun Bestujev-Marlinski ilə dostluğu, rusların demokratik mədəniyyətinə olan məhəbbəti göstərilmişdir. "Qubalı Fətəli xan" ssenarisinin qəhrəmanı Azərbaycan dövlətinin ayrı-ayrı xanlıqlarını birləşdirən Fətəli xandır. O, hələ XVIII əsrdə xalqının gələcəyini yalnız böyük qonşu rus xalqı ilə ittifaqda görürdü. Bütün bunlar bizim ədəbiyyatımızda əks olunmuşdur, lakin çox təəssüf ki, ədəbiyyatımızın bu böyük və yaxşı cəhəti bəzi tənqidçilərin, ədəbiyyatşünasların və yazıçı yoldaşların nəzərindən qaçmışdır.

Sovet ədəbiyyatının realizmi, onun böyük xəlqiliyi və məfkurəliyi, bütün sovet ədəbiyyatının sürətli inkişafı bizi yaradıcılıq qələbələrinə ruhlandırır. Əmin ola bilərsiniz ki, Azərbaycan sovet ədəbiyyatı öz qədim və öz yaxşı ənənələrini davam etdirərək, böyük rus ədəbiyyatının və qardaş xalqlar ədəbiyyatının yaxşı ənənələrini dərindən öyrənməklə bundan sonra da sovet ədəbiyyatında öz fəxri yerini tutacaqdır.

Hazırda yaradıcılıq həyatımızın mərkəzi hissəsini sovet vətənpərvərliyi məsələləri, sovet milli qüruru məsələsi təşkil edir. Biz dünya

irticaçılarının üzərinə hücum etməliyik. Azərbaycan ədəbiyyatı bu məsələdə Şərq sərhədlərində xüsusi rol oynamalıdır. Şərq ölkələrində Qərb imperialistlərinin və Şərq zülmkarlarının irticaçılığı getdikcə şiddətlənir. Azərbaycan sovet yazıçıları bizim şanlı babalarımız M.F.Axundov, C.Məmmədquluzadə, Sabir və başqa bir çoxları kimi eyni cəsarət və amansızlıqla Şərqdəki irticaçılara qarşı mübarizə aparacaqlar.

*1947*

## DAHİ AZƏRBAYCAN ŞAİRİ

Azərbaycan xalqı Sovet İttifaqının bütün başqa xalqları ilə birlikdə öz böyük şairi Nizaminin anadan olmasının 800 illiyini bayram edir.

800 il bundan əvvəl Azərbaycan torpağının ən bərəkətli və ən şairanə bir yerində – qədim Gəncədə xalqımızın şeir və sənət dühası olan ölməz Nizami yaşamış və yaratmışdır.

Azərbaycan xalqının doğma oğlu və sevimli şairi Nizami Gəncəvi Azərbaycan torpağını, onun sehirli mənzərələrini, uca dağlarını, coşqun çaylarını, ceyranlar gəzən və turaclar oxuyan ucsuz-bucaqsız düzlərini alovlu bir ilhamla tərənnüm etmişdir. O, doğma elinin qədim şöhrətini, şəhər və kəndlərini, yaylaq və otlaqlarının səfalı gözəlliyini böyük iftixar hissilə təsvir etmişdir. O, böyük şair və böyük vətəndaş idi. O öz xalqını böyük bir şair məhəbbətilə sevir və onun taleyinə ürəkdən yanırdı.

Lakin Nizaminin vətənpərvərliyinin əsas mahiyyəti bundan ibarət deyildir. Böyük insanpərvər olan Nizaminin zərif bir qəlbi, romantik xəyalı var idi. O, ictimai fəlakətlər törədən, xalq əzab və işgəncəyə salan zülmkarlara nifrət edirdi. İnsanpərvər şair şahları və sultanları, hər növ müstəbidləri coşqun bir qəzəblə ifşa edirdi. Aleksandr Makedonski (İskəndəri-Zülqərneyn) haqqında poemanın –"İskəndərnamə"nin məşhur epizodunu xatırlayaq: Aleksandr Makedonski Azərbaycan şahı Nüşabə ilə görüşür. Nüşabə yemək əvəzinə fatehə qiymətli daşlar, ləl-cavahirat verərək İskəndəri məzəmmət edir: "Sən heç kəsin yeyə bilmədiyi daşlar üçün insan qanı tökürsən", – deyir. Beləliklə, Nizami İskəndəri Azərbaycan xalqının müdrikliyi qarşısında diz çökdürməklə kifayətlənməyib, onun hərbi səfərlərinin yırtıcı qəsbkar mahiyyətini də ifşa etmişdir. Yalnız səthi düşüncəli saxta alimlər belə

düşünə bilərlər ki, Nizami öz əsərlərinə şahların adını verdiyi üçün şahlar və saraylar müğənnisi, tərənnümçüsü olmuşdur. Nə İskəndər və Xosrov, nə Nuşirəvan, nə də Bəhram Nizaminin idealı olmamışlar. Şair bu hökmdarların surətini öz ruhuna uyğun olaraq yenidən yaratmış və o zaman üçün tərəqqipərvər qayələr tərənnüm etmişdir. Şair öz xalqı ilə birlikdə, xalq hikməti ilə silahlanmış ədalətli bir dövlət xadimi görmək istəyirdi.

Tarixi xronika və hadisələr şairin yeni və orijinal proqressiv fikirlərini ifadə etmək üçün yalnız bir vasitə rolunu oynayırdı. "Xosrov və Şirin" poemasında İran müstəbidi Azərbaycan qızı Şirinin qadir məhəbbəti sayəsində, bu məhəbbətin təsiri altında dəyişib tərbiyələnir. Nizami adi insan məhəbbəti anlayışını hər şeyə üstün gələn insanpərvərliklə, həyatın və bəşər həqiqətinin əsasını təşkil edən gözəl qayələr və idrakla, kamalla bəzəmiş, zənginləşdirmişdir. O, insanın qüdrətinə, onun yüksək mənəvi keyfiyyətlərinin qalib gələcəyinə inanırdı.

Nizami heç bir zaman həyatı ətalətlə, fəaliyyətsiz müşahidə edən şairlərdən olmamış və təkcə gözəl arzularla kifayətlənməmişdir. Şairin iki məşhur kəlamı bunu aydın sübut edir:

Tikan tək çiynində tut yarağını,
O vaxt qucaqlarsan gül budağını.

Başqa bir yerdə şair yazır: "Əqrəbə rəhm etmək olmaz, onu məhv etmək lazımdır. Əqrəbə rəhm etmək ona qurban olmaq deməkdir".

Nizami öz dövrünün əməkçi insan surətlərini, başı bəlalar çəkmiş xalqın sadə nümayəndələrini böyük məhəbbətlə tərənnüm etmiş və əbədiləşdirmişdir. Nizami bununla müsəlman Şərqində ilk dəfə saray ədəbiyyatı ənənələrinin dar çərçivəsindən kənara çıxmışdır. O, bədii yaradıcılıq aləminə daşyonan Fərhad, kəniz, çoban, sənətkar, elm adamları və fiziki əməklə məşğul olan zəhmətkeşlər gətirmişdir. Şair və vətəndaş Nizami xalqa son dərəcədə yaxın idi. O, bütün həyatını xalqın xoşbəxtliyi uğrunda mübarizəyə sərf etmiş, xalqın mənafeyinə xidmət etmişdir. Xalq Nizaminin nəzərində həyatın ən yaxşı, ən işıqlı tərəflərini, kamal və ədaləti, bütün tərəqqipərvər qayələri təmsil edən yeganə ülvi bir qüvvə idi.

Nizaminin əsərlərində xalq içərisindən çıxmış sadə adamların mənəvi aləmi hökmdarların və şahların, feodal Şərqindəki zadəganların mənəvi aləmindən üstün göstərilir. Hələ bu azdır. Nizami həmin fikri

inkişaf etdirərək belə bir nəticəyə gəlir ki, dövləti və xalqı ən ağıllı, ən müdrik adamlar idarə etməlidir. Belə adamlar isə zəhmətkeş xalqın nümayəndələridir. Nizami yalnız xalq kütlələrinin səsinə qulaq asmağı bacaran hökmdarları, qanun verənləri müdrik hesab edirdi.

Nizami xalqın səsini, həqiqət səsini belə yüksəltmişdir. Nizamiyə qədər onun Şərqdəki sələflərindən heç birisi xalqın həyat və məişətini, adət və ənənələrini, yüksək ümid və arzularını Nizami kimi ölməz və bədii surətlərdə cəmləşdirə bilməmiş, belə məharətlə ümumiləşdirməmişdir. Xəlqilik – Nizami yaradıcılığının ən səciyyəvi xüsusiyyətidir.

Böyük sənətkar olan Nizami elmin və insan kamalının nailiyyətlərini bədii təfəkkür qanunları ilə əlaqələndirməyi bacarırdı. O, ötüb keçən əhvalatları, tarixi hadisələrin xronikasını və insanın zahiri xüsusiyyətlərini təsvir etmirdi. O, hər şeydən çox insanın mənəvi, ruhi aləmini açmağa çalışırdı. Nizami çox gözəl bilirdi ki, bədii əsərin qüdrəti, hər şeydən əvvəl, təsvir edilən hadisə və insanların nə dərəcədə dolğun ümumiləşdirilməsindən asılıdır.

Nizami romantizmi heç bir zaman passiv, kənarda durub müşahidə edən romantizm olmamışdır. O, hətta tarixi süjetlər üzərində işləyəndə də iti gözlərilə irəliyə, gələcəyə baxırdı.

Nizami öz zəmanəsinin oğlu və vətəndaşı idi. Məhz buna görə ölməz şair və mütəfəkkirin adı tarixdən silinmir. O öz dövrünün dövlət və siyasi çərçivəsinə sığmayırdı. Hərgah onun poemasının qəhrəmanı Fərhad dağları çapır, insan qüdrətinin əfsanəvi mücəssəməsi kimi yüksəlirsə, biz burada dağları yerindən tərpətməyə, çayların axarını dəyişməyə, dünyanı və kainatı dəyişməyə qadir olan məhəbbətin və pak ehtirasların romantikləşdirilmiş ifadəsini görürük. Nizami bizim dünyamızda ən qiymətli və ən gözəl nemətlərin yaradıcısı olan insanı belə yüksəltmiş və romantikləşdirmişdir. Nizami insan kamalını tərənnüm edir. Onun əsərlərində kainatın ən istedadlı məxluqu olan insanın yaradıcı qüdrəti hər şeydən üstündür. Elmin və elmi həqiqətlərin qüdrətini Nizaminin sələfləri və xələflərindən heç biri onun kimi tərənnüm edə bilməmişdir.

Nizami və onun bir çox böyük müasirləri tarixi şəraitdən asılı olaraq fars dilində yaratmağa məcbur idilər. Lakin bu faciə özü də Nizaminin böyük azərbaycanlı qəlbini, doğma xalqın səadəti uğrunda çarpışan mübariz şair qəlbini zəiflədə bilmədi.

“Leyli və Məcnun” poemasının yazılması haqqında Axsitanın məktubunda deyilir:

Bu təzə gəlinə, çəkəndə zəhmət,
Fars, ərəb diliylə vur ona zinət.
Türk dili yaramaz şah nəslimizə,
Əskiklik gətirər türk dili bizə.
Yüksək olmalıdır bizim dilimiz,
Yüksək yaranmışdır bizim nəslimiz.

Bu misralardan sonra həmin yerdə biz Nizaminin etiraz və qəzəb ifadə edən ölməz sözlərini oxuyuruq. Milli duyğuları təhqir edilmiş Nizami Azərbaycanın milli dilini və mədəniyyətini boğanlara müraciətlə belə deyir:

Qulluq halqasına düşdü qulağım,
Qan vurdu beynimə, əsdi dodağım.
Nə cürətim vardı, əmrdən qaçam,
Nə də gözüm vardı xəzinə açam.
Ömrüm viran oldu, solub saraldım,
Bu əmrin önündə cavabsız qaldım.
Uzaqdır həmdəmlər, uzaqdır dostlar,
Nə də dərd anlayan bir köməyim var.

“Leyli və Məcnun” poemasının Nizami tərəfindən əvvəlcə Azərbaycan dilində yazıldığını ehtimal etmək olar. Axsitanın öz sözləri də bunu göstərir:

Sözün sərrafıyam, sən ki, bilirsən,
Təzəni köhnədən tez seçərəm mən.
Kamal cövhərinin xəzinəsindən
Gör, kimin sapına inci düzürsən.

Nizaminin böyük qəzəbi onun qəlbinə sığmırdı. Dövr, zəmanə onun qüdrətli hissləri üçün dar bir çərçivə idi:

Lakin iki səmtə əsir bu ruzgar,
Fikir çox genişdir, könül mülkü dar.
Əfsanə dəhlizi dar olsa əgər,
Sənətin sözü də yolda ləngiyər.

Nizaminin böyük milli qürur hissinə malik olmasını göstərən onlarca misal gətirmək olardı. Yaşadığı dövrdən asılı olmayaraq hər bir sənət-

karda milli qürur hisi ilə döyünən qəlb olmalıdır. Milli qürur hissi olmayan yerdə ümumiyyətlə heç bir yaradıcılıq təsəvvür etmək mümkün deyildir...

* * *

Nizamidən danışarkən onun "İqbalnamə"də təsvir etdiyi məşhur ideal cəmiyyət utopiyasını xatırlamamaq mümkün deyildir. Nizami şimalda, böyük rus və slavyan xalqlarının vətənində gözəl bir cəmiyyət təsvir edir. Bu cəmiyyətdə qullar və quldarlar yoxdur, insanlar arasında bərabərlik hökm sürür, ictimai ədalətsizlik əbədi olaraq ləğv edilmişdir. Bu cəmiyyətdə yaradıcı əmək hökm sürür, hər bir şəxs bütün cəmiyyətin, kollektivin mənafeyi üçün işləyir, bu kollektivdə kamal və həqiqət hər şeydən üstündür.

Nizaminin utopiyası bizim sosialist cəmiyyətimizə nə qədər həmahəngdir! Ölkəmiz tarixi nailiyyətləri ilə romantik şairin bütün nəcib və yüksək arzularını ötüb keçmişdir.

Nizami dar milli çərçivə içərisində qalan, milli cəhətdən məhdud şüurlu adam deyildi. Öz dövründəki Azərbaycan xalqının ən yaxşı hisslərini və düşüncələrini ifadə edən Nizami dilindən və dini etiqadından asılı olmayaraq bütün xalqlara məhəbbət və ehtiramla yanaşırdı. Nizaminin əsərlərində xalqlar və onların ayrı-ayrı nümayəndələri, elm və sənət adamları, şairlər, dövlət və siyasət xadimləri məhəbbətlə tərənnüm edilirlər. O, bütün xalqların yaradıcılıq qabiliyyətinə, istedadına, azad və xoşbəxt həyat hüququna eyni dərəcədə hörmət edirdi.

Nizami öz xalqının gözəl ideallarını tərənnüm etməklə bütün bəşəriyyətin duyğu və düşüncələrini, saf əməllərini tərənnüm edirdi. Məhz ona görə böyük insanpərvər şairin yaratdığı əsərlər bütün bəşəriyyətin sevimli neməti olmuşdur.

*1947*

## NİZAMİ İRSİ VƏ MÜASİR DÖVRÜMÜZ

İndiyədək xalqımızın şeir və bədii düşüncə dühası olmaqda davam edən böyük Nizami 800 il bundan əvvəl Azərbaycan torpağının ən məhsuldar və şairanə bir guşəsində, öz təbii gözəlliyi ilə insanı heyran edən və milli mədəniyyətimizin yaranmasında böyük tarixi rol oynayan qədim Gəncədə yaşamış və yaratmışdır.

Nizaminin ölməz əsərləri öz təravətini və təsirini əsrlər boyunca itirməmişdir. Şairin fəlsəfi və bədii motivləri ən müxtəlif zamanlarda Şərq və Qərb xalqlarının dahi şairləri tərəfindən dəfələrlə yenidən işlənmişdir. Beləliklə, Nizami dünya bədii düşüncəsinin inkişafına çox böyük təsir göstərmiş, özündən sonra gələn adamların ən yaxşı düşüncə və duyğuları üzərində əsrlərlə hökmran olmuşdur.

Azərbaycan xalqı xoşbəxtdir və bununla fəxr edir ki, dünya mədəniyyətinin inkişafında ən yüksək mərtəbənin təməlini qoymuş olan sovet xalqları ailəsinin bərabər hüquqlu üzvlərindən biridir.

Azərbaycanın şəkilcə milli və məzmunca sosialist müasir mədəniyyəti qalib sosializm cəmiyyətinin çox zəngin iqtisadi və siyasi nailiyyətlərinə, bolşevizmin böyük ideyalarına, marksizm-leninizm fəlsəfəsinə əsaslanır ki, bunlar sovet adamlarının mənəvi həyatının inkişafını təyin edən və yönəldən vahid sosialist mədəniyyətinin tərəqqi yollarını işıqlandırır.

Azərbaycanın sosialist mədəniyyəti öz inkişafında, ən müxtəlif zamanlarda müxtəlif dillərdə bütün xalqların yaratdığı ümumbəşəri mədəniyyətdən geniş istifadə edir. Azərbaycan mədəniyyətinin inkişafına böyük rus xalqının mədəniyyəti xüsusilə gözəl təsir etmişdir, biz rus xalqından çox şey öyrənmişik, öyrənirik və öyrənəcəyik. (*Gurultulu alqışlar*) Müasir Azərbaycan xalqı özünün qədim milli mədəniyyətinin ən yaxşı, tərəqqipərvər və inqilabi ənənələrini davam və inkişaf etdirir, bu mədəniyyətin qiymətli inciləri ilə biz qurduğumuz sosializm mədəniyyətinin möhtəşəm sarayını bəzəyirik.

Mən öz məruzəmdə Nizami yaradıcılığının bizə irs qalan ən yaxşı ənənələri məsələsindən danışmaq istəyirəm.

Nizaminin əsərlərini biz sovet yazıçılarına və sosializm mədəniyyəti qurucularına yaxın və əziz edən cəhətlər hansılardır?

Sovet yazıçısı öz yurdunun vətənpərvəridir, öz dövlətinin mənafeyini qızğın müdafiə və tərənnüm edən, bolşevizmin böyük ideyalarını xalq kütlələri içərisinə yayan əsgərdir. Sovet yazıçısı şər qüvvələrinə və ictimai ədalətsizliyə qarşı ön atəş xəttində vuruşan əsgərə bənzəyir. Ədəbiyyatımız özünün yüksək ideyalılığı və mübariz inqilabi ruhu ilə bütün müasir dünya ədəbiyyatında qabaqcıl yer tutmuşdur.

Nizaminin yaradıcılıq irsinə sovet vətənpərvərliyi və sosializm cəmiyyətinin insanpərvərlik nöqteyi-nəzərindən yanaşılarsa, biz Nizaminin vətənpərvərliyində bir çox motivlərə rast gələ bilərik ki, bunlar zəmanəmizdə də öz böyük əhəmiyyətini və təsirini itirməmişlər.

Azərbaycan xalqının doğma oğlu və şairi olan böyük Nizami Azərbaycan torpağını, onun füsunkar təbiət mənzərələrini, buludlara qalxan dağlarını, coşqun çaylarını və şəlalələrini, göz işlədikcə uzanan və iti sürətli ceyranların cövləngahı, turacların seyrəngahı olan düzləri özünə məxsus coşqunluqla dəfələrlə tərənnüm etmişdir. Nizami doğma torpağımızın qədim şöhrətini, onun şəhər və kəndlərini, yaylaq və otlaqlarını tərənnüm etmişdir. Nizami öz xalqını şair və vətəndaş məhəbbətilə sevmişdir.

Çox böyük insanpərvər, romantik və incə qəlb sahibi olan Nizami cəmiyyətə zərər vuranlara və xalqın başına fəlakət gətirənlərə nifrət edirdi. O, padşahları və şahları öz əsərlərinin əsas qəhrəmanı etdikdə də onları insanpərvər şair coşqunluğu ilə tənqid edirdi. "İskəndərnamə"nin məşhur bir parçasını – İskəndərin Azərbaycan şahı Nüşabə ilə görüşünü xatırlayaq. Bu hekayədə Nüşabə cahangir İskəndərə yemək əvəzinə qiymətli daşlar təqdim edir və onu məzəmmət edib deyir ki, o, yeyilə bilməyən daşlar üstündə insan qanı axıdır.

Nizami bu sözlərlə böyük İskəndəri Azərbaycan xalqının zəkası qarşısında diz çökməyə məcbur etdiyi kimi, eyni zamanda, İskəndərin və bir çox başqa cahangirlərin keçirdikləri yürüşlərin yırtıcı işğalçılıq mahiyyətini ifşa edir.

Nizami insan gücünə, onun yüksək mənəvi qüvvələrinin qələbəsinə, zəka və həqiqətin təntənəsinə inanırdı. O öz zamanında Şərq ədəbiyyatına yenilik gətirən cəsarətli bir şair idi. Biz sovet adamları xalqların hüququnu öz qanımız, ağlımız və əməyimizlə müdafiə etdiyimiz bir zamanda, həyat və insan həqiqətinin, cəmiyyət həqiqətinin qəti qələbə çalacağına sonsuz inam bəslədiyimiz bir vaxtda, – bütün bunlar böyük azərbaycanlı Nizaminin surətini, insanpərvər, xeyir və səadətin bu misilsiz müğənnisinin surətini xatirəmizdə canlandırır.

Nizami həyatın passiv seyrçisi deyildi və təkcə xoş arzularla kifayətlənmirdi. Onun məşhur "Gül dəstəsini qucaqlamaq istəyirsənsə, yaraqlı tikan kimi olmalısan" aforizmini, yaxud "əqrəbə rəhm etmək olmaz, onun zərərli olduğuna görə məhv etmək lazımdır" kimi sözlərini və başqa bu cür dərin fikirlərini sizə xatırlatmaq istəyirəm. Böyük şairin bu sözləri işğalçılara, zəhmətkeş xalqın düşmənlərinə, iyirminci əsr barbarlarına, imperialist canavarlarına, qanlı müharibə doğuran fitnəkarlara, milyonlarla adamın vaxtsız ölümünə, xalqın fəlakət və bədbəxtliyinə bais olan adamlara ürəklərdə dərin kin və nifrət doğurur. Vətən müharibəsi iştirakçılarından aldığımız yüzlərlə mək-

tublarda, ordu qəzetlərində və mərkəzi qəzetlərdə biz, Nizaminin zalimlərə və xalqları əsarət altına almaq istəyənlərə qarşı çevrilmiş bu ölməz sözlərini oxuyuruq. Nizami yaradıcılığının insanpərvərliyi və mübariz ruhu azərbaycanlı əsgərləri XX əsrin Əhrimanı olan Hitlerə qarşı mübarizədə qəhrəmanlıq və igidlik göstərməyə ruhlandırırdı.

Əsil xalq mərifəti və xalq həqiqəti sovet ədəbiyyatı və mədəniyyətinin ruhunu təşkil edir. Geniş xalq kütlələrinin nümayəndələri, bəşəriyyətin malik olduğu bütün maddi və mənəvi nemətlərin yaradıcıları əsərlərimizin ideya qəhrəmanları və əsas simalarıdır.

Nizaminin əsərlərində biz çox zaman feodal Şərqindəki hakimlərin, şahların, əsilzadə adlanan adamların zehni və mənəvi xüsusiyyətlərinin xalq içərisindən çıxan adi adamların mərifət və mənəvi zənginliyi yanında sönük qaldığını görürük. Nizami xalqın səsini, həqiqətin səsini göylərə qaldırmışdır. O, xalqın həyat və məişətini, ənənə və adətlərini, yüksək düşüncə və istəklərini Şərqdə özündən qabaq gəlmiş olan şairlərin hamısından artıq bacarıqla ölməz bədii surətlərdə ümumiləşdirə bilmişdir. Nizami yaradıcılığının çox səciyyəvi olan bu cəhəti, yəni əsərlərinin xalq ruhu bu əsərləri bizə, sovet yazıçılarına daha yaxın etmişdir.

Nizami Yaxın Şərqin bütün ədəbiyyatında birinci dəfə olaraq zəhmətkeş bəşərin surətini yaratmışdır. Nizami möhtəşəm saraylardan uzaqda yaşayır, şəhər yoxsulları və sənətkarları ilə yaxın əlaqə saxlayırdı. Kəndlilər və şəhər yoxsulları ilə onun bu yaxın əlaqəsi Nizaminin qəlbində həyatın bütün nemətlərini yaradan zəhmətkeşlərə və zəhmətə qızğın məhəbbət alovunu şöləndirmişdi. Uşaqlıqdan zəhmət çəkən və daim zəhmətkeşlər arasında yaşayan dahi şair özünün hələ birinci əsərlərində: qəsidə və fəxriyyələrində cəsur zəhmətkeşlərdən heyrət və səmimi hörmət hissilə bəhs edir, əməyin əzəmət və şöhrətini tərənnüm edirdi. Ölməz “Xəmsə”də biz zəhmətkeş xalq içərisindən çıxan bir çox adamların: kərpickəsənlərin, əkinçilərin, bənnaların, çobanların, bağbanların və bir çox başqalarının surətlərinə rast gəlirik.

Nizami özünün birinci poeması olan “Sirlər xəzinəsi”ndə namuslu əməklə məşğul olan adamların üstünlüyünü kərpickəsən surətində göstərmişdi. Şair qoca kərpickəsənin bir cavan oğlanla görüşünü təsvir edir. Həmin cavan: “Nə üçün belə palçıq içərisində işləyirsən?” – deyə soruşduqda, zəhmətin ləzzətini dadmamış olan bu cavana qoca zəhmətkeş belə cavab verir:

Onunçün öyrətdim ki, əlimi bu sənətə,
Bir gün sənə əl açıb düşməyim xəcalətə.
Mən bir kəsə deyiləm xəznədən ötrü möhtac,
Əlimin zəhmətilə toxdur gözüm, deyil ac.

Sonra şair aşağıdakı nəticəni çıxarır:

Yaxşı olar özünü işə öyrətsən bir az,
Onda inan ki, əlin özgələrə uzanmaz.

Nizami zəhmətkeş adamın ən dolğun, həqiqətən möhtəşəm surətini "Xosrov və Şirin" poemasında yaratmışdır. Bu poemada Fərhad, zəhmət adamlarının ən yaxşı sifətlərini təcəssüm etdirir. Həmin surət üzərində böyük diqqət və məharətlə işləyən Nizami, onu özünün ölməz poemasının əsas qəhrəmanları səviyyəsinə qaldırmışdır.

Nizami öz əsərlərində insan əməyini tərənnüm edərək, mümkün olan yerdə belə bir fikri xüsusilə nəzərə çarpdırır ki, adamlara onların bilik və zəhmətinə görə mükafat verilməlidir.

Sovetlər ölkəsində zəhmətkeşlər bəşər tarixində indiyədək misli görünməmiş hüquqlardan istifadə edirlər. Sovet hakimiyyətinin qanunları sayəsində ölkəmizdə əmək igidlik və şərəf işi olmuşdur. Sovet ədəbiyyatı qarşısında, biz Azərbaycan yazıçıları qarşısında sadə zəhmətkeş adamların, həyat və mübarizəmizin ictimai mexanizminin xırda vintlərinin dolğun bədii surətlərini yaratmaq kimi böyük və nəcib bir vəzifə durur.

Azərbaycanın bədii ədəbiyyatında sosialist əməyinin gözəlliyini göstərməli, zəhmətkeş sovet adamının mənəvi və maddi üstünlüklərini bütün dünya qarşısında nümayiş etdirməli, onun məfkurə-mənəvi simasını bütün zənginliyi və gözəlliyi ilə təsvir etməliyik. Lakin zəhmətkeşin surətini geniş miqyasda yarada bilmək üçün yazıçının özü də Nizami kimi böyük zəhmətkeş olmalıdır.

Böyük sənətkar olan Nizami elm və insan zəkasının üzvi nailiyyətlərini bədii təfəkkürün qanunları və gözəllikləri ilə əlaqələndirə bilirdi. Ədəbiyyat tarixi göstərir ki, yalnız xalqın böyük fikir və düşüncələrini özündə əks etdirən, bu və ya digər dövrün qabaqcıl fəlsəfi görüşlərindən qüvvət alan və şöhrətlənən sənət əsərləri nəsillərin və əsrlərin yadında qalır.

Sovet xalqı ən mütərəqqi, ən güclü elmi görüşün – marksizm-leninizm fəlsəfəsinin ifadəçisi və yaradıcısıdır. Sovet yazıçısı xoşbəxtdir

ki, zəka və elmi həqiqətin təntənəsi dövründə yaşayır, o, kustar yazıçı deyil, bütün zamanların və xalqların qabaqcıl fəlsəfəsi olan marksizm-leninizm fəlsəfəsinin ifadəçisidir. Bütün bunlar bizim, sosializm dövrü yazıçılarının üzərinə zəmanəmiz haqqında fəlsəfi mənası dərin olan böyük əsərlər yaratmaq vəzifəsini qoyur.

Bir neçə kəlmə də Nizaminin romantizmi və biz sovet yazıçılarının öz əsərlərimizdə zəmanəmizin böyük ruhunu, sovet dövləti və sosializm cəmiyyəti şəraitində xalqlarımızın misilsiz maddi və mənəvi yüksəlişini necə tərənnüm edəcəyimiz haqqında deyək.

Nizaminin romantizmi heç bir zaman mürtəce və ya passiv –seyrçi romantizm olmamışdır. Böyük şair hətta tarixdən götürülmüş mövzular üzərində işlədiyi zamanlarda da daim irəli baxmışdır. Nizaminin böyük bir insan kimi öz zəmanəsinin oğlu və vətəndaşı olduğuna şübhə yoxdur, lakin o, bir şair və mütəfəkkir olmaq etibarilə daha artıq gələcək əsrlərin adamı idi. O öz zamanının dövlət və siyasi mənafeyi çərçivəçinə sığmırdı. Nizami XII əsr feodal Azərbaycandan və Şərqindən çox irəli getmiş olan bir şəxsiyyət idi.

Əgər Fərhad dağları yerindən dəbərdib insan qolunun çox böyük qüvvəyə malik olduğunu göstərirdisə, biz onun surətində nəinki dağları yerindən dəbərtməyə və çayların məcrasını dəyişdirməyə qadir olan, həmçinin bütün dünyanı və kainatı dəyişdirməyə qadir olan məhəbbət və yüksək ehtirasların dramatik gücünü də görürük. Nizami yer üzündə ən yüksək və qiymətli nemətlərin yaradıcısı olan insanı bu qədər yüksəltmiş və romantik bir surət şəklində göstərmişdir.

Sovet yazıçıları öz qəhrəmanlarını böyük Nizami kimi və bəlkə daha artıq qüvvə ilə romantikləşdirməyi bacarmalıdırlar, xüsusən ona görə ki, sovet adamı öz ideyalarına və əxlaqi sifətlərinə görə ən insanpərvər, deməli, ən romantik adamlardır. Biz həyatımızın gözəlliyini, adamlarımızın gözəlliyini açıq göstərə bilməli, böyük gələcəyimizi tərənnüm etməliyik. Bizim bəzi əsərlərimizin zəifliyi ondan irəli gəlir ki, biz inqilabi romantizmin qüvvətinə həmişə lazımınca qiymət verə bilmirik, halbuki, Aleksandr Maksimoviç Qorkinin dediyi kimi, bunsuz sosialist realizmi ola bilməz.

Nizami romantizminin gücünü onun xalqın gerçək həyatı və mübarizəsilə sıx əlaqəsində də görmək lazımdır. Nizami öz yaradıcılıq fantaziyasını xüsusən Azərbaycan folklorunun çox zəngin materialları ilə bəzəmişdir. Nizami yaradıcılığının tədqiq edilməsi sahəsində Azərbay-

canda görülən elmi işlər təsdiq edir ki, onun yaratdığı əsərlərin mənbələrindən biri xalq içərisində yayılmış nağıl və əfsanələrdən, şifahi xalq yaradıcılığından ibarət olmuşdur. Böyük şairin "Xosrov və Şirin", "Leyli və Məcnun" poemaları və başqa əsərləri xalq əfsanələri və dastanları üzrə qurulmuşdur. İndi də dildən-dilə gəzən məsəllərə və atalar sözlərinə Nizaminin əsərlərində çox tez-tez rast gəlmək olar. Bütün bunlar Nizaminin öz xalqının milli varlığı ilə sıx mənəvi əlaqəyə malik olduğunu, şairin həqiqətən xalq ruhunda yazan dərin sənətkar olduğunu göstərir. Nizaminin böyük milli iftixar duyğusunu aydın sübut edən onlarca parlaq misal gətirmək olar. Belə bir duyğu olmazsa, sənətkarın hansı dövrdə yaşadığından asılı olmayaraq heç bir böyük sənət əsəri yaradıla bilməz.

Biz müasir azərbaycanlılar İranda xalqın mənafeyinə xəyanətkarlıq edən indiki cəlladların Azərbaycan dilində yazılmış əsərləri və kitabları vicdansızlıqla yandırdıqlarını görərkən, böyük sələflərimiz Nizami, Xaqani, Fələki, Məhsəti xanım və bir çox başqalarının faciəsi, iztirabları sanki gözümüzün qarşısında yenidən canlanır...

Mən Nizaminin milli şair və insan olduğunu söylədim. Bununla bərabər mən Nizaminin başqa bir cəhətini, yəni digər xalqlara münasibətini də göstərmək istəyirəm. Biz bununla fəxr edirik ki, Nizami milli çərçivədən kənara çıxmayan insan deyildir, o, Azərbaycan xalqının ən yaxşı düşüncə və duyğularının ifadəçisi olduğu zamanda, bütün başqa xalqlara da, onların din və dil fərqlərindən asılı olmayaraq böyük məhəbbət və hörmətlə yanaşırdı. Nizaminin əsərlərində həm bütöv xalqlar, həm də bu xalqların elm, incəsənət və şerinin, siyasi və dövlət həyatının ayrı-ayrı nümayəndələri məhəbbətlə tərənnüm edilir. Nizami bütün xalqların yaradıcılığına, istedadına və quruculuq qabiliyyətinə hörmət edir, bütün xalqların həyat və səadət haqqını təsdiq edirdi. Nizami yaradıcılığının bu insanpərvər motivləri sovet ədəbiyyatında xalqların beynəlmiləlçilik motivlərinə, qardaşlıq ideyalarına yaxındır.

Biz Nizami varisləri, əsil beynəlmiləl ədəbiyyat yaradıcıları babalarımızın ən yaxşı ənənələrini davam və inkişaf etdirməliyik. Sovet ədəbiyyatında Sovet İttifaqı qardaş xalqlarının dostluğu və əməkdaşlığı mövzusu kimi böyük bir mövzuya həsr edilən əsərlər çoxdur. Bu sahədə Azərbaycan yazıçıları da az iş görməmişlər. Lakin nailiyyətlərimizi təsdiq etmək bizim irəliləyişimizə mane olmamalıdır. Biz sovet həyatının şöhrətini artıran, xüsusən xalqların qardaşlığı və dostluğu

mövzusunda yazılan əsil klassik əsərlər yaratmalıyıq. Bu məsələ indi bütün sovet ədəbiyyatının qarşısında durmuşdur. Qoy, bu sahədə deyilən hər bir sözümüz dünya irtica qüvvələri haqqında, insanpərvərliyin və xalqlar qardaşlığının düşmənləri haqqında, millətçilik və irq mövhumatını yayan, alçaq faşizmin insanlıqdan nifrət ideolojisini yenidən diriltməyə çalışan fitnəkarlar haqqında ölüm hökmü kimi səslənsin.

Yoldaşlar! Nizami böyükdür, o yaşayır, bizimlə bir sırada irəliləyir, bizim kimi daim irəli baxır. O, cəmiyyətimizə Azərbaycanın bədii düşüncəsinin dühası kimi bizimlə birlikdə daxil olacaqdır. Nizaminin yubileyi sovet sosialist mədəniyyətimizin qüdrətini bütün dünya qarşısında bir daha nümayiş etdirir. Yalnız Sovet hakimiyyəti sayəsində biz böyük və kiçik xalqlarımızın milli mədəniyyətinin tarixdə misli görünməmiş şəkildə dirçəlib coşqun surətdə tərəqqi etdiyini görürük.

Azərbaycanın müasir yazıçıları öz babalarının ənənələrini davam etdirərək, böyük rus ədəbiyyatı və mədəniyyətindən çox şey öyrənib, Şərqin qapısında qabaqcıl sosialist mədəniyyəti yaradırlar.

(*Gurultulu və sürəkli alqışlar*)

*1947*

## [AZƏRBAYCAN SOVET YAZIÇILARININ MÜŞAVİRƏSİNDƏ ÇIXIŞI]

Sovet Yazıçıları İttifaqının növbəti plenumu məlum olduğu üzrə, bir məqsəd üçün çağırılmışdı ki, o da Mərkəzi Komitənin ədəbiyyat və incəsənət haqqında olan tarixi qərarlarından sonra sovet ədəbiyyatına bir nəzər yetirmək və ədəbiyyatda əmələ gəlmiş yaradıcılıq və nəzəriyyə dönüşlərini qeyd etmək idi.

Plenum çox faydalı, səmərəli şəkildə keçdi, məlum oldu ki, Mərkəzi Komitənin tarixi qərarlarından sonra sovet ədəbiyyatında çox əhəmiyyətli və ciddi bir dönüş əmələ gəlmişdir. Bu dönüş nədən ibarətdir? Mərkəzi Komitənin tarixi qərarları məlum olduğu üzrə, hər şeydən əvvəl, bütün sovet ədəbiyyatı ordusunun böyük bir məqsədlə dəvət edirdi: məfkurə aydınlığı uğrunda mübarizə!.. Belə bir məfkurə aydınlığı uğrunda heç şübhəsiz ədəbiyyat ordusunun mübarizəsi lazım və zəruri idi. Xalqımız da bizdən bunu tələb edirdi.

Plenum əsas etibarilə bu tələblərin necə yerinə yetirildiyini yoxlamaq üçün toplanmışdı...

Bu gün biz Azərbaycan yazıçıları da belə bir sual qarşısında qalırıq ki, Mərkəzi Komitənin tarixi qərarlarından və Jdanov yoldaşın məruzəsindən sonra bizim ədəbiyyatda ciddi bir dönüş əmələ gəlmiş, ya yox?

Mənim şəxsi fikrimə görə-xalqı düşündürə biləcək, xalqın böyük əməllərini yüksək bədii formada ifadə edə biləcək monumental əsərlər nöqteyi-nəzərindən yanaşsaq – bizim ədəbiyyatımızın qarşısında hələ çox böyük vəzifələr durur.

Biz dramaturgiya sahəsində və teatr sənətində olan bir çox ciddi səhvləri vaxtında görə bilməmişik. Bunun nəticəsidir ki, son 7-8 il müddətində bizim dramaturgiya siyasətimiz böyük əsərlər yaratmaq yolu ilə getmək siyasəti olmamışdır. Biz yanlış yol ilə gedərək hər atüstü yazılmış, orta səviyyəli bir çox əsərlərlə barışdıq. Bəlkə onlar da günün tələblərinə görə lazım idi, lakin eyni zamanda böyük əsərlər uğrunda, səhnədə illərlə yaşaya biləcək ciddi əsərlər uğrunda mübarizə aparmadıq.

Biz hansı sahədə olursa-olsun əgər vaxtında böyük ədəbiyyat yaratmaq yolu ilə getsəydik, bədii yaradıcılıq sahəsində çox böyük nailiyyətlər əldə etmiş olardıq.

Ədəbiyyatımızı beləcə tənqid etdiyimiz zaman heç də o demək deyil ki, Azərbaycan yazıçıları yazıb-yaratmırlar. Yaratmaq təşəbbüsündə olan yazıçılarımız çoxdur. Yeni əsərlərimiz də vardır. Ancaq bizim tənqidimiz də yaradıcılarımızı lazımınca qiymətləndirməyi bacarmalıdır. Ədəbiyyatın canlı hissilə yaşamaq, heç olmazsa, yaradılan əsərləri xalqa çatdırmaq eşqi bizim tənqidçilər və ədəbiyyatşünaslarımızda zəifdir. Buna görə ədəbiyyatımızın yaxşı cəhəti, nəzər-diqqəti cəlb edən cəhəti bəzən oxuculara məlum olmur.

Demək lazımdır ki, 30 il müddətinə Azərbaycan dramaturgiyasının keçdiyi böyük inkişaf yolu diqqətə layiqdir. Şerimizin keçirdiyi inkişaf yolları daha böyükdür. Biz bu müvəffəqiyyəti indi də göstərməyib bəs nə vaxt göstərəcəyik? Bəs tənqid və ədəbiyyatşünaslığımız nə ilə məşğuldur? Demək lazımdır ki, biz ədəbiyyat tarixini öyrənmək işində də hələ çox az iş görmüşük. Bildiyimiz kimi, plenumda Nizami dövrünə və müasirlərinə aid bir sıra məsələlər ciddi elmi mübahisələrə səbəb olmuşdur. Bizim alimlərimiz bu mühüm məsələləri elmi yol ilə həll etməlidirlər. Belə elmi mübahisələr ondan doğur ki, bizim öz alimlərimiz arasında dövlət tarixi, ədəbiyyat tarixinin bəzi məsələləri haqqında hələ də vahid və möhkəm elmi fikir əmələ gəlməmişdir. Odur ki, biz gərək elmi fikrin inkişafı uğrunda ciddi mübarizə aparaq.

Sonra klassiklərə olan münasibəti götürək. Biz klassiklərimizə və ümumiyyətlə keçmiş ədəbi irsimizə marksist metodolojisi ilə yanaşmalıyıq.

Xaqani yaradıcılığının xüsusiyyətləri və ziddiyyətləri nədən ibarətdir? Nə üçün Xaqani cəlayi vətən olmuşdur? Bu böyük şairin mürəkkəb həyat tragediyası nədən əmələ gəlir? Bu xüsusda bizə ciddi elmi əsərlər lazımdır və mən əminəm ki, belə əsərlər tezliklə yaranacaqdır.

Məhəmməd Hadi barəsində bir-birinə zidd fikirlər söyləyirlər. Bəziləri deyir ki, Hadi orta məktəbin ədəbiyyat kitabına salınmasın, halbuki şəxsən mənim fikrimcə o, bizim ədəbiyyatımızda böyük şəxsiyyətlərdən biridir. Hadi bürjuaziya və mülkədarlara, müsavatçılara, çarizmə qarşı az mübarizə aparmamışdır. Hadi xalqını sevmiş, ancaq o, Sabir kimi inqilabın yolunu tapa bilməmişdir. Belə bir şairin bütün zəif cəhətlərini göstərmək olar və lazımdır, ancaq onu tamamilə rədd etmək olmaz...

...Son sözümüzdə bir həqiqəti təkrar etməliyəm ki, Yazıçılar İttifaqının növbəti plenumu və xüsusilə Fadeyev yoldaşın məruzəsi bizə çox yeni şeylər öyrədir. Biz öz işlərimizi bundan sonra daha yaxşı qurmaq, öz yaradıcılığımızı daha səmərəli bir şəklə salmaq üçün plenumdan geniş istifadə etməliyik. Partiyamızın Mərkəzi Komitəsinin ədəbiyyat və incəsənət haqqında tarixi qərarlarından sonra ədəbiyyat ordumuz necə hərəkət etməli, necə çalışmalıdır? Plenum əsasən bu məsələyə cavab vermişdir. Bu cəhətdən plenumun bütün işi ilə tanış olmaq, oradakı məruzə və çıxışları diqqətli surətdə təhlil etmək və onlardan özü üçün lazımi nəticələr çıxarmaq hər bir sovet yazıçısının borcudur.

*1947*

## ELMİ ŞURADA ÇIXIŞI

Azərbaycanın qədim, nadir tapıntıları bizim üçün böyük qiymətə malikdir.

Bu günlərdə mən Azərbaycan SSR Elmlər Akademiyasının işçiləri ilə birlikdə Mingəçevir rayonunda oldum, orada qazıntı zamanı Azərbaycanın qədim mədəniyyətini əks etdirən çoxlu əşyalar tapılmışdı.

Bunlar çox da böyük olmayan tapıntılar idi. Ancaq onlar məni ilhama gətirdi. Mən “Muğam” poemasını yazdım və bu nadir tapıntılar-

dan ilhamlanaraq poemanın bütöv bir fəslini Pompey qoşunlarına və başqa işğalçılara qarşı igidliklə vuruşan Azərbaycan xalqının keçmişinə həsr etdim.

Ancaq bu, təkrar edirəm, qismən kiçik tapıntı idi.

İndi mən dosent Cəfər Xəndanın işi ilə tanış oldum. Bu işin dərinliyi, genişliyi məni sevindirdi və özünə cəlb etdi. O öz dissertasiyasında bizə çoxlu yeniliklər verib. O bizim ədəbiyyatımızı qiymətli məlumatlarla zənginləşdirib. Biz indiyədək haqqında eşitmədiyimiz şairlərin adını öyrəndik; ancaq bununla belə, onlar çox böyük əhəmiyyətə malikdir; indiyədək məlum olmayan bir sıra ciddi əsərlərin varlığını öyrəndik.

Ayrıca götürülmüş, özlüyündə o qədər də böyük olmayan məlumatlar əslində ədəbiyyat tariximiz üçün geniş materialdır.

Dissertasiya poetik, talantla yazılıb və yüksək qiymət qazanır, müəllif filologiya elmləri doktoru adını daşımağa layiqdir.

Və əgər mən sizin elmi şuranın üzvü olsaydım, Cəfər Xəndanın namizədliyinə səs verərdim.

*1948*

## SƏNƏT AŞİQİ

Sənətin bütün dövrlər və zamanlar üçün dəyişməz bir qanunu var: insanları özünə məftun etmək könüllər mülkünə hökm etmək, hər ürəyin kiçik və böyük arzularından xəbər vermək! Soyuq və quru bir dillə, sakit və həyəcansız söylənilmiş fikirləri biz tez unuduruq. İnsan qəlbinin isti qanı soyuq sözlərin və fikirlərin qarlı-buzlu havasında donmaq istəmir.

Əsil sənət əsərinin hüsnü olan yüksək və dolğun mənaları da biz o əsərdəki ülvi hisslərdə, həyəcanlarda, iztirab və sevinclərdə, ümid və arzularda, xəyal və əməllərdə oxumalıyıq! Bu mənalı və gözəl hisslər dünyası insan mənəviyyatının ölməz poeziyasıdır! Belə bir poeziya Belinskinin pərəstiş və tərənnüm etdiyi gözəllikdir! Bu poeziyanı şairin uydurmaları, fantaziyaları və təxəyyüllər yaratmır. Bu qadir poeziya insanın öz qəlbindən qopub gələn müxtəlif səsli simfoniyadır. Bu gözəl poeziya həyatın zəruri və qanuni bir ehtiyacıdır, onun döşlərindən süd əmən doğmaca bir övladıdır! Odur ki, həyat kimi poeziya da təsa-

düfi bir hadisə deyil, iqlimin dəyişməsindən yaranan ötərgi bir hava cərəyanı da deyil! Belinskinin qəlbində bir ümman kimi daima təlatümə gələn poeziya eşqi – onun həyat eşqidir!

Məhz buna görə də o, realist poeziyanın alovlu nəğməkarı olmuşdur. O, belə bir poeziyanın rus torpağında, Puşkin qələmilə yaranmasına sevindi, hamıdan çox sevindi.

Biz sovet şairləri, bu gün tribunadan şeir oxuduğumuz zaman, müasir insan cəmiyyətinin ən qabaqcıl poeziyasını nümayiş etdirməyirikmi? Belə bir poeziya Belinskinin vətənində yarana bilərdi! Vətən torpağında əməlləri çiçəklənən insanlar nə qədər xoşbəxtdirlər! Buna görə də Belinski bizim müasirimizdir. O, bizimlə bir nəfəs alır!

* * *

Belinski qəhrəmanlıq aşiqi olduğuna görə də qəhrəmanlıq poeziyasının pərəstişkarıdır. Heç də təsadüfi deyildir ki, o, Lermontovun bir çox qəmgin və zahirən bədbin şeirlərinin daxilində gizlənmiş qəhrəmanlıq çağırışını, inqilabi ruhu kəşf etdi, həm də cəsarətlə kəşf etdi.

Həyat və səadətin zəfərinə inanmayan, ümidsizlik, məyusluq, acizlik tərənnüm edən poeziya insan şərəfini, insan ləyaqətini ucuzlaşdırır. Belinski belə bir poeziyanın amansız düşməni olmuşdur.

Belinskiyə görə əsl qəhrəmanlıq mənəvi qəhrəmanlıqdır.

Belə qəhrəmanlığın tarixdə əvəzi olmayan nümunələrini yaradan sovet insanı Belinskini bir də onun mənəvi qəhrəmanlığına görə sevir! Ömrü qəhrəmanlıqla keçirmək nə böyük səadətdir!

* * *

Biz Belinskinin ölməz əsərlərini oxuduğumuz zaman bu nadir insanın qəlbində alovlanan böyük bir hissə, milli vüqar hissinə heyran qalırıq. O öz vətənini, xalqını yalnız mütəfəkkir və vətəndaş kimi deyil, eyni zamanda böyük bir şair qəlbi ilə sevir. O deyir: “Mən rus xalqını qəlbdən sevirəm və bu xalq kütləsi içərisində ən kiçik bir qum zərrəsi olmağı özüm üçün namus və şərəf hesab edirəm”.

Bu təvazökarlıq və riyasız bir məhəbbətlə söylənmiş sadə sözlərdə nə qədər böyük bir şeriyyət vardır. Bu sözlər indi də bizi hər şeydən əvvəl namuslu və fədakar bir vətəndaş olmağa çağırır. Məncə,

həyatın, şerin və sənətin əsil mənası və hüsnü də insanın saf və müqəddəs vətəndaşlıq borcundadır.

Dünya ədəbiyyatı tarixi göstərir ki, əsil sənət və əsil sənətkar heç bir dövrdə məhdudluq, xüsusən milli məhdudluqla barışmamışdır. Belinski də bu mənada əsil bir sənətkar kimi düşünür və duyurdu. O, mənsub olduğu xalqın əzəmətilə fəxr etdiyi kimi, başqa xalqların da mənlik və varlığına sonsuz bir hörmət bəsləyirdi. "Hər xalq öz varlığı ilə bəşər həyatının müəyyən bir cəhətini ifadə edir", – deyən Belinski özünün simasında rus xalqına xas olan nəcib ruhu – internasionalizm ruhunu ifadə edirdi.

* * *

Xeyrin, səadətin, humanizmin zəfərinə inanmaq, etiqadla yaşayıb, etiqadla ölmək böyük sənətkarların sifəti olmuşdur. Belinski sadəcə həyat aşiqi olmaqla kifayətlənmədi. O, canlı həyatın cansız ölümlərə zəfər çalacağına böyük bir məslək eşqilə inanırdı. "Ofeliya gözəl yaşadığı kimi, gözəl də öldü. Onun bu ölümü bizi həyatla barışdırır, ona qarşı üsyana çağırmır" – deyən Belinski mənalı və şərəfli ölümdə də həyatın zəfərini, həqiqətin təntənəsini görürdü. Mən onun bu sətirlərini oxuduğum zaman bizim Vətən müharibəsi cəbhələrində həlak olmuş qəhrəman qızlarımızın şərəfli ölümünü əbədiləşdirəcək canlı bir əsər həsrətilə ürəyim titrədi. Əgər belə bir dastanı yaratmaq mənə nəsib olsa, onun mənası ilə Belinskinin həyata olan fəlsəfi baxışı arasında heç bir ayrılıq ola bilməz.

Belinskinin dahiyanə deyilmiş fikirləri arasında bir məsələ bu gün də çox zəruridir.

Hələ də bizim aramızda bütün ömrünü "sitatçılıq"la yaşayan, başqasının gözəl fikirlərini lovğalıqla və "mədəni bir şəkildə" dönə-dönə misal gətirənlər, əslində isə heç bir orijinal yaradıcılıq simasına sahib olmayan şair, ədib və tənqidçilərimiz az deyildir. Bunlar daima tələbə olaraq qalan acizlər və məhdudlardır. Beləlləri haqqında Belinski çox gözəl demişdir: "Başqasından öyrənən tələbə öz müəlliminə kamil bir nümunə kimi baxarsa, onun öyrəndiyi cansız və ölü olar. Tələbə öz müəlliminə bir nümunə kimi deyil, bir rəqib kimi baxmalıdır ki, öz müəllimini ötüb keçə bilsin".

Ayrı-ayrı əsərlərin və sənətkarların orijinal siması uğrunda mübarizə aparan Belinski milli ədəbiyyat və mədəniyyətin də orijinallığına canlı

və təbii bir sifət kimi baxır, xarici təsirlərə kor-koranə qapılan "əldəqayırma balzaklara" amansız atəşlər açırdı. "Avropadan gələn hər şeyin qarşısında bunların Asiyadan deyil, Avropadan gəldiyi üçün məftun olmaqdan əl çəkmək vaxtıdır. Biz onları yalnız o vaxt sevə bilərik ki, bu şeylərdə bəşəri ideallar olsun, əgər bu yoxdursa, Avropadan gələn hər şeyi eyni bir qüdrətlə rədd etməliyik!"

Belinskinin bu sözləri bizim üçün nə qədər müasir səslənir. Bu gün qalib sosializm elmi və mədəniyyəti Qərbin çürüməkdə olan burjua mədəniyyətinə hücum çəkmişdir. Bu zəfər və qalibiyyət addımlarımızın səsi dünyanın hər yerində eşidilir. Qalib gələn yalnız bizim siyasi və fəlsəfi görüşlərimiz deyil, eyni zamanda bütün mənəviyyatımız, əxlaq normalarımız, zövqlərimiz, şerimiz və sənətimizdir!

Ana Vətənimizin, sosializm cəmiyyətinin daxili şeriyyəti Belinskinin dediyi "qartal qanadları" ilə fəzaları fəth edir. Həyat isə bizdən yeni dastanlar, yeni bədii zəfərlər tələb edir.

Poeziya aşiqi Belinskinin nəcib xatirəsi bizi bir daha sənətin ecazkar qüdrətilə silahlanmağa, vətən torpağının qadir səsi bizim şeir rübablarımızı yeni nəğmələr tərənnüm etməyə çağırır.

*1948*

## AZADLIQ VƏ SƏADƏT BAYRAĞI ALTINDA

Xalqlar azadlığının, sülh və tərəqqinin beşiyi olan Sovet İttifaqının xoşbəxt və azad xalqlarının böyük qardaşlıq ailəsində yaşayan doğma, günəşli Azərbaycanımı Vrotslavda, demokratik Polşa torpağında keçirilən Ümumdünya konqresində təmsil etmək kimi böyük bir şərəf mənə nəsib oldu.

Azərbaycanın yaratdığı qədim mədəniyyət öz tarixində heç bir zaman böyük sovet demokratiyası sayəsində olduğu kimi coşqun milli intibah dövrü keçirməmişdir.

Vrotslavda mədəniyyət xadimləri konqresinin iclas etdiyi bu günlərdə Azərbaycan Dövlət Dram Teatrı böyük Moskva şəhərində öz sənət xəzinəsini nümayiş etdirdi.

Yalnız öz milli əsərlərini deyil, həmçinin Ostrovski və Şekspirin əsərlərini də göstərən Azərbaycan teatrının tamaşalarına sovet paytaxtı

əhalisindən on minlərlə adam sevinc və iftixar hissi ilə gəlib baxırdılar. Teatrın bu müvəffəqiyyəti bizim yalnız dövlət və siyasi nailiyyətimiz deyil, eyni zamanda çox böyük mənəvi nailiyyətimizdir.

Sovet Azərbaycanının əldə etdiyi müvəffəqiyyətləri nəzərə almaqla bütün dünya yəqin edə bilər ki, SSRİ-də müxtəlif milli mədəniyyətlərin olması xalqları bir-birindən ayırmır, əksinə olaraq, onları vahid bir sosialist ailəsində birləşdirir...

Azərbaycan xalqının yarıdan çoxu bizim yüz addımlığımızda, xırdaca Araz çayının o tayında yaşayır. İndi İran Azərbaycanının bütün küçə və meydanlarında dar ağacları qurulduğu, bütün ölkənin zindanlara çevrildiyi hamıya məlumdur. Köhnə cəlladlar, İran irticasına xidmət edənlər Azərbaycanın azadlıqsevən adamlarını məhkəməsiz və istintaqsız bu dar ağaclarından asırlar.

Azərbaycan xalqının xaricdə yaşayan beş milyonluq hissəsinin ana dili zorla əllərindən alınmışdır. Bütün İranda Azərbaycan dilində dərs keçən bir məktəb belə yoxdur; uşaqların hamısını zorla fars dilində oxutdururlar. İranın qatı millətçiləri və irticaçıları Azərbaycan dilində yazılmış köhnə və yeni kitablara od vurub yandırırlar. Baxın, İran irticası və millətçiliyi nə kimi həyasızlıqlar etməkdədir.

Lakin bu kütbeyin irticaçılar bir həqiqəti başa düşmürlər ki, hər hansı bir xalqın dilini, xüsusən öz südü ilə Nizami kimi dahi sənətkar və dünya ədəbiyyatı nümayəndəsi yetirən bir xalqın dilini, bütün Yaxın Şərqdə məşhur olan ölməz lirik şair Füzulinin rübabına qida verən xalqın dilini məhv etmək olmaz!

Xaricdəki beş milyonluq qardaş və bacılarımıza qarşı iranlı cəlladların tətbiq etdikləri və XX əsrə layiq olmayan inkvizitor tədbirlərinə mən, Azərbaycan mədəniyyətinin nümayəndəsi və Azərbaycan xalqının şairi olmaq etibarilə Qərb və Şərqin, Şimal və Cənubun qabaqcıl mədəniyyətinin konqresdə iştirak edən nümayəndələri qarşısında etiraz səsimi ucaltdım.

Əsrimiz bəşəriyyətin inkişaf tarixinin elə bir mərhələsidir ki, həm mədəniyyət, həm elm, həm də bütün inqilabi və demokratik hərəkat xalqları bir-birindən ayırmır, onları dostluğa və əməkdaşlığa, onları birliyə doğru aparır. Bunu da biz tarixi inkişafın təbii və qanunauyğun prosesi hesab edirik.

Halbuki tamahkar və qana susamış müstəmləkəçilər öz hökmranlığını müvəqqəti olaraq qoruya bilmək üçün hər vasitə ilə xalqları bir-

birindən ayırmağa, onları bir-birinin üzərinə saldırmağa, onların şüurunu millətçilik zəhərilə zəhərləməyə çalışırlar. Bununla da onlar elm və mədəniyyətin nailiyyətlərini tapdalayaraq tarixin təkərini zorla geri döndərməyə və onun təbii inkişafına mane olmağa cəhd edirlər.

Mən konqresdə müstəmləkə ölkələri nümayəndələrinin nitqlərini böyük heyrət və maraqla dinlədim. Milli-azadlıq və istiqlaliyyət olmayan yerdə mədəniyyət və zəka azadlığının olmadığı və ola bilməyəcəyi haqqında onların səmimi etiqadına mən də şərikəm və bu etiqadı alqışlayıram...

Daha bir mühüm məsələdən danışaq. İslam ideolojisi İran kimi ölkələrdə hakimlərin əlində demokratik hərəkatı boğmaq üçün xalqın mənafeyinə zidd siyasət alətinə çevrilir.

Hələ keçən əsrdə Azərbaycan xalqının böyük oğlu, müsəlman Şərqində birinci materialist filosof Mirzə Fətəli Axundov özünün məşhur fəlsəfi əsərində riyakar və satqın "alimlərin", molla və şeyxlərin maskasını yırtaraq yazmışdır:

"Ey vaizlər və alimlər, ey şarlatanlar, nə üçün siz yazıq camaatı Allah taalanın nemətlərindən məhrum edirsiniz? Nə üçün siz onların şadlığına zəhər qatırsınız? Nə üçün siz camaatı cəhənnəm əzabı ilə qorxudaraq, ona başqa xalqlarla əlaqə yaratmaq, elm və texnikanın nailiyyətlərini mənimsəmək imkanı vermirsiniz?"

Uzaq keçmişdə dünya şeir aləminə Firdovsi və Xəyyam kimi dahilər vermiş olan İran Axundovun zamanında olduğu kimi indi də "mömin şeyx" əbası altında gizlənən şarlatanların əsas vətənidir. Bütün bunları görəndə adam demək istəyir: İran irticaçıları barı öz böyük babalarının xatirəsindən utanaydılar.

Keçən il mart ayında mən Berlində olarkən, Berlini alan və Avropanı barbar faşistlərdən xilas edən sovet əsgərlərinə qoyulan abidə qarşısında başıaçıq durmuşdum.

Həmin abidənin üstündəki yazıda xilaskar qəhrəmanlar sırasında "Möhnət" adını oxudum. Bu ad bir azərbaycanlının, mənim həmvətənimin adı idi. Qəlbimdə iftixar hissi o qədər coşub daşdı ki, mən həlak olmuş qəhrəmanın məzarı qarşısında deyil, diri qəhrəmanla üz-üzə durub söhbət etdiyimi zənn etdim. Mən qəhrəmanımızın açıq və aydın üzündə, onun çox uzaqları görən şəffaf gözündə xilaskar sovet igidinin iftixar hissini oxudum. Bu hələ hamısı deyildir. Onun surəti mənim qarşımda ən yaxşı insani duyğu və arzuların ifadəçisi olan

humanist surəti kimi, dünyada dinc və ədalətli həyatın coşqun müdafiəçisi surəti kimi, mədəniyyət müdafiəçisi surəti kimi canlanmışdır.

Möhnət tək deyildir. Çoxmillətli Sovet İttifaqının milyonlarla oğulları bəşəriyyəti faşist taun xəstəliyindən xilas etmək üçün canlarından keçmişlər. Onlar yalnız öz sosialist vətənini deyil, Avropa xalqlarını da Hitlerin və onun quldur dəstəsinin zülm və əsarətindən qurtarmışlar.

Belə bir igid xalq, belə bir xilaskar xalq bütün xalqlar və qəbilələr tərəfindən yalnız hörmət və məhəbbətə layiqdir.

Biz, əsil mədəniyyət və elmin, azadlıq və demokratiyanın böyük karvanının sarbanları tərəqqi və sülh bayrağını, xalqların və qəbilələrin qardaşlıq bayrağını dik tutub irəliyə doğru hərəkət edirik!

*1948*

## İNSAN QƏLBİNİN TƏRƏNNÜMÇÜSÜ

Bütün xalqımız böyük bir hüznlə musiqi sənətimizin ölməz ustadı olan Üzeyir Hacıbəyovla vidalaşdı. Əziz və hörmətli bir insanın tabutunu torpağa tapşırmaq onu sevənlər üçün, bütün xalq üçün ağır bir dərddir.

Lakin insanın əsil qüdrəti bütün dərdlərə, matəmlərə və vaxtsız ölümlərə qalib gəlməkdə ifadə olunur. Üzeyir də bir insan, bir sənətkar olaraq ölümün zülmətindən yüksəklərdə dayanan bir qüdrətin timsalıdır! O, həyatın müvəqqəti yox, əbədi bir övladıdır, çünki hər böyük sənətkarın, dahi və filosofun, böyük dövlət və siyasət xadimlərinin qüdrəti onların şəxsi məziyyəti deyil, mənsub olduqları xalqın həyat qüdrətidir.

Xalq həyatı isə əbədidir, ölməzdir...

Biz Üzeyiri onun unudulmaz əsərlərinə görə, xalqımızın ən müqəddəs arzu və əməllərini ifadə edən sənətinə görə sonsuz bir məhəbbətlə sevirik. Bir də ona görə sevirik ki, o özü bizi, bütün sovet xalqını saf və təmiz bir ürəklə sevirdi, o yalnız bizim üçün yaşayıb-yaradırdı.

Ölüm sevinməsin qoy, ömrünü vermir bada
El qədrini canından daha əziz bilənlər.
Bir şirin xatirətək qalacaqdır dünyada
Sevərək yaşayanlar, sevilərək ölənlər...

Məşhur rus şairi Nekrasov demişdir ki, şair olmaya da bilərsən, lakin vətəndaş olmağa məcbursan.

Üzeyir ona görə böyük sənətkar oldu ki, o böyük bir vətəndaş idi... O, qəhrəman xalqımızın apardığı mübarizə tarixinin məna gözəlliyini, daxili pafosunu azad və xoşbəxt həyatımızın şeriyyət və romantikasını tərənnüm edən bir bəstəkar idi. Öz əsrinin həqiqi övladı və nəğməkarı olan sənətkara eşq olsun!...

*1948*

## QƏHRƏMANLARA EŞQ OLSUN!

"Şaxta kəsirdi, qar yağırdı, canilər isə Azərbaycanın qəhrəman oğullarının cənazələrini küçələrin daşları və xiyabanın asfaltı üzərində sürüyürdülər" (Abbas Cəfəri).

İnsan bu qanlı, bu dəhşətli səhnəni göz önünə gətirdiyi zaman ürək adi vəziyyətini itirir, keçirdiyimiz təlatüm və həyəcan köksün qəfəsinə sığmır. Bu qanlı, faciəli səhnə bizə orta əsr vəhşətlərini, nəhayət, bütün insani hisslərdən məhrum olan alman faşizminin insanları diri-diri odlara-alovlara atmasını xatırlatmırmı? Lakin dünya oxucuları yuxarıda təsvir olunan bu hadisəni göz önünə gətirmək istəsələr, fikrən nə orta əsrə, nə də qadir sovet xalqının hünərilə sərnigün edilmiş, külü göylərə sovrulmuş faşist Almaniyasına getməsin, indiki İrana diqqətlə baxsınlar.

Öz müqəddəs qanları ilə Təbrizin daşlı küçələrini, meydanlarını, bütün İran Azərbaycanı torpağını, eləcə də bütün İran torpağını suvaran, dar ağacı ayağına mərdanə gedən qəhrəmanlar kimdir? Onlar nə kimi amal və məqsəd uğrunda öz canlarını, gənc və qoca ömürlərini qurban verirlər?

Biz bu suala öz dilimizlə deyil, İran Azərbaycanı demokratlarının sədaqətli əsgərlərindən olmuş Dadaş Tağızadənin vəsiyyətnaməsilə cavab verək: "Mən, Azərbaycanın ləyaqətli oğluyam, budur, Azərbaycan xalqının azadlığı uğrunda başı uca can verirəm. Güman etməyin ki, mənim və yoldaşlarımın ölümü ilə azadlıq boğulacaqdır. Şübhəsizdir ki, bizi mühakiməyə çəkib dar ağacına tərəf aparan cinayətkarlar millət məhkəməsində cavab verməli olacaqlar".

Qəhrəmanın bu qadir səsi bütün milli hüquqlardan məhrum edilmiş, öz ana dilində məktəbdən belə məhrum edilmiş beş milyonluq

İran Azərbaycanı xalqının İran müstəbidlərinə qarşı, Rza xan üsulunun alçaq sələflərinə qarşı apardığı milli azadlıq hərəkatının səsidir! Onlar gözəl bilirlər ki,milli azadlıq olmayan bir torpaqda nə iqtisadi, nə ictimai, nə də siyasi bir azadlıq ola bilər! Buna ən açıq misal İrandakı şah üsul-idarəsinin mənfur pəncəsi altında inləyən, vaxtsız ölümlərin, aclığın, hüquqsuzluğun və bütün məhrumiyyətin ağır daşlarını öz çiynində daşıyan İran Azərbaycanı xalqının indiki faciəli vəziyyətidir!

Azərbaycanın qəhrəman demokratları öz şanlı və şöhrətli mübarizələrini məhdud və məhəlli bir hadisə kimi deyil, indiki dünya xəritəsində xalqların Amerika və İngiltərə imperializminə qarşı apardığı milli azadlıq hərəkatının bir halqası kimi qiymətləndirirlər. Biz bu böyük həqiqəti vüqarlı Savalan dağının əzəmətini andıran, iradəsi isə öz ulu babası Babəkin iradəsini xatırladan polkovnik Cavidanın dilindən eşidirik: “Siz bu gün mənim səsimi boğazımda boğursunuz, lakin məzlum xalqları öz haqlarını almağa çağıran bəşəriyyətin azadlıq səsi dünyanın hər yerində yüksəlməkdədir. Siz isə bu göy kimi guruldayan səsi boğmaqdan acizsiniz”.

Qardaş! Sənin bu məslək eşqində, bəşəriyyətin xoşbəxt istiqbalına inanan qəlbində duyduğumuz inqilabi romantikaya eşq olsun! Sənin qartal vüqarı ilə tufanları, fırtınaları yarıb keçən, yaxın və uzaq gələcəkdə belə səslənəcək bu qadir səsinə, həyat və mübarizə iradənə eşq olsun! Sənə döşlərindən süd vermiş anaya, nizamilər, füzulilər rübabına ilham vermiş, Babək, Koroğlu, Səttarxan qılıncına qüdrət vermiş Azərbaycan torpağına eşq olsun! Mən bu sətirləri yazdığım zaman ürək bədahətən Cavidanın xatirəsinə dil açdı:

Öz müzəffər bayrağıyla gəlib keçdikcə illər
Bir əbədi bahar kimi gül açacaq xatirən...
Yad edəcək hörmət ilə səni gələn nəsillər,
Heykəl kimi ucalırsan qəlbimizdə bu gün sən.
Al qanınla suvardığın Azərbaycan torpağı
Öz başını əyməyəcək cəlladlara bir daha!
Vüqarına and içdiyim bu azadlıq bayrağı,
Sənin ölməz adını da aparacaq sabaha...
Ölüm yoxdur qəhrəmana! Söyləyirəm mən yenə
Şəfəqlərdə sayrışacaq sabah sənin də türbən...
Ordu kimi salam verib o əziz xatirənə,
Hüzurunda baş əyirəm öz şerimlə bu gün mən...

İran xalqlarının şərəf və heysiyyətini Amerika dollarına satan, Amerika imperialistlərinə "sadiq nökərçilik" vəzifəsini görən müasir İran dövlət quruluşu və bütün İran irticası mədəni dünyanın sonsuz nifrət və lənətilə qarşılanır!

İran torpağı saysız-hesabsız zindanlarla, dar ağacları ilə dolmuşdur. Minlərlə demokrat, xeyirxah və nəcib insanlar İran cəlladlarının əli ilə qanunsuz və məhkəməsiz güllələnir, dar ağaclarından asılır! Bu dar ağaclarından asılan nəcib və qəhrəman insanlardan biri də demokrat Sübhi olmuşdur. İran cəlladları onu edam etdiyi zaman dar ağacının ipi qırılır. Sübhi öz vüqarlı başını dik tutaraq ürək dolusu deyir: "Cəlladlar! İndi mənim dediklərimə inandınızmı! Sizin hətta dar ağacınızın ipi də çürümüş və davamsızdır..."

Bu hakimanə deyilmiş sözlər yalnız İran irticasının ölümə məhkum olduğunu ifadə etmir, eyni zamanda, bütün dünya irticasının, Amerika imperializminin də qürubunu, son nəfəsini, son "dövranını" xəbər verir. Biz buna zərrə qədər şübhə etmirik! İnsan tarixi göstərir ki, ən qüvvətli, ən amansız dövlət quruluşuna, ordu və silah qüvvəsinə sahib olan müstəbidlərin, cahangirlərin hökmranlığı xalqların azadlıq uğrunda apardığı mübarizənin iradəsi qarşısında tar-mar edilmişdir. İndi dünya xalqlarını atom bombaları ilə qorxudan, bəşəriyyəti qan dənizində boğmağa cəhd edən Amerika imperializmi də öz qürubunu, son "dövranını" keçirməkdədir! Bütün yer üzündə müxtəlif xalqların, millətlərin vahid demokratik mübarizə cəbhəsi yaranmışdır! Bu qadir cəbhə bəşəriyyətin yeganə xilaskarı olan, sülhün və səadətin sönməz ocağı olan Sovetlər torpağından ilham alaraq dünya imperializminə qarşı çıxır, onun bütün hiylələrini, qara siyasətlərini ifşa edir! Azadlıqsevən dünya xalqlarının öz nəfəsilə hərəkətə gətirdiyi bu azadlıq qatarının təkərləri altında marşallar, trumenlər, çörçillər dünyası məhv olacaqdır!

Son günlərdə Parisdə və Praqada gedən sülh konqresi dünya xalqlarının yalnız sülh səsi deyil, eyni zamanda onların qəhrəmanlıq səsini, imperializmə qarşı mübarizə iradəsini nümayiş etdirir. Oyanmış dünya öz əbədi qurtuluşunu və əbədi azadlığını imperializmin ölümündə görür. Bu, mütləq bir qanundur!

Biz fəxr edirik ki, qan qardaşlarımız olan İran azərbaycanlıları da dünyada gedən azadlıq mübarizəsinin qabaq sıralarında, ölümlə, zülmətlə əlbəyaxa vuruşurlar. Onlar da bəşəriyyətin bu azadlıq dastanına öz qanları ilə qızıl səhifələr yazırlar! Biz qəhrəman qardaşlarımıza yeni zəfərlər arzu edirik.

Uğur olsun! Uğur olsun azadlığın karvanına!
Min eşq olsun! Min eşq olsun şəhidlərin al qanına.
Uğur olsun, bu qurtuluş ordusunun səfərinə,
Hər bugünkü çağrışına, hər sabahkı zəfərinə...
Qan qardaşım! Can qardaşım! Sən yardıqca o zülməti
Qoca Şərqə bayraq çəkir qurtuluşun şeriyyəti...
Biz duyuruq hər arzunu, hər müqəddəs diləyini,
Qaranlıqda məşəl kimi yandırırsan ürəyini...
Dünya sənin arxandadır, arxandayıq sənin biz də...
Qanın axır qanımızda, qəlbin vurur qəlbimizdə...
Alqış, zülfün binasına külüng vuran əllərinə!
Arazın o tayındakı Azərbaycan ellərinə!

*1949*

## "SOLĞUN ÇİÇƏKLƏR" HAQQINDA

Nə üçün biz M.Əzizbəyov adına Azərbaycan Dövlət Dram Teatrının hər yeni tamaşasını həvəs və maraqla, bəzən də dərin bir intizar hissi ilə gözləyirik?

Bizim bu qəlb çırpıntılarımıza səbəb nədir?

Teatrda əyləşib bir neçə saat vaxt keçirməkmi?

Bu müddət ərzində istirahət etməkmi? Xoşladığımız ayrı-ayrı aktyorların boyunu, simasını, məharət və hərəkətini izləməkmi? Yox! Müasir tamaşaçılarımızı teatrımıza bağlayan hiss daha mənalı və dərindir.

M.Əzizbəyov adına Azərbaycan Dövlət Dram Teatrı xalqımızın mənəvi qüdrətini onun həyat və yaradıcılıq istedadını, mübarizə qabiliyyətini, bədii zövqünü, gələcəyə olan əməl və arzularını ifadə edən mühüm bir mədəniyyət ocağıdır.

Biz bu ocağın alovlarında qızındığımız zaman canımızda yeni bir həyat təravəti duyuruq, xalqımızın keçmiş olduğu və keçdiyi mübarizə yollarından addımlayırıq.

Bəzən biz "ağalar və qullar" dünyasının təhqirlərinə, qanunların riyakarlığına, hakim sinif və təbəqələrin sönük ehtiraslarına, xüsusi mülkiyyətin, istismarın törətdiyi faciələrə şahid oluruq, babalarımızın həyat məşəqqətlərini göz önümüzə gətirib onlara acıyır, yanırıq. Eyni zamanda, yaratdığımız yeni dünyanın əzəmətini, daxili şeriyyətini, adamlarımızın azadlıq və səadətini görüb bununla fəxr edirik...

Nə üçün biz istedadlı yazıçımız İlyas Əfəndiyevin “Bahar suları” əsərini sevinc və şadlıqla qarşıladıq? Niyə biz onun qəhrəmanlarını sevdik? Onlarda nə kimi yeni, tarixi məziyyətlər gördük? Biz onların qəlbində gözəl, xeyirxah hisslər, həyat və mübarizəsində adamlarımızın əməl və arzularını, xalqa, vətənə yeni, həm də şairanə münasibətini görürük. Biz onların həyat və hərəkətlərini izlədiyimiz zaman xüsusi mülkiyyət dünyasının yaratdığı məhdud, xudpəsənd, paxıl, rəzil təbiətlər əvəzinə ictimai bir həyat zəminəsində yaranan, nəcib və alicənab təbiətlər gördük. Bu təbiətlər həyatda baş verən hər kiçik təsadüfi məhrumiyyətdən, yaxud şəxsi həyatın büdrəmələrindən, bir şəxsin mənafeyinin başqa bir şəxsin mənafeyi ilə toqquşmasından “faciələr”, “fəlakətlər” törətmir. Onlar həyat və səadətin ahəngini pozmayan, nə olunsa-olsun, yenə həyat təntənə çalmalıdır, səadət də, dostluq da, səmimiyyət də, məhəbbət də eyni məslək sahibləri arasında, eyni vətən övladları arasında daima yaşamalıdır, – deyən yeni insanlardır. Çünki onlar xudpəsəndliyin dəmir zəncirlərini qırmış, daha geniş, daha saf bir hava ilə tənəffüs edirlər. Biz “Bahar suları” əsərini onun bu şeriyyətinə görə sevdik, bir daha inandıq ki, sosializm həyatımızda yalnız maddi nəhənglər deyil, eyni zamanda yeni, zəngin, həm də gözəl bir insan mənəviyyatı yaradır.

Biz son həftələr ərzində teatrımızın afişalarında “Yaxın günlərdə “Solğun çiçəklər” tamaşaya qoyulacaq” sözlərini oxuduq. Hər birimiz bu əsərin gözəl, mənalı bir əsər olacağına hələ tamaşaya baxmadan inanırdıq. Çünki biz Cəfər Cabbarlı qələminin daima mənalı və dolğun əsərlər yaratdığını dəfələrlə görmüşük. Tamaşaya baxdığımız zaman isə ümidimizin doğru çıxdığını görüncə qanuni olaraq sevindik (tamaşanın quruluşu rejissor Ə.H.Ələkbərovun, bədii tərtibat İsmayıl Axundovun, musiqisi N.Fətullayevindir).

Hadisə yaxın keçmişə, xüsusi mülkiyyətin hakim olduğu bir dövrə aiddir. Əhvalat sayca çox olmayan kiçik bir ailədə gedir. Lakin biz bu kiçik ailənin faciəsini seyr etdiyimiz zaman bütün əsrin, bir ictimai quruluşun faciəsini görürük.

“Xüsusi mülkiyyət” bir çox insanları əsil və nəcib insan təbiətindən çıxarır, onlar vəhşiləşir, mal-dövlət ehtirası insanları cinayətə, həm də həyasız, açıq bir cinayətə sövq edir. Azad məhəbbət və səadət kimi gözəl nemətlər vaxtsız solub-saralır, əməllər, arzular təhqir olunur, insan ləyaqəti tapdalanır, insan hünəri isə “qızıl zəncirlərin” arasında

çırpına-çırpına nəfəs alır... Çıxış yolu, qurtuluş ümidi yoxdur, çünki bütün rəsmi qanunlar, qaydalar belə, pul əsiri, pul düşkünüdür... Pul bütün cinayət və xəyanətləri pərdələyən bir zülmət kimi qanad gərmişdir. Hakim əxlaq, hakim qanun və dövlət pul üzərində, xüsusi mülkiyyət üzərində qurulmuşdur.

Bütün bunları yaradan və yaşadan burjuaziya sinfi öz məhdudluğu içində – mənəvi yoxsulluğun çərçivəsində, öz həris və heyvani təbiətinin pəncəsində qanuni olaraq çürüyür, tökülür, hamını iyrəndirir, hamı ona nifrət edir.

Xüsusi mülkiyyətin sönük ehtirasına gözəl hisslər, nəcib duyğular, məhəbbət, dostluq, etibar, doğruluq, ədalət qurban gedir. Sonuncular müvəqqəti olaraq məğlub olur; əsərin fəlsəfi mənası budur.

Gülnisə (Mərziyə Davudova) böyük bir dövlətə özünü və qızı Pərini (Məhluqə Sadıqova) varis etmək üçün ağsaçlı ərinə zəhər verib öldürür. Bu cinayətin bir qadın tərəfindən baş verməsi bizi daha çox düşündürür. Burjua sinfinin mənəvi çürüklüyünün törətdiyi dəhşətlərə heyrət edirik. Pul, dövlət, şöhrət əsasında qurulmuş, azad məhəbbət və gözəl hisslərdən məhrum olan bir izdivacın nəsibi bu, yaxud buna bənzər faciələr ilə qurtara bilər ki, bu da xüsusi mülkiyyət cəmiyyətinin ən çirkin cəhətlərindəndir.

Biz Sara kimi (Leyla Bədirbəyli) şairanə, sakit, ancaq gözəl hisslərlə yaşayan bir qızın öz analığının "iblisliyi" üzündən şam kimi sönüb getdiyini gördükdə tüklərimiz ürpərir, damarlarımızda qan donur. Keçmiş dünyada minlərlə saraların nakam həyatı və nakam eşqi gözümüzün qabağından gəlib keçir. Biz bu zaman bir anlığa səhnədən diqqətimizi ayırıb tamaşa salonuna baxırıq. Gülnisə kimi iblislər əvəzinə, yüzlərlə anasız uşağa doğma ana münasibəti bəsləyən sovet qadınlarımızı görürük, qəlbimiz iftixarla döyünür.

Biz talesiz Sara əvəzinə teatr salonunda əyləşmiş azad və xoşbəxt qızlarımızı seyr edirik, "nə qədər yüksəlmişik, nə qədər ucalmışıq" deyə öz ürəyimizlə danışırıq. Lakin yenə sakit olmuruq, sıralarımızı bir də yoxlayırıq. Yeni və xoşbəxt gəncliyimiz həyatımızın sürətinə mane olmaq istəyən keçmişin bir çox zərərli qalıqlarını məişətimizdə kökündən qoparıb atmağa cəhd edir.

Milyoner oğlu təkcə öz taleyini, bir də sevgilisinin taleyini yaşatmaqda aciz olan, "hiyləyə hiylə" ilə, "cinayətə cinayətlə" cavab vermək istəyən Bəhram surətinə baxdıqda (İ.Dağıstanlı), bütün bir ölkəni, böyük

bir dövləti, ucsuz-bucaqsız sovet torpağını öz zəhməti və hünəri ilə mühafizə edən, iradəli, yüksək məfkurəli və yüksək hissli gəncliyimizi dönə-dönə alqışlayırıq, "nə qədər yüksəlmişik, nə qədər mənalı olmuşuq" deyirik!

Bütün əsər boyu Əbdül kişinin (M.Mərdanov) zənginlər dünyasına yağdırdığı "Zalimlər! Namərdlər!" sözünü eşitdikcə, onun səsində zəhmətkeş xalqın vicdan səsini, nəcabət və humanizmini duyuruq. Lakin o səsin üsyanı qızıl sarayların divarlarına dəyib qayıdır. Kütbaş, insani hisslərdən məhrum olmuş pul və dövlət sahibləri o səsdəki həqiqəti, el nəfəsini, el qəlbini duymaqdan acizdirlər. Bu, yaxın, lap yaxın bir keçmişdə olur. Ancaq indi isə həmin el səsi, el iradəsi, el nəfəsi qanunlar verir, tarix yaradır. Biz bunu da düşündüyümüz zaman "xalqımız nə qədər böyümüşdür, nə qədər qadir və mədəni bir xalq olmuşdur, nə qədər qabaqcıl bir şüur sahibi olmuşdur" deyə sevinirik!

Bütün bunlarla demək istəyirik ki, "Solğun çiçəklər" əsərinin tamaşası diqqətimizi yalnız keçmişlə məşğul etmir. Bu əsər bizə bu günü, öz varlığımızı, mənəvi nailiyyətlərimizi dərk etmək üçün yaxından kömək edir. Kim deyə bilər ki, əsərin faciəsini duyan bəzi yuxa qəlbli adamlarımız arabir ağladığı zaman öz qəlbində sevinmir, sahib olduğu azad məhəbbət və səadəti ilə bir daha ucalmır, faciələrə, vaxtsız ölümlərə, hicran və göz yaşlarına son qoyan sovet varlığını, sosializm dünyasını dönə-dönə alqışlamır, sovet adamı olması ilə bir daha fəxr etmir?

Yuxarıda qeyd etdiyimiz kimi, əsərin məzmunu yeni deyildir. Bu mövzuda Azərbaycan və dünya dramaturgiyasında bir çox əsərlər vardır. Bəs nə üçün biz bu əsərə təkrar kimi baxmırıq? Çünki o, konkret bir səslə, nəfəslə yaradılmışdır. Bu, Cəfər Cabbarlının əsəridir.

Cəfər Cabbarlının ilk qələm məhsulu olan "Solğun çiçəklər" əsərində bir çox primitiv dramaturji üsullar, ifadə və dil "sadəlikləri", müəyyən dərəcədə yarımçıqlıq da vardır. Ancaq biz tamaşaya baxarkən bunları unuduruq. Təsəvvür edin ki, ilk dəfə tribunaya çıxan istedadlı bir gənc min adamlıq bir auditoriya qarşısında danışır. O, bəzən cümləlari yarımçıq deyib keçir, bəzən də demək istədiyi dolğun fikirlərin ifadəsində çətinlik çəkir. Buna baxmayaraq, biz ona maraqla qulaq asırıq, o, alovludur, ürəyi doludur, o, tribunaya mütləq çıxmalı, mütləq danışmalı idi. Bir də o, təbii danışır, ürəyini boşaldır. O, canlıdır, nəfəslidir.

Cəfər Cabbarlının ölümündən on beş il keçdikdən sonra onun bizə məlum olmayan yeni bir əsərini gördükdə biz nə qədər sevindik!

Hər gözəl səhnə əsəri öz tamaşaçılarına bilik, mərifət, zövq və istirahət verməklə bərabər, eyni zamanda hər tamaşaçını öz sahəsində, öz işi və qabiliyyəti sahəsində yaradıcılığa, yeni-yeni nailiyyətlərə çağırır...

Mən bu tamaşadan sonra şəxsən özümün və bütün dramaturq yoldaşlarımın xalqımız və teatrımız qarşısında nə qədər borclu olduğunu bir daha hiss etdim. Bu məqaləni yazdığım zaman Belinskinin gözəl bir fikrini xatırladım. O demişdir ki, böyük təbiətlər heç vaxt öz işindən və hünərindən razı qalmaz... Bu narazılıq isə onların böyük təbiətindən doğur.

Biz əminik ki, teatrımız da öz təbiətinə, xalqımızın böyük təbiətinə sadiq qalaraq bu gün atdığı hər iri addımı sabah atacağı daha böyük bir addımla tamamlayacaqdır.

*1949*

## RUS ŞERİNİN GÜNƏŞİ

*"Yaratdığım bu heykəl görməmiş insan əli,*
*Ona gedən el yolu göyərməyəcək bir an..."*

Rus milli ədəbiyyatının və dünya poeziyasının böyük nümayəndəsi Aleksandr Sergeyeviç Puşkin özünün gələcək şöhrətini bu peyğəmbəranə sözlərlə qabaqcadan xəbər vermişdir.

Bəşəriyyətin bədii təfəkkür tarixində elə dahilər yetişmişdir ki, onlar öz xalqlarının şan və şöhrətini artırmış, öz istedad və dühasını hamıya təsdiq etdirmiş, öz millətlərinin yaradıcılıq qüdrətini hamıya bildirmişlər. Bu cür dahilər son dərəcə milli və orijinal sənətkar olmaqla bərabər, milli çərçivəyə – müəyyən tarixi dövr çərçivəsinə sığa bilməmişlər. Onlar milli zəmində inkişaf edərək öz böyük milli "mənlikləri" vasitəsilə bütün qabaqcıl bəşəriyyətin ən yaxşı düşüncə və arzularını, həyat və mübarizəsini ölməz əsərlərində tərənnüm etmişlər. Ona görə də belə dahilər yalnız öz xalqları içərisində deyil, həmçinin dünyanın bütün xalqları və qövmləri içərisində də böyük hörmət və məhəbbət qazanmışlar. Homer və Dante, Firdovsi və Nizami, Rustaveli və Nəvai, Şekspir və Höte, Tolstoy və Qorki bu cür dahilərdəndir. Puşkin də belə dahilərdən biridir.

Puşkin özünün böyük vəzifəsini iftixarla tərənnüm edib yazmışdır:

Yayılıb səsim tutar bu böyük Rusiyyəni,
Hər tayfa öz dilində oxuyacaqdır məni.

Belə bir fikir vardır ki, bütün tərəqqipərvər xadimlər, filosoflar və dahilər, rəhbərlər və arif adamlar hətta öz dövrlərini ötüb keçdikdə də öz sinifləri və xalqlarının düşüncə və istəklərinin, real həyat və mübarizələrinin, ideoloji və əxlaqi normalarının tərcümanı olmuşlar.

Bundan belə bir nəticə çıxarmaq olar ki, bütün başqa dahilər kimi Puşkin də bütün dünyada qazandığı şöhrətlə qüdrətli şair rübabına qida verən doğma xalqına borcludur.

Puşkin dövründə Rusiya ictimai-siyasi hadisələrlə dolu idi; oyanan rus xalqının mədəniyyət və mənəviyyatında bu dövrdə olduqca böyük dəyişikliklər əmələ gəlmişdi. Amma bu hadisələr yalnız o zamankı Rusiyanın coğrafi hüdudundan kənara çıxmış, beynəlxalq aləmə də səs salmışdı. O zaman Rusiya bütün Avropaya Napoleon işğalından nicat verməli olmuşdu. Napoleona qarşı vətən müharibəsinə çevrilən 1812-ci il müharibəsi o zamankı rus ictimaiyyətinin bir çox təbəqələrini vətənin şərəfini yadelli işğalçı imperatorun hücumundan qorumaq üçün vahid el gücündə birləşdirmişdi. 1812-ci il müharibəsi Rusiyada o zamana qədər görünməmiş milli iftixar hissi oyatmış, rus vətənpərvərliyini qüvvətləndirmiş və Avropanı zülm altında inlədən Napoleon üzərində cahanşümul tarixi qələbə ilə nəticələnmişdi.

Bunu Puşkinin özü aydın ifadə edərək demişdir ki, "ruslar öz qanları ilə Avropa üçün azadlıq, şərəf və dinclik qazandılar" Puşkin bunu da demişdir ki, "Avropa Rusiya barəsində həmişə nadan olduğu qədər də nankor olmuşdur".

* * *

1812-ci il müharibəsi Puşkinin qəlbində böyük vətənpərvərlik duyğusu, öz vətəni, onun gələcəyi üçün iftixar hissi alovlandırmışdı...

Puşkin hələ 14 yaşlı uşaq ikən, Kutuzovun vəfatını eşitdikdə yazmışdı:

Qələbəylə, şöhrətlə bəzənsə də həyatı,
Vətənini ağlatdı Kutuzovun vəfatı.
Əbəs ümid bəsləyib, əbəs sevinir cani,
Zənn edir yoxdur artıq qarşısında bir mane.

Sıralar üzərində gəzəcək ruhu onun,
Xalqın içindən çıxan böyük vətən oğlunun.
Belə oğul verən xalq zənn etmə ki, xar olar,
Yeni bir rəhbər çıxar, Allah bizə yar olar...

* * *

1812-ci il müharibəsi Puşkinin milli şüurunun müəyyənləşməsində çox böyük rol oynamışdır. Şair rus torpağı tarixinin bu şanlı dövrünü öz əsərlərində dəfələrlə tərənnüm etmişdir. O, məşhur "Yevgeni Onegin" romanında qədim və möhtəşəm Moskvanın simasında öz xalqının qüdrət və qüvvətini iftixar hissilə tərənnüm edib deyir:

Artıq, Pyotr qəsri görünür, budur!
Ağaclıq içində qaranlıq və tək
Yaxın keçmişilə fəxr edib durur.
Bir son səadətlə nəşələnərək,
Napolyon elə zənn etdi ki, təkdir...
Önündə Moskva diz çökəcəkdir,
Ona veriləcək Kremlin açarı;
Xeyr! Moskvanın qəhrəmanları
Başını əymədi onun önündə.
Ona bac vermədi mənim Moskvam,
Onun şərəfinə qurmadı bayram,
Yanğın hazırladı ona o gündə!
O da fikirlərə daldı heyrətlə,
Qorxunc alovlara baxdı heybətlə.

Şair öz xalqının qırılmaz iradəsini, yaradıcılıq qüvvəsinə sonsuz inamını, mərdlik və igidliyini bu heybətli alovda görürdü. Məhz bu sifətlərə malik olan böyük rus xalqı zəmanəmizdə bəşəriyyətin bütün inqilabçı və tərəqqipərvər qüvvələrinin bayraqdarı olmuşdur!

* * *

Lakin Puşkin dövrünün Rusiyası ayrı-ayrı şəxslərin və qrupların parlaq əməllərinə baxmayaraq, Lermontovun dediyi kimi, "qullar ölkəsi, ağalar ölkəsi" idi. Xalq bitməz-tükənməz əzab və əziyyət içərisində idi. Rəhmsiz qanunlar tətbiq edilir, şəxsiyyət və söz azadlığı boğulurdu. Ən dəhşətlisi o idi ki, milli heysiyyət və iftixarın nə olduğunu bilmə-

yən çar Nikolay rus xalqının milli qürurunu tapdalayırdı. Bu həmin adamdır ki, Puşkinin faciənə ölümündən sonra Parisdə ata minib böyük şairin rəzil qatili Danteslə yan-yana gəzməyə çıxmışdı. Rusiyada kəndlilər təhkimçilik üsulunun ağır və dözülməz boyunduruğu altında inləyirdilər. Xalqın torpaqdan istifadə etməyə ixtiyarı yox idi. Gənc şair məşhur "Kənd" şerində rus kəndlisinin ağır, kölə vəziyyətini həyəcanlı misralarla yazmışdı.

Bütün bunlara görə Puşkin mütləqiyyət quruluşuna nifrət edir, onu öz əsərlərində amansızlıqla ifşa edir, Rusiyanın və o zamankı Avropanın padşahlarını amansız və rəhmsiz qanunlar qoyduqları üçün rüsvay edirdi.

Biz "Azadlıq" şerində şairin müstəbid hökmdarlara qarşı çevrilmiş qəzəbli misralarını oxuyuruq.

Puşkin dünyagörüşünün müəyyənləşməsində, onun yaradıcılıq üslubunun və estetik baxışlarının yaranmasında və inkişafında dekabristlərin mütləqiyyətə qarşı mübarizəsi çox böyük rol oynamışdır. Puşkinin dekabristlər təşkilatına mənsub olduğu haqqında tarix bizə heç bir sənəd qoyub getməmişdir. Lakin Puşkin dekabristlərin məfkurə dostu idi; onun bütün düşüncə, duyğu və baxışları dekabristlər hərəkatı və mübarizəsi ilə bağlı idi. Cəsarətlə demək olar ki, dekabristlər hərəkatı olmasaydı, Puşkin yaradıcılığında bu qədər dərin ideyalılıq, ictimai mövzu bolluğu ola bilməzdi, şairin yaradıcılığı bu qədər aktiv və təsirli şəkil ala bilməzdi, belə bir ictimai əhəmiyyət zirvəsinə qalxa bilməzdi.

Əbəs deyildir ki, dekabristlər üsyanının rəhbərlərindən biri olan şair Kondrati Rıleyev Puşkinə bu sözləri yazmışdı: "Rusiya gözünü sənə dikmişdir; səni sevirlər, sənə inanırlar, səni təqlid edirlər. Şair və vətəndaş ol!"

Dekabristlərin məhz Puşkinə bu qədər böyük ümid bağladıqlarını ona bu qədər çox inandıqları ilə deyil, bəs nə ilə izah etmək olar?

Böyük şairimiz "Çaadayevə" sərlövhəli məşhur şerində yazmışdı:

Nə qədər ki, yanar alovlanaraq
Azadlıq eşqilə coşqun qəlbimiz.
Nə qədər şərəflə, namusla ancaq,
Yaşayıb dünyada ömr edirik biz,
Ey mənim əzizim, müqəddəs, gözəl
Arzusunu bu gün könlümüzün gəl,
Həsr edək vətənə, əziz vətənə.

Yoldaş, inan buna, deyirəm sənə,
Bir gün səadətin cazib ulduzu
Doğacaq, Rusiya ayılacaqdır,
Onda mütləqiyyət xərabəsinin
Üstündə adımız yazılacaqdır.

Bundan göründüyü kimi, Puşkin özünü istibdad və mütləqiyyətə qarşı mübarizə aparanlar sırasında, məhz dekabristlər sırasında saymaqla fəxr edirdi.

* * *

Beləliklə, yuxarıda göstərdiyimiz iki amil: 1812-ci il müharibəsi və 1825-ci il dekabristlər üsyanı bir şair, bir mübariz olmaq etibarilə Puşkinin ideya və sənətkarlıq düşüncəsinin müəyyənləşməsində həlledici rol oynamışdır.

Puşkin poeziyasının yaranması üçün onun orijinal, böyük milli mədəniyyət, elm, poeziya və ədəbiyyatdan qida alması da lazım idi.

Puşkindən əvvəl Rusiyada Lomonosov, Derjavin, Radişşev, Jukovski, Batyuşkov, Karamzin və bir çox başqa böyük rus maarifçiləri yetişmişdilər. Bu zaman Rusiyada orijinal milli rus elmi, fəlsəfəsi, poeziyası, ədəbiyyatı, incəsənəti, musiqi, rəsm və memarlığı yaranmışdı. Rus maarifçiləri rus xalqının böyük və işıqlı gələcəyini qabaqcadan görürdülər. Onlar inanırdılar ki, məhz rus xalqı bütün bəşəriyyətin önündə gedəcək, ona nümunə olacaqdır. Belinski 1840-cı ildə yazmışdı:

"1940-cı ildə mütərəqqi dünyaya başçılıq edən, elm və sənətin qanunlarını müəyyən edən və bütün tərəqqipərvər bəşəriyyətin ehtiramını qazanan Rusiyanı görəcək nəvə və nəticələrimizə həsəd aparırıq".

Puşkinin talantı belə bir tarixi və mədəni mühitdə, şəraitdə çiçəklənir və inkişaf edirdi. Böyük şairin müəllimi olan Derjavin, Jukovski və Batyuşkovu tanımadan Puşkini tam mənasilə başa düşmək çətindi. Biz bunu xüsusən ona görə qeyd etməli və göstərməliyik ki, Puşkin məhz doğma zəmin – əsil rus və çox münbit milli zəmin üzərində yetişib dahi sənətkar olmuşdur.

Lakin Puşkinin yaradıcılığı öz müəllimlərinin – sələflərinin yaradıcılığından xeyli irəli getmişdir. Bunu Belinski çox gözəl ifadə edib demişdir: "Böyük nəşrlər bir çox başqa çaylardan əmələ gəlir ki, bunlar öz bol sularını adi bir bac olaraq nəhrə axıdırlar. Kim, məsələn, Oka yaxud Kamanın suyunu tanımaq üçün Volqa suyunu kimyəvi su-

rətdə ayıra bilər? Bu qədər böyük və kiçik çayların suyunu toplayan Volqa öz dalğalarını köpükləndirə-köpükləndirə axıdır; onun başqa suları qəsb etdiyini hamı bildiyi və hamı onun geniş boyunca üzdüyü halda, kimsə bu qəsb olunmuş suları göstərə bilmir. Puşkinin ilham pərisi ondan əvvəl gələn şairlərin yaradıcılığı ilə bəslənmiş və yetişmişdir. Daha artıq desək; o, bunları öz qanuni malı kimi qəbul etmiş və dəyişdirilmiş şəkildə yenidən dünyaya qaytarmışdır".

* * *

Puşkin rus poeziyasının ən yaxşı milli ənənələrini davam və inkişaf etdirməklə bərabər bu poeziyanı dünya səhnəsinə çıxarmış və yeni tipli poeziya yaratmışdır. Bu poeziya nə Homer və Dantenin, nə Höte və Şillerin, nə də Bayron və Şekspirin poeziyasıdır. Bu poeziya Puşkin poeziyasıdır! Bu, dünya poeziyasının inkişafında yeni mərhələdir. Buna görə də biz belə zənn edirik ki, Puşkinin poeziyası olmasaydı, dünya poeziyası yarımçıq, natamam görünərdi. Puşkinin poeziyası dünya poeziyası tarixində realizmin qələbəsidir.

Məşhur alman şairi Höte demişdir: "Mən nə kimi oxucu istəyirəm? Elə bir oxucu ki, kitabımı oxuyarkən məni, özünü və bütün aləmi unudaraq təkcə kitabımla yaşasın".

Amma Hötenin bu gözəl və təntənəli sözləri onun tarixi məhdudluğunu ifadə edir. Bundan əlavə, həmin sözlər alman əxlaqının və subyektiv alman idealizminin xudbin mahiyyətini ifadə edir.

Puşkini oxuyarkən biz onu, özümüzü və obyektiv aləmi nəinki unutmuruq, əksinə, tarixi vərəqləyir, həyatın canlı kitabını, həyat və insan həqiqətini oxuyur, Puşkin istedadının hər şeyi qavrayan qüvvəsinə və onun böyük realizminin rəngarəngliyinə heyran oluruq.

Bütün bunlar şairin böyük mənəvi aləmini, onun insana və həyata sonsuz məhəbbətini, xalq həqiqətinin, məhəbbət və gözəlliyin qələbəsinə hədsiz inamını ifadə edir.

Puşkin rus poeziyası tarixində birinci sənətkar şair idi. O, poeziyaya özünün yeni ənənələrini, əsil realizm ənənələrini, dahiyanə sadəlik və xəlqilik ənənələrini gətirmişdir. Puşkin özünün böyük sənətkarlığı, realist surətləri və xarakterləri, həyat və təbiət mənzərələri ilə klassisizmin prinsiplərini, cansız seyrçilik, öyüdçülük və soyuq mühakiməçilik, bünövrəsiz və mücərrəd romantizm prinsiplərini – o zamankı Avropa poeziyasına xas olan bütün bu prinsipləri həmişəlik məhv etmişdir.

* * *

Tarixdə həmişə mühafizəkarlar, ölməkdə olan köhnə aləmin nümayəndələri bütün yeniliklərə və inqilabi meyllərə müqavimət göstərmişlər. Həmişə ölülər, tüfeylilər, xırdalar dirilər əleyhinə, nəhənglər əleyhinə çıxış etməyə çalışmışlar.

Puşkin dövründə də onun yaradıcılığındakı böyük xüsusiyyətləri şərəfsizcəsinə danmağa cəhd edən, onun yaradıcılığında guya milli xüsusiyyətlər olmadığını və guya Bayronu təqlid etdiyini söyləyən jurnal tənqidçiləri, ədəbiyyat sahəsində fırlanan cizmaqaraçılar var idi.

Lakin Rusiyanın böyük demokratları Belinski, Çernışevski, Dobrolyubov və başqaları şairin adını əsil-nəsəbsiz kosmopolitlərin hücumlarından, xaricilərə məxsus hər bir şey qarşısında səcdə edən adamların hücumlarından müdafiə etdilər.

Belinski böyük bir qəzəblə yazmışdı: “Otuzuncu illərin bir “alim” tənqidçisi Puşkini Bayronla müqayisə edərkən belə bir nəticəyə gəlmişdi ki, Puşkin poemaları qəhrəmanlarının Bayron poemaları qəhrəmanlarına nisbəti xırda şeytan balalarının böyük şeytana nisbətindən başqa bir şey deyildir və ümumiyyətlə Puşkinin əsərləri heç bir şeyə yaramazmış. Bu “alim” tənqidçinin fikrinə belə gəlmirdi ki, Bayron Homerin təqlidçisi olmadığı kimi, Puşkin də Bayronun təqlidçisi deyildir, Puşkinə Bayron kimi baxmaq deyil, Puşkin kimi baxmaq lazımdır”.

Belinsiki öz fikrini ətraflı izah edərək iddia edir və bizi qəti inandırır ki, Puşkin Rusiya haqqında, Rusiya üçün yazmışdır, – biz də onun orijinallığı və dahiyanə istedadının əlamətini bunda görürük ki, Puşkin Bayron təbiətinə tamamilə əks olan öz təbiəti və öz bədii duyğusuna uyğun hərəkət etmişdir və o, Bayron üslubunda rus romanı yazmaq meylinə qapılmaqdan çox uzaqdır.

Puşkin özü ədəbiyyat sahəsinə soxulan cızmaqaraçıların “Yevgeni Onegin” romanına hücum edəcəklərini qabaqcadan görərək öz oxucularına xəbərdarlıq edib yazmışdır:

Çiçəklər, məhəbbət, kənd, avaralıq,
Səhralar! Bağlıyam ruhumla sizə.
Oneginlə mənə fərq qoyun artıq,
Bir gözlə baxmasın insanlar bizə.
Rişxəndcil oxucu, yaxud bir böhtan
Naşiri, məni fərq etdiyi zaman.

Yalandan üzümə durub da bəzən,
Allahsızcasına deməsin ki, mən
Onegin adını bu sətirlərdə,
Şair Bayron kimi vüqarlanaraq,
Özümün əksimi çəkmişəm ancaq.
Xeyr! Düşməmişəm hələ bu dərdə,
Sanki özümüzdən başqasını biz
Yazıb göstərməyə qadir deyiliz.

Təkcə bu parça göstərir ki, Puşkin poeziyanın məqsədini xeyli geniş başa düşürdü, onun gücünü şairin özünün obyektiv aləmində deyil, daha böyük aləmdə – həyat və tarixin yaradıcıları olan insanlar aləmində görürdü.

* * *

Puşkin poeziyasının daxili gözəlliyindən, bu füsunkar poeziyanın əsil mahiyyətindən danışarkən Belinskinin verdiyi tərifi unutmaq olmaz: "Puşkin poeziyasının, xüsusən lirik poeziyasının ümumi koloriti insanın daxili gözəlliyində və qəlbi coşduran insanpərvərlikdədir... Bu sözlə biz bir insan olaraq insanın ləyaqətinə sonsuz hörməti nəzərdə tuturuq".

* * *

Puşkin çox gözəl başa düşürdü ki, əsil realist poeziya və xalq poeziyası romantikasız yaradıla bilməz, şairin fikri pərvaz etmədən yarana bilməz, çünki insan həyatı gələcəyə nəzər salmadan, irəlini görməyə can atmadan dolğun və həqiqi həyat ola bilməz... Qartal öz cismani gücünü ucsuz-bucaqsız hava boşluğunda vüqarlı uçuşla ahəngdar bir surətdə əlaqələndirdiyi kimi, böyük şair Puşkin də öz xəyal və arzularını həyat ilə ahəngdar bir surətdə bağlaya bilmişdir. Puşkin: "Xəyalat, siz nə qədər şirindiniz!" – deyə yazarkən, bəşərin gələcəyini və baharını xəyalatda, romantikada görürdü.

Lakin bütün bunlar həyatı nəzəri surətdə dərk etməyin nəticəsi deyil, Puşkinin böyük şair təbiətinin məhsulu idi. Bütün dövrlərdə böyük sənət əsərləri yalnız bu cür yaranır.

Puşkinin romantikası bəşəriyyətin bədii inkişafında irəliyə doğru addım idi. Bu romantika təsir göstərən, qəhrəmanlıq doğuran, təşkiledici bir romantizm idi. Puşkinin romantikası insan düşüncəsi və duyğularını qanadlandırır, insan ləyaqətini göylərə qaldırır.

Biz sovet şairləri böyük sələfimizdən dərs alarkən onun realizmini tamamilə dərk etməliyik. Puşkinin realizmi onun böyük romantikası üçün bünövrədir.

* * *

Rus realizminin atası və banisi, rus milli dilinin yaradıcısı olan Puşkin rus milli ədəbiyyatının inkişaf yolunu tam bir əsr, hətta zəmanəmizə qədər müəyyən etmişdir.

XIX əsrdə və əsrimizin birinci yarısında yaşayıb yaratmış olan dahi rus yazıçılarının hamısı müəyyən dərəcədə Puşkin əsərlərinin, onun füsunkar və doğru sözlərinin təsiri altında olmuşlar. Hətta Lev Tolstoy kimi nəhəng dünya yazıçısı özünün məşhur "Anna Karenina" romanını yazmağa Puşkinin əsərlərini dönə-dönə oxuduqdan sonra girişdiyini etiraf etmişdir.

Sovet ədəbiyyatımızın bayraqdarı olan böyük Qorki rus ədəbiyyatı tarixində Puşkin yaradıcılığının əhəmiyyətindən danışarkən demişdir ki, onun yaradıcılığı "bütün əsasların əsasıdır".

Puşkin müəllimimizdir. Bu yüksək sənət timsalı və sələfi olmasaydı, Qoqol malik olduğu əhəmiyyəti qazanmazdı. Yazıçı İ.A.Qonçarov deyir ki, Puşkin, Lermontov və Qoqolun yaradıcılıq qüvvəsinin xüsusiyyətləri bütün sonra gələn yazıçıların qanına və iliyinə işləmişdir.

İ.Gertsen Puşkin dühasının inqilabi-tərəqqipərvər əhəmiyyətindən, onun yaradıcılığının böyük təsirindən və ilhamverici qüvvətindən danışarkən demişdir: "Köləlik və əziyyət vadilərində təkcə Puşkinin gur səsli və geniş yayılan mahnıları ucalırdı; bu mahnı keçmiş dövrü davam etdirir, indiki dövrü mərdanə səslərlə doldurur və öz səsini uzaq gələcəyə yetirirdi".

Leninin Puşkin əsərlərini nə qədər coşqun məhəbbətlə oxuduğunu biz bilirik. Puşkin yaradıcılığına Marks və Engelsin nə qədər yüksək qiymət verdiklərini, Marksın rus dilini məhz "Yevgeni Onegin" romanı üzrə öyrəndiyini biz bilirik.

* * *

Puşkin poeziyasının təsiri rus klassik ədəbiyyatı və rus ictimaiyyəti çərçivəsindən xeyli kənara çıxmışdır. Bu poeziya inqilabdan əvvəl və sonra SSRİ xalqları ədəbiyyatının inkişafına çox böyük təsir göstər-

mişdir. Xalqlarımızın tarixində tərəqqipərvər yazıçı və şairlər Puşkin əsərlərinin gözəl təsirini hiss etmişlər.

Demək lazımdır ki, SSRİ xalqlarının poeziyasında realizmin meydana çıxmasında və inkişaf etməsində, Şərqin mücərrəd və didaktik poeziyasının köhnəlmiş qanunlarına qarşı şairlərimizin apardığı mübarizədə, poeziyamızın tarixində, yeni realist məktəbin qələbəsində Puşkin görkəmli rol oynamışdır.

Puşkin haqqında, onun böyük yaradıcılığı haqqında Şərqdə ilk böyük sözü deyən yeni Azərbaycan ədəbiyyatının banisi Mirzə Fətəli Axundov olmuşdur.

Puşkinin faciənə ölümündən çox mütəəssir olan Axundov özünün məşhur poemasını onun xatirəsinə həsr edərək bu sözləri yazmışdır:

Xəyalı tavus kimi bərli-bəzəkli,
Sözdən gözəl naxışlar eylərdi izhar.
Lomonosov bəzədi şerin evini,
Puşkin xəyalı orda oldu bərqərar.
Derjavin tutdu isə şerin mülkünü,
Şerilə Puşkin oldu o yerdə muxtar.
Karamzin tökdü camə bilik şərabı,
Oldu Puşkinə qismət o cami gülnar...
Rus torpağı yas tutub fəğan edir ki,
Ey qatillər əlində ölən namdar,
Qurtarmadın zamanın qanlı şərindən,
Tilsimin də olmadı sənə havadar...
Tutulub bu xəbərdən ağ saçlı Qafqaz,
“Səbuhinin” şerilə yasını saxlar.

Qızıl suyu ilə yazılmalı olan bu sözlər Puşkin poeziyasının tarixi əhəmiyyətinin nə qədər düzgün başa düşüldüyünü göstərir. Axundovun poeması Puşkinə və onun poeziyasına böyük və qızğın məhəbbəti ifadə edir.

Biz, dahi M.F.Axundovun bugünkü övladları bununla fəxr edirik ki, Puşkinin dünya poeziyasındakı əhəmiyyətini o zamankı Şərqdə düzgün başa düşən və səmimiyyətlə tərənnüm edən məhz böyük Mirzə Fətəli olmuşdur.

Bu mənalı, mehriban və səmimi sözlər üçün ona həmişə minnətdarıq!

* * *

Dillərimiz arasındakı fərqə, keçmişdəki siyasi və dini baxışlarımız arasındakı təfavütə baxmayaraq, “zülmət sənəti” şəraitində, ikiqat zülm şəraitində bizim demokrat yazıçılarımız əsası A.Bakıxanov və M.F.Axundov tərəfindən qoyulan ənənəni davam etdirərək rus demokrat yazıçıları ilə həmişə ideya birliyi tərəfdarı olmuşlar.

Əgər bu gün Azərbaycan mədəniyyəti qoca Şərqin sərhədində parlaq mayak kimi işıq saçırsa, biz buna milli mədəniyyətimizin bilavasitə yaradıcısı olan xalqımızın milli dühası sayəsində nail olmuşuq.

Əsil-nəsəbsiz kosmopolitlər, burjua millətçiləri, pantürkistlər və panislamistlər Azərbaycan mədəniyyətinə rus mədəniyyətinin böyük, nəcib və inqilabi təsirini həmişə həyasızlıqla danmağa çalışaraq mədəniyyətimizin ən yaxşı nailiyyətlərini gah burjua Qərbinin təsiri, gah da Şərqin feodal mədəniyyətinin təsiri ilə izah etməyə cəhd edirdilər...

* * *

İnqilabdan əvvəl Puşkinin ayrı-ayrı şeirləri və poemaları ən yaxşı şair və yazıçılarımız tərəfindən dilimizə tərcümə edilmişdir. Bu işdə şair Abbas Səhhətin xidməti xüsusilə böyükdür.

Lakin Puşkinin çoxlu əsəri ilə Azərbaycan xalqı yalnız indi, sovet illərində yaxşıca tanış ola bilmişdir.

Mən bu gün xalqımıza bunu xəbər verə bilərəm ki, Puşkinin altıcildlik əsərləri partiyanın və Sovet hökumətinin gündəlik köməyi, ən yaxşı şair və yazıçılarımızın səyləri ilə Azərbaycan dilinə tərcümə edilmişdir.

Puşkinin dahiyanə sözləri bütün xalqımızın qəlbində Nizami, Füzuli, Vaqif və Sabirin ölməz əsərləri ilə bir sırada nəqş bağlamışdır. Hər bir azərbaycanlı azadlıq və qardaşlıq müğənnisinə böyük hörmət və ehtiram bəsləyir.

Yetmiş yaşlı aşıq, xalq şairi Hüseyn Puşkin haqqında bu sözləri yazmışdır:

Min yeddi yüz doxsan doqquz sənədə
Puşkin bu cahanda ömür var olub,
Min səkkiz yüz on birinə keçəndə
Şeir bağlamağa həvəskar olub.

O vaxtda elmsiz olub insanlar,
Yoxsullara çox olubdur gülənlər,
Müftəxor keşişlər, bəylər və xanlar,
Hökumət onlara tərəfdar olub.

Puşkin baxdı tamam səhv, nöqsana,
Doqquz qadın nigahlıdır bir xana,
Gecə-gündüz çıxa bilmir bir yana,
Onlar da o zülmə giriftar olub.

Başladı şeirlə nöqsan yazmağa,
Zalım Nikolaya qəbir qazmağa.
Yazdığı sözləri yüz il qabağa,
Bizlərə nəsihət yadigar olub...

Ariflər, oxuyun mətləbi qanın,
Qüvvətli bir nəsihətdir inanın,
Belə sözlər o hökmüdar soltanın
Batıb gözlərinə bir xəncər olub.

Puşkin böyük şair olubdu gerçək,
Öz zehnilə gələcəyi biləcək,
Dedi yəqin bir zəmanə gələcək
Ki, mənim şöhrətim dil əzbər olub.

Sovetlər rəhbəri sən daim yaşa,
Gör nə zinət verdin qiymətli daşa,
Hüseyn bu barədə az düşüb başa,
Onunçün sözləri müxtəsər olub.

Puşkin tarix deyil, keçmiş deyildir, o bizim müasirimizdir. Biz sosializm dövrünün böyük və ən qabaqcıl poeziyasının yaradıcıları həmişə Puşkindən dərs almış və alacağıq.

Puşkin zülm və istibdadın düşməni, azadlıq və səadət müğənnisi idi. Onun gözəl poeziyasındakı insanpərvərlik duyğuları indi də azadlıq və istiqlaliyyət düşmənlərinə, Amerika və ingilis imperialistlərinə qarşı mübarizədə, bütün və hər cür müstəbidlərə qarşı mübarizədə Sovet İttifaqı xalqlarına kömək edir.

Puşkin yubileyi şənlikləri yüksələn sosialist mədəniyyətimizin bayram şənliyidir; əsrlərdən bəri qızğın vuruşmalarda və əmək cəbhəsində xalqımızın qazandığı ən yaxşı nailiyyətlərin təntənəsidir.

Puşkin poeziyasının bizimlə birlikdə qalib gəlməsinin səbəbi odur ki, bütün dünyada kommunizm poeziyası, insanlıq və tərəqqi poeziyası, xalqlar qardaşlığı poeziyası qalib gəlir.

*1949*

# ŞƏRƏFLİ YOL

Hər xalqın tarixində müəyyən mədəni hadisələr olur ki, onların mənası yalnız o hadisələrin spesifik sahəsi ilə məhdudlaşmır, bütün xalq mədəniyyətinin mənası, təntənəsi, tərəqqi və gözəllik simfoniyası kimi səslənir. Xalq bu simfoniyaya qulaq asdığı zaman öz tarixi, keçmiş olduğu şərəfli mübarizə yolları ilə, qəhrəmanlıq və fədakarlıq sifətləri ilə, insan mədəniyyəti tarixinə verdiyi elm, sənət və mədəniyyət incilərilə bir daha fəxr edir. Bu iftixar hissi xalq dühasını, xalq qüdrətini zəiflətmir, əksinə, onun qarşısında daha geniş inkişaf yolları açır. Xalq öz tarixi mövqeyini və mədəni əhəmiyyətini bir daha dərk edir.

Əzizbəyov adına Azərbaycan Dövlət Dram Teatrının 75 illik yubileyi də yuxarıda qeyd etdiyimiz qeyri-adi bir hadisədir.

Biz bu xalq təntənəsini qeyd etdiyimiz zaman 75 il müddətində yazılmış qalın, mənalı və şairanə bir kitab təsəvvür edirik. Bu böyük əsərin müəllifi ayrı-ayrı şəxsiyyətlər deyil, xalq dühası, xalq qələmidir.

Biz bu qalın kitabı vərəqləyib oxuduqca, onun müxtəlif və rəngarəng səhifələrinə diqqət yetirdikcə, xalqımızın əsrlərdən bəri yaşayıb-yaratmış olduğu həyat səhnələri, onun iztirab və işgəncələri, hünər və qəhrəmanlıq, azadlıq və səadət eşqi, ümid və arzuları, qənaət və zövqləri gözümüz qarşısında canlanır.

Qanuni olaraq mübahisəsiz bir qənaətə gəlirik: ta qədim zamanlardan başlamış, ərəb xəlifələrinin qılınc və nizələrinə sinə gərən, İran şahlarının, Türkiyə paşalarının xəyanət və cinayətlərinə, qəsbkarlıq niyyətlərinə qarşı meydan oxumuş qəhrəman xalqımızın həyat və mübarizə iradəsi tarixin zülmətlərində sönmədi; o, bir xalq olaraq özünü, öz vətənini, öz varlıq və tarixini yaşatdı. Bu böyük inkişaf yolunu bütün vüsətilə düşünmək istəyən hər kəs teatrımızın repertuarlarını bir daha nəzərdən keçirsin.

"Hacı Qara"lar", "Dərviş Məstəli şah"lar dövrü nə qədər uzaqda qalmışdır. Biz o dövrlərə nisbətən nə qədər yüksəklərə qalxmışıq!.. "Müsibəti-Fəxrəddin"lər, "Bəxtsiz cavan"lar dövrü nə qədər geridə qalmışdır! Elxan–Babək ərəb xəlifələrinə qarşı 25 il qılınc müharibəsi apardı. Xalqımızın qüdrəti müvəqqəti olaraq məğlub oldu. Azərbaycan xalqının boynuna zəhərli bir ilan kimi sarılmış islam şəriəti bizim milli varlığımızı əsrlər boyunca çeynədi, təhqir etdi. Şəriət əbasına girmiş "Ölülər" canlı insanları goreşənlər kimi yemək istədi.

Anamızın dilini, “Anamızın kitabını” bizə vaxtilə qadağan etdilər, “ərəb dili”, “fars dili”, “türk dili” deyə satqın və alçaq pantürkistlər, panislamistlər, müsavatçılar bağırışdılar. Azərbaycan xalqının gözəl ana dilini inkar etdilər, bizi bir xalq olaraq məhv etməyə çalışdılar.

Azadlıqsevən Azərbaycan xalqı bütün tarix boyu öz silahını yerə qoymadı, böyük bir iradə ilə öz istiqlaliyyəti və səadəti uğrunda çarpışdı.

Nizami Əxsitanla, Vaqif Qacarla, Koroğlu xanlar və paşalarla, Qaçaq Nəbi bəylər və feodallar ilə, Səttar xan İran şahları ilə üz-üzə gəldi, qılınclar qına, qələmlər qələmdana sığmadı. Xalq hərəkatı, xalq həqiqəti məşəqqətlər çəkdi, lakin məhv olmadı.

Bütün yuxarıda qeyd etdiyimiz xalqımızın həyat və mübarizə səhnələri, onun qəhrəmanlıq sifətləri teatrımızın 75 illik səhnəsində canlandı, nəsildən-nəslə tamaşa olundu.

II

Xalqımız XX əsrin fəhlə hərəkatı və inqilablar tarixinə qızıl səhifələr yazdı. Paytaxtımız Bakı şəhəri 1905-ci il rus inqilabının, fəhlə hərəkatının böyük ocaqlarından biri oldu. Bütün Qafqaz xalqlarını, Yaxın Şərq ölkələrini orta əsr yuxusundan ayılmağa, kapitalizm əleyhinə mübarizəyə, sosializm və kommunizm uğrunda mübarizəyə dəvət etdi...

Azərbaycanda sovet dövləti qurulduqdan sonra daxili əks-inqilab qüvvələri dondan-dona, cilddən-cildə girərək gənc sovet respublikamızı öz içindən çürütməyə cəhd etdi. Mübarizənin ən gərgin və mürəkkəb şəkilləri məfkurə sahəsində, elm, ədəbiyyat, incəsənət sahəsində təzahür etdi.

Elmi, ədəbiyyatı, bütün məfkurə sahəsini fəhlə və zəhmətkeş kəndli sinfinin mənafeyinə, əməl və arzularına qarşı qoymaq istəyən, onları proletar mənafeyindən ayırmaq istəyən pantürkistlər və müsavatçılar gənc sovet mədəniyyəti əleyhinə həyasız bir mübarizə meydanı açdı. Əksinqilabçı və irticaçı güruhların “məfkurə”sini ifadə edən “şairlər”, “ədiblər”, “nəzəriyyəçilər” “şairin mövqeyi dağ başındadır”, “sənət sənət üçündür”, “şeir pərisinin qanadları yerə enməz” şüarları ilə meydana atıldılar. Əslində isə onlar ölən siniflərin, ölən dünyanın matəmini tutan, onların xərabələri üzərində ötən bayquşlar idilər...

Gərgin mübarizə səhnələrindən biri də Azərbaycan Dövlət Dram Teatrı oldu. Uzun illərin mübarizəsi nəticəsində teatrımız “Ağac kölgəsində”, “Laçın yuvası”, “Dağılan tifaq”, “Od gəlini”, “1905-ci ildə”, “Yaşar”, “Almas”, “Sevil”, “Həyat”, “Madrid”, “Vaqif”, “Xanlar”,

“Qaçaq Nəbi”, “Dumanlı Təbriz”, “Qatır Məmməd”, “Nizami”, “Vəfa”, “Şərqin səhəri”, “Toy”, “Bahar suları” və bir çox başqa tamaşalar göstərdi.

Bu tamaşaların qarşısında düşmənlərimizin yazdıqları əsərlər həm öz məfkurəsi, həm də bədii təsiri etibarilə sönüb getdi. Onlardan xalqımızın hafizəsində heç bir xatirə qalmadı. Çünki xalq hafizəsi yalnız xalqın əməllərini, arzularını tərənnüm edən əsərləri yaşadır, özünə yad və düşmən əsərləri isə nifrətlə qarşılayır. Demək istəyirəm ki, sovet mədəniyyəti ordusunun pantürkizm və kosmopolitizm ilə apardığı tarixi mübarizədə teatrımızın xidməti olduqca böyükdür.

Teatrımız öz 75 illik fəaliyyəti tarixində Mirzə Fətəli Axundovdan başlayıb bu günə qədər davam edən Azərbaycan dramaturgiyasının qüvvətli realist üslubuna sadiq qalmışdır. Milli teatrımızın realistik üslubunun inkişafında, onun məzmun və şəkilcə inkişafında böyük rus dramaturqlarının (Ostrovski, Çexov, Qoqol) əsərlərinin, həm də Stanislavski məktəbinin müsbət və zəruri təsirini minnətdarlıq hissilə qeyd edirik.

Azərbaycan Dram Teatrı xalqımızı dünya dramaturgiyasının gözəl inciləri ilə, xüsusən Şekspirin ən böyük əsərləri ilə tanış etmək işində də qiymətli xidmət göstərmişdir.

Biz bu gün teatrımızın 75 illiyini bayram etdiyimiz vaxt bilirik ki, teatrımız yalnız Sovet dövləti qurulduqdan sonra əsil mənada mütəşəkkil və professional teatr şəkli aldı. Yalnız sovet dövlətinin qayğısı ilə teatrımız özünə sabit və zəngin bir repertuar, rejissor və aktyor kollektivi yaratdı, mədəniyyətimizin böyük ocaqlarından biri oldu.

Bugünkü tamaşaçılar teatrımızın bədii rəhbəri, Stanislavski məktəbinin gözəl şagirdlərindən sayılan istedadlı rejissor Adil İskəndərovun xidmətinə yüksək qiymət verirlər, Məmmədov, Şərifov, Turabov, Ələkbərov kimi mahir rejissorların tamaşaları ilə fəxr edirlər. Görkəmli teatr xadimlərimizdən İ.Hidayətzadə və R.Təhmasib Əzizbəyov adına teatrda boy atıb yetişmişlər.

Teatrımızın fəxri M.A.Əliyev, Sidqi Ruhulla, Rza Əfqanlı, Ələsgər Ələkbərov, Əli Qurbanov, Kazım Ziya, İ.Dağıstanlı, A.S.Gəraybəyli, M.Sənani, Ə.Sultanov, M.Mərdanov, İ.Osmanlı və başqa aktyorlarımız geniş tamaşaçılarımız tərəfindən sevilir. Xüsusən sovet dövründə yaranmış aktrisalarımızın inkişafı bizi sevindirir. Mərziyə Davudova, Fatma Qədri, Yeva xanım, Sona Hacıyeva, Barat Şəkinskaya, Hökümə Qurbanova, Əminə Sultanova, Mirvari Novruzova, Sofiya Bəsirzadə,

Leyla Bədirbəyli, Məhluqə Sadıqova və başqaları teatrımızın səhnəsində boy atmışlar.

"Sevil"in, "Yaşar"ın, "Həyat"ın, "Almas"ın, "Toy"un, "Bahar suları"nın və müasir həyatımıza həsr edilmiş başqa tamaşaların müvəffəqiyyəti bir daha sübut etdi ki, teatrımızın div addımları ilə inkişafı üçün müasir həyatımız, insanlarımızın mübarizə və məişəti böyük bir zəmin yaratmışdır!

Teatrımız, bununla yanaşı olaraq, xalqımızın keçmiş tarixinə də biganə qalmadı və qala da bilməzdi. Lakin teatr tariximizə fəal bir münasibət bəslədi, sosializm dövrünün mənafeyi nöqteyi-nəzərindən yanaşdı. O, tariximizin yalnız proqressiv və inqilabi səhifələrini nümayiş etdirdi ki, bunlar sosializm işinə az xidmət göstərmədi.

Xalqların dostluğu və qardaşlığı sosializm inqilabının ən müqəddəs bir qələbəsidir, bütün quruluşumuzun əsasıdır!

Bu mövzu hər zaman teatrımızın repertuarında şərəfli bir yer tutmuşdur. "1905-ci ildə", "Vaqif", "Xanlar", "Şərqin səhəri", "Qaçaq Nəbi" və başqa bu kimi xalqlar dostluğuna həsr edilmiş əsərlərin müvəffəqiyyəti də təsadüfi deyildir...

Teatrımız inqilabi və demokratik fikirləri Yaxın Şərqdə, xüsusən İranda yaşayan xalqlar arasında intişar etdirməkdə də az fəaliyyət göstərməmişdir. Yeri gəlmişkən bunu da qeyd edək ki, Azərbaycan teatr mədəniyyəti öz 75 illik tarixi boyunca bir çox Orta Asiya xalqlarının, İran xalqlarının teatr mədəniyyətinə çox müsbət təsir bağışlamış, onların yaranmasında tarixi bir rol oynamışdır!

Qoy dramaturgiyamız və teatrımız daha geniş yaradıcılıq yolları ilə addımlasın, öz repertuarını ildən-ilə zənginləşdirərək, sovet insanlarının cahanşümul mənasını öz rübabında simfoniyalar lisanı ilə tərənnüm etsin, bizim qalibiyyət günlərimizi, dünya imperializminin isə ölüm günlərini yaxınlaşdırsın!

*1949*

## MÜƏLLİMİMİZ VƏ DOSTUMUZ

Dünya poeziyasına Nizami kimi ölməz sənətkarı, bacarıqlı söz ustaları, məhəbbət və xoşbəxtlik nəğməkarı Füzuli və Xətaini, Vidadini və Vaqifi vermiş olan Azərbaycan xalqı başqa xalqların şairlərinin

yaratdıqlarını da yüksək qiymətləndirir. Lakin nə Bayron, nə Höte, nə Homer, nə Dante, nə Firdovsi, nə Hafiz – heç kəsin ötüb keçə bilmədiyi realist şair, azadlığın və xalq səadətinin alovlu nəğməkarı Aleksandr Sergeyeviç Puşkin qədər Azərbaycanda ümumxalq məhəbbəti qazanmamış və onun qədər məşhur olmamışlar.

Puşkinin müasiri, Azərbaycanda realist ədəbiyyatın banisi, görkəmli, filosof-demokrat Mirzə Fətəli Axundov şairin faciənə surətdə məhv olması haqqındakı kədərli xəbərə Şərqdə birinci səs vermişdir. Onun "Puşkinin ölümünə" poeması dərin dərd və kədər hissilə, böyük şairə əl qaldırmış kübar cəmiyyətinə qarşı qəzəb və nifrət hissilə doludur:

Söz ustalarının ordusunun başçısı Puşkindən
bir şey eşitməmişsən?
O Puşkin ki, onun dərin mənalı şeirlərinə
Hər tərəfdən yüzlərcə tərif səsləri yüksələrdi.
O Puşkin ki, onun qələminə meydan olmaq arzusu ilə
kağızın günü qara idi.
Onun xəyalı tovuz kimi hər bir gəzişi ilə
Sözdən minlərcə qəribə nəqşlər göstərərdi.

Biz azərbaycanlıları xüsusilə sevindirən odur ki, bu misralar Azərbaycan xalqının milli iftixarı olan bir adam tərəfindən yazılmışdır. M.F.Axundov "Puşkinin ölümünə" poemasında Puşkin yaradıcılığının dünya əhəmiyyəti haqqında böyük bir heyranlıq hissi ilə danışır:

Lomonosov təbinin gözəlliyi ilə nəzm evini bəzədi,
Puşkinin xəyalı isə orada qərar tutdu.
Əgər Derjavin söz mülkünü tutdusa,
O mülkün hökmranı və nizama salanı Puşkin oldu.
Karamzin ürfan şərabından bir cam doldurdu,
O şərabı dolu camdan içən Puşkin oldu.
Nikolayın cəlalı Çindən Tatara qədər tutduğu kimi,
Onun fəzilətinin şöhrəti də dünyaya yayıldı.
Təzə ay şərqlilərin göstəricisi olduğu kimi,
Onun barmağı da Şimal fəzasında bir göstərici idi.
Bu düşüncədə, belə bir təbə malik oğulu
Dörd ana, yeddi atadan doğmamışdır...

Axundov poeziyanın fəth olunmalı həqiqi zirvələrini öz müasirlərinə nə qədər də düzgün göstərmişdir! Xalqımızın taleyini rus xal-

qının tarixinə qardaşlıq telləri ilə bağlayan bizim şanlı babalarımıza eşq olsun! Xalqımızın ən böyük mənəvi nailiyyətini – böyük rus mədəniyyəti ilə ideya və yaradıcılıq əməkdaşlığını bizə irs qoyub getmiş Axundov və onun davamçılarına eşq olsun!

XIX əsrin böyük rus inqilabçı demokratları, qabaqcıl rus yazıçıları nəinki Azərbaycanda ictimai fikrin inkişafına, habelə bizim realist ədəbiyyatın ideya-bədii inkişafına da böyük təsir göstərmişlər. Belinski, Çernışevski, Dobrolyubov, Puşkin, Lermontov, Qoqol, Tolstoy, Qorki bizim klassiklərə – Axundova, Bakıxanova, Həsən bəy Zərdabiyə, Haqverdiyevə, Molla Nəsrəddinə, Sabirə, həmçinin Cəfər Cabbarlıya və digər Azərbaycan yazıçılarına çox şey vermişlər. Azərbaycan sovet ədəbiyyatını yaradarkən biz həm öz milli ədəbiyyatımızın ən yaxşı realist ənənələrinə, həm də böyük rus klassik və sovet ədəbiyyatının mübariz ənənələrinə möhkəm surətdə arxalanırıq... Biz dostumuz və müəllimimiz Puşkinin bütün əsərlərini tərcümə etmişik və bununla da Puşkin yaradıcılığının xəzinəsini bütün Azərbaycan xalqının malı etmişik.

Mənim öhdəmə "Yevgeni Onegin"i ilk dəfə Azərbaycan dilinə tərcümə etmək kimi böyük və şərəfli bir iş düşmüşdür. Belə bir yaradıcılıq cəsarətinə getməyə və üçillik yaradıcılıq həyatımı bu işə verməyə məni nə məcbur etmişdir?

Adamın elə dostu olur ki, ondan heç bir şeyi gizləmirsən, ona hər şeyi etibar edirsən. Belə dost həm sənin xoşbəxt günlərində, həm də sənin bədbəxt günlərində xəbərdarlıq etmədən sənin yanına gəlir. Onun gəlişinə həmişə sevinirsən. Sən istəyirsən ki, öz fikirlərini, sevincini, dərdini onunla bölüşəsən, istəyirsən ki, onun müdrik və səmimi məsləhətlərinə qulaq asasan. Belə bir dost olmayanda bəzən həyat ağır və darıxdırıcı olur.

Hələ otuz il bundan əvvəl mən on iki yaşımda Azərbaycanın uzaq Salahlı kəndində oxuyarkən A.S.Puşkin belə bir dost kimi mənim həyatıma daxil olmuşdur. Vaqif kimi o da nəinki mənim yaxın dostum, eyni zamanda müəllimim olmuşdur.

Uşaqlıq və gənclik illəri keçib getdi, indi artıq otuz ildir ki, poeziya mənim üçün əsas həyat işidir. Bütün bu illər ərzində mən Puşkinin gözəl poeziyasına, onun gözəl, təmiz xəlqiliyinə bəslədiyim məhəbbətə sadiq olmuşam. Mən Puşkinin şeirləri və poemalarını tez-tez yenidən oxuyuram, hər dəfə onları oxuyanda mənim təsəvvürümdə yüksək fəzalara doğru ucalan bir qartalın xəyalı canlanır.

Puşkinin əsərlərində xalqın arzu və xəyalları ilə qanadlanmış, səadətə can atan bir şairin nəfəsi duyulur.

Puşkin poeziyası, nəinki cənubun isti yay günlərində, habelə şimalın dondurucu qışında da insanın susuzluğunu yatıran həmişə saf və təmiz bir dağ bulağının suyuna bənzəyir, bu bulaq heç bir zaman donmur.

Mən bütün həyatım boyu Puşkindən öyrənmişəm və öyrənirəm. Onun yaradıcılığı mənim üçün böyük bir poetik məktəb olmuşdur. Əgər şair öz ideallarının və yaradıcılıq meyllərinin istiqaməti ilə bu məktəbə bağlanırsa, əgər böyük və əvəzsiz bir məhəbbət onu Puşkinə tərəf çəkirsə, bu məktəb şairə çox şey öyrədə bilər. Mən deyərdim ki, belə bir qarşılıqlı ruhi bağlılıq olmadan hər hansı bir yaradıcılıq öz mənasını itirir və kor, simasız, ruhsuz bir təqlidçiyə çevrilir.

Mən "Yevgeni Onegin"i ona görə tərcümə etdim ki, bu əsər məni nəinki bir oxucu, həmçinin bir şair kimi də cəlb etdi.

Mənim tərcümə üzərindəki işim çətin və mürəkkəb idi. Etiraf edirəm ki, mən öz orijinal əsərlərimdən heç birinə "Onegin"in tərcüməsi üzərində işlədiyim vaxtdakı qədər zəhmət və enerji, o qədər yuxusuz gecələr sərf etməmişəm. Nəhayət, 1936-cı ildə tərcüməni tamamlayıb son nöqtəni qoyarkən, mənə elə gəldi ki, bir dağı yerindən dəbərtmişəm... əsər özü, yaxın bir dost kimi, iş zamanı məni mənəvi ruhlandırır və bütün çətinlikləri aradan qaldırmağa kömək edirdi. Bu əsər məni o qədər özünə cəlb etmişdi ki, artıq geri çəkilə bilməzdim.

"Yevgeni Onegin"in tərcüməsi üzərindəki işin mənə nə verdiyini yalnız sonralar bütünlüklə başa düşdüm. Bu əsər bir şair kimi mənim qarşımda sonralar "Komsomol", "Vaqif", "Xanlar" kimi əsərlərimdə həyata keçirdiyim fikirlərimə geniş bədii imkanlar açdı. "Onegin"i tərcümə edərkən mən inandım ki, mənzum şəkildə də xalq həyatını bütün rəngarəngliyi ilə inikas etdirən geniş epik, realist əsərlər yazmaq mümkündür.

Puşkinin öz əsərlərində insanların, xüsusilə qadınların realistik və düzgün obrazlarını yaratmaq bacarığı məni xüsusilə özünə cəlb etdi. Puşkinin Tatyanası mənim üçün böyük mənalı bir kəşf oldu. Bu obrazı dərk edəndən sonra mən Şərq poeziyasında bir çox obrazların mücərrəd və abstrakt xarakterini başa düşdüm. Mən bir növ bu obrazları yeni şəkildə gördüm. Nizami və Füzuli tərəfindən tərənnüm edilmiş Leyli obrazı bütün məlahətinə baxmayaraq, yalnız poetik fantaziyanın məhsulu kimi gözəldir. Bu obraz həyatda yaşayan insanın canlı və real nəfəsilə yaşamır. Yalnız Vaqifin qadın obrazları bir növ Puşkinin qadın

obrazlarına yaxındır. Vaqifin təsvir etdiyi qadınlarda biz mücərrəd qadın cizgilərini deyil, Azərbaycan qadınının milli cizgilərini görürük.

Məlumdur ki, Puşkinin poemalarında şairin həyat və dünya haqqında mühakimələrinin ifadə olunduğu lirik ricətlər böyük yer tutur. Mən bu ricətləri də böyük şairdən öyrəndim. Bəziləri belə hesab edirlər ki, şairin poemada və ya romanda lirik ricətlərə çıxması artıqdır, əsərdə təsvir olunan həyat hadisələri haqqında həmin hadisələr özləri danışmalıdır. Mən bu fikirlə şərik deyiləm. Bundan başqa mən belə hesab edirəm ki, belə mühakimələr realizmin əsil təbiətinə ziddir. Əgər şairin fikirləri və ideyaları onun əsərinin süjet çərçivəsindən kənara çıxırsa, şair nə etməlidir? Şair bu fikirlərindən imtina etməlidirmi? Yox? Belə hallarda lirik ricətlər süjetin çərçivəsini genişləndirir, əsərin daxili inkişafına kömək edir və əsərdə təsvir olunmuş həyati hadisələri və insanları bir növ böyük poetik fikrin qanadları üzərində yüksəldir. Əlbəttə, bu qəbildən olan poetik fikirlərin özü də, Puşkinin poeziyasında olduğu kimi, təbii və üzvi surətdə əsərin özündən doğmalıdır.

Puşkinin əsərini tərcümə edərkən məndə yaranmış bəzi fikirlər belədir.

Mən öz bacarığım dairəsində çalışmışam ki, tərcümədə Puşkin şerinin sadəliyini, onun dilinin lakonizmini, fikir və hisslərinin böyük zənginliyini, ölməz aforizmlərini, Onegin bəndlərinin obrazlarını və zahiri formasını ifadə edəm.

"Yevgeni Onegin"i bu il mən, demək olar ki, ikinci dəfə yenidən tərcümə etmişəm.

Biz sovet şairləri dövrün ən qabaqcıl poeziyasını yaradırıq. Bu böyük və nəcib zəhmətdə bizə nəinki Puşkinin nurlu xatirəsi, habelə onun həmişə canlı, təsirli və həqiqi bədii sözü də kömək edir.

Əbədi canlı olan yaradıcılığı üçün Aleksandr Sergeyeviç Puşkinə eşq olsun! Puşkinin dühasını yetişdirmiş böyük rus xalqına eşq olsun!

*1949*

## ƏDƏBİYYATIMIZIN FƏXRİ

Azərbaycan sovet ədəbiyyatının fəxri, bütün sovet ədəbiyyatının simalarından biri olan C.Cabbarlının xatirəsi bütün sovet xalqı üçün daim əzizdir!

Cəfər Cabbarlının adı çəkiləndə sadəcə dillər deyil, canlı ürəklər danışır... Nə üçün? Çünki o, ürəkləri fəth edən bir sənətkardır. Milyon insanların, xüsusən əməkçi insanların həyat, məişət və mübarizə səhnələrindən ilham alan sənətkar öz şair rübabını ürəklə çaldı. İnsanlara hörmət və məhəbbət sovet insanlarına, sovet yazıçısına xas olan böyük və əsil bir humanizm Cəfər Cabbarlının ən nəcib sifəti idi. Onun humanizmi köhnə dünyanı, “ağalar və qullar” dünyasını uçurub, yeni dünya quran insanların humanizmi idi. O, həyat və mübarizə nəğməkarı idi. O, yalnız qəhrəmanları – öz zəhməti, işi və hünəri ilə tarixi dəyişən, qabaqcıl və inqilabi əməllərlə yaşayıb-yaradan qəhrəmanları sevərdi, onları tərənnüm edərdi. O özü də böyük bir qəhrəman idi. O da cəbhələr yardı, qara qüvvələrlə, əksinqilabi cərəyanlarla döş-döşə gəldi, mübarizədə yorulmadı, qalib çıxdı. Kimə? Azərbaycan xalqının tarixini, şanlı və şərəfli inqilabi keçmişini inkar edən, səhnəmizi ərəb peyğəmbərlərinin, Türkiyə sultanlarının, İran şahlarının tribunasına çevirmək istəyən pantürkist yazıçılara, “şerin, sənətin mövqeyi dağ başıdır, göylərdir” deyən idealistlərə, sosializm ədəbiyyatının inkişafına əngəllər törədən əksinliqabçılara, köhnə dünyanın xarabaları üzərində yas tutan bayquşlara qalib gəldi.

Bu gərgin və mürəkkəb mübarizədə Cabbarlı da bütün sovet yazıçıları kimi, milyonlarla əməkçi insanın iradəsinə arxalandı... Buna görə də onun ədəbi üslubu, əməl və arzuları qalib gəldi, dramaturgiyamızda yeni məzmunlu, yeni formalı sosialist realizminin təntənəsi kimi səslənən ədəbi bir məktəb yaratdı. Cabbarlı yaradıcılığının qüvvətli və rəngarəng xüsusiyyətləri bütün dramaturgiyamızın sosializm realizmi əsasında tərəqqi və inkişaf etməsinə təkan verdi. “Od gəlini”, “1905-ci ildə” əsərləri ilə Azərbaycan xalqının müstəqil milli tarixini, inqilab tarixini hamıdan qüvvətli bir səslə C.Cabbarlı təsdiq etdi, tərənnüm etdi. Biz Elxan – Babək simasında qəhrəman xalqımızın vüqarı, vətən eşqi, qəhrəmanlıq iradəsilə fəxr etdik. Biz “1905-ci ildə” əsərinin tamaşalarında Azərbaycanın, Bakının inqilab tarixini, babalarımızın sosializm inqilabı dastanına yazdığı səhifələri vərəqlədik, dönə-dönə ayağa qalxdıq, inqilab ordusunu dönə-dönə alqışladıq. Biz özümüzlə, öz tariximizlə fəxr etdik, sevindik, ucaldıq. Dənizdə tufan başladıqda böyük və güclü bir dalğa tərpənir. Onun cərəyan təzyiqi nəticəsində yaranan yeni dalğalar öz başlanğıcından ayrılmayaraq qüvvətli bir silsilə təşkil edər. İctimai fikir tarixi də, ədəbi-bədii şüur

tarixi də belədir. “Od gəlini“, “1905-ci ildə“ olmasaydı, “Vaqif“ də, “Xanlar“ da, “Fərhad və Şirin“ də, “Nizami“ də, “Qaçaq Nəbi“ də, “Qatır Məmməd“ də, “Şərqin səhəri“ də tam mənası ilə yarana bilməzdi. “Almaz“, “Yaşar“, “Sevil“ olmasaydı, “Həyat“ da, “Məhəbbət“ də, “Toy“ da, “Vəfa“ da, “Bahar suları“ da tam mənası ilə yarana bilməzdi. Demək istəyirəm ki, Cabbarlı dramaturgiya sahəsində bizim hamımızın böyük müəllimimiz olmuşdur. Biz dram əsərlərimizin ən realist səhnələrindən, surətlərindən və mükalimələrindən zövq aldığımız dəqiqələrdə, ixtiyarsız olaraq xatirimizə Cabbarlı realizminin sadə və mənalı gözəlliyi düşür. Bu passiv bir xatirə olaraq qalmır, ədəbiyyatımızda realizmin, sosializmin həqiqətinin qüdrətini yeni boyalarla tərənnüm etmək üçün bizə daxili bir qüvvət verir.

Biz yuxarıda dedik ki, Cabbarlının xatirəsi bütün sovet xalqı üçün əzizdir. Bu ona görə ki, o, sözün əsil və geniş mənasında beynəlmiləlçi bir yazıçı idi. Onun yaradıcılığında milli məhdudluq olmadığına görə, o, bütün sovet xalqlarını alovlu bir məhəbbətlə sevərdi. Onun birinci rus inqilabına – 1905-ci il inqilabına həsr olunmuş məşhur əsəri ədəbiyyatımızda beynəlmiləlçiliyin ən canlı və parlaq ifadəsidir. Azərbaycan dram teatrının salonunda Azərbaycan dilini bilməyən, ya da yarımçıq bilən rus və gürcü yoldaşların bu əsəri dönə-dönə alqışlamaları, onların gözlərində alovlanan qardaşlıq duyğuları ədibin böyük beynəlmiləlçi qəlbinə hörmət deməkdir! Çox təəssüf ki, bu gözəl şairanə əsər böyük rus dilinə yaxşı tərcümə edilməmiş, Moskva, Leninqrad, Kiyev və başqa şəhərlərdə tamaşaya qoyulmamışdır.

Biz Cabbarlı yaradıcılığından nə kimi gözəl məziyyətlər öyrənməliyik? Əsrin qabaqcıl sənətkarı olmaq üçün zamanın ən mütərəqqi və inqilabi fikirləri ilə yaşamaq, tarixi hadisələrə, ictimai və mənəvi yeniliklərə marksizm-leninizmin mübariz dünyagörüşü ilə baxmaq əsas şərtdir! Məhz bu fəlsəfi görüş, yeniliklə köhnəliyin gərgin və mürəkkəb mübarizə prosesində saysız-hesabsız hadisələrin, fikri toqquşmaların qaynağında yazıçıya ən doğru yol göstərir, onu mürtəce fikirlərindən və zövqlərindən hifz edir, onun mənəvi aləmini həyatı daima irəliyə, inkişafa aparan əməllər və arzularla zənginləşdirir. Qısa desək, yazıçı tam mənası ilə öz əsrinin övladı və ideoloqu olur. Bunsuz, həqiqi mənada əsrin yazıçısı olmaq mümkün deyildir. Belə bir dünyagörüşü Cabbarlı sənətinin düşünən beyni idi. Məhz marksizm-leninizmin dünyanı idrak nəzəriyyəsi sayəsində Cabbarlı tarixə, ictimai və siyasi ha-

disələrə fəal və mübariz bir münasibət bəslədi. O, sosializm quruluşunu sadəcə təsvirlə kifayətlənmədi, bu yeni dünyanın – azadlıq və humanizm dünyasının mübariz bir qurucusu olmaqla fəxr etdi, sevindi, ucaldı... Hər sənətkarın ürəyində alovlanan məslək eşqi ona qol-qanad verən ən böyük qüdrətdir!

* * *

C.Cabbarlı gözəl bilirdi ki, sovet ədəbiyyatı milyonların ədəbiyyatı olmalıdır. Bu isə yalnız həyatı və tarixi yaradan milyon insanların – əməkçi insanların həyat və mübarizəsini tərənnüm etməklə yarana bilər. Odur ki, Cabbarlı öz əsərlərinin məzmununu “əfsanələr”, “xəyallar“ dünyasından deyil, insan tarixində yeni bir keyfiyyət olan sosializm həqiqətindən, bu həqiqəti yaradan insanların adi həyat və məişət tərzlərindən alırdı. O gözəl bilirdi ki, həyat həqiqəti, insan nəfəsi burjua romantiklərinin təbliğ etdikləri “xəyali aləmlərdən“ müqayisəsiz dərəcədə üstündür. O bilirdi ki, heç bir fantaziya həyat həqiqətinin nəfəsi olmadan məna kəsb edə bilməz, müasir kosmopolitlərin məfkurəsi kimi yurdsuz və vətənsiz qalar. Ədibin vətən eşqi çox böyük idi! Buna görə də onun ədəbi dili də milyonların dili oldu, onun bütün əsərlərini xalq öz ürək çırpıntısı, öz nəfəsi kimi qəbul etdi. Bu, sənətkar üçün ən böyük səadətdir!

Cabbarlı nəinki yaşadığı bütün əsrin ruhunu, hər dövrün, hər ilin və ayın belə nəbzini tutmağı, ictimai hadisələrin sabahını da görməyi xüsusi bir istedadla bacarırdı. Buna görə də Cabbarlı dövrün ən aktual məsələlərini bizim hamımızdan əvvəl qələmə alırdı. Müasir mövzu, müasir insan Cabbarlı sənətinin çarpan ürəyi idi. O, günün ən adi hadisələrindən böyük sənət dili ilə danışmağı, həm də dərin və mənalı danışmağı bacarırdı. Cabbarlının bütün yaradıcılığı, bizə bir daha sübut etdi ki, müasir həyat və müasir insan tərənnüm edilmədən böyük ədəbiyyat yaratmaq olmaz – müasir mövzu bütün ədəbiyyatımızın canı, nəfəsi, beyni və ürəyi olmalıdır... O, uzaq, tarixi mövzuları tərənnüm etdiyi zamanlar belə, onlara öz əsrinin övladı kimi canlı bir münasibət bəslədi. Buna görə də keçmiş tariximizin unudulmuş qəhrəmanları, həyat səhnələri yeni bir qüdrətlə səsləndi...

Böyük sənətkarların yaradıcılığına xas olan aydınlıq, mənalı və dolğun bir sadəlik – əsil xəlqilik deməkdir.

Bu nöqteyi-nəzərdən Cabbarlı əsərlərindəki şairanə bir aydınlıq, dolğun bir sadəlik bizi bu gün də heyran edir. O, bu mənada, öz sələfləri olan dahi dramaturqumuz M.F.Axundovun, Ə.Haqverdiyevin, S.Saninin, Nəcəfbəy Vəzirovun, C.Məmmədquluzadənin – ümumiyyətlə milli dramaturgiyamızın ən realistik və nəcib xüsusiyyətlərini inkişaf etdirdi, yeni bir mərhələyə qaldırdı. O, dünya dramaturgiyasının, xüsusən Ostrovskinin və Şekspirin ən gözəl sənət xüsusiyyətlərindən bir yaradıcı kimi istifadə etməyi bacardı. O, bütün ömrü boyu oxudu, düşündü, daşındı, öyrəndi... O, heç vaxt özündən müştəbeh olmadı, teatr salonunun hər alqışını yeni bir yaradıcılıq sifarişi kimi qəbul etdi.. Qaşlarını çatıb yeni həyat səhnələri, yeni mövzular, yeni əsərlər fikirləşdi... O qəlbən duyurdu ki, ümumən insanın, xüsusən sənətkar həyatının böyük mənası daim düşünmək, daim axtarmaq, daim duymaq və yaratmaqdır. O, bilirdi ki, bir anlıq sükut, bir anlıq hərəkətsizlik belə insan təbiətinə, sənətkar təbiətinə ziddir. Bütün ömrünü səmərəli keçirən sənətkara, yorulmaq bilmədən gecə-gündüz yaradan, beləliklə də öz əsrinin sürətilə ayaqlaşan bir sənətkarın nəcib ruhuna eşq olsun! Qoy Cabbarlının bu qəhrəmanlıq sifəti də bizim hamımıza bir nümunə olsun.

*1950*

## VLADİMİR MAYAKOVSKİ VƏ ŞERİMİZ

... Mayakovskinin ölümündən iyirmi il keçir. Bu müddət ərzində Mayakovski poeziyasını dərindən və hərtərəfli tədqiq edən əsərlər meydana çıxmalı idi. Doğrudur, bu illər ərzində yazılan bir sıra kitabları, məqalələri, ədəbiyyat xadimlərinin mülahizələrini, Mayakovskinin dost və müasirlərinin xatirələrini göstərmək olar. Lakin mən bütün bunların arasında Mayakovski yaradıcılığını mükəmməl bir şəkildə təhlil və tədqiq edən ümumiləşdirilmiş əsər göstərə bilmərəm.

Nə üçün indiyə qədər çap olunan bu əsərlərdən çoxu, özünü şairin silahdaşı və davamçısı hesab edən, Mayakovski sənətinə ən yaxşı qiymət verməyi ürəkdən arzu edən adamlar tərəfindən yazıldığı halda, bunlardan heç birində Mayakovski poeziyasının məfkurəvi-bədii təcrübələri dərindən ümumiləşdirilməmişdir?... Zənnimcə, bunun səbəbi odur ki, “Mayakovski bizim ən yaxşı və ən istedadlı şairimizdir” sözlərini təkrar edən həmin yoldaşlar öz fikirlərində, təhlil və qiymət-

lərində şairin yaradıcılığına, onun böyüklüyünü əsil mənada görməyə imkan verə biləcək tam və geniş bir ölçüdə yanaşa bilməmişlər. Məsələ poeziyamızın Mayakovski ilə yaradıcılıq əlaqəsini açıb göstərməyə gəldikdə onlar Mayakovski ənənələrini sovet dövrü, eləcə də bütöv halda bütün sovet poeziyası miqyasında deyil, bir neçə məşhur yazıçının şeir yaradıcılığı miqyasında götürmüşlər. Bizim bəzi ədəbiyyat xadimləri Mayakovski haqqında danışarkən, demək olar ki, rus poeziyası çərçivəsindən heç bir vaxt kənara çıxmırlar, Mayakovski və çoxmillətli sovet poeziyası kimi böyük mövzunu nəzərdən qaçırırlar (Mayakovski haqqında "Literaturnaya qazeta"da gedən müvəffəqiyyətsiz mübahisə buna acınacaqlı bir misal ola bilər).

Halbuki yalnız rus sovet ədəbiyyatının deyil, həm də Sovet İttifaqının başqa qardaş xalqları ədəbiyyatının tarixi inkişafını Mayakovskisiz təsəvvür etmək, onun poeziyasının bu xalqların ədəbiyyatına müsbət təsirini göstərməmək olmaz. Mayakovskinin bizim çoxmillətli sovet poeziyasına böyük və faydalı təsirini görmək və öyrənmək üçün ayrı-ayrı qardaş xalqların ədəbiyyat tarixini nəzərdən keçirmək, onun inkişafını izləmək lazımdır. İstər əvvəllərdə, istərsə də indi Mayakovskidən öyrənən və Mayakovski ənənələrini davam etdirən poeziyamız öz inkişafında ona çox borcludur. Zənn edirəm ki, Mayakovski ilə əməkdaşlıq, onun yaradıcılığı ilə möhkəm və canlı əlaqə ədəbiyyatın qarşısında duran daha böyük vəzifələri yerinə yetirməkdə bizə kömək edəcəkdir.

Mayakovski və çoxmillətli sovet poeziyası mövzusu özünün ciddi surətdə tədqiq edilməsini gözləyir. Bu toxunulmamış mövzu haqqında öz kiçik qeydlərimin, eyni zamanda, Sovet İttifaqının başqa şairlərinin çıxışlarının məna və əhəmiyyəti orasındadır ki, bütün bunlar gələcək tədqiqat işini genişləndirməyə təkan verə bilər, iyirmi ildən bəri Mayakovskinin şeir sənətinə dair tələblərini, onun ənənələrini müvəffəqiyyətlə yerinə yetirən poeziyamızın çiçəklənməsində Mayakovskinin böyük rolunu konkret surətdə aydınlaşdırar.

Mayakovski bir neçə dəfə Azərbaycanda olmuşdur. O, Bakını sevmiş və onun haqqında çox yazmışdır. Lakin indi mən bu barədə bəhs etməyəcəyəm. Mən burada başqa bir məsələni, Mayakovski poeziyasının tam vəhdət halında bizə, Azərbaycan şairlərinə nə qədər yaxın olmasını, illər boyu bu poeziyanın bizə nə kimi kömək etdiyini, ondan necə öyrəndiyimizi və öyrənməkdə olduğumuzu göstərmək istəyirəm.

Biz Azərbaycan şairləri iyirmi və iyirmi beşinci illərdə – sosializm uğrunda şiddətli sinfi mübarizə illərində müasirimiz Mayakovskinin böyük şair simasına rast gəldik. Biz onunla ön atəş xəttində görüşdük. Döyüş cəbhəsi çox geniş idi. Biz yalnız dövlət hakimiyyətimizi möhkəmləndirmək uğrunda mübarizə aparmırdıq. Mədəniyyətimizi, yenilik yaradan sosializm poeziyamızı inkişaf etdirmək uğrunda da döyüşlər gedirdi. Biz ədəbiyyat sahəsində açıqdan-açığa təzahür edən əksinqilabçılara qarşı, bütün geriliyə və mürtəce əhvali-ruhiyyələrə qarşı, özlərini "əsl sənət" nümayəndəsi cildinə salan, xalq içərisindən çıxıb ədəbiyyat sahəsinə gələn həqiqi yaradıcı qüvvələri görmək istəməyən dekadentlərə və simvolistlərə qarşı mübarizə aparırdıq.

Bu cəbhənin döyüş xətlərindən biri Azərbaycandan keçirdi. O zaman bizim, Sovet Azərbaycanında yetişən gənc şairlərin qarşısında böyük və çətin vəzifələr dururdu. Biz yalnız sovet ədəbiyyatının bu məfkurə düşmənlərinin şişirdilmiş yaradıcılığının xalqa zidd mahiyyətini ifşa etməklə kifayətlənə bilməzdik. Biz eyni zamanda yeni, sovet varlığını təsdiq edən sosialist poeziyası yaratmalı, onun böyük məfkurəvi-bədii üstünlüyünü sübut etməli, onun geniş kütlələr arasında rəğbət və nüfuzunu artırmalı idik. Çürüyüb məhv olan burjua-millətçi, dekadent poeziyası ilə mübarizədə biz M.F.Axundovun, Vaqifin, Zakirin, Sabirin realist demokratik ənənələrinə – Azərbaycan ədəbiyyatında sələflərimizin şanlı ənənələrinə arxalanırdıq. O zaman biz gənc şairlərdən bir çoxu xırda burjua poeziyasının – bədbinlik və düşkünlük ifadə edən poeziyanın təsirindən hələ tamamilə yaxamızı qurtara bilməmişdik. Poeziyada köhnəliyə, bizə yabançı olan hallara qarşı mübarizəni şiddətləndirməklə bərabər, eyni zamanda, öz şüurumuzdakı köhnəlik qalıqlarını təmizləmək, onlara üstün gəlmək lazım idi.

Otuzuncu ildən əvvəl yaradıcılığa başladığım ilk dövrü xatırlayıram. Yeni həyat, bu həyatın iqtisadiyyatda, məişətdə, xalq kütlələrinin psixolojisində əmələ gətirdiyi böyük dəyişikliklər bir şair kimi məni cəlb etdi. Xalqın sosializm uğrunda qəhrəman mübarizəsi mənə ilham verdi, tarixi dəyişən və yeni tarix yaradan fəhlə sinfinin və əməkçi kəndlilərin yeni surətləri məni məftun elədi. Bununla bərabər, o zaman mənim yaradıcılığımda tənhalıq, kədərli məhəbbət və idillik tərənnüm motivləri, "sakit" və "bəxtiyar" təbiətin "əbədi" və "soyuq" gözəlliyini tərənnüm etmək motivləri öz ifadəsini tapırdı.

Bu, nədən irəli gəlirdi? Ondan irəli gəlirdi ki, poeziya haqqında, nəyi tərənnüm etmək, həyatda nəyin "şairanə" olması və ya "şairanə" olmaması haqqında köhnə, sinfi cəhətdən yabançı təsəvvürlər mənə və yaşıdlarım olan başqa gənc şairlərə hələ hakim idi. Əlbəttə, bu təsəvvürlərə qarşı artıq bizim düşüncəmizdə şübhə və tərəddüdlər oyanmışdı. Lakin şeir yaradıcılığında yeniliyə, sosialist sənətinə doğru qəti dönüş yaradılması lazım idi. Yalnız belə bir dönüş bizim, yeni yazmağa başlayan gənc şairlərin burjuaziya estetikasının qanunlarından həmişəlik yaxa qurtarmasına kömək edə bilərdi.

Bu dönüşü Mayakovski yaratdı. O, tamamilə saf və aydın poeziya proqramı ilə şairlər mühitimizə gəldi.

O, eyni zamanda özünün "yüz cilddən ibarət partiyalı kitabçaları" ilə bizə köməyə gəldi. Bu da bizim üçün şeir yaradıcılığı sahəsində böyük kəşf oldu.

Onun yaradıcılığında sovet varlığı bütün zənginliyi ilə, şairanə boyalarla, forma gözəlliyi ilə, yeni şeir dilinin bütün parlaqlığı ilə öz əksini tapdı. O, bir bağban kimi bizi sovet həyatının gülüstanına gətirdi və dedi: – Budur, həqiqi poeziya buradadır!

Mayakovski yalnız yaradıcılığının böyük ideyalarla dolğun olan məzmunu ilə deyil, həm də bədii sözün misilsiz inandırıcılığı ilə bizim hamımızı özünə məftun etmişdir. Sovet vətənpərvərliyi, proletar internasionalizmi və beynəlxalq imperializmə nifrət motivləri heç bir şairin əsərində Mayakovskinin şeirlərində olduğu kimi bu qədər bədii bir qüdrətlə səslənməmişdir.

Mayakovski yaradıcılığının dərin partiyalılığı bədii təfəkkürün inkişafını yeni estetik bir səviyyəyə qaldırdı. Mayakovskinin poeziyası bizi yeni estetik meyarla, ədəbiyyatın partiyalılığı meyarı ilə silahlandırdı. Əlbəttə, bu da yalnız Azərbaycan sovet poeziyasının deyil, həm də bütün Sovet İttifaqı poeziyasının inkişafı üçün böyük əhəmiyyət kəsb etdi.

O zaman ədəbiyyat mühitində gəncləri düzgün yaradıcılıq yolundan azdıran, nəzəri cəhətcə hər cür yanlış fikirlər ortalığa atılırdı. Burada da Mayakovski öz poeziyası ilə şeir sənətimizin bir müəllimi kimi böyük tərbiyəvi vəzifəsini yerinə yetirdi. Mayakovskinin şeirləri bizim üçün sosialist estetikasının təcrübəli məktəbi oldu. Bu şeirlər sovet varlığını təsvir etmək məharətini bizə öyrətdi. Onlar bizim üçün örnək və timsal oldu. Biz gənc şairlər Mayakovskidən öyrənərək, yeni mövzular axtarıb tapır və öz yaradıcılığımızda bu yol ilə irəliləyirdik.

Doğrusunu desək, həmin dövrdə biz hələ "öz gücümüzə inanmayaraq çəkinirdik" və bəzən həyatın irəli sürdüyü böyük yaradıcılıq vəzifələri qarşısında dayanıb dururduq. Biz sovet şairləri Mayakovskiyə ona görə minnətdarıq ki, belə hallarda onun poeziyası bir dost, böyük yoldaş və "məchul" mövzuların igid kəşfiyyatçısı kimi köməyimizə çatdı, həqiqi yazıçı olmaq üçün bizdə yaradıcılıq cəsarəti tərbiyə etdi. Onun "V.İ.Lenin" və "Yaxşı" poemaları müasir dövrün ən böyük mövzularını yaratmaq işində yaradıcılıq cəsarətinin gözəl timsalı idi. Mayakovskinin şeir yaradıcılığı öz əhatə dairəsinin genişliyi, poetik vüsəti, dolğun obraz sisteminə malik olması, geniş bədii ümumiləşdirmə məharəti ilə bizi heyran edir və sevindirirdi. Mayakovskinin şeirləri bizi sovet həyatının hadisələrini bədii yaradıcılıqda geniş əhatə etməyə, qabaqcıl inqilabi ideyaları və böyük inqilabi hadisələri təsvir edən poeziya yaratmağa, həyata fəal surətdə bağlı olmağa çağırırdı.

Öz keçdiyim yaradıcılıq yoluna nəzər salanda aydın görürəm ki, bir şair kimi mənim inkişafımda, heç şübhəsiz. Mayakovski poeziyasının nəcib təsiri olmuşdur. Onun poeziyası indi də yaradıcılıq işində mənim yol yoldaşımdır.

Otuzuncu ildə yazdığım "Raport" və "Fanar" əsərləri bilavasitə Mayakovskinin təsiri ilə yaranmışdır. Bu şeirlər həmin illərdəki yaradıcılığımda bir dönüş idi. Bu əsərlərdə birinci dəfə Mayakovskinin yolu ilə gedərək, aydın və dürüst siyasi dildə öz fikrimi ifadə etmişəm. "Raport" şeri bilavasitə fəhlə sinfinə müraciətlə yazılmışdır, çünki mən gördüm ki, inqilabın hegemoniyası, ictimai inkişafın aparıcı qüvvəsi, yalnız şəhəri deyil, həm də o dövrdə geridə qalmış patriarxal kəndi yenidən quran inqilabi sinif – fəhlə sinfidir. "Fanar" şerində gələcəyə bəslədiyim inam tərənnüm edilir. Doğrudur, bu şeirlərdə sxematizm əlamətləri də olmuşdur, ancaq onlar mənim şeir yaradıcılığımı sosializm realizminin geniş yoluna çıxardı. Mayakovskinin poeziyasından öyrənmədən beynəlxalq əhəmiyyəti olan mürəkkəb siyasi mövzuları qavramaq mənim üçün çox çətin olardı. Bu mövzular "26-lar" və Georgi Dimitrovun mühakiməsinə həsr olunan "Ölüm kürsüsü" adlı poemalarımda öz əksini tapmışdır.

Bir müddət bundan əvvəl yazdığım "Zəncinin arzuları" poeması mənim üçün Mayakovskidən öyrənməyin ən əsaslı sübutu sayıla bilər. Burada mən Amerika və İngiltərə imperialistlərini ifşa edirəm. Bu əsər Mayakovskinin Amerika və Qərbi Avropa haqqındakı məşhur

şeirləri ilə səsləşir və həm də öz ruhu etibarilə, ictimai mövzunun bədii cəhətdən işlənməsi etibarilə Mayakovskinin mübariz, partiyalı poeziyasına yaxındır.

Mən bu xüsusda cəsarətlə danışarkən zənn edirəm ki, bu sözlər çoxdan bəri özlərini və yalnız özlərini Mayakovski yaradıcılığının yeganə davamçısı, onun yeganə varisi elan edən bəzi şairlərin “etirazına“ səbəb olacaqdır. Mən bu cür iddialar irəli sürməkdən həmişə uzaq olmuşam və yenə də uzağam. Mən möhkəm inanmışam ki, böyük şairin çoxcəhətli yaradıcılığı bizim sovet poeziyasına çox qüvvətli müsbət təsir etmiş və onda dərin izlər buraxmışdır. Poeziyamızda bu və ya digər cəhətdən Mayakovski yaradıcılığı ilə, onun novatorluq axtarışları ilə bağlı olmayan, onun şeir pafosu ilə səsləşməyən böyük və ya kiçik bir hadisə olduğunu təsəvvür edə bilmirəm.

Mən burada öz haqqımda danışdım və öz əsərlərimi xatırlatdım. Ona görə belə etdim ki, sovet poeziyasında Mayakovskinin şeir üsulu ilə yazan yalnız bir neçə “seçilmiş şairin“ Mayakovski yaradıcılığının davamçısı olması haqqında “uydurulan əfsanəni” bu misallar əsasında ifşa etmək mənim üçün daha asan idi. Şairlərin Mayakovski yaradıcılığına yaxınlığı onların Mayakovski kimi öz yaradıcılıqlarında nə dərəcədə partiyalı olmaları ilə, həyatımızın poeziyasını Mayakovski kimi məfkurəcə dolğun və inandırıcı tərənnüm etməsilə, həmçinin yaradıcılıqda Mayakovski kimi ehtiraslı və həyəcanlı, qüvvətli və vüsətli olması ilə müəyyən edilir. Burada Mayakovski poeziyasının bədii formasına yaxın olmaq ehtimalı da istisna deyildir. Lakin mən bu yaxınlığı Mayakovskini zahiri cəhətdən təqlid etməkdə, onun şeir üsullarını mexaniki surətdə Azərbaycan poeziyasının milli zəmininə gətirməkdə deyil, Mayakovskinin novatorluq prinsiplərinin tətbiq edilməsində – həyatımızdakı hadisələrin sosialist məzmununu daha dolğun bir şəkildə açıb göstərən konkret şeir forması axtarıb tapmaqda və bu məzmunu canlandıra bilməyən, əksinə olaraq, onu təhrif edən, yaxud nəzərdən qaçıran formanı qəti surətdə rədd etməkdə görürəm. Mayakovskinin şeir sənətinə gətirdiyi bədii təsvir vasitələri yeni Azərbaycan poeziyasını yaratmaqda bizə kömək etdi. Mayakovski yaradıcılığını izləyən qabaqcıl şairlərimiz Şərq poeziyasının köhnə qanun-qaydalarını vurub dağıtdılar, Azərbaycan milli poeziyasının inkişaf yolunu kəsən, ədəbiyyatda yeni ideyaları, anlayışları və həyat hadisələrini müstəqil ifadə etməyə mane olan rəsmi zahiri məşrutluğu kənara atdılar. Biz Maya-

kovskinin yolunu davam etdirərkən, şerin geniş xalq kütlələrinin həyatına bağlı olması üçün yeni formalar tapmağa və yaratmağa çalışdıq.

Azərbaycan poeziyasında dekadentliyin qalıqları, Mayakovski yaradıcılığına münasibətdə tamamilə əks mövqe tutmuşdular. Onlar Mayakovski poeziyasının formasını saxtalaşdırır və onu ideya məzmunundan ayırırdılar. Mayakovskinin şeirləri üzərində bu cür manipulyasiya aparanlardan biri Rəfili kimi başabəla şairlər və başabəla ədəbiyyatşünaslar olmuşdur. Onlar Mayakovski yaradıcılığını əksinə qələmə verməyə, formalizm güzgüsündə göstərməyə cəhd edirdilər. Onlar Mayakovskinin novatorluğuna guya tərəfdar olduqları xüsusda hay-küy salaraq, Mayakovskinin meydana çıxmasında Puşkin, Lermontov, Nekrasov kimi sələflərin böyük rolu haqqında susurdular; onlar bir tərəfdən Mayakovski poeziyasında realizm və xəlqilik ənənələrini ört-basdır etməyə çalışır, o biri tərəfdən isə Azərbaycan poeziyasının inqilabi-demokratik ənənələrini və milli xüsusiyyətlərini inkar edirdilər. Onlar Mayakovskini sovet poeziyasında sosializm realizminin banisi kimi deyil, az qala onu yaradıcılıqda ideyasız bir eksperimentçi kimi göstərməyə cəhd edirdilər; onlar Mayakovskinin şeirlərini mahiyyət etibarilə satirik felyeton janrının dəyişən forması... adlandırırdılar.

Bu vətənsiz kosmopolitlər və dekadentlər öz cızmaqaralarını, öz mənasız şeirlərini Mayakovskini təqlid etməyin bir timsalı kimi qələmə verirdilər. M.Rəfilinin bir anekdot kimi dillərə düşən "Lirik şeirlər" kitabı buna misal ola bilər. Rəfili bu kitaba daxil edilən şeirlərindən birində özünü Qızıl meydanın daşlarına dəyib parçalanan sərçəyə oxşatmışdır. Bu alleqoriya xalq kütlələrinin inqilabi hücumundan qorxan xırda burjua ziyalısının iniltisini ifadə edirdi. Bəla burasındadır ki, Mayakovskini təqlid etmək pərdəsi altında Rəfili xalqa zidd dekadent motivlərini Azərbaycan ədəbiyyatına gətirməyə cəhd edirdi.

Bu hadisə bizə öyrədir ki, formalistlərin və onlara bənzər çürük və mənasız şeirlər yazmaq əhvali-ruhiyyəsi daşıyanların Mayakovskinin nüfuzundan istifadə edərək, öz iyrənc sifətlərini ört-basdır etməyə dəfələrlə çalışdıqlarını yaddan çıxarmayaq. Onların təhqiramiz hiylələri bütün ədəbi ictimaiyyət tərəfindən qəti surətdə dəf edilməlidir.

Mayakovski sovet poeziyasının müstəsna dərəcədə dürüst meyarını bizə öyrətmişdir. Bu poeziya, hər şeydən əvvəl, sovet dövrünün ən yaxşı, ən istedadlı şairinin yaradıcılığını bütün mənası və dolğunluğu ilə aydınlaşdırır.

Kommunayla ölçürəm.
Mən şerin növünü.
Kommunaya vurğunam,
Qəlbim
gülür,
sevinir.
Çünki
hər yüksəklikdən
yüksəkdir
Kommuna.
Dərinlikdə
yetişməz
heç bir dərinlik ona.

Budur, əsərlərimizin Mayakovskiyə yaxınlığını, sovet poeziyasında onun yaradıcılığının qüdrətini bu meyarla müəyyən etməliyik!

Mayakovski şeir yaradıcılığına diqqətlə və məsuliyyətlə yanaşmağı bütün ədəbiyyatçılardan tələb edirdi. Vladimir Mayakovski gənc şairlərə yaradıcılıq işində müstəqil təfəkkürə malik olmağı öyrədərək demişdir: "Hər bir şair özünün xüsusi səsinə malik olmalıdır". O, bir-birilə yarışda sovet poeziyasının sosialist məzmununun bütün zənginliyini açıb göstərə bilən ən yaxşı, ən bədii ifadə gözəlliyinə malik formalarını yaratmağa çağırırdı. O bizim hər birimizi peşəkar şair olmağa öyrədirdi. O, elə əsərlər yazmağa öyrədirdi ki, şairin hər bir misrası mübarizə və əmək şüarı kimi qəbul olunsun; o tələb edirdi ki, şairin hər bir əsəri sovet adamlarının ən yaxşı sifətlərini, onların vətənpərvərliyini, əmək qəhrəmanlığını parlaq bədii ümumiləşdirmə şəklində əks etdirsin.

Mayakovski belə şair idi. Onun istək və arzusu belə idi. Mayakovskinin bu tələblərini başa düşməyənlər onun ən pis təqlidçisi oldular. Onların hər bir əsəri, öz poeziyası ilə sənətkarlığa ən gözəl örnək olan Mayakovskinin həmişə uğrunda mübarizə apardığı ideyadan və müstəqil yaradıcılıq xüsusiyyətlərindən tamamilə məhrum qaldı. Onların əsəri xalqın həyat və mübarizə axınına qarışmadı.

Mayakovski bu gün də "canlı insan kimi" bizimlə danışır, bizimlə yanaşı irəliyə və yalnız irəliyə doğru addımlayır. Mayakovski öz səmimi, yüksək partiyalı və yüksək bədii poeziyası ilə bizimlə birgə zəfərlərə doğru addımlayır...

*1950*

# MÜQƏDDİMƏ

I

Lap bu yaxınlarda qədim Azərbaycan torpağının min illik əzab və əziyyətlərinin, ərəb xilafətinə və İran şahlarına qarşı mübarizədə xalqın qəhrəmanlıqlarının şahidi olmuş gur dalğalı Araz çayının o biri sahilində mən kədərli və fəci bir mənzərənin şahidi oldum.

Arazın o tayındakı dağların, çılpaq qayaların ətəklərində bom-boş bir kənd vardır. Mən heç olmazsa, bircə nəfər adam görmək, at kişnəməsi yaxud it hürüşü eşitmək ümidi ilə uzun müddət bu kəndə baxdım. Lakin, heyhat!.. Qarşımdakı bu kənddə heç bir həyat əlaməti yox idi.

Boz və çiy kərpicdən tikilmiş çoxlu ev sükuta qərq olmuş nəhəng qəbiristanlığın qəbir daşlarını xatırladırdı. Burada dəhşətli bir sükut hakim idi. Ömürlük aclıq, traxoma, yatalaq, vərəm kimi yoluxucu xəstəliklər bu kəndin əhalisini kütləvi surətdə qırmışdır. Sağ qalanlar isə doğma ocaqlarını tərk edib bir parça çörək ardınca didərgin düşmüşlər.

Bu kənd tək deyil. O, beş milyonluq əhalisi İran cəlladlarının zülmü altında inləyən İran Azərbaycanının yüzlərlə, minlərlə kəndinin rəmzidir.

Yüz ildən də artıqdır ki, İran Azərbaycanı xalqı ən adi milli, demokratik hüquqlardan məhrumdur. Bütün ölkədə ana dilində bircə dənə də məktəb, bircə dənə də qəzet və kitabça yoxdur. Lakin iradəli xalq öz doğma dilini, ən yaxşı milli ənənələrini göz bəbəyi kimi qoruyub saxlayır. İran Azərbaycanı xalqı azadlıq və milli istiqlaliyyətini boğanlara qarşı bitib-tükənmək bilməyən mübarizənin odu-alovu içərisində yeni və gözəl ədəbiyyatını yaratmışdır.

II

Bu ədəbiyyatı həqiqətən qəhrəman ədəbiyyat adlandırmaq olar. Bir sıra hallarda Şərq poeziyasına xas olan sxolastika və mistika, göylərdən nicat ummaq fəlsəfəsi bu ədəbiyyata yaddır.

İran Azərbaycanı şairlərinin oxuculara təqdim edilən bu məcmuəsi sovet poeziyasının, xüsusən Azərbaycan sovet poeziyasının qanı qanımızdan olan qardaşlarımızın formalaşmasına və yaradıcılıq inkişafına nə qədər böyük təsir göstərdiyini parlaq surətdə təsdiq edir. İran Azərbaycanı poeziyası kədər, qəzəb və həyəcanla nəfəs alır.

Müasir İranın milyonlarla hüquqsuz adamlarının acı dərdlərinin şahidi olan şair yazır:

Başında yaylıq yox, ayağı yalın,
Dalında ağır bir kömür şələsi.
Ehtiyac içində boğulanların
Kəsibdir çiynini ömür şələsi.
Bu yerdə insana ömür də yükdür,
Həyatı, nəşəsi, eşqi sönükdür.

İran Azərbaycanı şairləri sovet poeziyasının ən yaxşı realist ənənələrindən öyrənərək bir çox maraqlı və istedad nümunəsi olan əsərlər yaratmışlar.

Bu əsərlərdə onlar azadlıq və xalq səadəti uğrunda mübarizə aparan İran xalqlarının qəhrəmanlıqlarını tərənnüm edir, müasir İranın ağır vəziyyətini göstərərək, öz xalqını və sənətini Amerika, ingilis imperialistlərinə satan müasir İranın hökmdarlarını qəzəblə damğalayırlar. Bu şairlər əsil demokratiya və azadlığın ocağı olan bizim böyük Sovet Vətənimizi tərənnüm edirlər.

Yalnız öz xalqının deyil, dünyanın bütün xalqlarının xilasını Moskva Kremlinin beşguşəli ulduzunun parlamasında görən gözəl şair Azəroğlu iftixarla belə yazır:

Moskva, SSSR, Qırmızı bayraq,
Bizim dünyamızı yaşadan budur!
Kremlin üstündəki o yanan mayak
Fərəhli günlərin dan ulduzudur.

* * *

İran xalqlarının həyatı və mübarizəsi nə qədər ağır olsa da, İran Azərbaycanı şairləri xalqın haqq işinin qələbə ilə qurtaracağına möhkəm inanır, qorxuları ifşa edir və qəhrəmanları işıqlı günlər uğrunda mübarizədə irtica qaranlığı üzərində qələbəyə çağırırlar.

Şəhrin o qərq olub zülmət içində,
Ora nə nur düşür, nə şəfəq qonur.
O soyuq, qaranlıq, zillət içində
Ürəklər, beyinlər, sinirlər donur...

Orda haqq söyləyən insan oğlunu
Yuxusuz qoyurlar, ac saxlayırlar...
“Cəza” maşınında qarıb qolunu,
Başını, gözünü şallaqlayırlar...

Həyat bir meydandır, orda görünür
İnsan övladının mərdi-naməmərdi.
Kimisi ucalır, kimi sürünür,
Gözündə qarışır sevinci, dərdi...

Adam var, satılır sərvətə, ada,
Ölməkçin yaşayır... xəyanət edir.
Adam var, ömrünü verməyib bada
Daim yaşamaqçın ölümə gedir!..

Biz inanırıq ki, İran Azərbaycanı şairləri öz pəhləvan xalqı ilə birlikdə inkişaf edəcək və möhkəmlənəcəklər və onlar öz vətənlərini azad görəcək, doğma xalqlarının səadəti haqqında yeni gözəl şeirlər yazacaqlar.

*1950*

## MUĞANIN YENİ DÖVRANI

Muğan! Muğan! Tarixlər şahidi qocaman səhra!

Bizim tanışlığımız bu gün başlamır... Mən ömrümün bir çox səhərini sənin qoynunda açmışam, bir çox axşamını isə gah sənin qamışdan tikilmiş, sarı palçıqla suvanmış komalarında, gah da ağ daşlı, taxta döşəməli yeni evlərində, kəndlərində, qəsəbələrində, şəhərlərində gecələmişəm. Sənin havası darısqal, qapısı dar, yarım-adam boyunda olan qamış komalarına belimi əyib girdiyim zaman “Yazıq babalar!” deyə, çox düşünmüşəm...

Sənin hündür qapılı, geniş pəncərəli, yaşıl eyvanlı yeni evlərini seyr etdiyim zaman gözlərimdə yeni bir tarix – yeni bir dastanın ilk səhifələri canlanır, vüqarım yerə-göyə sığmayır, səadətim dənizlər kimi aşıb-daşır.

Sənin dünənki duzlu və bataqlı şoranlarında bu gün qatar-qatar cərgələnmiş sərvlər, çinarlar, yam-yaşıl üzüm bağları, öz budaqlarına ağırlıq eləyən alma və armud bağları görürəm. Sənin əsrlərdən bəri boysuz və yöndəmsiz qarağat kollarından ibarət olan ucsuz-bucaqsız

düzənlərin insan xəyalını yerdən küsdürmüş, insan qəlbini məngənə kimi sıxmış, şüura ağırlıq və kəsalət gətirmişdir. İndi isə haman düzlərdə sapsarı kəhrəba rəngli buğda zəmiləri, gömgöy mərci, yamyaşıl pambıq tarlaları üzə gülür. Onları seyr edən dünyagörmüş qocalarımızın bükülmüş beli yenidən düzəlir, ağsaçlı qarılarımızın zəif gözlərinə təzədən işıq gəlir. Mən bu qocaların dilindən eşitmişəm ki, "MUĞAN MUĞAN OLSA BİRİ ÜÇ ELƏR, MUĞAN TUFAN OLSA ÜÇÜ HEÇ ELƏR..."

Doğrudan da, sən beləsən! Sənin bir üzü bahar, bir üzü qış olan bir xasiyyətin var. Sən gah lütfkar bir ana kimi mehriban olursan; xoşsifət və mülayim təbiətli insanlar kimi üzə gülürsən. Geniş ürəklər, səxavətli əllər kimi öz nemətlərini heç kəsdən əsirgəmirsən. Belə vaxtlarında sənin qışın da baharından seçilmir. Sənin qış Günəşin də xeyir xəbərlər carçısı kimi, öz kəhər atına minib kənd-kənd, oymaq-oymaq, qapı-qapı gəzir. "Bu il bolluqdur!" deyə, insanları sevindirir. Doğrudan da, "biri üç eləyirsən"... Nə olsun ki, sənin bir üzün də çox yamandır...

Bəzən sənin səhra küləklərin həftələrlə, gecə-gündüz tufan qoparır. Kolları-kosları kökündən qoparıb, təslim olmuş ordular kimi qabağına salıb aparır.

Vaxt olur ki, sənin səhərlərinin və axşamlarının ayazı insanı qılınc kimi kəsir, yerin donu uzun müddət açılmır, yaşıl tarlalar və zəmilər saralmağa başlayır... Vaxt olur ki, göylərindəki ağ buludlar qarlı dağlar kimi tərpənmir. Onlar böyük buz parçaları kimi göydən yerə sallansalar da bir damcı yağış yağmır... Səhra "su! su!" deyib mələyir, torpaq susuzluq çəkmiş insan dodaqları kimi cadar-cadar olur. Sən belə vaxtlarında doğrudan da "üçü heç eləyirsən".

LAKİN ... İNSAN DÜNƏNKİ İNSAN DEYİL, SƏN DƏ DÜNƏNKİ MUĞAN DEYİLSƏN!

Sən bizim gözlərimizin qarşısında nəinki ildən-ilə, aydan-aya, hətta gündən-günə, saatdan-saata dəyişirsən! Ancaq təəssüf ki, sənin təbiətin çox inaddır; sənin kor stixiyaların insan əllərinin qüdrəti ilə, insan idrakının işığı ilə çarpışır... Sənin hər hektar şoran yerində bağ-bağat salmağa nə qədər insan vaxtı, insan zəhməti sərf olunur!

LAKİN SƏNİ YENİDƏN QURAN, SƏNƏ YENİ ZİNƏT VƏ HƏYAT VERƏN SOVET İNSANIDIR! ONUN İRADƏSİ ÇOX BÖYÜKDÜR! ONUN HƏYAT GÜCÜ DƏ HƏYAT EŞQİ KİMİ SONSUZDUR...

# TAXIL BİÇİNİ

Budur, Astraxanbazar rayonunun "Göllü" deyilən bir parçası!

Adından da məlum olur ki, bu yerlər vaxtı ilə yağış gölməçələrinin məskəni olmuşdur. Bəs indi? Gözləriniz önündə böyük bir buğda zəmisi açılsın. Siz bu zəminin şərqində dayanıb qərbinə, cənubundansa şimala tərəf baxın! Zəminin sonunu görə bilməyəcəksiniz. Onun bütün sahəsi 20000 hektardan ibarətdir...

Bu sonsuz buğda zəmisinin vüsətinə baxdıqca, insan xəyalının üfüqləri genişlənir, insan ağlı heyrətə gəlir. Bunu yalnız böyük arzularla yaşayan insanlar yarada bilər! Bunu yalnız böyük iradələr yarada bilər! – deyə içimdən bir səs gəlir. Bu genişlik, bu vüsət və əzəmət bir də Muğan səhrasının, bütün Azərbaycan torpağının daha böyük bir sabahını nümayiş etdirir...

* * *

Muğan səhrasının yay küləyi yavaş-yavaş əsdikcə "Göllü"nün buğda zəmisi dəniz kimi dalğalanır, təlatümə gəlir. Şaxəli buğdanın ağ şamlara bənzər gəlin barmaqlarını andıran sünbülləri bir-birinə dəydikcə tarla xışıldayır, elə bil dəniz ləpələnir...

Dən-dən olmuş sünbüllər insan əllərinin həsrətini çəkir! Onlar hələ nazlı və küsəyən qızlar kimi boynunu da bükür...

Biçin vaxtı çatmışdır. Bu il Astraxanbazar kəndlərinin taxıl zəmiləri öz yatağına sığışmır...

Bu bayram el bayramıdır. Bir gün də, bir saat da gecikmək olmaz. Sünbüllər yol gözləyir...

Traktorlar tüstülənib səsləndi. Kombaynlar nəhəng kombaynlar "Göllü" zəmisinə hər tərəfdən "hücum çəkdi".

Elə bil ki, vaporlar-paroxodlar dəniz üzərində hərəkət eləyir, dalğalarla çarpışır, gah onları öz sinəsində parçalayır, gah da öz altına alıb sivri bir ox kimi irəli süzür...

* * *

Sosialist Əməyi Qəhrəmanı Bayram Cəfərovun sahəsindəyik. Bu məşhur kombaynçının adını bütün respublikamız tanıyır. O, ortaboylu, qabarıq sinəli, geniş çiyinli, qarabəniz, otuz-otuz beş yaşlı bir adamdır.

Mən onun qüvvətli qollarının möhkəm əzələlərindən yapışaraq "bu qollar məndə olsa, mən də qəhrəman olaram" deyə zarafat eləyirəm. Bayram bu il qabaqcıl sovet elminin yaratdığı mükəmməl bir kombaynla işə başlayır.

Bayram builki biçin mövsümündə 320 hektar taxıl əvəzinə 850 hektar biçməyi öhdəsinə götürmüşdür...

Bu, sadəcə rəqəmlər deyil!.. Bu rəqəmlərin daxili mənası və şeriyyəti vardır. Bu rəqəmlərdə sovet insanlarına məxsus olan sonsuz bir yaradıcılıq eşqi, böyük bir fədakarlıq hissi, sarsılmaz bir iradə və mətanət, vətənə və xalqa olan müqəddəs bir məhəbbət nəğmələri səslənir. Bu, doğrudan da, qəhrəmanlıq poeziyasıdır...

Bu rəqəmlərdə xalqımızın daha zəngin və xoşbəxt həyatı, gələcək nəsillərimizin gözəl və uğurlu bir sabahı var... Sabahsız həyat olmadığı kimi, sabahsız qəhrəmanlıq da yoxdur! Sovet insanlarının ən böyük məziyyəti də onların yalnız bu gün üçün deyil, daha xoşbəxt və böyük bir gələcək uğrunda çarpışmalarıdır. Bu böyük sabahı Bayram da görür. "Göllü" düzünün taxıl biçininə çıxmış yüzlərcə sadə adam da görür.. Onlar indidən görürlər ki, yaxın, lap yaxın bir gələcəkdə bütün Azərbaycan torpağı öz çörəyi ilə özünü təmin edəcək!

* * *

Bütün gün "Göllü" düzünə səs salan kombaynlar özü biçdi, özü də döydü; kəhrəba kimi sapsarı, istisi soyumamış buğda dənələrini ovcuna alıb qoxulayan insanların ürəyi dağa döndü. Bu sarı buğdalardan həyat nəfəsi gəlirdi, təzə bişmiş təndir çörəyinin istisi gəlirdi...

Təəssüf ki, "Göllü" düzünün axşamı uğursuz gəldi.

Muğan göylərinin ağ buludları birdən-birə qaraldı, kinli və amansız adamların sifəti kimi boğuldu, dolan buludlar boşalmağa başladı... İridamcılı yağış xəlbirdən buğda ələnən kimi ələnməyə başladı. Səhranın sərt küləkləri də yağışa qarışıb taxıl tarlalarına basqın elədi. Şaxəli sünbüllər bir-birini qucaqladı, yağan yağışa, əsən küləyə sinə gərdi, xeyli sinə gərdi. Nə olsun ki, onların təbiəti zərif, küləyin təbiəti isə amansızdır.

Gecə keçdi. Yağış ara verdi, külək dayandı. Günəş öz şəfəqlərini səhraya yaydı. Bəs şaxəli sünbüllər? Onlar bu tufandan salamat çıxa bildimi? Təəssüf ki, onların bir çoxu çovğundan çıxmış körpə quzu sürüsü kimi baş-başa verib yerə yatmışdı, üzü üstə torpağa döşənmişdi...

Çox keçmədən yay günəşinin istisi "Göllü"nün torpağını qızdırdı.

Kombaynlar yenə yürüş elədi. Lakin onların dəmir barmaqlı pəncələri yatmış taxılın hamısını pəncələyə bilmədi. Kombaynların açdığı izlərdə külli miqdarda sünbül qalır. Bəzən bir hektarda 5-6 sentner biçilməmiş nemət qalır.

Bu zaman biçinçilər dönüb arxaya baxır... Kəndlərdən qoşun-qoşun insanlar köməyə gəlir. Qızlar, gəlinlər, tətilə çıxmış məktəb uşaqları tankçıların ardınca hücuma keçən piyadalar kimi taxıl zəmilərinə yayılırlar. Kombaynların biçə bilmədiyi taxıl oraqla biçilir, yerə dağılmış sünbüllər əllə yığılır, xarallara doldurulur, arabalar və maşınlar ilə kəndə daşınır.

Hamı bir ağızla: "Yerdə bir sünbül də, bir sünbül də qalmamalıdır" deyir. Axı, onlara nə qədər insan zəhməti sərf olunmuşdur! O sünbülləri bütün il boyu öz alın təri ilə becərib bəsləyənlərin arzuları yerdəmi qalsın? Təbiətin kor qüvvələri bizə gülsünmü? "Yox! Yox! Biz sosialist Vətənimizin gözəl nemətlərini heç bir qəsbkara vermədiyimiz kimi, təbiətin kor qüvvələrinə də verə bilmərik!" Mən bu sözləri Muğandakı qəhrəman insanların dilindən deyil, onların iş üstündə, təbiətlə mübarizədə çarpan ürəklərinin döyüntüsündən eşitdim...

## SADƏ BİR İNSANIN HƏYAT ZÖVQÜ HAQQINDA

Yalnız kütləvi qəhrəmanlıq prosesində hər fərdin məhdud qüvvəsinə geniş meydan açılır, bir qolun qüvvəti min qolun gücü kimi səslənir, bir ağlın qüdrəti min ağlın qüdrəti ilə bir səviyyədə qanad çalır, bir insan ürəyinin arzusu milyonlarca insan ürəyinin arzularına qarışır – müxtəlif səsli böyük bir həyat simfoniyası yaranır! Mən bu simfoniyanı Astraxanbazarın geniş taxıl zəmilərində, yamyaşıl pambıq tarlalarında çiyin-çiyinə, nəfəs-nəfəsə çalışan minlərcə sadə insanın səsində dinlədim.

Bütün kənddə ən çox diqqəti cəlb edən bir ev qarşısındayam. O, mərtəbəyarımdır. Evin üstündəki yaqut kimi qızaran kirəmitlərdə günəşin şəfəqləri sayrışır. Otaqların geniş pəncərələri evi üç tərəfdən qucaqlamış yaşıl eyvanlara açılır. Evin həyəti çox da böyük deyil. Lakin bu balaca həyətdə o qədər ağac və yaşıllıq var ki...

Burada eyvanlara kölgə salan çinarlar da, müxtəlif meyvə ağacları da, güllər və çiçəklər də bu kiçik həyətə, kiçik evə bütün il boyu bir bahar gözəlliyi, bir bahar təravəti verir. Həyət və ev çiy kərpicdən hörülmüş,

səliqə ilə suvadılmış bir hasar içinə alınmışdır... Lakin bu hasar çox hündür çəkilməmişdir; o elə ustalıqla çəkilmişdir ki, evin yaşıl eyvanı da, gözəl və təmiz pəncərələri də, həyətdəki yaşıl bağça da hər tərəfdən görünür, yalnız ev sahibinə deyil, yoldan gəlib-gedənlərə də mənəvi zövq verir. Ürəyimdə deyirəm ki, yəqin bu ev kolxoz sədrinin, yaxud briqadirlərdən birinin, ya da qəhrəmanlardan birinin evidir. Lakin mənim bu gümanım doğru çıxmır.

Bu yaraşıqlı ev, səliqəli həyət sıravi kolxozçu İsmayıl Şahbazovundur.

Məncə, sıravi bir kolxozçu İsmayıl Şahbazovun bu mədəni və gümrah həyatı, bu zövqü və səliqəsi onun işdə də, döyüş meydanında da çalışqan və yüksək zövqlü bir qəhrəman olduğunu ifadə edir. Mədəni yaşamaq, yaxşı istirahət etmək gözəllik və təmizlikdən zövq almaq da insan ömrünü gümrahlaşdıran, bu ömrü uzadan səbəblərdən biridir. Bu da hünərdir. Bu da qəhrəmanlıqdır. Əfsus ki, təsvir etdiyimiz bu evin ətrafındaca ot və saman çardaqlı, qapısını sirkənlər və qanqallar basmış, divarlarının suvağı uçub tökülmüş, həyətində kölgəlik bir ağac əkilməmiş evlər də vardır! Bu yöndəmsiz evlər köhnə dünyanın – feodal-patriarxal kəndin qalıqlarıdır. Onlar bizim elektrik işıqlı, daş döşəməli, mədəniyyət saraylı sosialist kəndlərimizə yaraşmır. Yeni və gözəl kəndlərimizi yaraşıqdan salır. Ancaq bu evlərdə minlərcə sadə insanlarımız yaşayır. Onların maddi vəziyyətlərinə görə, siyasi və ictimai şüurlarına nisbətən məişət mədəniyyətləri geridir.

Biz hamımız sadə insanlarımızın qapılarını tanımalıyıq. Bir para adamların şüurunda və qəlbində hələ də davam edən köhnəlik qalıqlarını, məişətlərindəki bir çox köhnə adət və vərdişləri bir təbib kimi müalicə etməliyik.

Biz onların şəxsi həyatlarını, şəxsi ehtiyaclarını, mənəvi tələblərini duymalı, hər birinə yaxından kömək etməli, xeyirxah məsləhətlər verməli, onlara yazacağımız yeni, yüksək keyfiyyətli ədəbi və elmi əsərlərimizlə xidmət etməliyik.

Aqil və çalışqan bağbanlar bəslədikləri böyük bağlara "ümumən" qulluq etmirlər. Onlar hər ağacın, hər şitilin, hər gül və çiçək kolunun ayrıca qeydinə qalırlar. Yalnız belə olduqda ağaclar hamısı bir boyda, bir gözəllikdə inkişaf edir, onların nemətləri də ildən-ilə çoxalır, ömürləri də ildən-ilə gümrahlaşır. Hər dövlət xadimi, hər kolxoz sədri, hər briqadir sadə insanların xüsusi qeydinə qalmalı, onların ayrı-ayrı çarpan ürək səslərini dinləməlidir...

## KİÇİK ŞƏHƏRİN BÖYÜK SABAHI

Respublikamızın ən cavan şəhəri Astraxanbazardır. Ona yalnız bu il – 1952-ci ilin 28 fevralında şəhər adı verilmişdir.

Respublikamızda son illərdə yeni şəhərlərin yaranması xalqımızın iqtisadi və mədəni yüksəlişini nümayiş etdirən bir hadisədir.

Bakıdan Astaraya uzanan aynalı yolun 210-cu kilometrliyində sağa tərəf uzanmış daş döşəməli geniş bir yol bizi Astraxanbazar şəhərinə aparır. Yolun hər iki tərəfində köhnə və yeni əkilmiş ağaclar cərgələnmişdir. Evlərin eyvanları və pəncərələri bir-biri ilə üz-üzə dayanıb salamlaşır. Şəhərin uzunluğu 3 kilometrdən artıqdır. Biz şəhərə daxil olduğumuz zaman yeni, səliqə ilə salınmış şəhər parkı üzə gülür. Bu park, demək olar ki, şəhərin bütün mərkəz hissəsini tutmuşdur. Park bugünkü şəhərə görə böyük nəzərə çarpır. Görünür ki, onu yaradan başlar və əllər öz doğma şəhərlərinin sabahını da düşünmüşdür... Onlar düşünmüşlər ki, Astraxanbazar şəhərinin əhalisi bu gün yeddi-səkkiz min isə də, sabah çox-çox artacaq... Bu, təsadüfi deyil. Biz bu vüsəti paytaxtımız Bakı şəhərində yaranan yeni meydançalarda, geniş küçələrdə, əzəmətli binalarda da görürük. Qurulan hər yeni binanı, yazılan hər yeni əsəri yalnız bu günə görə yox, bir də sabaha, həm də böyük bir sabaha görə yaratmaq sovet insanının geniş təbiətinin, onun yaradıcılıq qabiliyyətinin tükənməz bir çeşmə olduğunu göstərir. Yeni şəhərimizdə – Azərbaycanın balaca Ukraynasının mərkəzi Astraxanbazarda gedən tikinti və quruculuq işləri çox heyrətamizdir. Son üç-dörd il müddətində bu yeni şəhərdə qırxdan çox mədəni, ictimai bina tikilmişdir. Məsələn, müəllimlər evi, işıqlı və yaraşıqlı partiya kabinəsi, bir neçə böyük və geniş otaqlardan ibarət müalicə evi, yay kino-teatrı, maliyyə evi, kənd təsərrüfatı idarəsi, rayon partiya komitəsinin yeni binası, aptek, mədəniyyət evi, iki artel, dörd gözdən ibarət kəndli evi, 5 otaqlı körpələr evi, 10 palatalı xəstəxana və qeyriləri... Öz şəhərlərini isti bir ürəklə sevən yerli insanlar dövlət və partiyamızın şəhərin abadlığına buraxdığı külli miqdarda pul və vəsaiti səmərəli xərcləyir, yerli imkanlardan da geniş surətdə istifadə edirlər. Lakin bütün bunlar görüləcək daha böyük işlərin başlanğıcıdır. Düşünülən başlar dayanmır, yaradan əllər yorulmur. Bu ildən başlayaraq, şəhərin bütün daş yolları qırla-asfaltla döşənəcək, seyrək evlərin arasında yeni evlər, bağlar-bağçalar salınacaq, şəhər başdan-başa yaşıllığa qərq olacaq, onu isti və

soyuq səhra küləklərindən qorumaq üçün ətrafında yeni meşələr, bağ-bağatlar salınacaqdır. Bu gün Astraxanbazar rayonunun yalnız 15 kəndində hamam varsa, yaxın gələcəkdə bütün kəndlərində hamam tikiləcək. Bu gün rayonun yalnız 10 kəndində elektrik işığı varsa, sabah, lap yaxın bir gələcəkdə rayonun bütün 38 kəndi elektrik işığına qərq olacaqdır. İşıq yalnız işıq deyil, yaraşıq da deyil! İşıq qüvvətdir. Bu qüvvətlə qəhrəman kolxozçularımız əkəcək, becərəcək, məhsul toplayacaq. Xalqımız dağlarda, səhralarda, təbiətin kor qüvvələrinə elektrik gücüylə zəfər çalacaq. Hələ də həyatımızda müvəqqəti olaraq yaşayan bəzi ağır zəhmət növləri ləğv olunacaq. İnsan zəhmətinin məhsuldarlığı qat-qat artacaq. Bu, xəyal deyil, böyük bir həqiqətdir! Bu, yeni dünyanın yeni dastanıdır. Bu səadət və həyat dastanının ilk səhifələri yazılmışdır. Bu səhifələrdə qəhrəman Azərbaycan xalqının da imzası var... Lakin bu dastan qurtaran deyil... Çünki bu dastan şairlərin yazıb qurtardığı, sonuna nöqtə qoyduğu dastana bənzəməz. Bu, həyat dastanıdır, – hüdudsuz, sonsuz daima yazılan, daima zənginləşən, daima gözəlləşən bir dastandır...

Bu dastan zamandan-zamana, nəsildən-nəslə yazıla-yazıla davam edəcək! Bu dastana yeni səhifələr yazılacaq, yeni imzalar qoyulacaq... Bu dastana qəhrəman sovet xalqları, bütün qabaqcıl bəşəriyyət "Kommunizm dastanı", "Yeni dünya" adı vermişdir.

*1952*

## BÖYÜK SƏNƏT MƏSƏLƏLƏRİ

Tipiklik bizim ədəbiyyat və incəsənətin gələcək inkişafı üçün həyati əhəmiyyətə malik bir problemdir.

Tipiklik məsələsi marksist estetika üçün yeni bir məsələ deyildir. Buna baxmayaraq, etiraf etmək lazımdır ki, tipiklik haqqında bizdə hələ indiyə qədər aydın bir anlayış yox idi. Bizim bir çoxumuz hazırkı tarixi ictimai hadisələrin mahiyyətini ifadə edən şeyləri yox, həyatda çox yayılmış olan, məişətdə kök salmış şeyləri tipik sayırdıq. Deməli, tipiklik haqqında, obrazların və hadisələrin şüurlu surətdə şişirdilməsi haqqında söhbəti bizim bədii yaradıcılıq praktikamızın özü irəli sürmüşdür.

Obrazların və hadisələrin şüurlu surətdə böyüdülməsi məsələsinin mənim üçün xüsusi əhəmiyyəti vardır, çünki bir yazıçı kimi, mənim öz

yaradıcılıq yolumda bu məsələdə həm müvəffəqiyyətlərim, həm də müvəffəqiyyətsizliklərim az olmamışdır.

Obrazların şüurlu surətdə böyüdülməsi nə deməkdir? Mənə elə gəlir ki, böyük incəsənətin bütün mahiyyəti və qəlbi məhz bu məsələdədir. Bu, çoxdan məlum olan, lakin bizim hamımız tərəfindən unudulmuş belə bir həqiqətə doğru geri qayıtmaq deməkdir ki, böyük incəsənət heç bir zaman böyük bədii ümumiləşdirmələr olmadan, yüksək idealsız yaşaya bilməz.

Dünya ədəbiyyatının tarixindən bir çox nümunələr və misallar məlumdur ki, bəzən tamam bir dövrün və ya bütün bir xalqın ruhu və qəlbi hər hansı bir şairin yüksək fikirlərində və hisslərində öz ifadəsini tapmışdır. XVIII əsrdə yaşamış böyük Azərbaycan şairi Vaqifin, XX əsrin əvvəllərində yaşamış dahi satirik şair Sabirin yaradıcılığı buna misal ola bilər. O zaman ki, məsələn, tənqidi realizm ədəbiyyatında olduğu kimi, yazıçı öz yüksək ideallarını kapitalizmin əzdiyi, alçaltdığı, eybəcərləşdirdiyi kiçik adamların obrazlarında ifadə edir, belə hallarda həmin kiçik adamların da obrazı qabarıq çıxa bilmişdir. Lakin bizim sosialist incəsənətimiz üçün başlıca məsələ güclü ehtiraslara malik olan adamların, böyük və qüvvətli xarakterlərin göstərilməsidir.

Belə adamların bədii surətdə təsvir olunması bu təsvir üçün münasib bədii vasitələrin, münasib bədii dilin tapılmasını tələb edir. Bu təsvirin sənətkarın parlaq boyalarına, yüksək poetik bədii dilinə ehtiyacı vardır. Lakin bəzən belə olur ki, yazıçı öz qəhrəmanının dili ilə yüksək və alovlu sözlər deyəndə, yüksək fikirləri və arzuları ifadə edəndə bəzi tənqidçilər həmin yazıçını qeyri-təbiilikdə, sünilikdə, bəzən isə mücərrədlikdə taqsırlandırırlar. Guya ki, belə bir dil normal, adi adamın dili deyildir, yazıçının öz dilidir. Belə üzdəniraq tənqidçilər yazıçının təsvir etdiyi adamların dilini onların gündəlik və adi məişət dili ilə məhdudlaşdırmaq istəyir. Onlar böyük mənəvi aləmin dilini, yüksək fikirlərin və arzuların, nurlu hisslərin və duyğuların dilini inkar edirlər. Onlar sosializm realizmi prinsiplərini bəsitləşdirir, yoxsullaşdırır və ən nəhayət, təhrif edirlər.

Mən bir neçə dəfə belə suallar verməli olmuşam: nə üçün sərkərdə Otello yüksək poetik dildə danışa bildi, bizim sərkərdələr isə belə bir dildə danışmamalıdırlar? Nə üçün Dezdemona, yaxud Tatyana Larina yüksək emosional dildən istifadə edə bilirdilər, amma bizim qəhrəmanlar belə bir dildən istifadə edə bilməzlər? Axı, doğrudan da Puşkin

Tatyana Larinanın öz canlı dilini çox gözəl bilirdi. Lakin Puşkin onun həmin bu canlı dilini olduğu kimi bədii əsərdə verməyə cəhd etməmişdir; Puşkin şüurlu surətdə başqa bir dil yaratmışdır, o, Tatyana Larinanın elə bir bədii dilini yaratmışdır ki, bu dil artıq Puşkinin yaratdığı dildir, sadəcə olaraq, mülkədar qızı Tatyana Larinanın dili deyildir.

Əgər biz böyük və güclü insan obrazları yaratmaq istəyiriksə, gərək həmin insanlar üçün ifadəli, həmin adamların həyatını və mübarizəsini, onların mürəkkəb daxili aləmini açıb göstərməyi bacaran, zəngin bədii dil də yaradaq. Məsələn, sovet adamlarının beynəlmiləlçilik hissi, həyata məhəbbəti, yoldaşlıq hissi, xalqın azadlığını boğanlara dərin nifrət hissi haqqında, bütün bəşəriyyətin işıqlı sabahına böyük inamı kimi yüksək hisslər haqqında poeziyada adi danışıq dili ilə necə danışmaq və söhbət açmaq olar? Axı həm də nəzərə almaq lazımdır ki, bizim həyatımızda, sovet adamlarının namuslu və sülhsevər əməyində nə qədər yüksək bir poeziya vardır! Yox, hər kəs poeziyanın dilini adi danışıq dili ilə əvəz etmək istəyirsə, yüksək realizmi naturalizmlə, əsil xəlqiliyi – yalançı xəlqiliklə əvəz etmək istəyirsə, belə adamlar çox dərindən səhv edirlər.

Obrazların (istər müsbət, istərsə də, mənfi obrazların) şüurlu surətdə böyüdülməsi böyük yaradıcılıq cəsarətindən və böyük sənətkarlıqdan doğan bir məsələdir. Bizim ədəbiyyatımızda konflikt məsələsi də bununla yaxından əlaqədardır. Bir çox dramaturqlar indiyə qədər başa düşmürdülər ki, insanların həyatındakı konfliktlər öz-özünə yaranmır. Bu konfliktlər güclü ehtiras və xarakterlərin, zidd ideyaların və baxışların bir-biri ilə mübarizəyə girişdiyi yerlərdə doğulur. Bax buna görə də yaxşı ilə ən yaxşı arasında konflikt yaranmır, bəlkə konfliktlər həmişə işıqlı cəhətlə qaranlıq arasında, qabaqcıl cəhətlərlə geri qalmış cəhətlər arasında, inqilabi meyllərlə əksinqilabi meyllər arasında yaranır. Deməli, əsil konflikt yaratmaq, hər şeydən əvvəl, güclü, bir-biri ilə ölüm-dirim mübarizəsi aparan xarakterlər yaratmaq deməkdir.

Təsadüfi deyildir ki, dramaturgiyada konfliktsizlik nəzəriyyəsini məhz o dramaturqlar müdafiə edirlər ki, onlarda bitkin və tamamlanmış müsbət və mənfi obrazlar yaratmaq üçün lazım olan əsil sənətkarlıq çatmırdı. Ola bilər ki, həmin bu dramaturqlar bizim həyatımızda mübarizənin olduğundan, özü də böyük bir mübarizənin, xeyirlə şərin, yaxşı ilə pisin, yeni ilə köhnənin, işıqla qaranlığın arasındakı mübarizədən xəbərsiz idilər. Yox, bu ola bilməz, onlar belə bir mübarizənin

olduğunu bilirdilər, lakin hiyləgərlik edirdilər; ona görə hiyləgərlik edirdilər ki, ya onlarda həmin gördükləri mübarizəni vətəndaş bir yazıçının, böyük incəsənətin mövqeyində göstərmək üçün bacarıq çatmırdı, yaxud da, ən çox, onlar buna cəsarət etmirdilər. Belə dramaturqlar həmişə öz yaradıcılıq imtahanlarını "üç" qiymətə vermək, ortabab bir yol tutmaq istəyirdilər.

Son illərdə bizdə böyük dramaturgiya uğrunda aparılan mübarizə zəifləmişdir. Bəzən bu mübarizə "yazıçının son bacarığı" adlanan çox zərərli bir nəzəriyyə ilə əvəz edilmişdir. Görürsən ki, yazıçı orta səviyyəli bir əsər yazmışdır, lakin həmin əsərləri ideya və bədii cəhətdən daha da yüksəldib təkmilləşdirmək imkanı vardır. Belə olduqda tənqidçilər çıxış edib deyirdilər ki, bu müəllif bundan artıq bir şey bacarmaz. Belə tənqidçilər unudurlar ki, bədii əsərlərə qiymət verərkən biz birinci növbədə qabaqcıl incəsənətimizin yüksək səviyyəsini, onun böyük "sabahını", bizim oxucu və tamaşaçılarımızın tələblərinin səviyyəsini nəzərə almalıyıq. Bundan başqa, yazıçıya bu cür münasibət bəsləmək onu öz qüvvəsinə inamsızlıq ruhunda tərbiyə edir, yazıçı uzun müddət ədəbiyyatda orta bir vəziyyətdə qalır, bu isə, necə deyərlər, onun üçün adətkərdə yaradıcılıq hissinə çevrilir.

Obrazları, hadisələri şüurlu surətdə böyütməyə çağırış, yəni böyük və monumental klassik incəsənətə çağırış ədəbiyyatda solğun, orta səviyyəli və xaltura əsərlərə qarşı bizim kəskin mübarizə aparmağımızı nəzərdə tutur. Bunu böyük incəsənətin öz təbiəti tələb edir. Böyük yazıçılar öz zəmanələrinin ideoloqları olmuşlar. Sosializm şəraitində yazıçının əsas vəzifəsi daha böyük məsuliyyət kəsb etmişdir. Yazıçı bizim müasirimizdir. Buna görə də bizim yaratdığımız hər bir əsər cəmiyyətimizin mənəvi aləminə bir yenilik, işıq, müdriklik, dərin fəlsəfə və inqilabilik gətirməlidir. Bu isə yazıçını məcbur edir ki, öz poetik istedadının və poetik şişirtməsinin gücü ilə qəhrəmanını elə bir yüksəkliyə qaldırsın ki, bir çox nəsillər üçün ideal olsun. Bizdən geniş və əhatəli ümumiləşdirmələr gözləyirlər. Buna görə də indi bizə sadəcə şair yox, şair-ideoloq, sadəcə dramaturq yox, dramaturq-ideoloq lazımdır.

Son illərdə tənqidçilər poeziyada Şərq "abstraksiyası", "mücərrədliyi" haqqında çox danışırlar. Onlara elə gəlir ki, əgər şair sadə yazırsa, bu çox yaxşıdır, bu çox realdır. Mən isə, şəxsən realizmi belə başa düşürəm ki, yazılan əsər həm sadə olsun, həm də bu sadəliklə birlikdə dərin, müdrik və dəbdəbəli olsun. Nə üçün biz poeziyada aforizmlər-

dən, qanadlı sözlərdən, dərin fikirlərdən qorxmalıyıq? Yəni doğrudanmı bunlar mücərrədlikdir? Firdovsi və Nizami məhz bu mücərrədliyin sayəsində min illərdir ki, yaşayırlar. Yaşasın belə mücərrədlik!

Əlbəttə, biz əsassız fantaziya ilə poetik ümumiləşdirmə arasındakı fərqi başa düşürük. Ola bilər ki, fikri olmayan, lakin çox sadə bir şeir yazasan. Belə şeir xoşa da gələ bilər, lakin elə o saat da unudular. Lakin poetikləşdirilmiş böyük fikir isə heç bir zaman unudulmur. O, dolğun, bədii obrazların özü kimi heç bir zaman pozulub yaddan çıxmır.

Tipiklik məsələsi ilə əlaqədar olaraq milli xarakter problemi də yeni bir şəkildə meydana çıxır. Bəziləri hər bir xalqın bütün milli xüsusiyyətlərini yalnız milli dillər arasındakı fərqlərə aparıb çıxarmağa meyl edirlər.

Formaca milli və məzmunca sosialist mədəniyyətində forma yalnız dildən ibarət hesab edilmir. Dünyada bir çox xalqlar vardır ki, eyni bir dildə danışırlar, lakin onların milli xarakterləri müxtəlifdir. Hər bir xalqın özünün xüsusiyyətləri: öz məişəti, öz ənənələri və zövqü, adətləri və vərdişləri vardır ki, bütün bunlar da əsrlər boyunca yaranıb inkişaf etmişdir, hər bir xalqın öz təfəkkür tərzi və dünyanı dərk etmək tərzi vardır. Bu o demək deyildir ki, müxtəlif milli mədəniyyətlər bir-birindən Çin səddi ilə ayrılmışdır. Onların arasında hətta forma cəhətdən də bir çox ümumi cəhətlər vardır. Sənətkarın vəzifəsi ondan ibarətdir ki, həm xalqları birləşdirən, onları bir-birinə yaxınlaşdıran, onları bir-birini anlamağa vasitə olan cəhətləri, həm də dünya mədəniyyətini zənginləşdirən və ümumiləşdirən milli xüsusiyyətləri görüb duya bilsin.

İnsandakı milli xüsusiyyətləri düzgün və bütün rəngarəngliyi ilə təsvir etmək böyük və parlaq xarakterlər yaratmaq üçün zəruri şərtdir.

*1953*

## M.F.AXUNDOV BİZİMLƏDİR

Yeni və realist Azərbaycan ədəbiyyatının banisi olan Mirzə Fətəli Axundov xalqımızın ictimai, fəlsəfi və bədii şüur tarixində böyük bir rol oynamışdır. Onun istər fəlsəfi, istərsə də bədii yaradıcılığındakı demokratik ideyalar, xəlqilik və humanizm kimi nəcib xüsusiyyətlər, onun mübariz ateizmi, bədii satirasının qüdrəti bu gün belə öz təravətini saxlayır, bizə – yeni dünya qurucularına yaxından kömək edir.

Mirzə Fətəli Axundov xalqlar tarixində nadir yetişən fövqəladə bir istedad, başdan-ayağa hünər və mənəvi qəhrəmanlıq timsalı olan sarsılmaz bir iradə, alovlu bir məslək eşqilə yaşayan, böyük ideyalar uğrunda tarixin qara qüvvələrilə ömrü boyu çarpışan qəhrəman və dahi bir şəxsiyyət olmuşdur. Onun istər elmi, istərsə də bədii yaradıcılığının əsas mahiyyətini təşkil edən materialist və ateist dünyagörüşü XIX əsr müsəlman Şərqinin zülmətləri içərisində bir ildırım sürətilə işıq saçdı: fatalizm və fanatizmin qaranlıq dünyasını, mənfur islam şəriətini baltaladı, yalan və riyadan uzaq olan elmin, əsil mədəniyyətin keşiyində dayandı, dini etiqadların və ayinlərin elmə və mədəniyyətə düşmən olmasını sübut etdi.

Çernışevski 1860-cı ildə çap etdirdiyi əsərlərinin birində "Qədim Şərqin din və fəlsəfəsi" əsərinin müəllifi Novitskini din ilə fəlsəfəni barışdırmaq istədiyinə görə çox kəskin tənqid edərək yazırdı ki, "cənab Novitski Aristotelin fəlsəfəsini xristian dini məsələlərilə qarışdıraraq sxolastiklərin və dini ehkamları elm ilə qarışdıran transendental filosofların dolaşıq saldığı yolla gedərək din ilə fəlsəfəni qarışdırmışdır".

Çernışevski sonra acı bir kinayə ilə Novitskiyə gülərək yazırdı: "Novitski güman edir ki, o, filosofdur. Madam ki, belədir, gərək ilahiyyatçı deyil, filosof olsun, çünki birinciyə aid olan ikinciyə aid ola bilməz. Lakin aydın görünür ki, o, elmi kifayət hesab etmir, dini fəlsəfədən yüksək tutur.. Əgər belədirsə, lazım gəlir ki, o, elmi bir kənara tullasın, özünü filosof zənn etməkdən əl çəksin, ilahiyyat müəllimi olsun. Novitski özü deyir ki, ilahiyyat fəlsəfədən çox xeyir gətirir. Belə isə nə üçün o, az faydası olan işə, elmə vaxt sərf edir, daha çox faydalı işlə məşğul olmur? Novitski özünü aldadır... Yalana qarşı yalnız iki cür münasibət ola bilər. Ya gərək yalana xidmət edəsən, ya da onunla mübarizə edəsən, onu rədd edəsən".

Həmin məsələ haqqında Axundovun fəlsəfi məktublarından aşağıdakı fikirləri Çernışevskinin fikirlərilə ahəngdar bir surətdə səslənir: "Bizim bu günə qədər haqqı batildən seçməkdə və doğrunu əyridən ayırd etməklə yanlışlığımız bu cəhətdəndir ki, biz daima bir-birinə zidd olan iki qəziyyəni bir-birinə qarışdıraraq bir qəziyyə saymışıq. Halbuki, bu iki qəziyyə başqa-başqa şeylərdir. Onlardan biri elmdir, o birisi etiqad".

"Din və imanla elm və fəlsəfə iki zidd halətdir, qətiyyən bir şəxsdə toplana bilməz. Din və iman sahibi olan adam elm və filosof sayıla

bilməz, əgər elm və fəlsəfə sahibi olursa, dindar və mömin ola bilməz. Din və iman talibi olan kimsə qətiyyən mərifət dairəsinə yaxınlaşmasın və mərifət talibi olan kimsə, istər-istəməz və ixtiyarsız olaraq din və imandan uzaq olmalıdır".

Onun "bu qədər var ki, mən külli-ədyani puç və əfsanə zənn edirəm" deməsi, yalnız Azərbaycanda deyil, bütün Yaxın Şərq xalqlarının şüurunda bir inqilab idi.

* * *

M.F.Axundov böyük və realist bir dramaturqdur. Onun zəngin və klassik dramaturgiyası yalnız Azərbaycanda deyil, Yaxın Şərq ölkələrinin dramaturgiya və teatr tarixində müsbət bir rol oynamışdır. O özü bu haqda yazır: "Mən öz əsərlərimin ləyaqəti haqqında öyənməyə özümü haqlı hesab edirəm ki, mən müsəlmanlar içərisində birinci məzhəkə müəllifi olmaq şərəfinə nail olmuşam".

Axundovun estetik görüşləri orta əsr Şərq poeziyasında hökm sürən sxolastik, doqmatik qanunların, şeirdə Sədi nəsihətçiliyinin və didaktizminin əsaslarına zidd idi. Onun estetikası real həyat və real insanlarla nəfəs alan, ictimai mübarizəyə qol-qanad verən fəal və mübariz bir ədəbiyyatın, insan gözəlliyi ilə zinətlənən bir poeziyanın estetikası idi.

Axundov estetikası əsil və yüksək poeziya üçün məzmun və forma vəhdətini zəruri və labüd bilir. Bu haqda onun rəyi böyük rus mütəfəkkiri və tənqidçisi Belinskinin rəyi ilə bir səslənir.

Belinski məzmun və forma haqqında yazır: "Nə zaman ki, forma məzmunun ifadəsidir o, məzmunla elə sıx surətdə əlaqədardır ki, onu məzmundan ayırmaq məzmunu məhv etmək deməkdir. Əksinə, məzmunu formadan ayırmaq da formanı məhv etmək deməkdir. Forma ilə ideyanın, ideya ilə formanın bu canlı əlaqəsi daha doğrusu, bu üzvi əlaqəsi ancaq dahilərin bacara bildiyi bir işdir.

Adi talant həmişə ya məzmuna arxalanır ki, o zaman onun əsəri forma cəhətdən əbədi ola bilmir. Yaxud da daha çox forma cəhətindən parıldayır ki, bu zaman onun əsəri məzmun cəhətindən bur günlük ömrə malik olur" (*V.Q.Belinski,* 3-cü cild, səh.138).

Axundov da eyni fikri özünə məxsus bir orijinallıqla irəli sürür və estetik nəzəriyyəsini əsaslandırmaq üçün Azərbaycan və Şərq poeziyasından misallar gətirir.

Heç də təsadüfi deyildir ki, Axundov milli şerimizin günəşi olan Nizami Gəncəvi, Vaqif və Zakir kimi böyük realist şairlərimizin yaradıcılığına olduqca müsbət qiymət verir, onlara hörmət və məhəbbət bəsləyir, onların yaradıcılığını əsil poeziyaya nümunə gətirirdi. Biz bununla fəxr edirik, sevinirik və ucalırıq...

M.F.Axundovun materialist dünyagörüşünün təşəkkülündə, onun bədii yaradıcılığının və estetik görüşlərinin inkişafında misilsiz və tarixi bir rol oynamış böyük bir amili, XIX əsr böyük rus mədəniyyətinin, o vaxtkı qabaqcıl, inqilabi və demokratik ideyaların müsbət təsirini xüsusi olaraq, həm də dərin bir minnətdarlıq hissilə qeyd etmək lazımdır.

Biz bu gün, Axundovun ölümünün 75 illiyini qeyd etdiyimiz vaxtda Azərbaycan xalqının ictimai və bədii şüur tarixində misilsiz rol oynamış rus mədəniyyətinin ölməz simaları olan Belinskini, Puşkini, Çernışevskini, Dobrolyubovu və başqalarını böyük bir minnətdarlıq hissilə yad edirik!..

*1953*

## [SSRİ YAZIÇILARI İTTİFAQININ XIV PLENUMUNDA ÇIXIŞI]

Yoldaşlar, mən K.Simonovun dramaturgiyanın inkişaf problemlərindən bəhs edən məruzəsini məmnuniyyətlə dinlədim. Məruzəçi çox yaxşı və yerində olaraq öz məruzəsinə sovet dramaturgiyamızın öz gözəl realist və inqilabi ənənələri olması, xalqlarımızın bədii fikrinin inkişaf tarixində; ümumiyyətlə bütün ədəbiyyatımız kimi onun da yeni sənət hadisəsi olması kimi inkaredilməz faktla başladı.

Bizim klassik ənənələrə, ilk növbədə öyrəndiyimiz və bundan sonra da öyrənəcəyimiz böyük rus ədəbiyyatının realist ənənələrinə olan məhəbbətimiz o demək deyil ki, bizdə, sovet dramaturqlarında fəxr etməyə borclu olduğumuz yaradıcı ənənələrimiz yoxdur.

Mən nihilizmi insanda ən qorxulu hiss hesab etmişəm və indi də belə hesab edirəm. Nihilizm kosmopolitizmin gizli təzahür forması kimi dünən də mövcud olmuşdur,  bu gün də mövcuddur.

Nihilizm bizə çox zərərlər vurmuşdur. Bu elə bir xəstəlikdir ki, onunla nəinki ayrı-ayrı tənqidçilər və mədəniyyət işçiləri yoluxmuşlar, bizim bir sıra partiya və sovet rəhbərləri də xəstələnmişlər. Nihilizm bizim bir çox yaradıcı adamlarımızın öz yaradıcılıq qüvvələrinə olan

inamını məhv edərək onları düşkünləşdirmişdir. Nihilizm və kosmopolitizmi quldur və başkəsənlərdən daha pis hesab edirəm, çünki onlar bizdə ən başlıca olanı – bizim nikbin başlanğıcımızı, öz gücümüzə, ideallarımızın qələbəsinə olan inamı öldürməyə çalışırlar.

Və bizim kosmopolitizm və nihilizmlə mübarizəmiz bitməmişdir. Döyüş xəttində müvəqqəti sakitlik son vuruşun başlanmasından xəbər verir.

Bu kosmopolitizm və nihilizmin, o cümlədən bir sıra yoldaşların bu məsələyə sadədil münasibətinin bizə necə zərər vurmasını mən Azərbaycan dram teatrının repertuarının bugünkü vəziyyətində göstərmək istəyirəm.

Azərbaycan dramaturgiyası, sizin bildiyiniz kimi gənc deyil, özünün təqribən yüzillik tarixi vardır. Bu klassik dramaturgiya Axundov, Haqverdiyev, S.Sani, C.Məmmədquluzadə, Cabbarlı və b. kimi söz ustalarını meydana gətirmişdir. Təəccüblü odur ki, bu gün teatrımızın səhnəsində adlarını çəkdiyim bu klassiklərin bir əsəri belə yoxdur. Buna əlavə olaraq, bizim səhnədə Mirzə İbrahimov Mehdi Hüseyn, Süleyman Rüstəm, Sabit Rəhman və b. kimi istedadlı sovet dramaturqlarının əsərləri də yoxdur. Əlbəttə, nihilist və kosmopolit qalıqları olan adamlar tapıldı desinlər ki, bəzilərinin əsərlərində guya forma köhnəlmişdir, bir qismində bədii vasitələr yararsızdır, üçüncü bir qisimdə isə dil köhnəlmişdir və s. Mədəniyyət Nazirliyindəki bir sıra üzdəniraq mədəniyyət işçiləri hətta ümumxalq tərəfindən bəyənilmiş əsərləri teatrlarımızın repertuarından yalnız o səbəbə çıxarmaq üçün sərəncam verməyi fikirləşiblər ki, guya bu tamaşaların dekorasiyaları köhnəlmişdir.

Dramaturqlarımızın qənaətbəxş işləməmələrinin mühüm səbəblərindən biri dramaturgiyamızın mövzu rəngarəngliyi uğrunda zəif mübarizə aparmağımızdır. Eyni cür həyat hadisələrinin, həm də eyni cür kompozisiya və yaradıcılıq üsullarının təkrarı məhz bundan irəli gəlir. Belə hadisələrə də rast gəlmək olur ki, bir pyesin qəhrəmanları o biri pyeslərin qəhrəmanlarından yalnız öz familiyası, ixtisası və kostyumu ilə fərqlənir.

Tənqidimiz və dramaturqlarımız həmçinin dramaturgiyamızda üslub və yaradıcılıq cərəyanlarının müxtəlifliyi, parlaq yaradıcı fərdiyyətlərin aşkara çıxarılması uğrunda da zəif mübarizə aparırlar.

Bununla əlaqədar çoxdan məni düşündürən bir məsələ üzərində dayanmaq istəyirəm.

Biz çox yaxşı bilirik ki, sosialist realizmi bütün ədəbiyyatımızın yeganə və vacib metodudur. Onu da bilirik ki, sosialist realizmi metodu hamı üçün yeganə və standart üslub deyildir. Onu da bilirik ki, ədəbiyyatımızda bəziləri fəal, bəziləri isə qeyri-fəal olan müxtəlif yaradıcılıq cərəyanları mövcuddur. Bu cərəyan və üslublar arasında güclü yaradıcılıq mübarizəsi getdiyini də bilirik, bu isə, şübhəsiz ki, müsbət hadisədir.

Çox təəssüf ki, bizim plenum canlı yaradıcılıq cərəyanlarının bu mənzərəsini göstərmədi. Biz hansı cərəyanın sağlam başlanğıcını müdafiə etməli, əksinə, hansı qeyri-sağlam, lazımsız olanı rədd etməli olduğumuzu demədik.

Ədəbiyyatımızda, əksəriyyətinizə, o cümlədən mənə də çoxdan məlum olduğu kimi, yüksək pafoslu romantik üslubun varlığının tam vətəndaşlıq hüququ vardır. Lakin mühitimizdə elə adamlar da az deyil ki, onlar bəzən "romantika", "ruh yüksəkliyi", yaxud "təntənəli üslub" sözlərini işlətməkdən qorxurlar. Belə halda onlar bütün bu keyfiyyətləri keçmişə aid edirlər.

Mən təsdiq edirəm ki, sosializm dövründəki insanın fikir və hisslərinin, ideal və irəliyə doğru cəhdlərinin tam çiçəkləndiyi bir dövrdəki adamların həyatı, taleyi və ideallarındakı belə romantika heç bir zaman olmamışdır. Ancaq romantika və təmtəraqlılıq əleyhdarları tez-tez böyük və qanadlı realizmi naturalizmlə, laqeydliklə, adi məişət təsviri ilə əvəz edirlər ki, bunun üçün ümumiyyətlə heç yazıçı olmaq lazım deyildi.

Onlar bizə deyirlər ki, budur, hazır həyat, hazır insan və hazır dil, götür, yaz. Onlar bununla yazıçının, şübhəsiz ki, əsasların əsası olan həyata yaradıcı münasibətini qiymətləndirmirlər, belə ki, yalnız həyat həqiqəti yaradıcı coşqunluğun, arzu və xəyalların nəhəng qanadlarını öz çiynində saxlamağa qadirdir.

Təsadüfi deyil ki, bir çox personajlarımızın dili fikir və hisslərin zənginliyi ilə yox, sözçülük bolluğu, boş, ifadəsiz və kobud söz bolluğu ilə seçilir. Bizim əcdadlarımız belə yazmırdılar: Nizami və Rustaveli, Puşkin və Tolstoyu bir-birindən müxtəlif zamanlar ayırsa da, hər birinin öz dili vardır, çünki onlardan hər birinin təkrarolunmaz və böyük sənəti vardır.

Real adamların danışığı ilə həmin adamların yazıçı tərəfindən yaradılan bədii obrazlarının dilləri arasında bərabərlik işarəsi qoymaq istəyən yoldaşlar haqlı deyillər. Əgər "yazıçı qəhrəmanı istədiyi dildə danışmağa vadar etməməlidir" – deyən yoldaşların fikri ilə razılaşsaq, onda adamlarımızın yanına yazıçı deyil, təcrübəli və vicdanlı stenoqrafist

göndərmək lazım gələrdi. Söhbət başqa məsələdən gedir. Söhbət elə böyük, zəngin, gözəl və həqiqi dil yaratmaqdan gedir ki, o, gerçəkliyin zahiri tərəfini deyil, adamlarımızın mürəkkəb mənəvi aləmini, onların yüksək fikir və hisslərini, irəliyə doğru sürətli axında olan dolğun real həyatını ifadə edə bilsin.

Mən bu mövzuda "Şairin hüquqları" məqaləmdə demişdim. Orada mən Nizaminin, Firdovsinin, Şekspirin, Puşkinin, ümumi dostumuz və müəllimimiz V.Mayakovskinin dilini misal gətirmişdim. Ancaq bu məqaləyə görə mən Azərbaycanda nəinki mənən, hətta fiziki cəhətdən də zərər çəkdim. Elə yüksək mənsəb sahibləri tapıldı ki, məni bir sinif kimi ləğv etmək üçün bütün əsərlərimin teatrların repertuarlarından çıxarılması barədə sərəncam verdilər. (*Gülüş*)

Lakin bu qərar hər hansı bir yalan kimi uzunömürlü ola bilmədi: Elə xeyirxah "həmkarlar" da tapıldı ki, ədəbiyyatımızda yüksək üslubu müdafiə etdiyim üçün mənə qarşı "qəhrəmancasına" hücum təşkil etdilər. Onlar sübut etmək istəyirdilər ki, Vurğun realizmin anadangəlmə düşmənidir, ancaq bu "qəhrəmancasına igidlik" də hər hansı yalan və uydurma kimi puça çıxarıldı.

Dünən Mirşəkər yoldaş dedi ki, guya mən yazıçılarımızı Nizamiyə yaxud Firdovsiyə qayıtmağa çağırıram. Bu, doğru deyildir. Bu açıqdan açığa mənim fikirlərimi təhrif etməkdir. Hətta mən istəsəm belə, iki səbəbdən keçmiş yüzilliklərə qayıtmaq mümkün deyildir: əvvələn, ona görə ki, tarixin çarxı geri hərlənmir, hər zamanın həyat tərzi, psixologiyası, dünyagörüşü, öz bədii zövqü və estetik görüşləri vardır.

İkincisi, ona görə ki, Nizami də, Firdovsi də, Tolstoy da, Puşkin də böyük sələflərimiz və yoldaşlarımız kimi bizimlə birlikdə geriyə yox, irəliyə addımlayırlar. Mən onların adlarına ona görə müraciət etmişəm ki, yazıçılarımızı bu adamların yaratdıqları bədii abidələr, onlara müvafiq olan böyük və zəngin dil, onların bütün füsunkarlıqları, yüksək fikirləri, aforizmləri, fəlsəfi mühakimələri və s. kimi böyük sənətkarlığa çağırım. Mənim əsas məqsədim bu idi: bu, məsələnin subyektiv tərəfi də var idi: Nizaminin nəhəng simasını, heç olmasa, kiçik bir vərəsəsiz qoymaq istəməməyim və qoya bilməməyimdir. Böyük Firdovsiyə gələndə isə istedadlı tacik şairi Mirşəkər onun bilavasitə varisidir.

Yuxarıda deyilənin davamı olaraq, mən qısaca bir mühüm məsələ üzərində dayanmaq istəyirəm. Bu, Şərq xalqları ədəbiyyatının klassik irsinə; onun ən yaxşı ənənələrinə münasibət məsələsidir. Etiraf etmək

lazımdır ki, hələ bizim içərimizdə elə adamlar var ki, Şərq ədəbiyyatlarında yalnız mücərrədlik, tərkidünyalıq, əfsanə və uydurma görürlər. Əlbəttə, belə hallarda burjua şərqşünaslığı görüşünün qalıqları özünü göstərir. Nəhayət, biz başa düşməliyik ki, Nizami də, Firdovsi də yüzillərlə uydurma və əsassız mücərrədçilik sayəsində deyil, dahi sənətkarların əzəmətlə tərənnüm etdikləri böyük həyat və insan həqiqəti sayəsində yaşayırlar. Qədim Şərqin bir sıra bədii təfəkkür dahilərinin özünə xas, tarixən təşəkkül tapmış realizmi mövcuddur. Mən Nizami və Firdovsinin yaradıcılığındakı hətta bütün romantik örtüklər, əfsanəvi süjetlər, fəlsəfi haşiyələrin və s. olmasına baxmayaraq, oradakı obrazların reallığına heç vaxt şübhə etməmişəm.

Bizim sovet tənqidi və ədəbiyyatşünaslığımız Şərq klassiklərinin ən yaxşı realist və romantik ənənələrini dərindən və hərtərəfli öyrənməlidirlər. Unutmaq olmaz ki, çoxmillətli sovet ədəbiyyatımız bir çox milli ədəbiyyatlardan ibarətdir və hər birinin özünə xas tarixi, öz gözəl ənənələri vardır; bu ənənələri çiçəklənən sosializm şəraitində yeni bədii keyfiyyətlərlə inkişaf etdirir və zənginləşdiririk. Ona görə ki, bizim mədəniyyətimiz məzmunca sosialist formaca millidir. Lakin bu böyük məsələnin digər bir mühüm tərəfi haqqında danışmamaq mümkün deyildir: bizdə xalqlarımızın keçmişinə münasibət məsələsində aydın marksist-leninçi metodologiyası vardır. Biz keçmişin mədəniyyətini – kölələr və ağalar cəmiyyətinin mədəniyyətini idealizə etməyəcəyik. Keçmişin hətta mütərəqqi xadimlərini belə idealizə etməyəcəyik, onların dünyagörüşləri və baxışlarındakı, həm də onların estetik və bədii zövqlərindəki tarixi məhdudluq haqqında cəsarətlə danışacağıq. Lakin onlardan bizim mənəvi aləmimizin zənginləşməsinə kömək edən bütün işıqlı və mütərəqqi, bütün yaxşı və gözəl olanı götürəcəyik. Yaddan çıxarmayaq ki, yüzillərlə toplanmış bütün bəşər mədəniyyətinin nailiyyətlərinə yiyələnməliyik. Bütün bəşər mədəniyyəti özünün tarixi və milli müxtəlifliyində çox böyük ümumbəşər gözəlliyini təşkil edir və biz onu ehtiramla və məhəbbətlə qucaqlamalıyıq!

Bizim plenumda dramaturgiyamızın və ədəbiyyatımızın bəzi əsərlərinin zamanın sınağına davam gətirməməsi və öz ömürlərini qəfil ölümlə başa vurması səbəbindən qanunauyğun söhbət gedir. Bəzi yoldaşlar bunu onunla izah edirlər ki, bizim həyatda kəskin dəyişiklik baş verir. O, sürətlə inkişaf edir, adamlarımız tez-tez dəyişir, bugünkü adam tam mənada dünənki deyil. Əgər buna inansaq, dünənki "xudahafizdən"

sonra bu gün biz bir-birimizi tanımazdıq. Doğrudanmı, biz belə asanlıqla dəyişirik? Bizim inkişafımızı və adamlarımızın yüksəlişini belə vulqarlaşdırmaq olmaz. Əgər belə bir məntiqə inansaq, onda biz heç bir vaxt uzunömürlü əsərlər yaza bilmərik, ona görə ki, həyat da, adamlar da daim dəyişəcək və inkişaf edəcəklər. Bəlanın kökü tamamilə başqadır, bunun daha ciddi səbəbi var. Günün hadisələrinə, dəqiqənin meylinə həsr olunmayan, bütöv bir tarixi inkişaf dövrünün hadisələri və adamlarından bəhs edən əsərlər uzunömürlü ola bilər. Əgər dramaturq öz əsərini bu il Qafqazda merinos cinsli qoyunların yetişdirilməsinə həsr etmişsə və gələn il Əkinçilik Nazirliyi desə ki, merinoslar Qafqazın iqliminə davam gətirmirlər və Qarabağ cinsini yetişdirmək lazımdır, onda bu mövzuda əsər yazmış (belə əsərlər mövcud idi) dramaturqa merinosun zərif və sıx yunu içərisində belə isti olmayacaqdır. Böyük incəsənət mövzusunun belə xırdalanmasına aid çoxlu oxşar nümunələr gətirmək olar. Mən yaxşı, xeyirli oçerkləri qiymətləndirirəm. Ancaq böyük incəsənətin qapılarını oçerkçiliyə açmaq olmaz. Biz öz zamanımızın mövzularını seçməyi bacarmalıyıq və dövrü ifadə edən əsərlər yaratmağa çalışmalıyıq. “Sakit Don” və “Tarmar”, “Lyubov Yaravaya” və “Rus meşəsi”, “Vasili Tyorkin” və “Oğul” poemaları həyatımızın, mənəvi inkişafımızın müəyyən mərhələlərini inikas etdirdiyi üçün uzun illər yaşayacaqlar.

Açılan yaradıcılıq mübahisələri arabir gözlənilməz çıxışlarla kəsilməsə idi, plenumumuz daha təsirli nəticələr verə bilərdi. Biz dramaturgiyamızın sonrakı inkişafı naminə öz yaradıcı simamızı, yaradıcı bioqrafiyamızı təkrar-təkrar yoxlamalıyıq. Partiyamız, tamaşaçılarımız bizdən nə tələb edir? Mən başa düşürəm ki, bizim hər birimizin içində bu və ya digər dərəcədə yaradıcı “özünəməftunluq” hissi vardır. Elə mən özüm də bir çoxları kimi bu xəstəliyə tutulmuşam. Ancaq biz özümüzdə hər bir böyük, yaxud kiçik yazısının əməyini obyektiv və vicdanla başa düşmək və qiymətləndirmək kimi müqəddəs xeyirxahlıq hissi tərbiyə etməliyik. Bu o deməkdir ki, mən sizin ifadə etdiyiniz kimi başa düşməliyəm, daha yoxsa heç fikrinizdə olmayanı durub sizin ayağınıza yazmamalıyam. Bu isə bizdə tez-tez olur. Bu ümumi inkişafımızı ləngidir, hər birimizə mane olur.

Qədim yunan filosofu demişdir: “Əgər bir hamımız biz-birimizin sözünü əsil mənasında başa düşsək, hamımız üçün vahid olan həqiqətin dərkinə daha tez çatmış olarıq”.

*1953*

## MƏTBUATIMIZ HAQQINDA

Hər il mayın beşində xalqımız – milyonlarla sovet oxucusu, dünyanın ən qabaqcıl mətbuatı olan sovet mətbuatı gününü dərin iftixar hissilə qeyd edir.

Sovet mətbuatının gücü, hər şeydən əvvəl və hər şeydən artıq, onun doğruçuluğunda, cürətli olmasındadır. Hər bir yeniliyi, hər bir mütərəqqi və inqilabi cəhəti təbliğ etmək və həvəsləndirmək üçün qüvvətli bir vasitə olan sovet mətbuatı hər cür ətaləti, iyrəncliyi, geriliyi, mühafizəkarlığı da eyni dərəcədə mərdliklə qamçılamağı və kökündən qoparmağı bacarır. Bu mənada sovet mətbuatı sovet adamlarının nəcib və mərd xarakterinin yaranıb təşəkkül tapmasında böyük rol oynamışdır.

Mətbuatdakı sözün əsasını təşkil edən ideyaların, fikirlərin, duyğuların həqiqiliyi və aydınlığı sovet mətbuatının əsas xüsusiyyətidir. Bu xüsusiyyət burjua mətbuatı üçün xarakterik olan liberal və riyakar "insanpərvərliyə" qarşı, yalançılığa və aldadıcılığa qarşı çevrilmişdir.

Mətbuatımızın tarixi xalqımızın canlı tarixidir, onun mübarizəsinin, yaratdığı böyük dəyişikliklərin tarixidir. Gələcək nəsillər öz babalarının tərcümeyi-hallarını, bütün bəşəriyyətin səadəti naminə işıqlı idealların təntənəsi uğrunda onların nə qədər böyük fədakarlıq, nə qədər böyük ardıcıllıqla mübarizə apardıqlarını məhz mətbuatımızdan öyrənəcəklər. Bizim mətbuatımız görkəmli hadisələrlə dolu olan zəmanəmizin ensiklopediyasıdır.

Bizim mətbuatımız kabinələrdə doğulmamışdır. O, cəbhələrdə vuruşan müzəffər bir əsgər kimi, passifizmə qarşı, meşşanlığa qarşı, insanların şüurundakı idealist – dini mövhumata, fatalizmə və cəhalətə qarşı idrakın, materialist fəlsəfənin, əsil həqiqi elmin təntənəsi naminə qızğın mübarizədə doğulmuş, yetkinləşmiş və boy atıb böyümüşdür.

Sovet ədəbiyyatının inkişafında, poeziyamızın və nəsrimizin ən yaxşı nümunələrinin geniş kütlələr arasında yayılmasında mətbuatımız – qəzet, jurnal və kitablarımız olduqca böyük rol oynamışdır. Sovet mətbuatı bizim ən səmimi əməl və arzularımızı ifadə edir, ədəbi həyatımızda fəal iştirak edir.

Sovet mətbuatı ədəbiyyatımızın ideya-nəzəri və bədii səviyyəsini yüksəldən, onu formalizm, simvolizm, dekadentlik və kosmopolitizm kimi xalqa zidd cərəyanlardan təmizləyən, sosialist realizmi və inqilabi romantizm prinsiplərinə qələbə qazandıran qüdrətli bir müəllimdir. Mətbuatımızın həyatında istiqamətverici rol oynayan mübariz ali bir

qərargah olan "Pravda"nın bu işdə böyük və nəcib xidmətlərini ayrıca qeyd etmək istəyirəm.

Mən öz yaradıcılığımın təşəkkül tapıb inkişaf etməsində mətbuatımızın görkəmli roluna hədsiz dərəcədə minnətdaram. Mənim ən yaxşı şeirlərim, poemalarım, tənqidi və publisist məqalələrim, oçerklərim və başqa yazılarım ilk dəfə qəzet və jurnallarımızın səhifələrində dərc edilmişdir. Mətbuatımız yaradıcılığımın genişlənib zənginləşməsinə daim kömək etmişdir.

Mətbuatımız mənim yaradıcılığımdakı ayrı-ayrı səhv və nöqsanları vaxtında, düzgün və cürətlə göstərmişdir. Mənim "İnsan" pyesim haqqında Azərbaycan KP MK orqanı "Kommunist"in tənqidi məqaləsi buna canlı misaldır. Vaxtında edilən bu düzgün partiya xəbərdarlığı pyesdəki idealizm əlamətlərini, onun "xeyr ilə şər arasındakı əbədi mübarizə" fikrindən ibarət olan qüsurlu fəlsəfi əsasını başa düşmək, öz realist ənənələrimizə qayıtmaq, sosialist realizmi prinsiplərimizə uyğun olan əsərlər yazmaq üçün mənə kömək etmişdir. Mən, oxucuların tanıdıqları "Zəncinin arzuları", "Muğan", "Köhnə dostlar", "Leninin kitabı" poemalarımı və bir çox başqa əsərlərimi məhz bu tənqiddən sonra yazmışam.

Biz Azərbaycan yazıçıları ədəbiyyatımızın inkişafında rus mətbuatının son dərəcə böyük tarixi rol oynadığını mətbuatımızın bu şanlı yubileyi günündə dərin iftixar və minnətdarlıq hissilə qeyd edirik. Heç kimə gizli deyildir ki, bizim milli yazıçılarımızın əsərləri, məhz rus mətbuatının sayəsində bütün sovet xalqlarının malı olmuşdur. Rus dili sayəsində, bizi ruscaya tərcümə edən böyük qələm qardaşlarımız rus şairləri və yazıçılarının böyük əməyi sayəsində əsərlərimiz xarici ölkələrdəki oxucu dostlarımız arasında da yayılmışdır.

Mənim P.Antokolski tərəfindən tərcümə edilmiş "Xanlar" pyesim bu yaxınlarda Çexoslovakiyanın paytaxtı Praqada tamaşaya qoyulmuşdur. Bunun üçün mən bütün dünya xalqları arasında mədəni əlaqələrin möhkəmləndirilməsində qüdrətli bir vasitə olan böyük rus dilinə minnətdaram.

Mətbuatımızın şanlı yubileyi gününü qeyd edərkən biz sovet yazıçıları öz mətbuatımıza, öz böyük xalqımıza borclu olduğumuzu bir daha etiraf edirik. Biz, mübariz mətbuatımızın səhifələrini yeni, dolğun məzmunlu bədii əsərlərlə zinətləndirməli, ədəbiyyatımızın və bütünlüklə mətbuatımızın daha artıq zənginləşməsinə kömək etməliyik.

*1953*

# ŞAİRİN HÜQUQLARI

Dünyada ən qabaqcıl ədəbiyyat olan çoxmillətli sovet ədəbiyyatı yalnız özündə yeniliyi, sosialist məzmununu ifadə etməsi ilə deyil, eyni zamanda öz zənginliyi ilə də güclü və gözəldir.

Sosializm realizmi bizim bütün ədəbiyyatımız üçün vahid metoddur, lakin bu metod bütün millətlərdən olan sovet yazıçılarını heç də məcbur etmir ki, onlar həyatımızın bütün proseslərini və hadisələrini yalnız müəyyən bir çərçivə daxilində, bütün milli ədəbiyyatlar üçün yeganə olan bir formada açıb göstərsinlər və ümumiləşdirsinlər. Sosializm realizmi metodunun mahiyyətini belə başa düşmək – onu ehkam halında, məhdud şəkildə başa düşmək və həyat həqiqəti ilə tam ziddiyyətə girmək deməkdir. Axı, həyat özü müxtəlif şəkillərdə təzahür edir, bu isə incəsənətdə formaların, o cümlədən milli formanın da rəngarəng və müxtəlif olmasını şərtləndirir. Hər bir millətin öz tarixi inkişaf yolu, öz məişət tərzi, əsrlər boyunca yaranıb təkmilləşmiş öz ənənələri vardır, öz dili, öz adətləri, vərdişləri, öz düşüncə tərzi və ruhi aləmi vardır. Bütün bunlar hər bir millətin təkraredilməz və xüsusi keyfiyyətini təşkil edir...

Azərbaycanlı Süleyman Rüstəm və belorus Arkadi Kuleşov, rus şairi Mixayil İsakovski və gürcü şairi Georgi Leonidze kimi bir-birinə oxşamayan şairlərin istedadları yalnız milli zəmində inkişaf edib ərsəyə çata bilmişdir.

Hamıya məlum olan bu ümumi həqiqətləri ona görə təkrar etmək lazım gəlir ki, ayrılıqda hər bir milli ədəbiyyatın, milli formanın özünəməxsus xüsusiyyətləri sayəsində bizim ümumsovet ədəbiyyatının inkişafı işinə verdikləri hədiyyəni qiymətləndirməyən adamlar indi də tapılır.

Ədəbiyyatçıların və tənqidçilərin bir qisminin arasında belə bir bəsit və zərərli "nəzəriyyə" vardır ki, bu nəzəriyyəyə tərəfdar olanlar milli formalar arasındakı müxtəlifliyi yalnız sovet xalqları ədəbiyyatlarındakı dil fərqlərindən ibarət bilirlər və milli formanın bütün qalan xüsusi ünsürlərini inkar edirlər. Beləliklə, onlar mahiyyət etibarilə sosialist millətlərin özünəməxsus orijinallığını, milli xarakterin zəngin xüsusiyyətlərini inkar edirlər.

Həmin "nəzəriyyə"nin tərəfdarları nəyi əsas götürürlər? Onlar təsdiq edirlər ki, bir halda ki, SSRİ-də yaşayan bütün xalqlar bütün ölkə üçün ümumi olan fikir və arzularla yaşayırlar, həmin xalqların arasında müəy-

yən fərqin olması haqqında da danışmağa əsas yoxdur. Azərbaycanlı da – sovet adamıdır. Onlar yalnız dillərinə görə bir-birindən fərqlənirlər.

Əlbəttə, bu doğrudur: biz hamımız sovet adamlarıyıq. Lakin sosializm mədəniyyəti yalnız milli formada inkişaf edə bilər. Gələcəyin yolu – millətlərin, milli dillərin və milli mədəniyyətlərin çiçəklənməsi yoludur.

Bu, bütün sosialist millətlərin hamısına aiddir.

Əlbəttə, öz-özlüyündə aydındır ki, bugünkü milli forma öz dünənki şəklində deyildir. Milli forma arasıkəsilməz dialektik inkişafdadır; milli formaya dəyişməyən, donmuş, həmişəlik və ədəbi bir kateqoriya kimi baxmaq olmaz. Onun müəyyən keyfiyyətləri ölüb aradan çıxır, müəyyən yeni keyfiyyətləri isə yaranır; beləliklə, milli formanın bütün keyfiyyətləri arasıkəsilməz bir halda, xüsusilə indi daha coşqun şəkildə zənginləşmə prosesi keçirir.

Bu və ya digər bir millətdən olan sovet adamının xarakterini təsvir edən yazıçı nəzərə almaya bilməz ki, onun qəhrəmanının milli xarakteri əsaslı surətdə dəyişmişdir. Həmin qəhrəmanın ayrılmaz, milli keyfiyyətlərindən biri indi proletar beynəlmiləlçiliyi olmuşdur. Beynəlmiləlçilik insanın milli xüsusiyyətlərini təsdiq etməklə bərabər, eyni zamanda onu milli varlığın elə bir yüksəkliyinə qaldırır ki, burjua cəmiyyəti belə yüksəkliyi heç bir zaman tanımamış və tanıya da bilməz.

Əgər yazıçı yeni bədii vasitələrin gücü ilə öz xalqının başqa xalqlarla qardaşlıq birliyindəki inqilabi coşqunluğunu inikas etdirməsə, o zaman həmin xalqın irəliyə doğru irəliləməsini də göstərə bilməz, beləliklə də öz vəzifəsini yerinə yetirməmiş olar. Yazıçı əgər öz xalqının həyatına möhkəm daxil olmuş yeniliyin təzahür etdiyi xüsusi formaları nəzərdən qaçırarsa, o, yenə də müvəffəqiyyətsizliyə uğrayacaqdır. Əgər yazıçı nə isə universal, həmişə və hər şey üçün ümumi ola biləcək mücərrəd formalar axtarmaqla məşğul olsa, yenə də səhv edəcəkdir.

Milli formaların zənginləşməsinin mənbəyi həyatın özündədir, müxtəlif xalqların ədəbiyyatları arasındakı sıx və möhkəm qarşılıqlı yaradıcılıq əlaqəsində və təsirdədir.

Məsələn, böyük rus ədəbiyyatının Azərbaycan ədəbiyyatına nə qədər səmərəli təsir göstərdiyi, bu ədəbiyyatda qabaqcıl ideyaların və orijinal formaların inkişafına nə qədər kömək etdiyi məlumdur.

Klassik rus poeziyasının bir çox ünsürləri (əlbəttə, yaradıcı cəhətdən mənimsənilmiş şəkildə) Azərbaycan poeziyasının üzvi ünsürləri

olmuşdur. Məsələn, rus poeziyasında olan "Onegin bəndi" tamamilə hüquqlu bir şəkildə Azərbaycan poeziyasına da daxil olmuşdur. Mayakovskinin mübariz şerinin ritmikası Azərbaycan şerinin sillabik vəzninə daxil olmuşdur.

Rus poeziyası həmçinin Azərbaycan poeziyasının demokratik, mütərəqqi ənənələrinin inkişafında böyük rol oynamış, bizim poeziyanın sxolastikadan, əsassız mücərrədlikdən, didaktikadan, süni dəbdəbədən, köhnəlmiş poetik forma və qanunlardan, vaxtı ilə Axundovun və bizim digər realist yazıçılarımızın mübarizə apardıqları əhəmiyyətsiz poetik normalardan azad olması işinə kömək etmişdir.

Ədəbiyyatların arasındakı qarşılıqlı əlaqə və təsiri nəzərə almamaq tamamilə açıq-aşkar olan faktlara göz yummaq demək olardı. Lakin, eyni zamanda, hər hansı bir milli ədəbiyyatın ənənələrinin başqa bir milli ədəbiyyatda özünəməxsus şəkildə inikası haqqında sükut edən adamlar da səhvə yol verirlər. Ədəbiyyatlar arasındakı qarşılıqlı əlaqəni və təsiri əsas götürərək, milli formaların özünəməxsus bütün xüsusiyyətlərini və zənginliyini inkar etməyə təşəbbüs göstərənlər də səhvə yol verirlər.

Sosializm realizmi metodu bizim üçün vahid metoddur, lakin sosializm realizminin dünyada hər şeyi əhatə edən, hamı üçün vahid və məcburi olan yeganə "forması" yoxdur.

* * *

Sovet Azərbaycanının şairləri də bizim hər hansı respublikamızın şairləri kimi vahid bir metod – sosializm realizmi metodu ilə işləyirlər. Lakin onların hərəsi bir cür yazır... Şairlər öz yaradıcılıqlarında ən müxtəlif poetik priyomları tətbiq edirlər, bədii ifadənin ən müxtəlif vasitələrinə müraciət edirlər.

Süleyman Rüstəmin qabarıq, parlaq boyalarla cilalanmış şerini heç bir zaman Əhməd Cəmilin lirik tonun, qızğın bir səmimiliyin üstün gəldiyi şeirləri ilə qarışdırmaq olmaz. Rəsul Rza və Məmməd Rahim kimi şairlər bəzən yaradıcılıq müzakirələrində qızışaraq hətta bir-birini "inkar" etməyə təşəbbüs göstərirlər. Lakin nə etmək olar? Əlbəttə, bu, lazımsız halda müəyyən bir rütbə keçmək, "əyintiyə" yol vermək deməkdir, ancaq mahiyyət etibarilə belə bir müzakirə onu təsdiq edir ki, bizim şairlərimiz canlı, bir-biri ilə yaradıcılıq yarışında çalışaraq inkişaf edir və irəliləyirlər.

Bizim əsas yaradıcılıq metodumuzun imkanları dairəsində hər bir şairin öz fərdi poetik üslubunu yaratmağa və onu dərindən ifadə etməyə bütün hüquqları vardır.

Aramızda elə vulqar ədəbiyyatçılara təsadüf olunur ki, onlar sosializm realizminin prinsiplərini təhrif edirlər, danışıq zamanı "yüksək", "romantik", "dəbdəbəli" kimi sözlərdən tamamilə qorxurlar. Axı, sosializm realizmi metodu bir çox cəhətləri əhatə edir!

Bizim həyatımızın həqiqəti, bizim fikirlərimiz və hisslərimiz, bizim ideallarımızın həqiqəti donmuş bir şəkildə deyildir, bu həqiqət genişdir, onun böyük gələcəyi vardır. Bizim həqiqətimiz əbədi irəliləyiş və inkişaf prosesi keçirir, sovet adamlarının gözəl gələcəyə ehtiraslı meylində öz ifadəsini tapır. Şairin fikri gərək qartal qanadları üzərində ucalsın və həyatın şəfalı havası bu fikirlərə qida versin.

Bizim həqiqətimiz yüksək ideallarımızla qanadlanmış bir həqiqətdir.

Mən qətiyyən demək istəmirəm ki, üslubun romantik və dəbdəbəli olması yaradıcılıqda bütün şairlər üçün istisna edilmədən, onların poetik fərdiyyətləri nəzərə alınmadan məcburidir. Belə bir fikri təsdiq etmək mənim özümün həmişə mübarizə apardığım sxolastikanın əsiri olmaq deməkdir.

Lakin mən inanıram ki, poeziya romantik və yüksək üslubsuz və keçinə bilməz, çünki romantika bizim daim irəliyə doğru inkişaf edən həyatımızın özündə vardır.

Əgər sovet şairi sosializm realizm zəminində möhkəm dayanırsa, əgər o, həyat həqiqətinə sadiqdirsə, cəsarətlə öz qəhrəmanını romantik vüsətdə göstərə bilər, çünki oxucu ilə fəlsəfi söhbət açmaq üçün qəhrəmanın özünü və taleyini təntənəli və yüksək boyalarla göstərmək əlverişlidir.

Bizim adamlar, bizim həyatımız onların haqqında poetik əfsanələr yaradılmağa tamamilə layiqdirlər. Mayakovski yazırdı ki, sovet adamlarının məhəbbəti "Onegin məhəbbətindən də güclüdür". Belə olduqda mən soruşuram ki, bəs nə üçün mənim qəhrəmanlarımın dili – emosionallıq, dəbdəbəlik cəhətdən – vaxtı ilə Lenskinin, Otellonun, Tatyananın, Dezdemonanın danışdıqları dildən geri qalmalıdır? Nə üçün Nizaminin yaratdığı sadə daşyonan Fərhad yüksək fəlsəfi məna daşıyan, poetikləşdirilmiş bir dildə danışırdı, müasir sovet adamları, dünyada ən qabaqcıl fəlsəfəyə çatmış bu insanlar şairlərin əsərlərində belə bir yüksək dildə danışmaq hüququndan məhrumdurlar? Mən inanıram ki,

poetik dilin dəbdəbəli və yüksək olmağı yalnız keçmiş dövrün yazıçılarına, bəzi şairlərin öz obrazlarını mücərrəd və romantik bir dildə danışdırmağa məcbur olduqları dövrün proqressiv ideallı şairlərinə məxsus deyildir! Həyatın yeni böyük məzmunu onun sosialistcəsinə ifadəsində də bir çox yeni formalar tələb edir ki, bunların arasında da yüksək romantik üslub haqlı olaraq əsas yerlərdən birini tuta bilər.

* * *

Bizim poeziyamızda cərəyanların, janrların, ifadə vasitələrinin və priyomların çox olmağı eyni zamanda poetik səslərin rəngarəngliyi və çoxluğu ilə həmahəngdir.

Təəssüf ki, bir çox şairlər öz yaradıcılıq fərdiyyətlərinə həmişə sadiq qalmırlar. Özlərini qorumaq məqsədi ilə "orta hesaba", "qızıl orta" vəziyyətinə meyl göstərən şairlər özlərini simasızlaşdırır və onların şeirləri də iki damcı su kimi bir-birinə oxşayır.

Bəzən də belə olur: görürsən ki, hər hansı bir şairin özünəməxsus müəyyən bir səsi vardır, lakin həmin şair, nədənsə, bir janr üçün yararlı olan bu səsi başqa janrlara da tətbiq edir. Bunun səbəbi nədir? Lirik şeirlər yazan şair epik mövzuya müraciət edəndə, görürsən ki, müvəffəqiyyətsizliyə uğrayır, özü öz səsinə xəyanət edir, axırda da onu itirir... Mən belə hesab edirəm ki, poetik iqlimin birdən-birə dəyişməsi, əlbəttə, yaradıcılığın "soyuqlamasına" əsas səbəb deyildir. İqlimi dəyişmək lazımdır, çünki bunun poetik səsin sağlamlığı üçün əhəmiyyəti vardır. Lakin yalnız bir janrın dairəsində məhdudlaşıb qalmaq olmaz. Şair hər yerdə və hər cürə iqlimdə öz xüsusi poetik səsini qoruyub saxlamalıdır.

Mən epik mövzuların yalnız epik əsərlər yazan şairlər üçün, lirik mövzuların isə yalnız "təmiz" lirik şeirlər yazan şairlər üçün mövcud olduğunu təsdiq edən adamların fikri ilə şərik deyiləm. Məhəbbət haqqında qüvvətli, oxucunu həyəcana gətirən şeir yazmış şair eyni emosional qüvvətlə öz süjetli şeirlərində, məsələn, deyək ki, poladəridənin həyatı və zəhməti haqqında , yaxud şaxtaçının həyatı və zəhməti haqqında da danışa bilər və bu barədə epik əsərlər də yarada bilər. Lakin həmin şair bir mövzudan başqa mövzuya keçərkən öz poetik səsini dəyişmək istəsə, yeni seçdiyi mövzuya guya daha çox "uyğun" gələn və bu janrda "qəbul olunmuş" bir qaydada səsini kökləsə, o zaman heç bir müvəffəqiyyət qazanmayacaqdır.

Lirik şeirlər yazan Məmməd Rahim, bizcə, "Leninqrad göylərində" poemasında da öz poetik səsini saxlaya bilmişdir. Bu isə onun üçün müvəffəqiyyətdir. Lakin o, "Abşeron torpağında" poemasında öz ifadəsini tapmış başqa yeni bir mövzuya müraciət edərkən öz yaradıcılığında qalxmış olduğu yüksək mövqeyi saxlaya bilməmişdir, çünki o öz təbii poetik səsinə xəyanət etmişdir. O öz qəhrəmanlarını lirik bir şəkildə tərənnüm etmək əvəzinə onların haqqında mədhiyyəçilik üslubunda danışmağa başlamışdır.

Əlbəttə, şairin öz poetik səsini müxtəlif janrlarda yoxlayıb nümunə etməsi yaxşıdır. Lakin hər bir janr üçün hər bir mövzu üçün nə isə xüsusi bir poetik səsin tələb olunduğunu düşünmək gülüncdür.

Macarıstanın böyük lirik şairi Petefinin, bolqar poeziyasının klassiklərindən sayılan Xristo Botevin yaradıcılığında (mən onların ikisini də çox sevirəm) həm məhəbbətə dair şeirlər, həm də çox kəskin siyasi və ictimai motivlərdə yazılmış şeirlər istənilən qədər vardır. Azərbaycan xalqı dörd yüz ildir ki, öz dahi lirik şairi Füzulinin qəzəllərini və 200 ildir ki, Vaqifin şeirlərini mahnı kimi oxuyur. Bu şairlər, öz yaradıcılıqlarında müxtəlif mövzu və motivlərin bolluğuna baxmayaraq, heç bir zaman öz poetik səslərini zorlamamışlar, öz yaradıcı fərdiyyətlərini dəyişməmişlər.

Bizim zəmanədə, sosializm dövründə isə şairin yaradıcı fərdiyyəti nə qədər dolğun və hərtərəfli açılıb çiçəklənə bilər!

Bizim hamımızın ümumi dostumuz və yaradıcılıq müəllimimiz olan Vladimir Mayakovskinin yaradıcılığı bunun ən yaxşı nümunəsidir. Mayakovskinin böyüklüyü həm də ondadır ki, onun əsərlərində (istər lirik, istərsə də epik və satirik əsərlərində) mövzuların və janrların çoxluğuna baxmayaraq, biz şairin öz xüsusi səsini, onun poetik fərdiyyətini də duyuruq. Biz gərək Mayakovskidən eyni zamanda poetik səsə sadiq qalmağı və cəsarətli olmağı öyrənək. Mayakovskinin vaxtı ilə nə qədər hücumlara məruz qaldığını, nə qədər mübarizələr aparmağa məcbur olduğunu xatırlamaq kifayətdir. Bütün bu mübarizələrin içərisində o, bir dəfə də olsun öz poetik səsini dəyişməmişdir... Mayakovskinin əleyhdarları olan həyasız demaqoqlar şairi subyektivizmdə və guya təvazökarsızlıqda təqsirləndirirdilər. Onların fikrincə, guya Mayakovski öz şeirlərində "mən" sözünü həddindən çox işlətmişdir.

Lakin axı, Mayakovskinin lirik "mən"i bir qram da olsun subyektivizm mənası daşımamışdır! Mayakovski xalq ruhunun böyüklüyünə

dərindən inanan, heç bir zaman özünü xalqdan ayırmayan əsil xalq şairi idi. Onun öz əsərlərində işlətdiyi "mən" sözündə xalqın arzu və istəkləri, düşüncələri və idealları təcəssüm etmişdir. Çox qüvvətli xarakterə malik bir şair olan Mayakovski öz poetik mənliyinin əzəmətli gəmisini dumanlar və burulğanlar arasından məharətlə və cəsarətlə keçirib irəliyə aparmışdır...

Mayakovski öz xalqına, öz dövlətinə, öz partiyasına tamamilə sadiq idi və deməli, o heç bir zaman partiyanı dövlətimizi tərənnüm edən öz poetik səsini dəyişə bilməzdi.

* * *

Bizim poeziyamızda poetik fərdiyyətlərin çox zaman aradan çıxmasının taqsırkarı təkcə şairlərin özləri deyil, həm də ayrı-ayrı poeziya "xiridarlarıdır". Məsələn, istedadlı şair Zeynal Xəlil "Həyatın gözəl günləri" adlı avtobioqrafik şerini yazarkən simasız poeziya tərəfdarları onun üzərinə hücum edərək, şairi "mən-mən" deməkdə taqsırlandırır, guya şair ictimaiyyətin səsini gözləmədən öz otuz illik yubileyini qeyd etməyi qərara almışdır... Halbuki şair Zeynal Xəlil həmin şerində öz uşaqlıq illərində keçirdiyi ağır günlər haqqında və eyni zamanda Sovet hakimiyyəti illərində gəlib çatdığı xoşbəxtlik haqqında çox səmimi və coşqun bir şəkildə danışmışdır...

Şair həmin şerində ümumi cümlələrdən, öz nəslinin xoşbəxt həyatı haqqında hamıya məlum olan ümumi ifadələr yazmaqdan qaçmışdır. Lakin şeri oxuyan oxucu həmin şerdə təsvir olunan şairin taleyində öz taleyini də görməyə bilməz. Bu şeir oxucunu həyəcanlandırır, düşündürür, bur əsas cəhət isə nəzərdən qaçırılmışdı.

Şairlik etdiyim müddət ərzində mən özüm də dəfələrlə çox böyük təəssüf hissi keçirmişəm, acımışam, çünki bəzən ədəbiyyat haqqında mühakimə yürüdən ayrı-ayrı adamlar mənim əsərlərimi oxuyarkən yaradıcılıq meyllərimi, mənim əsərlərimdə olan romantik dəbdəbənin mənasını və mahiyyətini anlamamışlar, halbuki, mən belə bir üslubun indi də qızğın tərəfdarıyam. Əlbəttə, mən başa düşürəm ki, keçdiyim yaradıcılıq yolunda bu məsələdə mən həmişə nailiyyət qazanmamışam; lakin bu, mənim səhv yol seçdiyimi hələ göstərmir. Mən məhz bu yolla gedərək "Vaqif" və "Xanlar" pyeslərimi, "Zəncinin arzuları" poeması və imkanlarım daxilində müvəffəqiyyətli çıxmış buna bənzər digər əsərlərimi yaratmışam.

Poeziyada orijinallığın əleyhdarları çox zaman sosializm realizmi metodunu əsas göstərirlər. Lakin bu metod şairin yaradıcılıq qüvvələrini bağlamır, əksinə, həmin qüvvələri açır, şairə poeziyada özünə məxsus bir təbiiliklə və parlaq surətdə işləməyə imkan verir. Ayrı-ayrı müvəffəqiyyətsizliklər heç bir zaman bizi qorxutmamalı, bizi böyük yaradıcılıq axtarışları yolundan sapdırıb başqa, tapdanmış yollara salmamalıdır. Bu cəhəti gənc şairlərin tərbiyəsi işində xüsusilə yadda saxlamaq lazımdır.

* * *

Mən burada yaradıcılıq fərdiyyəti məsələsi ilə əlaqədar olan başqa bir ciddi məsələyə də toxunmaq istəyirəm: bu da poetik səsin qüvvəsi məsələdir.

Əsil şair öz-özünü sığorta etmək məqsədi ilə, mübarizə və "mürəkkəbləşdirmə"dən qorxaraq öz poetik səsini heç bir zaman azaltmamalıdır. Əgər şair öz oxucuları ilə danışmaq üçün çox dərin bir daxili ehtiyac hiss edirsə, onlarla çox güclü və namuslu, cəsarətli və aydın bir dildə danışmalıdır. Məhəbbət heç bir zaman yarımçıq ola bilməz; yarımçıq şəkildə nifrət bəsləmək də mümkün deyildir. Şair xalqın qəhrəmanlığına olan məhəbbətini hərtərəfli və bütün dolğunluğu ilə ifadə etməli, eyni zamanda bizim irəliyə doğru hərəkətimizə mane olan bütün geri qalmış, qüsurlu və saxta olan hər şeyə qarşı öz nifrətini də aydın ifadə etməlidir.

Partiyamız deyəndə ki, bizə qoqollar və şedrinlər lazımdır, bu heç də o demək deyildir ki, bizim ölkəmiz satira yazmağı bacaran istedadlarla yoxsuldur. Söhbət o barədə gedir ki, əsil satirik əsər yalnız həqiqi yaradıcılıq cəsarəti nəticəsində, əhatəli və ifşaedici bir dildə danışmağı bacaran yazıçıların cəsarətlə və dərindən həyata nüfuz etməsi nəticəsində yarana bilər!

Biz poeziyada əbədi yaşaya biləcək, əhatə dairəsi geniş olan əsərlər yaratmağa doğru getməliyik. Mayakovski də bizi belə bir poeziya yaratmağa çağırırdı:

Elə şeir verin ki,
        ömrü, heç olmasa,
Yüz il olsun,
Tüstü kimi yayılıb
        əriməsin.

Elə şeir ki,
        cingildəsin qulaqlarda,
        onunla fəxr edəsən
        zamanın qarşısında,
Respublikanın,
Sevgilinin qarşısında.

Bizim ümumi vəzifəmiz sovet klassik poeziyasının qızıl xəzinəsini yeni əsərlərlə zənginləşdirməyə çalışmaqdır.

*1953*

## NİZAMİ GƏNCƏVİ

Bütün sovet xalqları bu gün, Azərbaycan ədəbiyyatının milli fəxri və şöhrəti, dünya poeziyasının böyük siması, azadlıq və səadət nəğməkarı, humanist şair Nizami Gəncəvinin vəfatının 750-ci ildönümünü qeyd edirlər. Realist poeziyanın banisi olan Nizami özündən sonra "Xəmsə" adı ilə şöhrət tapmış beş ölməz poema qoyub getmişdir.

Böyük şair Puşkinin dili ilə desək, Nizami özünə elə bir heykəl yaratmışdır ki, bu heykələ doğru gedən el yolunu heç bir zaman ot basmamış və basmayacaqdır...

Nizamini bizdən 750 illik bir vaxt ayırır. Bu müddət ərzində Azərbaycan torpağı yadelli işğalçılar tərəfindən dəfələrlə dağıdılmış və qarət edilmişdir. Bu müddət ərzində çox əzablar görmüş Azərbaycan xalqı bir çox qiymətli şeylər itirmiş, çox şeylər onun xatirindən çıxmışdır. Lakin o özünün ən başlıca sərvətini – milli dilini, mədəniyyətini, öz doğma oğlu və şairi Nizamini itirməmiş və yaddan çıxarmamışdır.

XII əsrdə Azərbaycanda bir sıra böyük şairlər olmuşdur. Onlar xalqımıza böyük bir ədəbi irs qoyub getmişlər. Xaqani Şirvani, Əbül-Üla Gəncəvi, Məhsəti xanım Gəncəvi, Fələki Şirvani, Qətran Təbrizi və başqalarının əsərləri bu gün belə bizim üçün qiymətli və əzizdir. Lakin bu ölməz poetik simaların içərisində Nizaminin nəhəng siması bir günəş kimi ucalır.

Nizaminin yaradıcılığındakı hansı ideyalar, ictimai motivlər, hansı estetik və bədii görüşlər bizə kömək edir?

Nizaminin bizim üçün ən böyük əhəmiyyəti və qiyməti şairin demokratik və humanist görüşləridir, onun insana və həyata olan sonsuz eşqi, həyat həqiqətinə və insana möhkəm inamı, işıqlı qüvvələrin qaranlıq üzərindəki qələbəsinə, xeyrin şər üzərindəki qələbəsinə inamı, nəhayət, onun zəhmətkeş insanın yaradıcı qüvvəsinə olan inamıdır. Bunu da qeyd etmək lazımdır ki, bütün bu yüksək mənəvi keyfiyyətlər təkcə şairin şəxsi keyfiyyətləri deyil, bəlkə onun mənsub olduğu xalqın nəcib mənəvi keyfiyyətləridir.

Yüksək ideyaları və arzuları ilə dahi şair, hər şeydən əvvəl, ürəkdən sevdiyi və ömrünün sonunadək bir gün belə ayrılmadığı öz xalqına minnətdardır. Təsadüfi deyildir ki, yalnız "Leyli və Məcnun" poemasından başqa şairin bütün əsərləri Azərbaycan folkloru, şifahi xalq yaradıcılığı, xalq nağılları və əfsanələri əsasında yazılmışdır. Burada şairin həqiqətən böyük bir mənəvi qəhrəmanlığını qeyd etmək lazımdır.

Hamıya məlumdur ki, orta əsr ənənələrinə uyğun olaraq bir çox böyük və kiçik şairlər özlərinin şah və sultanlara, xəlifə və əmirlərə yaxın olmaları ilə, saray şairi olmaları ilə fəxr etmişlər. Çünki bu vəziyyət həmin şairlərin həm maddi həyatını təmin edir, həm də onlar üçün mənsəb yaradırdı. Lakin böyük vətənpərvər şairimiz əsrlərdən bəri davam edən bu ənənəvi qırmışdır. O, saray şairi olmaq istəməmiş və xalq şairi olmağı daha üstün tutmuşdur. Bu, Nizaminin xalqa olan böyük sevgisini və onun vətəndaşlıq qürurunu göstərir.

Xalqla olan bu bağlılıq şairin yaradıcılığındakı dərin xəlqiliyin əsasını təşkil edir. Real həyat şairin yaratdığı bütün əsərlərin mayasını təşkil etmiş, bir sıra canlı real obrazlar, real lövhələr yaratmaqda böyük sənətkara kömək etmişdir.

Nizaminin bütün qəhrəmanları canlı insanlardır; onlar hamısı canlı insanlar kimi yaşayır, düşünür və yaradırlar.

Nizaminin obrazları ona qədərki orta əsr ədəbiyyatında mövcud olan mücərrəd və əfsanəvi obrazlardan tamamilə və kökündən fərqlənir. Nizami öz əsərlərində xeyir və şər qüvvələri mücərrəd bir şəkildə deyil, konkret insan obrazları vasitəsilə göstərmişdir. Onun yaratdığı obrazlar həyatda real bir qüvvə kimi yaşayır, mübarizə edirlər.

Şair öz əsərlərində əfsanəvi mələkləri, huriləri və pəriləri tərənnüm etməmişdir. Onun təsvir etdiyi gözəllər canlı insanlar olub, düşüncə, ağıl və qəlbə malikdirlər.

* * *

Nizaminin yaradıcılığındakı qiymətli bir cəhəti xüsusi qeyd etmək lazımdır. Bu da onun zəhmətkeş insana olan sonsuz məhəbbətidir. Şair insan həyatının ən böyük mənasını məhz zəhmətdə görürdü.

Şairin bütün əsərlərində zəhmətkeş insanın mənsəb sahiblərindən – şahlardan, sultanlardan əqli və mənəvi üstünlüyü təsdiq edilir. Zəhmətkeş xalqın əqli və mənəvi üstünlüyünü göstərmək üçün şair öz əsərlərində bir sıra dramatik səhnələr yaradır, xalq nümayəndələri ilə zülmkarları qarşılaşdırır, bu mübarizədə xalqın mənəvi qələbəsini göstərirdi.

Nizami bütün ömrü boyu hakimləri xalqdan öyrənməyə və xalqa qulaq asmağa çağırmışdır. Şair inanırdı ki, əgər hakimlər xalqın səsinə qulaq assalar, onların haqlı tələblərini, müdrik və xeyirxah məsləhətlərini dinləsələr, ədalətsizlikdən və zülmdən əl çəksələr, hakimiyyətə layiq ola bilərlər.

Lakin böyük humanist ömrünün axır illərində bu fikrin idealist bir fikir olduğunu qət etdi və bu fikirlərindən əl çəkdi. Nizami belə bir fəlsəfi qənaətə gəldi ki, xalq öz-özünü idarə etməlidir. Şahların və əyanların "yaxşılaşacağını və təkmilləşəcəyini" gözləmək nahaqdır.

Lakin Nizaminin hakimlərə xeyirxah və humanist məsləhət verməklə kifayətləndiyini söyləmək onun yaradıcılığına yanlış, birtərəfli yanaşmaq demək olardı. Şair öz əsərlərində eyni zamanda dəfələrlə xalqa müraciət edir və xalqı zülmkarlara qarşı etiraza da çağırırdı.

Nizaminin özündən sonra yaranmış olan dünya poeziyasına böyük təsiri olmuşdur. Nizamidən başqa ikinci bir şair tapmaq çətindir ki, bu qədər təqlidçisi olsun. Yüzlərlə şair Nizaminin şagirdi və davamçısı olmaqla fəxr etmişdir. Bunlardan İran şairi Cami, özbək şairi Nəvai, hind şairi Xosrov Dəhləvi, Azərbaycan şairi Füzuli kimi dahi şairləri və başqalarını göstərmək olar.

Nizami əsərlərinin ölməz motivləri bu şairlərin əsərlərində müxtəlif vaxtlarda, müxtəlif tarixi şəraitdə yenidən işlənmişdir. Bu dahi şairlərin hər biri Nizami əsərlərinin süjet və motivlərinə bir sıra orijinal cəhətlər əlavə etmiş, onları daha da inkişaf etdirib zənginləşdirmişdir. Lakin bu nəhəng sənətkarlardan heç biri Nizami sənətinin zirvələrinə qalxa bilməmişdir.

* * *

Nizami humanizminin və dünyagörüşünün ən yaxşı cəhətlərindən biri də onun dini etiqad və irqi mənsubiyyətindən asılı olmayaraq bütün xalqlara bəslədiyi sevgi hissidir. Nizamidəki bu hiss onu bizə daha çox yaxınlaşdırır və sevdirir. Orta əsr müsəlman fanatiklərinin bütün töhmət və təhqirlərinə baxmayaraq, Nizami hər zaman millətçilik və irqçilik kimi alçaq hisslərə yabançı olmuşdur.

Nizaminin yaratdığı ölməz poemalarda azərbaycanlıların, iranlıların, ərəblərin, slavyanların, misirlilərin, çinlilərin, hindlilərin, yunanların və bir sıra başqa millətlərin nümayəndələrinin bədii obrazları yaradılmışdır. Şair ölkələri talayan, xalqları qarət edən bütün zülmkarları eyni bədii qüvvə ilə ifşa etmiş, xeyirxah və zəhmətkeş adamları milliyyətindən asılı olmayaraq eyni məhəbbətlə tərənnüm etmişdir.

Nizami yaradıcılığındakı bu xeyirxah keyfiyyətlər millətçilik və irqçilik nəzəriyyələrinə qarşı, imperializmin insana nifrət təbliğ edən ideologiyasına qarşı bütün bəşəriyyətin bugünkü mübarizəsində bizə yaxından kömək edir.

Nizami humanizmi hər cür süniliyi rədd edir. Həyatın və insan tarixinin təbii inkişafına mane olan, insan ağlına və vicdanına, sağlam fikir və məntiqə zidd olun, cəmiyyətin mənəvi və maddi inkişafını ləngidən hər şeyi rədd edir.

Nizami humanizmi təbii və xeyirxah şeyləri, həyatın normal və qanunauyğunluğun inkişafına kömək edən şeyləri təsdiq edir, dünyada insanın əli və ağlı ilə yaradılmış sərvətlərin daha da artmasına kömək edir. Şairin dağıdıcı qüvvələrə və qəsbkarlara qarşı kəskin nifrəti, qanlı müharibələrə qarşı qəzəbi də məhz buradan irəli gəlir.

Nizami dövrü bizim indi yaşadığımız atom bombası dövrü deyildir. Lakin Nizaminin humanizmi bu gün belə qanlı qırğınlar təbliğ edən imperialistlərə qarşı mübarizədə bizə və bütün qabaqcıl bəşəriyyətə kömək edir, xalqlar arasında qardaşlıq və dostluğun, qarşılıqlı anlayışın təntənəsinə, bütün dünyada sülhün təntənəsinə kömək edir.

Nizami yaradıcılığı bu gün belə köhnəlməmişdir. Şair bizim böyük sələfimiz olmaqla qalmır, eyni zamanda, bugünkü mübarizədə bizim yol yoldaşımızdır. Bu barədə sovet şairi Nikolay Tixonov obrazlı bir şəkildə demişdir ki, "Nizami dünyadakı nəhənglərdən biridir. Odur ki, Nizami bu gün də – yürüşdə də, dinc əməkdə də bizimlə bir yerdədir".

Biz sovet şairləri Nizamidən çox şey öyrənməliyik. Biz hər şeydən qabaq, ondan böyük poetik sənətkarlıq öyrənməliyik.

Mahir söz ustası olan Nizami öz əsərlərində bitkin insan xarakterləri, monumental obrazlar, güclü və böyük insan ehtirasları yaratmışdır. O öz əsərlərində insan psixologiyasının bütün mürəkkəbliyini göstərə bilmiş, onun bütün ziddiyyətlərini açmışdır. Şair öz əsərlərində insan qəlbinin bütün işıqlı və qaranlıq cəhətlərini göstərmiş, insanları və hadisələri tipikləşdirməyi bacarmışdır. Böyük sənətkarın əsərində şablon və trafaret obrazlara, standart fikirlərə rast gəlmək mümkün deyildir. Nizami yaradıcılığı bizi zəmanəmizin qabaqcıl elmini hərtərəfli öyrənməyə, öz əsərlərimizdə bədii obrazların və fikirlərin köməyilə fəlsəfi ümumiləşdirmələr verməyə ruhlandırır.

Nizami dramaturq deyildir, lakin onun poemalarında biz Şekspir dramatizmini xatırladan gərgin səhnələrə və vəziyyətlərə rast gəlirik. Şairin yaradıcılığındakı bu cəhət qüvvətli dramatik konfliktlər, gözəl dramatik dialoq və monoloqlar yaratmaqda bizə kömək edə bilər.

Xalq hər hansı bir sənətkarın yaratdığı əsərdə yalnız ayrı-ayrı bədii obrazları və xarakterləri deyil, eyni qəhrəmanlarının aforizmlərini də uzun zaman yaddan çıxarmamalıdır. Bu cəhətdən də böyük Nizami bizə müəllim ola bilər.

Dünya ədəbiyyatının tarixi göstərir ki, novatorluq həmişə mütərəqqi ədəbi cərəyanların başlıca xüsusiyyəti olmuşdur. Nizami məhz novator-sənətkar olmuş və ədəbiyyatda tamamilə orijinal bir yol ilə getmişdir. Onun novatorluğu yalnız əsərlərindəki ideya-bədii motivlərin yeniliyində deyil, eyni zamanda bu əsərlərin formasının, stil və dil xüsusiyyətlərinin yeniliyindədir.

Bizim sovet ədəbiyyatının böyük novator təbiətinə köhnəlmiş ədəbi üsullar ziddir. Hər bir sovet sənətkarı öz əsərində yeni yaradıcılıq yollarına əl atmalı, öz nəfəsi ilə ədəbiyyata gəlməlidir. Lakin qeyd etmək lazımdır ki, bir çox şairlərimizin əsərləri bu keyfiyyətlərdən məhrumdur. Biz ədəbiyyat aləmində xalturaçılara və zəif əsərlər yazanlara qarşı böyük şair Nizami kimi amansız olmalıyıq.

Nizami bədii sözü yüksək qiymətləndirirdi. Nizami ədəbiyyatda sözçülüyün və mənasız sözlərin amansız düşməni idi. Şair az sözlə böyük məna ifadə etməyi tələb edirdi.

Nizami yaradıcılığının bizim üçün qiymətli olan bir xüsusiyyətindən də danışmaq lazım gəlir. Bu da onun yaradıcılığındakı romantikadır.

Nizami həyatı realist şəkildə təsvir etməsinə baxmayaraq, ona romantik bir vüsət də verirdi. Məhz buna görədir ki, bir çox hallarda onu romantik şair adlandırırlar. Qeyd etmək lazımdır ki, bəzi sənətkarların yaradıcılığındakı romantik pafos, onun stil və dilindəki əzəmət yaradıcılığındakı realizmi azaltmır, əksinə, ona yeni bir qüvvə verir, onu qanadlandırır, qəhrəmanların daxili aləmini daha da zənginləşdirir. Bugünkü sənətimizdə romantika və fantaziyanı lazımınca qiymətləndirməyən adamlar sosialist realizmi məfhumunu yoxsullaşdırırlar.

Poetik xəyalın ən yaxşı nümunələrini biz dahi şairin yaradıcılığında görürük. “İskəndərnamə” poemasındakı “Xoşbəxtlər ölkəsini” təsviri məhz şair xəyalının məhsulu idi.

Nə qədər ki, insanın yüksəlmək, kamilləşmək və zənginləşmək meyli vardır, xəyal da olacaqdır. Biz sovet yazıçıları öz əsərlərimizi həyatdan uzaq olmayan, həyatla bağlı olan xəyalla, inkişafımızın istiqamətini, böyük sabahımızı göstərən romantika ilə zənginləşdirməyi bacarmalıyıq.

Biz müsbət qəhrəman obrazını yaradarkən böyük Nizaminin etdiyi kimi, qəhrəmanlarımızı şüurlu surətdə yüksəltməyi bacarmalıyıq.

Keçmiş mədəni irsə qarşı əlaqəmizdə biz marksist-leninçi metodolojisini əldə rəhbər tuturuq. Biz bilirik ki, tarixi nə yaxşılaşdırmaq olar, nə də pisləşdirmək olar. Aydındır ki, Nizaminin dünyagörüşündə, yaradıcılığında, onun estetik görüşlərində və bədii zövqündə bir sıra məhdud cəhətlər də vardır ki, biz onun dövrünü öyrənmək üçün bunlardan istifadə etməliyik. Nizami də keçmişin bütün dahi şairləri kimi öz dövrünün oğlu olduğu üçün bir sıra məsələlərdə onun dünyagörüşünü həmin dövr müəyyən etmişdir. Şairin dünyagörüşündə idealizmin, orta əsr sxolastikasının, doqmatikanın, islam şəriətinin təsiri vardır. Lakin bütün bunlar böyük şairin yaradıcılığına kölgə sala bilməz... Fəlsəfi və estetik məsələlərdə böyük şairin tarixən məhdud olan bir sıra cəhətləri onun daim yaşayan və təsir göstərən dahi sənətkar simasını pərdələyə bilməz.

Sovet hakimiyyəti illərində Nizaminin əsərləri ilk dəfə olaraq Azərbaycan dilinə tərcümə edilmişdir. Puşkin və Tolstoyun, Qorki və Mayakovskinin dili olan böyük rus dili sayəsində Nizaminin əsərləri bütün sovet xalqının malı olmuşdur.

İnsanlığın əsrlərdən bəri gözlədiyi azadlıq baharı gəlib çatmışdır.

Bu gözəl dövrdə eyni zamanda insanlığın əsrlərdən bəri yaratdığı ən gözəl və mütərəqqi əsərlər də öz ömrünün baharını keçirir. Böyük Nizami də əsil qiymətini məhz bu dövrdə almışdır.

Partiyamızın milli siyasəti sayəsində Vətənimizdə yaşayan bütün böyük və kiçik xalqlar öz taleyinin, öz milli mədəniyyəti və tarixinin sahibi olmuşdur.

Bu gün biz sovet adamları dahi şairimiz və mütəfəkkirimiz Nizami Gəncəvinin vəfatı gününün 750 illiyini qeyd edərkən zəmanəmizin ən qabaqcıl ideallarını təmsil edən, əsrimizin bayraqdarı, zəkası, qəlbi və vicdanı olan kommunist partiyamıza öz sonsuz minnətdarlığımızı bildiririk.

*1953*

## "SEVİL" OPERA-TAMAŞASI HAQQINDA RƏY

"Sevil" operasının M.F.Axundov adına Azərbaycan Dövlət Opera və Balet Teatrının səhnəsində göstərilməsi bizim respublikanın həyatında həqiqətən böyük mədəni bir hadisədir.

Opera teatrı səhnəsində biz C. Cabbarlının pyesindən tanış olan hadisə və obrazları yenidən gördük. Amma bəstəkar F.Əmirovun və libretto müəllifi şair yoldaş T.Əyyubovun xidmətlərini qeyd ilə, demək lazımdır ki, onların əsərlərində hadisələrlə surətlər yeni xüsusiyyətlər kəsb edib, yeni və daha dərin təəssürat doğurur.

"Sevil" opera əsərinin məzmunu tarixi-ictimai zəmin ilə zənginləşmişdir. Əsərin məzmunu və qəhrəmanların taleyi ictimai hadisələrlə üzvi surətdə bağlanmışdır.

Buna görə də biz azərbaycanlı qadın Sevilin faciəsini ədəbi məxəzdə olduğundan daha qüvvətlə hiss edirik, opera müəllifləri bu faciəni inqilabdan əvvəlki Azərbaycanda, ümumiyyətlə, bütün qadınların taleyi kimi açıb göstərirlər.

Biz inqilab tərəfindən köləlik və zülm altından xilas edilib, azadlıq və səadət yoluna çıxmış yeni Azərbaycan qadınının – yeni Sevilin böyük sevinc və səadətini dərindən hiss edirik.

Tamaşaçı tamaşanın lap əvvəlindən bütün hadisələrin fəal iştirakçısına çevrilir. O, sanki mürəkkəb hadisələrin axınına daxil olub, baş verən bütün hadisələrə qarşı canlı bir əlaqə göstərir. O, əsərin qəhrə-

manları ilə birlikdə kədərlənir və sevinir, ağlayır və gülür; onlarla birlikdə iztirab çəkir və onlarla birlikdə qələbəni təntənə ilə qeyd edir. Tamaşaçı böyük bir bədii zövq alır, ona təqdim edilən əxlaqi-etik və mənəvi qidanı acgözlüklə qəbul edir.

"Sevil" tamaşasının müstəsna müvəffəqiyyətini aşağıdakı səbəblərlə izah etmək olar: birincisi – operanın özünün ideya-bədii üstünlükləri, bəstəkar Fikrət Əmirovun müvəffəqiyyətli musiqisi, ikincisi – həmin operanın müvəffəqiyyətlə tamaşaya qoyulması, rejissor Mehdi Məmmədov tərəfindən əsərin ağıllı, maraqlı səhnə həllinin tapılmasıdır.

Azərbaycan xalq musiqisinə yaxşı bələd olan F.Əmirovun müvəffəqiyyəti çox böyükdür. "Sevil" operası müəllifin tükənməz xalq muğamlarımızın xəzinəsindən aldığı və məharətlə istifadə etdiyi cazibəli melodiyalarla zəngindir. Xalq musiqisi opera üçün çox zəngin musiqi materialı olmuşdur.

F.Əmirov, hər şeydən əvvəl, melodistdir; lakin "Sevil" operasında onun bir melodist kimi duyğu və qabiliyyəti klassik opera sənəti ilə ahəngdar bir surətdə uyğunlaşmışdır. Bu cəhətdən o, rus və Azərbaycan opera məktəbinin gözəl realist ənənələrinə, xüsusən Çaykovski və Hacıbəyov məktəblərinin ənənələrinə sadiq qalmışdır. "Sevil" operası müəyyən mənada musiqidə xəlqilik və realizm uğrunda mübarizənin məhsulu, Sov.İKP MK qərarlarında irəli sürülən tələblərə cavab sayıla bilər. Bu operanın musiqisi ifadəli və yadda qalan melodiyalarla zəngin olub, dərindən duymağa və düşünməyə, həyəcan keçirməyə və fikirləşməyə vadar edir. Bu, xüsusən əsas rolların ariyalarına aiddir. Sevilin kədər və şikayətlərini onun birinci pərdədəki ariozusu gözəl ifadə edir. Onun laylası kədər və ümidlə doludur. Sevilin ikinci pərdədə, ana məhəbbətinin son həddə çatdığı yerdə ariyası ən yüksək emosional ehtirasa qədər yüksəlir. Sevilin son pərdədə Moskva haqqındakı nəğməsi ən yüksək duyğularla doludur.

"Sevil" tamaşası bizim M.F.Axundov adına Opera və Balet teatrının həyatında mərhələ təşkil edən bir addımdır. Teatrın kollektivi bəstəkar və libretto müəllifi ilə əməkdaşlıq edərək, "Sevil" operasının yaranması və səhnədə nümayiş etdirilməsi işində böyük əmək sərf etmişdir.

"Sevil" tamaşası rejissor Mehdi Məmmədovun tərtibatında bədii mükəmməlliyi və vəhdəti ilə sevindirir. Tamaşanın gözəlliyi orasındadır ki, operanı, onun ideyasını düzgün açıb göstərir və musiqi ilə tamamilə ahəngdardır. Eşitmə və görmə duyğuları müvəffəqiyyətlə

bir-birinə uyğunlaşdırılmış və üzvi bir vəhdət təşkil etmişdir. Rejissor iki dünyanı, iki qənaəti üz-üzə gətirib, onlar arasındakı konfliktin ardıcıl və coşqun bir surətdə inkişafına nail olmuşdur. Tamaşada genişlik, baş verən toqquşmaların böyük vüsəti hiss olunur. M.Məmmədov köhnə aləmi göstərmək üçün çox ifadəli üsul və boyalar tapa bilmişdir. Lakin ən ifadəli boyalar, mizanlar, epizodlar Sovet Azərbaycanında yeni həyatı təsvir edən yerlərdədir. Rejissor son pərdədə yeni nəslə xüsusi diqqət yetirir və onu böyük bir məhəbbətlə göstərir.

Müəllif ideyasının musiqi vasitəsilə açılıb göstərilməsində və tamaşada ümumi ansambl yaradılmasında dirijor Ə.Bədəlbəylinin əməyini xüsusilə qeyd etmək lazımdır.

Aktyorlar səmimi və real oynayır, daha doğrusu, hərəkət edirlər. V.Abışeva “Sevil” partiyasını müvəffəqiyyətlə ifa edir. Onun ifasında dərin bir dramatizm hiss olunur. Bu partiyanın gənc aktrisa F.Muradova tərəfindən ifasını da müvəffəqiyyətli saymaq lazımdır.

Balaş rolunu ifa edən R.Behbudov tamaşaçılar tərəfindən heyranlıqla qarşılanmışdır. Onun ifası nadir bir artistizm və musiqi, xanəndəlik və aktyorluq məharəti ilə seçilir. O, opera səhnəsində aktyorluq sənətinin gözəl bir nümunəsini göstərmişdir.

Artist – A.Bünyadzadə mehriban, lakin ciddi bir qoca olan Atakişi surətini ılıq bir məzəlilik və nəcib cizgilərlə təsvir edir.

Gənc aktrisa R.Cabbarovanın ifasında cürətli, mübariz qız Gülüş surəti tamaşada müvəffəqiyyətli bir surətdir. Teatrın ən köhnə artistlərindən olan M.Bağırov riyakar, mühafizəkar Əbdüləli bəy surətini canlı yaratmışdır.

Rəssamlardan İ.Seyidova və E.Almaszadə tərəfindən verilmiş çox ifadəli bədii tərtibat operanın ümumiyyətlə yaxşı mənimsənilməsinə çox kömək edir.

Mən “Sevil” operasının bir neçə tamaşasında olmuşam. Hər dəfə tamaşaçıların böyük heyranlıqlarına şahid olmuşam və hər dəfə yuxarıda qeyd etdiyim təəssürat və fikirlərimin yenidən təsdiq edildiyini görmüşəm. “Sevil” tamaşası bizim ictimaiyyət və tamaşaçı kütləsi tərəfindən 1953-cü ilin ən yaxşı, ən görkəmli əsəri kimi qiymətləndirilmişdir.

“Sevil” opera və tamaşasının Dövlət mükafatına təqdim edilməsini müvafiq və layiq bilirəm.

*1953*

## MƏNİM QORBUNOVAYA CAVABIM

Qədim yunan filosofu demişdir ki, əgər bir-birimizi bizim sözlərin ilkin mənasında başa düşsək hamımız üçün vahid olan həqiqəti dərk etməyə daha tez nail olarıq mən bu sözləri çoxdan oxuduğuma görə müəllifin adını unutduğum üçün oxuculardan üzr istəyirəm.

"Böyük sənət məsələləri məqaləsinin müəllifi ilə mübahisə edən Qorbunovanın "Sosialist realizminin bəzi nəzəri məsələləri haqqında" məqaləsi göstərir ki, Qorbunova ya bizim irəli sürdüyümüz müddəaların ilkin mənasını dərk etməyə hələ çatmamış, ya da onlardan əks tərəfə xeyli uzaqlaşmışdır. Ondan başlayaq ki, ədəbiyyatımızın mühüm məsələsi olan milli forma barədə bizim mülahizəmizi Qorbunova necə qiymətləndirmişdir. O, sosialist incəsənətində milli formanı inkar etməsə də, bununla belə elə fikirləşir ki, milli formanın dil və başqa elementlərinin müxtəlifliyi xalqları birləşdirməyə deyil, bir-birindən ayırmağa doğru aparır. Biz Qorbunovanın bu konsepsiyasını qeyri-elmi, kökündən səhv və zərərli hesab edirik. Biz, sovet adamları, milli mədəniyyətlərimizin formaları haqqında danışarkən, bununla yanaşı bu mədəniyyətlərin vahid sosialist məzmununun necə müəyyən bir milli formada yaranması və inkişaf etməsindən də söz açırıq; başqa sözlə, bizim mədəniyyətimiz hamı üçün Qorbunovanın yaxud Səməd Vurğunun əlindən hazır və standart forma almır, müəyyən tarixi, ictimai və milli şəraitdə yaranan canlı insanlar kimi o da öz mənbəyində – müxtəlif milli formalarda yaranır.

Sosialist mədəniyyətinin məzmun və forması ahəngdar və dialektik vəhdət təşkil edir. Buna görə də Qorbunova bizim milli mədəniyyətimizi, – guya onun ayıran tərəfləri var, və birləşdirən tərəfləri var, – deyə bölüb parçalamaqla səhv yola düşür.

Milli forma və xüsusiyyətlərin müxtəlifliyi xalqları bir-birindən ayırmır, əksinə birləşdirir; belə ki, bütün bu forma və xüsusiyyətlər vahid dünyagörüşü, vahid məzmun ilə canlanmışdır.

Sosializm şəraitində dil müxtəlifliyi və bir sıra başqa milli keyfiyyətlər bir-birini tamamlayır, zənginləşdirir və inkişaf etdirir. Ancaq Qorbunova bunun əksini təsdiq etməklə bizim dövlət quruluşumuzun böyük nailiyyətini – sosializm şəraitində milli dillərin və mədəniyyətlərin inkişafı faktını kobudcasına qiymətləndirmir.

Müasir burjua kosmopolitizmi imperializmi pərdələmək məqsədilə dillərin və milli mədəniyyətlərin müxtəlifliyini qəsdən böhtanlayaraq,

guya “bütün fəlakətlərə və müharibələrə səbəb bu fərqlərdir” – deyə ara qarışdırırlar.

Milli mədəniyyəti Qorbunovanın qiymətləndirməməsi xalqlarımızın klassik irsinə olan münasibətində də özünü açıq-aydın göstərir. Ancaq “əlbəttə”, “pis deyil” və s. kimi sözlər onun tərəfindən elə soyuqqanlılıqla və etinasızcasına deyilmişdir ki, bizim ən yaxşı klassik irsimizə, toplanmış gözəl milli mədəniyyət ənənələrinə onun “hörməti” dərhal nəzərə çarpır.

Oxucu bilir ki, biz “Şairin hüquqları” və b. məqalələrdə poeziyamızın romantik vüsətli şeir üslubunun yaşaması üçün onun vətəndaşlıq hüququnu qızğın müdafiə edirik. Çünki, ədəbiyyatımızın vahid metodu (yalnız metodu) olan sosializm realizmi üslub rəngarəngliyini, yaradıcılıq istiqamətinin, poetik fərdiyyətlərin müxtəlifliyini əvvəlcədən müəyyən etmişdir. Fikrimizcə, bütün sovet poeziyası təcrübəsində və nəzəriyyəsində romantik vüsətli poeziyanı qiymətləndirməmək halları mövcuddur. Buna görə də mən şəxsən bir şair kimi müəyyən münasibətli olan bu üslubun taleyi haqqında öz məqalələrimdə danışmışam və həm də haqqım var ki, onu bir sıra sosializm realizmini vulqarlaşdıranlardan müdafiə edəm. Lakin Qorbunova, nədənsə özündən uydurur ki, guya mən, onun dediyinə görə, “özümün ən sevimli üslubumu” zorla hamıya qəbul etdirmək istəyirəm. Ancaq, əfsuslar olsun ki, əgər mənim hamıya hər hansı bir vahid üslubu zorla qəbul etdirmək cəhdimə, hətta Qorbunova da kömək etsə belə, qətiyyən bu, mümkün deyildir. Təbiətdə belə bir şey yoxdur və bir-birini təkrar edən hətta iki yazıçı, yaxud üslub da qətiyyən ola bilməz. Mənim belə bir xam xəyalla məşğul olmağa heç cür vaxtım yoxdur; elə bircə o sadə səbəbə görə ki, mənim bu azacıq yaradıcılığım hətta bir neçə şairə belə nümunə ola bilməz, çünki onun hələ kamilləşməyə, bir sıra əsaslı nöqsanlardan təmizlənməsinə ehtiyacı vardır! Lakin, bununla belə, nə səbəbə Qorbunova “bizim ən sevimli üslubumuza” istehza edir? Onun fikrincə, Vurğunun poetik yaradıcılığı üçün təmtəraqlılıq səciyyəvidir. Əlbəttə, Qorbunova mənim yeganə oxucum olmuş olsa idi, mən onun bu sözlərini təhqir kimi qəbul edərdim. Ancaq mən onunla təsəlli tapıram ki, kiçicik yaradıcılığımda ədəbi ənənələrin kor-koranə təqlidini deyil, əsasən imkanlarım daxilində tərənnüm etdiyim həyat həqiqətini və insanı görən çoxlu başqa oxucularım vardır.

Qorbunova daha da həddini aşaraq, şübhə ilə soruşur: “onların sevimli üslubu bizim zamanın, bizim insanın xarakterinə nə dərəcədə

uyğun gəlir?” Bax, burada mən sovet yazıçısı Vurğunu öz zamanından təcrid etdiyinə görə Qorbunovadan bərk inciyirəm. O, hətta hər bir sovet yazıçısının böyük yaxud kiçik üslubunun bizim zamanın və bizim insanın ruhuna uyğun gəldiyini (bu və ya digər dərəcədə) yaddan çıxararaq daha böyük bir səhvə yol verir. Əks təqdirdə biz onu sovet yazıçısı adlandırmazdıq. Güman edirəm ki, Qorbunova bu məsələ barədə bizim cavabımızdan razı qalacaqdır. İstedadı və mədəniyyəti kifayət edən Qorbunovaya məsləhət görürəm ki, özünün gələcək tədqiqatlarında ağına-bozuna baxmadan, əsassız ittihamlara yol verməmək, özünü “ağır şübhələrdən” xilas etmək üçün bizim şairlərin yaradıcılığını dərindən və möhkəm öyrənsin. Daha sadə desək, o, bu və ya digər milli yazıçının bütövlükdə üslubu haqqında mühakimə yürütmək üçün mənəvi əsası olsun deyə, heç olmazsa, bizim başlıca əsərlərimizi oxumalıdır. Bu da təsadüfi deyil ki, Qorbunova özünün böyük və kifayət qədər əhatəli məqaləsində tez-tez sosializm realizmi metoduna müraciət etsə də, bu metodun məhz müxtəlif yaradıcılıq üslubları və istiqamətləri, poetik fərdiyyətlər və səslər ilə zəngin və gözəl olması barədə bir yerdə də bir söz demir.

Realizmi vulqarlaşdıran, yazıçıları və əsərləri maraqsız, bir-birinə bənzər görmək istəyənlərin hamısı belə hərəkət edirlər.

*1953*

## YENİ, 1954-cü İL PLANLARIM

Keçən il mən bəşəriyyətin ən qabaqcıl arzu və istəklərini təcəssüm etdirən böyük partiyamız haqqındakı “Zamanın bayraqdarı” poeması üzərində işimi qurtardım. Poema Azərbaycanda çap olunmuşdur, onu P.Antokolski rus dilinə tərcümə edir.

İndi isə partiyamızın müxtəlif antimarksist cərəyanların nümayəndələrinə qarşı apardığı ideya mübarizəsinə həsr olunmuş mənzum dramı qurtarmaq istəyirəm. Hadisələr 1917-ci ildə Peterburqda cərəyan edir.

Eyni zamanda, ümid edirəm ki, hələ 30-cu illərdə başladığım və Azərbaycanda komsomol təşkilatının yaranmasına, komsomolçuların vətəndaş müharibəsində iştirakına həsr olunmuş poemamı tamamlayım.

Nəhayət, yeni ildə mütləq çap etdirəcəyim lirik şeirlər kitabımı hazırlayacağam.

*1954*

## ELMİN GÜCÜ

Əziz balalar! Bizim Vətənimiz ən qabaqcıl elm və mədəniyyət ölkəsidir. Sovet elminin böyük nailiyyətləri yer üzündə xariqələr yaratmışdır. Gözəl və geniş Vətənimizi qarış-qarış gəzib, onun hər bir guşəsinə nəzər saldıqda elmin gücü ilə yaranmış hər şey adamı heyran edir. Böyük sənətkarlıqla tikilmiş monolit binalar, nəhəng fabrik və zavodlar, açıq dəniz qoynunda uzanıb gedən buruqlar meşəsi – bir sözlə, insan qəlbini fərəhlə dolduran hər bir şey elmin gücü ilə yaranır. Elmin gücü ilə biz torpağın altından belə xəbər tutur, onun təbii sərvətlərini mənimsəyirik. Vətənimizin geniş münbit torpaqları altında hələ əvvəllər də faydalı qazıntılar, sərvətlər çox idi. Lakin bunlar kəşf edilmir, istifadəsiz qalır, yaxud çox az miqdarda mənimsənilirdi. Yalnız bizim sovet dövründə inkişaf etmiş elmin gücü ilə yerin lap dibindən hər cür sərvətləri çəkib çıxarırıq.

İnsan qüvvəsi təbiətə qalib gəlir. Çünki o, qabaqcıl elmlə silahlanır. Təbiətin böyük dəyişdiricisi İ.V.Miçurin demişdir ki, təbiət öz xoşuna sənə heç şey verməz. Bunu ondan biz özümüz almalıyıq. Bunu almaq üçün isə təbiəti idarə edən qanunları bilmək lazımdır.

Elə elm də bizə ona görə lazımdır ki, ictimai həyatı idarə edən qanunları dərk edək, çünki ancaq bu qanunları dərk edərəkdən biz öz həyatımızı, mədəniyyətimizi qura bilər və şanlı Vətənimizi daha qüdrətli edərik.

Elə buna görə də biz elm və təhsili öz ürəyimiz kimi sevib, onu mənimsəyib zəhmətkeş xalqımızın mənafeyinə sərf etməliyik.

Hazırda sovet elmi böyük sürətlə inkişaf edir, irəliləyir. İndi elm xadimlərimizi insan əməyini yüngülləşdirən, həyatımızı daha şən və firavan edən yeni ixtiralar düşündürür. Bu yaxınlarda ölkəmizdə atom enerjisi ilə işləyən ilk elektrik stansiyasının işə salınması buna parlaq misaldır. Biz elmin nailiyyətlərini xeyirxah işlərə, sülh işinə yönəltmişik. Bax, sovet elminin gücü də elə bundadır. İndi elmimizin qarşıya qoyduğu məqsəd daha böyük, daha cəlbedicidir. İndi elmin qarşısında kainatın bütün sirlərini öyrənmək, Marsa, Aya uçmaq və bu kimi şərəfli vəziyələr durur.

Görürsünüzmü, uşaqlar, elmin, bizim qabaqcıl sovet elminin nə böyük gücü vardır.

Uşaqlar, siz Vətənimizin yeni nəslisiniz. Bizim elm, sovet və ədəbiyyatımızın, bütün mədəniyyətimizin sabahkı yaradıcıları sizsiniz. Ona görə də siz indidən elm və mədəniyyətin işıqlı və çətin yollarında

möhkəm bir iradə, gələcəyə inam, həyata, insana hörmət və məhəbbət hissi ilə, iftixarla addımlamalısınız. Siz indidən bilməlisiniz ki, hərtərəfli təhsil almaq – politexniki təhsil insan qabiliyyətinin məhdud inkişafına, onun yalnız ixtisas çərçivəsində qalmasına son qoyur. O, həyatda rast gəldiyi təbii və ictimai hadisələrin qarşısında aciz qalmır.

Elə buna görə də siz indidən yalnız bir ixtisas dalınca qaçmamalı, bir çox sənətlərə yiyələnməlisiniz. Elmlərin əsasına dərindən yiyələnmək üçün isə sinif partası arxasından başlayaraq, özünüzdə müntəzəm mütaliə vərdişi yaratmalısınız.

Bunun üçün məktəb qaydalarına riayət etmək, nizam-intizamlı olmaq, evə verilən tapşırıqları vaxtlı-vaxtında yerinə yetirmək lazımdır. Məktəb təcrübəsi göstərir ki, nizam-intizama riayət edən uşaqlar həmişə müvəffəqiyyətlə oxuyurlar. Məktəb qaydalarını gözləməyən, dərsə müntəzəm surətdə davam etməyən və ev tapşırıqlarını təxirə salan şagirdlər nə qədər zirək olurlarsa-olsunlar, öz yoldaşlarından geri qalırlar.

Ayrı-ayrı fənləri dərindən öyrənməkdə müəllimlərə diqqətlə qulaq asmağın, eləcə də qarşılıqlı yoldaşlıq münasibətinin böyük əhəmiyyəti vardır. Müəllimə diqqətlə qulaq asan şagirdlər evə verilən tapşırıqları yerinə yetirməkdə heç bir çətinlik çəkmirlər.

Elm xadimlərimizin arasında olduğu kimi, sizin də aranızda olan bugünkü dostluq dərs müvəffəqiyyətinizə böyük kömək edər. Üzrlü səbəblərə görə geridə qalan şagirdlərə yoldaşlıq köməyi göstərmək, bildiklərinizi başqa yoldaşlarınıza da öyrətmək sizin nəcib əxlaqi sifətlərinizdən biri olmalıdır.

Bütün bu deyilənlərə riayət etdikdə, elmlərin əsasına indidən mükəmməl yiyələnməyə başladıqda, siz də böyük qüvvə kəsb edən sovet elminin layiqli sahibləri ola bilərsiniz.

Uşaqlar, yeni dərs ilində yeni-yeni nailiyyətlərinizdə xalqımızı və Vətənimizi sevindirin. Sizi, yəni dərs ilinin başlanması münasibətilə ürəkdən təbrik edirəm.

*1954*

## M.QULUZADƏNİN "ƏDƏBİ SƏYAHƏTİ"

"Kommunist" qəzetinin 13 mart tarixli nömrəsində M.Quluzadənin "Səməd Vurğunun "Aygün" poeması haqqında" adlı məqaləsi dərc olunmuşdur. Güman edirik ki, oxucularımız istər əsər haqda, istərsə də Quluzadənin "tənqidi" haqda müəllifin də rəyini bilmək istəyirlər.

Biz əsər və tənqid haqda fikrimizi söyləməzdən əvvəl Quluzadənin müəllifin ünvanına uydurduğu bir sıra böhtanlara, ucuz və əsassız ittihamlara cavab verməliyik.

Birinci: “Səməd Vurğunun bəzi əsərlərində xüsusilə “İnsan” pyesində həyat həqiqətindən, reallıqdan uzaqlaşmaq, mücərrəd romantikaya meyl etmək hallarını partiya mətbuatı və ədəbi tənqidimiz vaxtında göstərmişdir. Lakin görünür ki, Səməd Vurğun bu partiya tənqidindən lazımi nəticə çıxarmamışdır”.

Oxucularımız gözəl bilir ki, biz “İnsan” pyesindən sonra “Muğan”, “Zəncinin arzuları”, “Köhnə dostlar”, “Leninin kitabı” kimi poemalar, nəhayət “Avropa xatirələri” adlı şeirlər məcmuəsi yazmışıq. Bu əsərlərin müsbət hadisə olduğunu Quluzadə özü də məqaləsində etiraf edir. Lakin o, hiyləgərlik edərək, bu əsərlərin “İnsan” haqqında olan partiya tənqidindən sonra yazıldığını göstərmir. O bununla da bizim partiya tənqidinin sovet yazıçısının yaradıcılıq inkişafına göstərdiyi xeyirxah, nəcib və müsbət təsiri danır. Bizim siyasi düşmənlərimizin dəyirmanına su tökür.

İkinci: Quluzadə Belinskinin arxasında gizlənərək bizə “mədəniyyət dərsi” verir. O yazır ki, Belinski şairin təbii istedadını az hesab edir, şairdən yüksək mədəniyyət və dolğun məzmun da tələb edir; Səməd Vurğunsa “Bu sadə həqiqəti dərindən dərk etməmişdir”.

Quluzadə bu sözləri yazdığı zaman “Vaqif”, “Xanlar”, “Fərhad və Şirin” pyeslərini, “26-lar”, “Bəsti”, “Ölüm kürsüsü”, “Komsomol” poemalarını, nəhayət, müəllifin bütün yaradıcılığını bir küll halında öz gözlərinin önünə gətirdimi?

Əsas əsərləri zaman qarşısında imtahan vermiş, müxtəlif dillərə tərcümə olunmuş bir şairi “mədəniyyətsiz” adlandırmaq ədalətsizlik deyilmi?

Yeri gəlmişkən onu da qeyd edək ki, orijinal və qabaqcıl fikirlər deməkdən məhrum, öz mənəvi aləmi yoxsul olan bir para “tənqidçilər” yerli-yersiz, vaxtlı-vaxtsız böyük nəzəriyyəçilərdən sitatlar gətirməklə özlərini “mədəni” bir insan kimi qələmə vermək istəyirlər. Onlar unudurlar ki, Belinskinin də, Dobrolyubovun da, Axundovun da mədəniyyəti, hər şeydən əvvəl, yaradıcı bir mədəniyyət olmuşdur. Odur ki, şairin mədəniyyətini onun yaradıcılığından ayırmaq, təcrid etmək özü mədəniyyətsizlik və savadsızlıqdır.

Üçüncü: Aygün surətinin öz ailəsini dağıtmamaq məqsədilə, öz eşqini yaşatmaq məqsədilə, müvəqqəti olaraq öz əri Əmirxana bir para

güzəştlər etməsindən Quluzadə narazı qalır. Doğrudur, Aygün öz ərinə müəyyən güzəştlər edir. Lakin o, öz arzuları və əməlləri uğrunda mübarizə aparmayırmı? Nə vaxt və harada Aygün yastığa rahatca baş qoyub yatdı? Nə üçün tənqidçi Aygünün müəyyən güzəştlərini gördüyü kimi, onun Əmirxana qarşı olan qanuni etirazlarını ört-basdır edir, oxuculardan gizləməyə çalışır? Məsələn:

Bəsdir baxa bilməyirəm artıq üzünə
eşitməsə bir insan kimi
Elə bu gün o yuxudan ayılan kimi
Bütün ürək sözlərimi deyib özünə,
Baş götürüb getməliyəm!”

Yaxud:

Axı mən insanam, məqsədlərim var,
Əl götür Əmirxan bu tərsliyindən.
Məni məngənə tək sıxır dörd divar
Qul yaranmamışam bir kişiyə mən...
Niyə tay-tuşumla ayaqlaşmayım?
De kimdən əskikdir mənim hünərim?
Yenəmi ayları, illəri sayım,
Nə var ki, qısqancdır, qorxaqdır ərim?...

Yaxud:

Sinəmdə gül açan böyük arzular
Gözəl bir sabaha çağırır məni,
Səninsə buz kimi bir ürəyin var,
Nə şeri sevirsən, nə də nəğməni.

Yaxud:

Yalnız öz nəfsini sən sevə-sevə
Məni düşünmədin, səndədi günah.

Nə üçün Əmirxanın üzündə bir sillə kimi səslənən Aygünün bu etiraz səslərini tənqidçi eşitməyir?

Quluzadə get-gedə filosofluq iddiasına düşərək belə bir nəticəyə də gəlir: Bunun səbəbi müəllifin öz görüşlərində qadına qarşı köhnə münasibət bəsləməsində, ailəni möhkəmləndirmək istəməməsi kimi başa düşməsində deyilmi?

Əlbəttə, deyil.

Bəs Aygün surətinin keçdiyi mürəkkəb, həm nəşəli, həm də iztirablı, getdikcə yüksələn inkişaf yolu? Bəs onun nəticə etibarilə öz ərindən asılı olmayaraq ictimai varlığımızın köməyi ilə gözəl bir bəstəkar olması, mübariz simfoniyalar və nəğmələr müəllifi olması? Axı biz Aygünü mətbəxə, yalnız evdar bir qadın olmağa çağırmadıq, ona geniş bir ictimai meydan verdik, o həyatımızla bir nəfəs olan mübariz və istedadlı bir bəstəkar oldu:

Gəlin sənət ilə yaşadı yalnız,
Ona sirdaş oldu hər bir əsəri.
Dinib danışdıqca qələmlə kağız,
Aygünün dağınıq düşüncələri –
Yığılıb bir yerə bir dastan oldu,
Sevindi qəlbində xoşbəxt bir aləm...
O həyat aşiqi bir insan oldu
Nə hicran yurd saldı qəlbində, nə qəm.

Sonsuz bir eşq ilə sevdi varlığı,
Sevdi təbiəti, axar suları.
Sevdi hər zəfəri, bəxtiyarlığı,
Yüksək əməlləri, saf arzuları.

Dörd divar içində yalqız durmadı,
O, duydu hər qışı, hər baharı da.
Xəyal dünyasında tək oturmadı,
Gəzdi zavodları, tarlaları da

Bəzən eşitdiyi hər yeni səsdən
Gözəl rübabında bir nəğmə çaldı.
Hər canlı hünərdən, hər xoş nəfəsdən,
Hər yeni nəğmədən bir ilham aldı.

Aylarla qalxmadı bəzən iş üstdən,
O yüz düşüncədən birini seçdi...

Elə bil qovladı o vaxtı qəsdən,
İllər bir-birindən tez gəlib keçdi.
Ülkərin boynundan oxudu bəzən
Aygün, bu sürətlə keçən illəri.
Kiçik bir zeh açdı saçlarına dən,
Başda çiçək açar insan hünəri...

Axı Aygün o qədər yüksəldi ki, onun əzəməti qarşısında Əmirxan öz kiçikliyini, məqsədsizliyini, öz mənfi xasiyyətlərini dərk etməyə, utanmağa, peşman olmağa başladı:

"Qəflət yuxusunda neçə il qabaq
Heç bir hünərinə inanmadığım,
Bir də duymadığım, o qanmadığım
Aygünün indiki cəlalına bax!

Qəribə dövrandır. Adi bir insan
Nə böyük sürətlə gedir irəli,
Atını dördnala çapdıqca zaman
Tanımaq olmayır keçən günləri.

Mənsə dala qaldım, hamıdan dala...
Qeyrətim olmadı bir qadın qədər.
Ölüm də yoxdur ki canımı ala,
Mənim də adıma kişi deyirlər...

"Aygünün "acizliyi", köhnəliyi və geriliyi budurmu?

Dördüncü: Quluzadənin çıxardığı ümumi nəticələrdən biri də budur ki, guya Səməd Vurğun "Aygün" poemasında sosializm realizmi prinsipindən geri çəkilmişdir.

Məgər möhkəm ailə uğrunda məhəbbətin təntənəsi uğrunda mübarizə aparmaq, bu yolda rast gəldiyimiz qısqanclıq, xudpəsəndlik, idealsızlıq kimi köhnə dünyadan bizə irs qalmış xəstəlikləri ifşa etmək, bəzi gənclərimizi də bunlardan mühafizə etmək, onları cəmiyyət üçün faydalı bir hala gətirmək sovet ədəbiyyatının, sosializm realizminin mühüm məsələlərindən deyilmi?

Quluzadə yazır: "Bəs nə üçün Əmirxanın bu nöqsanlarını orta və ali məktəb düzəldə bilməmişdir?"

Əgər bu mühüm məsələnin öhdəsindən Quluzadənin düşündüyü kimi yalnız məktəblər, ayrı-ayrı kollektivlər və təşkilatlar gələcək imişsə, bəs ədəbiyyat və sənətin həyata göstərəcəyi aktiv və tərbiyəvi əhəmiyyət nədən ibarət imiş? Əgər bizim inkişafımıza əngəl törədən hadisələrin, köhnəliyin və fənalığın ləğv olunması Quluzadənin düşündüyü kimi çox asan və sadəcə bir ştamp ilə başa gəlsəydi, həyatda ciddi bir mübarizəyə ehtiyac qalardımı?

Tənqidçi yuxarıda dediyimiz iddiası ilə həqiqəti pərdələməyirmi? O, bizi də özü kimi cəsarətsiz olmağa dəvət etməyirmi?

Quluzadə "Literaturnaya qazeta"nın 6 mart tarixli baş məqaləsini oxumuşdurmu? "Həyatımızın nöqsanlarını cürətli və qəti tənqid sosializm cəmiyyətinin qanunudur və partiya sovet ədəbiyyatını, mətbuatını ona görə yüksək qiymətləndirir ki, o, öz kəskin söz silahı ilə bizim irəliyə doğru inkişafımıza mane olan hər cür əngəllərə qarşı mübarizə aparır... Mənfilikləri göstərməmək, həqiqətin əleyhinə çıxmaq, sosializm realizminin prinsiplərindən geri çəkilmək deməkdir".

Odur ki, bizi sosializm realizmi prinsiplərindən və bolşevizmdən geri çəkilməkdə "ittiham" edən Quluzadə öz öhdəsinə tarix qarşısında ağır bir məsuliyyət götürür.

## II

"Aygün" poeması nə məqsədlə yazılmışdı? Tənqidçi bu əsərin əsas ruhunu duya bilmişdirmi?

Əsər bizim ailələrimizdə və cəmiyyətimizdə ideal uğrunda mübarizə ilə idealsızlığın toqquşmasını, xalq və vətən səadəti uğrunda yaşayıb yaratmaq meylləri ilə dünyaya laqeyd baxmağın, insan ömrünün mənasını kefdə, əyləncədə görməyin mübarizəsini, saf və müqəddəs bir məhəbbətlə qısqanclığın, xudpəsəndliyin çarpışmasını nəticədə birincilərin zəfər çalmasını, ikincilərin isə həyatımız tərəfindən rədd edilməsini, ləğv olunmasını tərənnüm edən bir əsərdir.

Aygünün simasında ümumiləşdirilmiş birinci keyfiyyətlər, həyatımızın inkişaf meylləri olduğundan o bir çox müqavimətlərə rast gəlsə də, hər yerdə özünə dayaq tapır, Aygün öz məqsədlərinə nail olur. Əmirxan simasında verilmiş keyfiyyətlər isə köhnə dünyanın mürtəce qalıqları kimi bir müddət ailələrimizdə özünə isti yuva tapsa da, inkişafımız tərəfindən həm ifşa, həm də islah yolu ilə rədd olunur.

Nəticədə isə yeni sovet ailəsi köhnə dünyanın qalıqlarından təmizlənir, saflaşır, zəhmət, məhəbbət və dostluq kimi gözəl keyfiyyətlər zəfər çalır.

Tənqidçi isə əsərin bu dediyimiz məfkurə və məqsəd istiqamətini qəti surətdə dərk edə bilməmişdir. O, qələmi əlinə alan kimi, bizim əsərin yuxarıda dediyimiz işıqlı məqsədləri üzərinə qara ləkələr salmaq kimi bir təşəbbüsə başlamışdır. Odur ki, tənqidçinin iki arvadlılıq məqaləsində iki illik şair zəhmətinin məhsulu olan bir əsər haqda iki kəlməcə ürək açan sözə təsadüf etmək mümkün deyil. Biz bu haqda tənqidçidən küsməyirik. Çünki həyatda geniş və səxavətli təbiətlər çox olduğu kimi, məhdud və xəsis təbiətlər də az deyildir...

Tənqidçi o qədər ifrata varır ki, əsərdəki mənəvi gözəllik heykəli olan Aygün surətini də təhrif etməyə can atır. O yazır:

"Aygünün ailə və məhəbbət haqqındakı fikir və hissləri köhnədir, məhduddur və bir çox halda bayağıdır. O, öz ailə həyatı və əri üçün həsrət çəkir. Lakin bu həsrət və iztirabların mahiyyəti nədən ibarətdir? Şair Aygünün iztirablarını belə təsvir edir:

"Neçə il bir öpüş görməmiş inan!
Gah sola çevrilir, o gah da sağa,
Arabir yataqdan qalxıb ayağa
Ayrılmaq istəyir xəyallarından...
Nədir düşündüyü? Mehriban bir səs,
Sinəsi üstündə isti bir nəfəs,
Bir öpüş, qəlb açan uğurlu bir söz,
Mehriban bir baxış, mehriban bir göz,
Evdə kişi səsi, qadir bir hünər,
Eşqin keşiyində dayanan bir ər".

Bəli, öz ərindən neçə il qabaq ayrılmış Aygün yalqızlıq keçirsə də, bir çox təbii hisslər və həyəcanlar keçirsə də yüngül və təsadüfi nəvazişləri, öpüşləri öz qadınlıq şərəfinə sığışdırmayır. O, yenə də məhəbbət, mehriban bir ər və bu məhəbbətdən doğan saf bir nəvaziş və öpüş də arzu edir. Bunda insan təbiətinə zidd olan bir şey varmı?

Əksinə, Aygünün bu iztirablı, fəqət təmiz və namuslu həyəcanı onun yüksək əxlaqını ifadə etməyirmi?

Quluzadənin rəyinə görəsə, saf bir məhəbbətin və bundan doğan mehribanlıq və hörmətin həsrətini çəkmək "məhdudluq", "bayağılıq" və "köhnəlik" imiş.

Biz buradaca fikri köhnəliyin, geriliyin nə olduğunu Quluzadəyə sübut etmək və ədəbiyyatımıza kömək məqsədilə onun bir “nəzəriyyəsi” haqda söhbət açmalıyıq.

O yazır ki, “Beləliklə Aygün şair tərəfindən tamamilə müsbət planda verilməsinə baxmayaraq ümumiləşdirici bir tip olmaq etibarilə ciddi nöqsanlara malikdir. Onun da görüşlərində, duyğu və düşüncələrində qabaqcıl sovet qızları üçün xarakterik olmayan cəhətlər çoxdur”.

Quluzadə bilməli idi ki, bizim müsbət insanlarımıza qarşı bu vulqar münasibəti təbliğ edən “nəzəriyyə” çoxdan köhnəlmişdi. O, indi qabaqcıl nəzəriyyəmiz tərəfindən tənqid və ifşa olunur. O, bilməli idi ki, artıq bir tərəfdə yalnız ağlar, o biri tərəfdə isə yalnız qaralar göstərmək və qabaqcadan ağ rənglərin qaralara üstün gələcəyini oxuculara xəbər vermək üsulu ədəbiyyatımızda rədd olunub. O, bilməli idi ki, bizim müsbət insanlarımızın daxilində belə qüvvətli və yeni keyfiyyətlər ilə nöqsanlı və bizi geriyə çəkmək istəyən keyfiyyətlər mübarizə aparır. Bu daxili ziddiyyəti insan təbiətindən çıxarmaq, kənara atmaq – insan xarakterinin daxili ziddiyyətlər mübarizəsində inkişaf etməsini danmaqdır. Hərəkət və inkişafın dialektikasını anlamamaqdır.

Quluzadənin bu “nəzəriyyəsi” yeni olmadığı kimi, orijinal da deyildir. Bütün sovet dramaturgiyasında bir çox müsbət surətlərin cansız, sxematik yaranmasına bu “nəzəriyyə” az “kömək” etməmişdir. RSFSR xalq artisti A.Lobanov bu haqda çox doğru yazır:

“Nə zamankı bütün müsbət personajlar idealizə yolu ilə təsvir olunur, yalnız qırmızı bir rənglə göstərilir, o vaxt bütün təsvir olunanlara biz inanmayırıq, bizi kəsalət basır”.

Bəs belə isə əgər biz yaratdığımız müsbət insan surətlərinin müəyyən nöqsanlarını, zəif cəhətlərini də göstəririksə, nə üçün tənqidçi bunu “qeyri-real” və “xarakterik” olmayan bir hadisə kimi düşünür. Əsil köhnəlik və gerilik də budur.

Quluzadə əsərdəki müsbət planda verilmiş: öz sənətini ürəkdən sevən, xudpəsəndlik, qayəsizlik kimi xəstəliklərdən azad, müqəddəs bir eşq ilə yaşayan, öz sevgilisinin səadəti üçün öz eşqindən belə qəlb ağrıları ilə ayrılan Elyar surətini də məfkurəsizlikdə, bayağılıqda töhmətləndirir.

Tənqidçi Məmməd Cəfər Cəfərov isə Quluzadəyə səs verərək Elyarın Aygünə olan məhəbbətini “cinsi məhəbbət” kimi qələmə verir. Biz Elyarın saf və yüksək məhəbbətini ifadə edən – onun Aygünə yazdığı məktubu oxucularımıza xatırlamaq istəyirik:

“Bəlkə də yazdığım bu məktubla mən
Xəbər verməyirəm ürəyinizdən...
Odur ki, əvvəlcə üzr istəyirəm
Ki, sizə “sevgilim Aygün” deyirəm.
Bəli... Mən sevirəm... haqqım var buna,
Məhəbbət şərəfdir insan oğluna.
Yalnız məhəbbətlə insan ucalır
Eşqsiz bir ürək vaxtsız qocalır.
Fəqət sevməmişdim mən indiyədək,
Hər qızda bir cürə eyib görərək.
İndisə... xoşbəxtəm!.. Sevirəm sizi,
Sizin şairanə xilqətinizi.
Elə ki, simanız qarşımda durur,
Ürəyim döyünüb şiddətlə vurur...
Bəzən yuxum belə qaçır gözümdən
(Açıq bir fikirlə deyirəm bunu).
Dünyada bir sizi sevməyimlə mən
Bildim məhəbbətin nə olduğunu...
Nə qədər şirindir bu əziz nemət!
Şərbət tək içilir bu yolda qəm də.
İnsana yaraşır yalnız məhəbbət,
Deyə bir səs ötür hər vaxt sinəmdə...
Eşidin qəlbimdən qopan bu səsi,
Baxmayın üzümə biganələr tək.
İçimdə yandıqca eşqin nəfəsi
Ürəyim odlanır pərvanələr tək.
Mən bir nəğməkaram, sizsə bəstəkar,
Sənət rübabının qoşa simiyik.
Bizim bir yolumuz, bir qayəmiz var,
Bir canda biz iki ürək kimiyik...
Var olsun birləşən ürəklərimiz,
Solmasın əbədi bir bahar kimi.
Sənət dünyasının göylərində biz,
Gəlin, qoşa süzək qartallar kimi”.

İnsafla deyin! Burda cinsi məhəbbətdən bir əsər belə varmı? Məgər Elyar Aygünü onun nəcibliyinə görə, yüksək istedad və sənətinə görə sevməyirmi?

Nə üçün tənqidçi Elyarın oxuduğu:

“Ay işığı, bulaq başı, göy çəmən” – romansından yapışır. Axı bu romansı dəyişmək, başqa bir romans ilə də əvəz etmək olar. Elyar xa-

rakterini ifadə edən bu romansmıdır? Nə üçün tənqidçi Elyarın bariton – "ordu kimi mübarizəyə hücum çəkən" səsinə daha uyğun, böyük bir məclisdə oxuduğu "Mənim səsim" adlı dolğun, mənalı və siyasi bir nəğməndən sükutla keçir. Çünki o, Elyarı da yıxmaq üçün yalnız onun zəif cəhətlərindən yapışır...

Əsərdə ən çox mübahisəyə səbəb olan Əmirxan surətidir. Biz yuxarıda dediyimiz kimi, Əmirxan simasında həyatımızda rast gəldiyimiz məqsədsizlik, xudpəsəndlik, lovğalıq və qısqanclıq kimi mənfi halları ifşa və islah etmək məqsədini daşımışıq. Tənqidin ümumi ruhunu istiqaməti və ruhu isə bizi bu fənalığa göz yummağa dəvət edir. Və bizi "sovet həqiqətinə, sovet insanlarına böhtan" atmaqda təqsirləndirir".

"Pravda" qəzeti özünün 7 aprel 1952-ci il tarixli nömrəsinin "Dramaturgiyanın geriliyini aradan qaldırmaq" adlı məqaləsində yuxarıda dediyimiz zərərli meyli kəskin tənqid edərək yazır:

"Bəzi tənqidçilər tələb edirlər ki, bədii əsərlərdə yalnız ideal tiplər göstərilsin. Əgər yazıçı, dramaturq həyatda olan mənfi insanları göstərirsə, onu möhkəmcə tənqid etmək istəyirlər. İşə bu cürə münasibət doğru deyildir. Belə hərəkət etmək "qorxaqlıq" göstərmək və həqiqət qarşısında günah işlətməkdir. Bizdə hər şey yaxşı və gözəl deyil, bizdə mənfi tiplər var, həyatımızda fənalıq az deyildir, saxta qəlbli adamlar da az deyildir. Biz nöqsanları və çətinliyi göstərməkdən qorxmamalıyıq. Nöqsanları müalicə etmək lazımdır. Bizə Qoqollar və Şedrinlər lazımdır hərəkət və inkişaf olmayan yerdə nöqsansız da olanı yoxdur. Biz isə inkişaf edirik, qabağa hərəkət edirik, – demək ki, bizdə çətinliklər də, çatışmayan cəhətlər də vardır". Biz də bu əsərdə nöqsanları "müalicə" məqsədini daşımışıq. Məqsədsiz bir ömür keçirən Əmirxan illər keçdikcə, həyatın məhkəməsi qarşısında məqsədə doğru, ideala doğru hərəkət edir. Cəmiyyətə faydalı bir insan olur.

Qəribə burasıdır ki, tənqidçi müəllifi Əmirxana rəğbət bəsləməkdə ittiham edir.

"Üç dəfə basıldı qapının zəngi,
Kimdir qonaqlığa bu vaxtsız gələn?
Ağardı qar kimi Aygünün rəngi...
Yonulmuş daş kimi arıq bir bədən
Dayandı gəlinin qarşısında lal.
O heç danışmadı, dinmədi bir an,
Aygünə bir dəstə gül verib dərhal
Gözləri yaşarmış çıxdı qapıdan".

Məgər bu səhnədə yüksələn və mənəvi təntənə çalan Aygünün qarşısında lal kimi dayanan, cansız bir heykələ dönən kimdir, yalnız Əmirxanmıdır? Xeyir. Bizim yüksəlişimizə mane olmaq istəyən, nəhayət, bu yüksəliş romantikası qarşısında təslim olan ətalət, xudpəsəndlik, qısqanclıq və idealsızlıqdır.

Müəllifin bilavasitə Əmirxana olan münasibətinə gəlincə:

İş üstündə çətinliyə düşdüyü vaxtlar
Nə insandan, nə kitabdan kömək istədi.
Özü lovğa, biliyi az, hövsələsi dar,
Mən heç kəsin ayağına getmərəm, dedi.

Yaxud:

Bəzən əlindəki gözəl neməti
İtirəndən sonra ayılır insan.
Əmirxan! Duydunmu sən bu dəhşəti,
Yenəmi aləmdə kor qalacaqsan.

Yaxud:

Əmirxansa öz yerini itirdiyindən
Neçə səmtə asıb getdi gicbəsər kimi.
Utandı da teatroya biletsiz gələn
Ayaq üstə, yersiz qalmış adamlar kimi...

Budurmu müəllifin Əmirxana olan "hüsnü-rəğbəti"?

Biz bu misalların sayını çox-çox göstərə bilərik. Bütün bunlara baxmayaraq, biz Əmirxanı sıradan çıxarmaq istəmədik, ona ümidsiz bir varlıq kimi baxmadıq. Onun xarakterində olan bir çox mənfi cəhətlərə baxmayaraq Əmirxan şüurlu və siyasi bir düşmən deyil, onun islahı mümkündür və lazımdır. Əgər biz Əmirxanı sıradan çıxarsaydıq, sovet cəmiyyətinin insanları yenidən tərbiyə etmək, onları köhnə dünyanın iyrənc qalıqlarından xilas etmək kimi müqəddəs tərbiyə prinsiplərini unutmuş olardıq. Bu isə ədəbiyyatda yüngül müqavimət yolu, çətinlikdən yaxa qurtarmaq, özünü sığortalamaq kimi sovet yazıçısına xas olmayan bir sifət olardı. Təəssüf ki, tənqidçi belə bir geriliyə bizi də dəvət edir.

Bununla əlaqədar olaraq etiraf etməliyəm ki, Əmirxanın yenidən qurulma prosesində ictimai həyat amillərinin təsirini daha aydın, daha canlı göstərmək lazımdır. Bu haqda biz tənqidçinin fikrinə haqq veririk. Əsərdə bir çox zaman və məkan normalarını pozan momentlər də vardır. Əsərin bu və başqa nöqsanlarını, çatışmayan cəhətlərini müəllif düzəltmək və yenidən işləmək istəyir. Nə üçün Quluzadə əsərdə rast gəldiyi düzəlməsi mümkün olan nöqsanların aradan qaldırılmasını müəllifə məsləhət görməyib, bütün əsərə qara bir xətt çəkir?

Görünür ki, Quluzadə müəllifin yenə də işləmək və işləyə bilmək qabiliyyətinə, istedadına inanmayır. Onu öz dediyi kimi "geri qalmış" bir sənətkar hesab edərək məyus və ümidsiz olur. Quluzadə öz ədəbi səyahətinə çox məyus və ümidsiz bir ürəklə başladı...

*1954*

## SOVET POEZİYASI HAQQINDA

[*Sovet yazıçılarının İkinci Ümumittifaq qurultayındakı əlavə məruzə*].

Yoldaşlar! Sovet yazıçılarının Birinci və İkinci qurultayı arasından keçən iyirmi il ərzində bizim böyük, dünyada ən qabaqcıl sovet poeziyamız ideya-bədii cəhətcə zənginləşmənin və inkişafın, mübarizə və yaradıcılıq qələbələrinin böyük və şanlı yolunu keçmişdir.

Poeziyamızın bütün hadisələrini və bu hadisələrin bütün zənginliyini və gözəlliyini ətraflı əhatə etmək iddiasında olmayaraq, mənim əlavə məruzəmi qurultayımızda genişlənəcək böyük və canlı söhbətə bir giriş sözü kimi qəbul etmənizi rica edirəm.

Keçən dövr ərzində çoxmillətli sovet poeziyamız haqqında, heç olmazsa, onun əsas xüsusiyyətləri haqqında aydın təsəvvür əldə etmək üçün onun mənbələrinə ötəri də olsa bir nəzər yetirmək lazımdır. Bunu həm də ona görə etmək lazımdır ki, keçən iyirmi il ərzində poeziyamızın qazandığı ən yaxşı nailiyyətlər hələ Birinci Ümumittifaq qurultayından əvvəl poeziyamızda yaranmış ən yaxşı ənənələrin davamı və inkişafıdır.

Böyük Oktyabr sosialist inqilabı bəşəriyyət tarixində yeni dövr açmışdır. O, zəmanəmizin bədii fikrinin inkişafında da yeni dövr açmışdır.

Sosialist inqilabı bəşəriyyətin bədii fikrini mənəvi yoxsulluq və zəiflikdən, dekadentçilik və simvolizmdən, işıqlı və gözəl gələcəyin qələbəsinə inamsızlıqdan xilas etdi.

Böyük Oktyabr sosialist inqilabından sonra yeni tarixi şəraitdə dünya poeziyasının inkişafının bütün təcrübəsi keçmiş "sənət sənət üçündür" nəzəriyyəsinin tamamilə əsassız olduğunu sübut etdi. Bəşəriyyətin bədii fikri yalnız böyük ideyalar əsasında inkişaf edə bilər. Qabaqcıl fəlsəfi və siyasi ideyalardan kənarda heç bir böyük ədəbiyyat yaşaya bilməz və hətta ən parlaq istedadlar da ideyasızlıq xaosuna düşəndə sönür və məhv olurlar.

Birinci və İkinci rus inqilabları arasındakı dövrdə rus poeziyasının vəziyyətini yadımıza salaq. Qorkinin dediyinə görə, bu, rus ziyalılarının tarixində ən biabırçı və ən istedadsız bir dövr olmuşdur. Bu elə bir dövr idi ki, bu zaman böyük rus poeziyasının – Puşkin, Lermontov, Nekrasov poeziyasının xəlqiliyindən və inqilabi-demokratik əsaslarından, bu poeziyanın şanlı vətəndaşlıq ənənələrindən uzaqlaşmışdılar.

Vaxtilə hələ Lermontov:

...Xalqın bayramında, dərdli günündə
Nəcib fikirləri əks-sədatək
Qüllədə çalınan zəngi andıran

şair haqqında bir ideal kimi danışarkən həqiqi poeziyanın vətəndaşlıq prinsipini təsdiq edirdi.

Nekrasov öz ilham pərisini hüquqsuz rus təhkimçi qızının taleyi ilə müqayisə edirdi:

Dünən saat altıydı
Mən girəndə həyətə,
Gənc bir kəndli qadını
Qamçı ilə döyürdülər.
Onun səsi gəlmirdi,
Yalnız qamçı vıyıldayır,
Oynayırdı havada...
Mən öz ilham pərimə
Dedim ki, "bir ona bax,
O, sənin doğma bacındır!"

Rus poeziyasının dekadent şairlər tərəfindən xaincəsinə təhqir edilib kənara tullanmış bu gözəl vətənpərvərlik və vətəndaşlıq ənənələri yalnız Böyük Oktyabr inqilabı sayəsində yeni bir əsasda, inqilabi zəmində təntənəli surətdə canlandı.

Oktyabr inqilabı Vladimir Mayakovski kimi böyük istedadın, Demyan Bednı kimi güclü istedad sahiblərinin bir şair olaraq yetişib çiçəklənməsinə kömək etdi. A.Blok, V.Bryusov, S.Yesenin kimi şairlərin simvolizm və dekadent bataqlığından çıxmasına kömək etdi.

İnqilabla addımlayın, birgə yeriyin!
Düşmən rəhmsizdir, yatmayıb, bilin!

A.Blokun bu poetik çağırışı köhnə dünya əleyhinə mübarizədə sayıqlığa səsləyən bir şüar oldu.

Oktyabr inqilabı bizim bir sıra qardaş respublikaların poeziyasının, məsələn, gürcü və Azərbaycan poeziyasının dekandent təsirindən azad olmağına kömək etdi. Şevçenko və Franko, Axundov və Sabir, Çavçavadze və Sereteli, Tokay və Abay və bir çox başqa demokrat şairlərin realist ənənələri də inqilabdan sonra yenidən canlandı və möhkəmləndi.

Oktyabr inqilabından sonra Gürcüstanda Qalaktion Tabidze kimi görkəmli şairlər böyük yaradıcılıq təkamülü keçirmişlər. Oktyabrın təsiri altında Belorusiyanın xalq şairləri Yanka Kupalanın və Yakub Kolasın yaradıcılığı geniş qol-qanad açmış, Ukraynanın istedadlı şairləri P.Tıçina və M.Rılski və gürcü şairi Georgi Leonidze yetişib formalaşmışlar. İnqilab onların yaradıcılığını böyük mövzuların və yüksək ideyaların geniş yoluna çıxardı, onları xalqa xidmət etmək pafosu ilə qanadlandırdı.

Birinci qurultaydan keçən iyirmi il ərzində sıralarımıza xeyli yeni yaradıcı qüvvələr gəldi. Qazax xalqının dahi şairi Cambulun gur səsi bütün qüvvəsi ilə eşidildi, Dağıstanın xalq şairi Süleyman Stalskinin, Abxasiyanın xalq şairi Dm. Qulianın, Buryat-Monqolustanın xalq şairi Xotsa Namsarayevin yaradıcılığı möhkəmlənib çiçəkləndi; Oktyabrdan əvvəl öz əlifbası olmayan qırğız, başqırd, mari, çuvaş, adıgey və başqa xalqların poeziyası əhəmiyyətli qələbələr qazandı. Yenidən birləşən Qərbi Ukrayna və Qərbi Belorusiya, Latviya, Estoniya, Litva və Moldaviya şairlərinin gur və qüdrətli səsi sovet poeziyasının ümumi xoruna qoşuldu.

Xarici ölkələrin proqressiv poeziyasında görkəmli yer tutan böyük şairlərin Lui Araqon, Pol Eluar, Pablo Neruda, V.Bronevski, V.Nezval, Stanislav Neyman, Nikola Vantsarov, İohannes Bexer, Erix Vaynert, Nikolas Gilyen, Nurdal Qrik kimi şairlərin, otuz ildən bəri yaradıcılığı tacik sovet ədəbiyyatı ilə sıx bağlı olan Ə.Lahutinin yaradıcılığına Oktyabr inqilabı ideyalarının səmərəli təsir etdiyi haqqında danışmağa tam haqqımız vardır.

Məşhur türk şairi Nazim Hikmət Oktyabr inqilabının əzəmətini tərənnüm edərək yazmışdır:

Yenə bizim səsimizdə
Oktyabr inqilabının qüdrəti qaynayır,
Biz yenə Sibir küləkləri ilə birlikdə,
Bağırırıq, sanki
Kolçakı biz güllələmişik!

Görkəmli Çili şairi Pablo Nerudanın Oktyabr vətəninə həsr etdiyi şeirləri də güclü məhəbbət hissi ilə aşılanmışdır:

Sovet torpağı! Əgər sənin
Bir ana kimi bütün dünyaya verdiyin qanı,
Can verən azadlığı xilas etmək üçün
Tökdüyün bütün qanı toplasaq –
Böyük bir dəniz yaranardı!..

Vaxtilə V.İ.Lenin “Beynəlmiləl”in müəllifi fəhlə şair Ejen Potye haqqında yazmışdır ki, Potye “özündən sonra həqiqətən mənəvi bir abidə qoyub getmişdir. O, nəğmə vasitəsilə iş aparan və böyük təbliğatçılardan biri idi”.

Biz bununla fəxr edirik ki, sovet poeziyası sözün ən geniş mənasında, partiyialı poeziyadır. V.Mayakovski:

Mən
        şairlərin bütün gücünü
Sənə verirəm, ey hücum edən sinif!

– deyərkən, bu həm böyük şairin səsi idi, həm də əsrin səsi, yeni poeziyanın səsi idi.

Bizim poeziyanın partiyalı mahiyyətini tarixən sinfi mübarizənin öz təbiəti müəyyən etmişdir və bu mahiyyət heç bir zaman bizim dövrdə olduğu qədər öz kəskin və aydın ifadəsini tapmamışdır. Bizim poeziyamız xidmət etdiyi məqsəd və idealları məhz partiyalılıqda tapır. Bu poeziya gündən-günə inkişaf edərək yaşayır və tamamilə aydın surətdə dərk edir ki, bizim dövrdə –

...Mahnı da,
şeir də –
bombadır, bayraqdır,
Nəğməkarın səsi də
sinfi ayağa qaldırır.

Bizim poeziya bəşəriyyətin bədii fikrinin inkişafında irəliyə doğru bir addımdır. Poeziyamız özünün formalaşdığı illərdə müxtəlif burjua estetik cərəyanlarının qalıqları ilə, "sənət sənət üçündür" nəzəriyyəsi tərəfdarları ilə, dekadentçilik və futurizm yolu ilə gedənlərlə, proletkultçularla və poeziyanın mahiyyət və məqsədinə xalqa zidd baxışlarla yanaşan başqa cərəyanlarla kəskin sinfi mübarizədən doğan bir çox çətinlikləri və maneələri aradan qaldırdı.

Uzun illər davam edən bu mürəkkəb tarixi mübarizədə bizim, sovet şairlərinin müvəffəqiyyətləri və müvəffəqiyyətsizlikləri olmuşdur, lakin son nəticədə bizim partiyalı poeziyamız, vətənpərvər və vətəndaş poeziyamız qalib gəldi.

Xalqımız üçün ciddi imtahan, onun bütün qüvvələri üçün ciddi sınaq olan Böyük Vətən müharibəsi illərində xüsusilə aydın hiss edildi ki, şairin sözü – "insan qüvvəsinin sərkərdəsidir".

Bununla əlaqədar olaraq, vətənpərvər şair Musa Cəlilin parlaq obrazını xatırlayaq. O, həbsxananın divarları arasında, hər dəqiqə ölüm gözləyərək, faşist cəlladlarına qarşı məğrur nifrətlə dolu olan şeirlərini yaratmışdır:

Soyuq cəsədi qucsa da torpaq,
Odlu nəğmələri udmaz torpaqlar.
Zəfərlərlə ölən bir qəhrəmana
Öldü söyləməyə kimin haqqı var?!

Biz öz böyük poeziyamızın milli inqilabi-vətənpərvər ənənələrini gələcəkdə də göz bəbəyi kimi qorumalıyıq.

Bizim sovet poeziyasının böyüklüyü və birliyi onun çoxmillətli səsində və ahəngindədir. O, azad xalqların qardaşlıq və dostluq poeziyasıdır, mübarizə və döyüşlərdə qorunub müdafiə edilmiş sosialist Vətənimizi bütün sovet xalqlarının dillərində tərənnüm edən qüdrətli poetik səslərdən yaranmış bir xordur, vahid bir iradə ilə vahid ailədə birləşmiş xalqlarımızın yaradıcılıq qəhrəmanlığıdır. Sovet vətənpərvərliyi bizim bu poeziyanın hərəkətverici qüvvəsidir. Ukrayna şairi Pablo Tıçina yazır:

Birliyi xalqların parlayır yenə
Rəngbərəng görünür qövsi-qüzehtək.
O qədər yüksəkdir bu birlik, dostluq,
Sanki birgə nəfəs alır bu el, bu oba,
Gurlayıb qəlbinə səs salsan əgər,
O coşqun dağlardan cavabın gələr.

Bütünlükdə sovet poeziyasının əldə etdiyi nailiyyətləri nəzərə almadan ayrılıqda milli poeziyanın müvəffəqiyyətləri haqqında da danışmaq mümkün deyildir. Bizim bütün böyük və kiçik xalqlarımızın şairlərinin hamısı bir-birini qarşılıqlı surətdə tamamlayır və yaradıcı şəkildə zənginləşdirir.

Biz, İkinci qurultayımıza toplaşmış qardaş respublikaların şairləri klassik və müasir rus poeziyasının böyük tarixi rolunu hədsiz minnətdarlıqla qeyd edirik. Bu poeziya bizim milli ədəbiyyatlarımızı yeni pilləyə qaldırmış, bədii yaradıcılığımızı öz realist və inqilabi ənənələri ilə zənginləşdirmişdir.

Rus poeziyası milli respublikaların poeziyasının yeni poetik formalarla zənginləşməsinə böyük təsir göstərmişdir. O, Şərq xalqlarının poeziyasında köhnəlmiş şərti şeir qanunlarını aradan qaldırmağa kömək etmişdir. Yeni poeziya əsrinin qüdrətli səsi olan V.Mayakovskinin poetik irsi Sovet İttifaqının bir çox şairlərinin yaradıcılığına böyük təsir göstərmiş və göstərir. Biz hamımız, qardaş respublikaların şairləri, V.Mayakovskini özümüzün dostu və müəllimi hesab edirik.

Poeziyamız bütünlükdə hər cür millətçilik, dindarlıq və irqçilik xurafatından azaddır. Sovet şairləri bütün dünya xalqları arasındakı dostluğu və proletar beynəlmiləlçiliyinin qadir gücünü tərənnüm edirlər, Vətənimizdə və bütün dünyada meydana çıxan ən gözəl və işıqlı nə varsa hamısını sevinclə qarşılayırlar. Məsələn, Nikolay Tixonov öz

şeirlərində azad və xoşbəxt Gürcüstanı necə tərənnüm edirsə, o, eyni dostluq və hörmət hissi ilə Pakistan və Hindistanın zəhmətkeş xalqının taleyindən və həyatından yazır.

Vladimir Luqovskoyun gözəl, yüksək pafosla yazılmış "Danqara" poemasını xatırlayaq. Bu əsərdə rus şairi Orta Asiya xalqlarının həyatını, onların Sovet hakimiyyəti uğrunda, imperializmin və basmaçıların hiylələri əleyhinə apardığı mübarizənin tarixini böyük hörmət və məhəbbət hissi ilə təsvir etmişdir.

Özbək şairi Qafur Qulamın insanın sosializmdə xalqların vahid qardaşlıq ailəsindəki yüksək vəziyyətini ilhamla tərənnüm edən "Mən yəhudiyəm" adlı diqqətəlayiq şerini xatırlayaq:

Mən –
insan irqinin
nümayəndəsiyəm.
Millətim –
insandır!
Silinəcək yer üzündən
irqlər də, siniflər də...
İnsan özü qalacaq
əsrlərdə əbədi.
Ruhuma yaddır mənim
din tiryəki, zəhəri,
Bədənim də tanımır
nə xəstəlik, nə zəli.
Vətəndaşıyam böyük
Sovetlər ölkəsinin,
Ailəsinin üzvüyəm
bizim yer kürəsinin.

Konstantin Simonov müharibə dövründə yazdığı şeirlərində öz həmvətənlərinin igidlik və qəhrəmanlığını tərənnüm etmişdir. O özünün "Dostlar və düşmənlər" kitabında da xarici ölkələrin xalqlarının demokratik və inqilabi meyllərini təbrik edir, sözün ən geniş və nəcib mənasında beynəlmiləlçiliyin müğənnisi kimi çıxış edir.

Andrey Malışkonun Amerika haqqında "Mavi dənizin o tayında", Mikola Bajanın və A.Surkovun İngiltərə haqqında, N.Qribaçovun Koreya haqqında şeirləri, Süleyman Rüstəmin "İki sahil" kitabına daxil edilmiş şeirləri, M.Tursunzadənin "Hindistan balladası", Vera İnberin,

Geğam Saryanın, Osman Sarıvəllinin İran haqqında poemaları və şeirləri, Yan Sudrabkalnın, S.Çikovaninin, Antanas Ventslovun, Maksim Tankın, Qasım Amanjolovun, Yemilyan Bukovun şeirləri və yüzlərlə başqa misal göstərir ki, sovet poeziyası öz ölkəsinin sərhədləri arasında qapanıb qalmır, onun əsas məzmununu təşkil edən sovet vətənpərvərliyi hissi proletar beynəlmiləlçiliyi hissindən ayrılmazdır.

Bu mənada, poeziyamız bəşəriyyətin bədii fikrinin inkişafında da irəliyə doğru böyük addım atmışdır. Biz beynəlmiləlçilik ənənələrinə gələcəkdə də sadiq qalmalı və mümkün qədər poeziyamızı bu istiqamətdə inkişaf etdirib zənginləşdirməliyik. (*Alqışlar*)

Poeziyamız öz vətəndaşlıq və inqilabi meyllərini hansı bədii obrazlarda təcəssüm etdirmişdir? O, hansı müsbət tipləri və xarakterləri yaratmışdır?

Bizim bugünkü və keçmiş həyatımızda qabaqcıl və mütərəqqi meyllər uğrunda mübarizə aparmaq, köhnə və ölüb gedən qalıqlarla toqquşmada yeniliyi təsdiq etmək – sovet poeziyasının həyatın özündən doğan əsas mövzusudur. Bizim poeziyada müsbət obrazların dairəsi geniş və rəngarəngdir. Bu obrazları təxminən belə qruplaşdırmaq olar.

Əvvəla, bu obrazlar tarixi qəhrəmanların – uzaq keçmişin qabaqcıl adamlarının obrazlarıdır, dövlət xadimlərinin, sərkərdələrin, xalq qəhrəmanlarının və bahadırların, alimlərin və şairlərin obrazlarıdır. Bizdə bir sıra əhəmiyyətli tarixi poema və mənzum dramatik əsərlər yazılmışdır. Mikola Bajanın “Daniel Qalitski” poemasında tarixi qəhrəmanın obrazı həqiqi bir şəkildə verilmiş və rus torpaqlarını yadelli qəsbkarlardan müdafiə edən xalq parlaq göstərilmişdir.

Gürcü şairi Simon Çikovani “David Quramişvili haqqında nəğmə” adlı ilhamlı poema yazmışdır; belorus şairi Petrus Brovka milli qəhrəman “Kastus Kalinovski” haqqında poema yazmışdır. Azərbaycan şairi Süleyman Rüstəm “Qaçaq Nəbi” mənzum dramını yazmış və bu əsərdə çarizmə və yerli feodalların özbaşınalığına qarşı mübarizə edən xalq qəhrəmanı təsvir edilmişdir. Mənim fikrimcə, “Paltavadan Qanqutadək” faciəsində İlya Selvkinski qüvvətli dramatik çarpışmalarda Rusiyanı yenidən quran I Pyotrun obrazını göstərməyə müvəffəq olmuşdur. Həmin faciədə Pyotrun poetik monoloqu xüsusilə ifadəlidir:

Böyük İvanın arzuları
Həyata keçir! Budur, od və polad,
Yuxusuz gecələrin min bir zəhməti,

Gizli düşüncələr bizlərə
Gümüş sulardan yol açır,
Uzaq üfüqlər görünür.
...Mən ağlayıram, qardaşlar...
Həm də utanmıram bu göz yaşımdan...
Dalğalı dəniz indi öz əlimizdədir.
Nəhəng öz iplərini qırmışdır!
Bunu kim dərk etməyə qadirdir?!

L a p u c a d a n

Rusiya!

Ə k s - s ə d a

Mən!

P a d ş a h

Sən okeana çıxmısan!

Biz bir çox şeir və poemalarda öz şanlı ata-babalarımızın obrazlarına müraciət edib, xalqın mənafeyi naminə onların göstərdiyi qəhrəmanlığı və çəkdikləri zəhməti təsvir etmişik və bununla da öz müasirlərimizdə vətənpərvərlik düşüncəsi tərbiyə etmişik. Lakin şairlərimiz bir sıra əsərlərdə tarixi həqiqəti təhrif edərək, keçmişi idealizə etmişlər. Məsələn, Şeyxzadənin "Cəlaləddin", Tajibayevin "Biz qazaxlarıq" dramatik poemaları belədir. Keçmişin idealizəsi Səməd Vurğunun "Fərhad və Şirin" dramında da vardır.

İkincisi, inqilabımızın tarixi müsbət qəhrəmanların obrazlarını yaratmaq üçün tükənməz ilham mənbəyidir. Şairlərimiz bizim inqilabın, partiyanın rəhbərlərini, görkəmli inqilabçıları təsvir edən iri həcmli poetik əsərlər yazmışlar.

Sovet poeziyası yeni tipli əsərlər yaratmışdır. Bu əsərlərdə əsas yeri müfəssəl, ardıcıl şəkildə təsvir olunan tərcümeyi-hal, böyük insanın tərcümeyi-halı tutmur; bu əsərlərdə, hər şeydən əvvəl, böyük insanın tarixi fəaliyyətinin ictimai mənası obrazlı şəkildə ifadə edilir və açılıb göstərilir.

İnqilabın rəhbəri haqqındakı poemasında V.Mayakovski həm sənətkar – tarixçi kimi, həm də qəlbi sovet xalqının sevincini və kədərini

duyan müasir şair kimi çıxış edir. Ən ağır itkinin baş verdiyi saatda şair yol vermir ki, dərd və kədər ona qalib gəlsin; şair gələcək haqqında, partiyanın və xalqın tükənməz qüvvəsi haqqında düşünür.

Azərbaycan şairi Rəsul Rzanın "Lenin" poeması V.İ.Lenin haqqında yazılmış əhəmiyyətli əsərdir.

Vətəndaş müharibəsinin qəhrəmanları, 26 Bakı komissarı haqqında, Çapayev, Şors, Jeleznyak, Voroşilov, Budyonnı haqqında şeirlər, poemalar və nəğmələr xalqımızın böyük rəğbətini qazanmışdır.

M.Bajan özünün "Atalar və oğullar" adlı poemasını 1919-cu ildə Xarkov yaxınlığındakı döyüşlərdə həlak olmuş Luqansk fəhləsi Pyotr Tsulova həsr etmişdir. Bu poema vətəndaş müharibəsinin sıravi qəhrəmanlarını şöhrətləndirən yüksək pafosla yazılmışdır. Salomeya Nerisin ən yaxşı əsərlərindən biri – "Dördlər" poeması burjua Litvasında inqilabi mübarizə qəhrəmanlarına həsr edilmişdir.

Şairlərimizin inqilabın qorxmaz döyüşçülərini tərənnüm edən obrazları böyük tərbiyəvi əhəmiyyətə malikdir. Bu obrazlarda xalqın işıqlı gələcək uğrunda mübarizədə əldə etdiyi ən gözəl insani keyfiyyətlər, partiya işinə sədaqət, mətanət və fədakarlıq təcəssüm etdirilmişdir.

Lakin təəssüflə qeyd etməliyik ki, inqilabi-tarixi mövzularda yazılan poemalarda qabaqcıl inqilabçı fəhlə obrazı hələ layiqli yerini tutmamışdır. Bizim inqilabi hərəkatımızın tarixi isə belə obrazlarla zəngindir.

Poeziyamız müasirlərimizin diqqətəlayiq obrazlarını verən əsərlərlə haqlı olaraq fəxr edir. Əlbəttə, bizim burada verdiyimiz bölgü şərtidir. Məsələn, Nikolay Aseyevin "Mayakovski başlanır" poemasının qəhrəmanı eyni zamanda bizim müasirimiz kimi, həm də ədəbiyyatımızın tarixində sosializmin təntənəsi uğrunda aparılan mübarizədə öz sözü ilə fəal iştirak etmiş, yaradıcılığı inqilabın taleyi ilə həmişəlik bağlanmış bir şair kimi çıxış edir.

A.Tvardovskinin "Mouraviya ölkəsi" poeması hələ müharibədən əvvəlki illərdə yaranmış və haqlı olaraq ümumin rəğbətini qazanmışdır. Xalq səadəti axtarmaq haqqındakı əfsanəvi motiv bu əsərdə kəndli kütlələrinin həyatında və şüurunda böyük dəyişikliyi əks etdirən real vəziyyətlərin və səciyyələrin təsviri ilə təbii surətdə birləşir.

A.Tvardovski "Vasili Tyorkin" poemasında vətənpərvər sovet döyüşçüsünün ümumiləşmiş obrazını yaratmışdır.

Bu obrazda zəhmətkeş, vətənpərvər və döyüşçü olan rus adamının xarakterindəki ən gözəl milli xüsusiyyətlər ümumiləşdirilmişdir. Bu

poema Vətən müharibəsi zamanı adamlarımızın qəhrəmanlığını epik səpkidə göstərməkdə ilk və iri addım oldu. Biz Tyorkini ona görə sevirik ki, o, doğma yurduna, insana məhəbbət bəsləyir, cəsarətlidir, qəhrəmandır, çətinliklərə üstün gəlməyi bacarır, həyatla mübarizənin ən faciəli dəqiqələrində belə ruhdan düşmür.

"Vasili Tyorkin" poemasını adamların qəhrəmanlığı və həyatı haqqında böyük nəğmə adlandırmaq olar. Bu poemanın pafosu – qəhrəman və ölməz optimizmdə, həyat eşqindədir ki, bu da şöhrətdən daha qiymətli, ölümdən daha qüvvətlidir: "...Şöhrət xatirinə deyil, yer üzündə həyat xatirinə döyüş gedir". Aydın və təsirli bir dildə, rus klassik poeziyasının ən gözəl ənənələri ruhunda yazılan bu poema ədəbiyyatımızda həmişə yaşayacaqdır. Lakin böyük və mübahisəsiz yaxşı cəhətləri ilə yanaşı, mənim fikrimcə, poemanın nöqsanı ondan ibarətdir ki, əsərdə partiyanın həyatımızda təşkiledici və istiqamətverici rolu göstərilməmiş, Vasili Tyorkin obrazının müsbət keyfiyyətlərinə baxmayaraq, bu obraz bəzən ideya dərinliyi ilə fərqlənmir, öz zəmanəsinin qabaqcıl fikirlərini və səylərini dolğun şəkildə ifadə etmir.

Marqarita Aliger lirik-romantik "Zoya" poemasında böyük rus xalqının şanlı qızı Zoya Kosmodemyanskayanın parlaq və qəhrəman obrazını yaratmışdır. M.Aliger bu poemada sovet gənclərinin təmiz qəlbini, onların qəhrəmanlığını və vətənpərvərliyini tərənnüm etmişdir. Məmməd Rahim özünün "Leninqrad göylərində" poemasında igid azərbaycanlı təyyarəçi Hüseynbalanın obrazını və onun rus təyyarəçisi Alekseylə dostluğunu göstərmişdir. Semyan Kirsanov öz poemasında sovet fəhləsi Makar Mazayın qəhrəman obrazını vermişdir. Onun yazdığı əsərlər arasında, bizcə, ən realistik əsər olan bu poemada şair sosializm quruculuğunun əmin-amanlıq illərində qəhrəmanın xarakterinin necə formalaşdığını və onun Böyük Vətən müharibəsi illərində meydana çıxan qəhrəmanlığının mənbələrini açıb göstərmişdir. Başqırd şairi Maqsud Sundukle də öz poemasını eyni mövzuya həsr etmişdir. Müharibədən sonrakı illərdə poeziyamızda Aleksey Nedoqonovun "Kənd Soveti üzərində bayraq", Aleksandr Yaşinin "Alyona Fomina", Mixail Lukoninin "İş günü", Nikolay Qribaçovun "Pobeda"da bahar" kimi poemalarında yeni müsbət qəhrəmanların obrazları yaradılmışdır. Mənim fikrimcə, N.Qribaçov son poemasında partkom Zernovun obrazında realist cizgiləri inqilabi-romantik cizgilərlə birləşdirmək üçün müvəffəqiyyətli təşəbbüs göstərmişdir. Zernov öz təvazökarlığı, adam-

lara və onların taleyinə qayğı ilə yanaşması ilə diqqəti cəlb edən, eyni zamanda xəyalpərəst, gələcəyə nəzər salan, sabaha baxan bir insan kimi bizim qarşımızda canlanır. Zernov inanır ki:

...Bizim hər işdən çətin
Böyük vəzifəmiz var, –
Gərək almaz kimi
Saf olsun insanların
Şüuru, düşüncəsi.
Bu isə – hər işdən çətin və mürəkkəbdir,
Yuxusuz gecələr tələb edən bir işdir.

Əsrimizin qəhrəmanının müsbət obrazını yaratmaq çətin vəzifədir. Bu vəzifəni həll edərkən, müəlliflərimizdən bəziləri sxematikliyə və səthiliyə yol verirlər, onlar müasirlərimizin obrazlarını bütün dərinliyi ilə və hərtərəfli açıb göstərməyə müvəffəq olmurlar. Bu işdə bəzən böyük şairlər də oçerkçiliyə və təsvirçiliyə qapılırlar.

Məmməd Rahimin "Abşeron torpağında" poemasında vəziyyət daha pisdir. Bir sıra gözəl əsərlərin müəllifi olan şair, görünür, bu poemada nə mövzunu, nə də insanları duymuş, öz poetik səsinə sadiq qalmamışdır. Bütün bunlar isə nəticədə onu həyatın poetik mənasını təhrif etməyə gətirib çıxarmışdır.

Təqlid edilməyə nümunə olan sadə sovet adamlarının – bizim müasirlərimizin obrazını yaratmaq işində şairlərimiz hələ də az müvafiq olurlar...

Mənə elə gəlir ki, bu obrazların zəif çıxmasının səbəblərindən biri odur ki, müasir mövzu və xarakterlərin poetik cəhətdən işlənməsi sahəsində kifayət qədər təcrübə yoxdur. Halbuki tarixi mövzuların və tarixi obrazların yaradılması sahəsində dünya poeziyasının əsrlərlə davam edib gələn ənənələri vardır. Bax, elə buna görə də müasir mövzunun işlənməsində irəliyə doğru bir addım kimi qiymətləndirilən əsərlərə biz olduqca diqqətli və qayğıkeş münasibət göstərməli, bununla yanaşı, həmin əsərlərdəki nöqsanları ən ciddi və xeyirxah surətdə tənqid etməkdən də çəkinməməliyik.

Müasir mövzuların zəif işlənməsinin başqa bir səbəbi də budur ki, müsbət qəhrəmanın şər qüvvə ilə, ona qarşı duran mənfi qüvvələrlə mübarizəsini vermədən onun obrazını yaratmaq olmaz.Bizdə adamların şüurunda qalmış və bizi geriyə çəkən keçmişin köhnə qalıqlarına qarşı

arasıkəsilmədən mübarizə aparılır. İçərimizdə irəliyə doğru inkişafımıza mane olan mənsəbpərəstlər, acgözlər və ikiüzlülər vardır. Bizə düşmən olan kapitalist cəbhəsindən içərimizə casuslar və təxribatçılar göndərilir. İdeoloji təxribatçılıq halları ilə də qarşılaşırıq. Lakin bəzən yazıçı və tənqidçilər bu cür "şər qüvvələrlə" olan həyati və kəskin toqquşmalardan yan keçməyi üstün tutur və müsbət qəhrəmanın xarakterindəki xırda ziddiyyətlərlə öz işlərini məhdudlaşdırırlar – guya ki, insanın mənəviyyatındakı müsbət keyfiyyətlərin özü elə həmişə mənfi cəhətlərlə mübarizə aparır.

Zəmanəmizin müsbət qəhrəmanını tərənnüm edərkən ona qarşı duran zidd qüvvələri göstərməkdən ehtiyat edib, qorxaqlıq göstərmək lazım deyildir. Axı mübariz inqilabçının tam dolğun obrazını yaratmaq üçün gərək qüvvətli düşmənin obrazını ona qarşı qoyasan. Düşməni zəif göstərsək, biz öz qüvvəmizi də göstərə bilmərik. Biz gərək həyat həqiqətinin tələb etdiyi kimi, müsbət qəhrəmanı çətin və uzun müddətli mübarizədə bütün itkiləri və müvəffəqiyyətləri ilə göstərək. Belə edilsə, müsbət qəhrəmanın qalibiyyəti daha çox inandırıcı olar.

Şekspirin obrazlarından ikiüzlü və xain Yaqonu xatırlayın. Bizim irihəcmli epik və dramatik poemalarımızda siyasi və mənəvi düşmənlərimizin bu cür ümumiləşdirilmiş qüvvətli obrazı varmı? Sual olunur: bizim müsbət qəhrəman kimlə vuruşur və kimə qalib gəlir? Müsbət qəhrəmanın mənfilərə qarşı apardığı mürəkkəb, gərgin hadisələrlə zəngin mübarizə və müsbət qəhrəmanın axırda qalib gəlməsi – poeziyada dramatizmin əsasını təşkil edir.

Bütün bunlar o deməkdirmi ki, bizim müsbət qəhrəman hər hansı daxili ziddiyyətlərdən məhrum olmalıdır? Yox, müsbət qəhrəmanın öz daxili ziddiyyətləri, zəif və qüvvətli cəhətləri vardır ki, bu da hər bir canlı adamda olur. Lakin mənim fikrimcə, "canlı insanı" göstərmək nəzəriyyəsinin tərəfdarları əsas bir cəhəti – qəhrəmanın xarakterindəki əzəli olan müsbət keyfiyyətləri ört-basdır etmək, bunu arxa plana çəkmək və insana xas olan zəifliklərin içərisində əritmək istəyirlər. Daha doğrusu, "canlı insanı" göstərmək nəzəriyyəsi ideyasız obyektivizm mövqeyinə yuvarlanır, həyatımızdakı müsbət cəhətləri nəzərə çatdırmalı, bu müsbət keyfiyyətlərin inkişafına və təntənəsinə kömək etməli olan sovet yazıçısının fəal rolunu inkar edir. Təkrar edirəm, bu heç də o demək deyildir ki, mən müsbət qəhrəmanın zəif cəhətlərini göstərməyin əleyhinəyəm: lakin sənət əsərlərində müsbət qəhrəmanın

xarakterindəki zəif cəhətlərin göstərilməsi nəyə xidmət etməlidir? Nizaminin "Xosrov və Şirin" poemasından Fərhad obrazını alaq. Fərhad – mənəvi cəhətdən bahadır qüdrətinə malik bir obrazdır. O, saf insan məhəbbəti naminə dağları yerindən tərpədir, qayaları yarır, qeyri-insani bir qüvvətlə çalışır. Lakin o, insanlara inanır, xain adamlar sevgilisinin öldüyünü və onun məhəbbəti naminə Fərhadın bütün qəhrəmanlıqlarının əbəs olduğunu söyləyərkən Fərhad buna da inanır. Şirinin ölümünə inanan Fərhad özünü məhv edir.

Əlbəttə, elə tənqidçilər də tapıla bilər ki, onlar Fərhadın bu inamını onun zəifliyi və hətta nöqsanı kimi qələmə verərlər. Lakin elə bu zəiflikdə də onun xarakterindəki müsbət cəhət özünü göstərir. Fərhad məhəbbətsiz yaşayıb yarada bilməz; onun üçün məhəbbət – idealdır, bütün həyatının mənasıdır. Bununla bərabər, namuslu bir adam olan Fərhad insanların bu cür vicdansızcasına yalan söyləyəcəyini təsəvvürünə belə gətirmir. Fərhadın bu inamı onun saf və təmiz xarakterindən doğur.

Başqa bir misal götürək.

Dezdemona öz sevimli Otellosuna deyə bilərdimi: "Cənab, siz hansı əsasa görə məni qısqanırsınız, mənim namusuma şübhə edir və beləliklə də mənim təmiz məhəbbətimi təhqir edirsiniz? İndi ki, mənə belə yanaşırsınız, mən də sizdən ayrılıb gedirəm öz atamın yanına..."?

Puşkin "Otello"nu "qısqanclıq faciəsi" deyil, "inam faciəsi" adlandırarkən haqlı idi. Yox, Otello öz inamında da güclüdür, o, insana səmimi surətdə və dərindən inanır, onu əhatə edən adamların arasında xain və yaramazların olması fikrini heç ağlına da gətirmir. Lakin onu əhatə edənlərin arasındakı yaramaz adamı tanıyanda ona layiqli və amansız bir cəza verir.

Bu iki misalla mən demək istəyirəm ki, müsbət qəhrəmanın xarakterindəki qüvvətli və zəif cəhətlər vahid bir ahəng yaratmalı, vahid bir istiqamətdə meydana çıxmalı, bütün sifətləri məhz onun müsbət təbiətinin hərtərəfli inkişafı kimi verilməlidir. Əks halda, biz müsbət obrazın təbiətinə xas olan bütövlüyü itirə bilərik. Həm də müsbət obrazın təbiətinə xas olan bu bütövlük işıqlı və qaranlıq cəhətlərin hərcmərcliyindən ibarət deyil, müxtəlif formalarda özünü büruzə verən vahid və tam xarakterdən ibarətdir.

Müsbət qəhrəman öz xarakterinin müəyyənləşməsində və inkişafında köhnəlik qalıqlarını aradan qaldırıb, yeni keyfiyyətlər qazanarkən təsvir edilə bilər. Lakin bütün bunlar gərək bədii ümumiləşdirmənin

əsas vəzifəsinə – bütöv və tipik xarakterlər və obrazlar yaratmaq vəzifəsinə tabe edilsin.

Ümumiləşdirilmiş xarakterlər və obrazlar yaratmaq, ictimai həyat hadisələrini və vəziyyətlərini göstərmək üçün epik poeziya sənətkara hədsiz imkanlar verir.

Dünya və klassik rus poeziyası həyatı realistcəsinə dərindən əks etdirməsi və öz təsvir gücü etibarilə böyük və gözəl epik əsərlər yaratdığı zamanda dekadent poeziya poema formasını tanımamış, həyatı geniş və hərtərəfli əhatə edən, onu inkişafda göstərən əsərlər yarada bilməmişdir.

Böyük inqilabi təbəddülat dövrü – xalq həyatında baş verən tarixi hadisələrin mənasını dərindən açıb göstərən böyük poetik lövhələrin yarandığı bir dövr olmalıdır. Hələ vaxtı ilə Belinski yazmışdı ki, "epos xalq həyatı hadisələrinin inikasıdır".

"İliada"dan və "Şahnamə"dən "İzmayıl bəy"ə və "Yevgeni Onegin"ə qədər, "Rusiyada kimin günü xoş keçir" əsərindən Mayakovskinin "Lenin" əsərinə qədər poema janrı inkişaf yolu keçmişdir və bu inkişafın hər bir pilləsində xalq həyatının hadisələri yeni tarixi məzmunun müəyyən etdiyi yeni formada təcəssüm etmişdir. Marks köhnə eposla yeni dövrün eposu arasındakı əsas fərqi xüsusi göstərmiş və keçmiş dövrlərə aid formalara qayıtmağın mümkün olmadığını da qeyd etmişdir. Yeni eposun cizgilərini biz sovet şairlərinin yaratmış olduqları poemalarda da görürük.

V.Mayakovski özünün inqilab ərəfəsində yaratmış olduğu "Hərb və sülh" poemasında bütün bəşəriyyəti sarsıtmış hadisələri təcəssüm etdirməyə, həmin hadisələrin bütün tarixi mənasını əhatə etməyə çalışmışdır. O, "Lenin" və "Yaxşı!" poemalarında bəşəriyyət tarixində yeni dövr açmış böyük tarixi hadisələrin geniş mənzərəsini yaratmışdır. Mayakovski həm epik obrazlarda, həm də onun təsvir etdiyi hadisələrin subyektiv inikasını verən lirik təsvirlərdə böyük və mürəkkəb bir məzmun açıb göstərir. Bu iki plan, bu iki xətt – epik və lirik xətt – Mayakovskinin poemasında üzvi surətdə bir-biri ilə bağlanmışdır. Bu əlaqəni şair özü də qeyd edərək demişdir ki:

Bu ya bizim ölkəyə,
əsgərlərə
üz vermiş,
Ya da mənim sinəmdə,
qəlbimdə qövr edirmiş.

Mayakovskinin əsərlərində şairin şəxsiyyəti birinci plana keçir. Elə bil ki, hər şeyin haqqında və hamının əvəzinə şair özü danışır. “Lenin” və “Yaxşı!” poemalarında sanki süjet xətti yoxdur. Əslində isə belə deyildir. Poemadakı hadisə və hərəkətin inkişafı tarixin öz hərəkəti ilə, inqilabın özünün qüdrətli addımları ilə birləşmişdir. Onun poemaları sanki zəmanə haqqında, tarix haqqında, bu gün və gələcək haqqında böyük epik monoloqdur; eyni zamanda burada epos lirikanın məftunedici, qüdrətli səsi ilə və hadisələrin dramatik təsvir forması ilə birləşmişdir.

Bununla birlikdə biz Mayakovskinin böyük zəmanəni təsvir edən poemalarında insan xarakterlərini, tiplərin geniş qalereyasını – həmin dövrdəki hadisələrin şahidi olan insanları tapa bilmərik. Bu isə qarşımızda duran vəzifəni bir daha bizə göstərir: yəni biz gərək Mayakovskinin böyük və canlı ədəbi irsini qiymətləndirməklə bərabər, eyni zamanda, yalnız onun yolu ilə məhdudlaşıb kifayətlənməyək, onun yaradıcılıq yolunu qanun şəklinə salmayaq, böyük inqilabi dövrün epik təsvrində başqa yollar da axtarıb tapaq.

Bizim sovet şairlərinin vəzifəsi yeni dünya uğrunda mübarizə aparan, qurub-yaradan sovet adamının obrazını yaratmaqdır. Bizim epik poeziyamızın artıq bu sahədə yaratmış olduğu diqqətəlayiq əsərlər az deyildir.

N.Aseyev “Semyon Proskakov” əsərində vətəndaş müharibəsi qəhrəmanının obrazını yaratmışdır. Həm də bu obrazda, demək olar ki, lap sənədlərə uyğun gələn tarixi bir düzgünlük böyük bir lirika ilə birləşmişdir. Eduard Baqritski “Opanas haqqında düşüncələr”də insan talelərinin və xarakterlərin kəskin toqquşmasını göstərərək, sosialist inqilabına sədaqət ideyasını romantik bir ehtirasla təsdiq etmişdir. Nikolay Dementyevin şeirlə yazmış olduğu “Ana” hekayəsindəki qəhrəmanların xarakterləri və münasibətləri psixoloji cəhətdən çox incə və aydın işlənmişdir.

Böyük Vətən müharibəsi illərində yeni epik əsərlər yaranmışdır. N.Tixonovun “Kirov bizimlədir” poemasında qəhrəman şəhərin monumental obrazı verilmişdir. P.Antokolskinin “Oğul” poemasında vətən uğrunda, haqq işimiz uğrunda mübarizə aparmış gənc nəslimizin obrazı böyük bir qüvvətlə verilmişdir. AKuleşov “Briqadanın bayrağı” poemasında xalqımızın işğalçılar əleyhinə mübarizəsini göstərən romantik səhnələr və obrazlar yaratmışdır. V.İnber “Pulkov meridianı” poema-

sında mühasirəyə alınmış Leninqradın vətənpərvər coşqunluğunu və qəhrəman mətinliyini tərənnüm etmişdir. Olqa Berqqolts da özünün “Fevral günləri”ni eyni mövzuya həsr etmişdir. Böyük Vətən müharibəsinə həsr olunmuş poemaların sırasına A.Malışkonun “Prometey” poemasını da daxil etmək lazımdır. Bu əsərdə şair bu gün bəşəriyyətin xoşbəxtliyi uğrunda mübarizə aparan müasir insanın xarakterini açıb göstərmək üçün qədim əfsanədən bacarıqla istifadə etmişdir.

Y.Dolmatovskinin böyük bir daxili coşqunluqla yazmış olduğu “İtkin düşmüşdür” adlı diqqətəlayiq poemasını da xatırlamaq lazımdır. Tilvitisin Litva xalqının sosializm şəraitindəki intibahını və inkişafını parlaq obrazlarda təsvir edən “Litva torpağında” adlı gözəl poemasını da qeyd etməliyik.

Bu poemalar, şübhəsiz ki, sovet adamının epik obrazını yaratmaq sahəsində poeziyamızın əldə etmiş olduğu nailiyyətlərdir. Məhz bu vəzifə, mənim fikrimcə, bizim poeziyamız üçün əsas və vacibdir. Müharibə dövründə yaranmış poemalarda təhkiyənin epik və lirik formaları üzvi bir vəhdətlə yaxından bağlanmış, şairin fərdi xüsusiyyətlərinə müvafiq olaraq təsvirin hərtərəfli və müxtəlif şəkillərində meydana çıxmışdır. Burada eposla lirika arasındakı fərq məsələsini qeyd etmək də yerində olardı. O zaman ki şair öz daxili aləmini, öz xarakterini, öz düşüncələrini, bir növ, öz qəlbini oxucunun qarşısında açıb göstərir, o zaman ki, şair onu bilavasitə həyəcanlandıran şeylərdən danışır, nə ilə yaşadığı və nə ilə nəfəs aldığından danışır – bu, lirikadır. O zaman ki, şair öz zəkasının bütün gücü, ehtirası və əqidəsi ilə xalq həyatının lövhələrini çəkir – bu, eposdur. Mən burada, həmin məsələni tamamilə əhatə edən dəqiq tərif vermirəm, mən burada epos və lirikada nəyin, mənim fikrimcə, başlıca olduğu haqqında danışmıram. Onu da qeyd etmək istəyirəm ki, bunların ikisi də – lirika və epos – bir araya sığa bilir, böyük epik lövhələrdə isə çox zaman bunlar ayrılmaz surətdə bir-biri ilə bağlı olur. Müharibə və müharibədən sonrakı illərdə bir sıra poemalar çap olunmuşdur ki, bunlarda xalq baş qəhrəman kimi göstərilmişdir. Məsələn, orijinal rus şairi A.Prokofyevin “Rusiya” adlı gözəl poeması, qazax şairi Tair Porokovun gənc sovet mühəndisinin obrazını müvəffəqiyyətlə göstərən “Axın” poeması, Berdı Kerbabayevin “Türkmən poeması”, M.Aligerin “Gözəl Meça”, M.Mirşəkərin “Qızıl qışlaq” və bir sıra başqa poemalar belə əsərlərdəndir.

Bəzi poemalarda, xüsusən müharibədən sonrakı illərdə yazılanlarda, lirik elementin epik elementlə üzvi surətdə bağlanması həmin əsərlərdə tələsikliyə, uzunçuluğa və hətta təsvirin tutqunluğuna gətirib çıxarmışdır. Məsələn, A.Yaşinin bütünlükdə pis əsər olmayan "Alyona Fomina" poemasında uzunçuluq və təsvirçilik vardır. Y.Dolmatovskinin Aşqabad zəlzələsinə həsr olunmuş poemasında dramatik süjet olmağına baxmayaraq, əsas konfliktin müəyyənliyi və xarakterlərin təsvirində aydınlıq çatışmır.

S.Podelkovun, V.Juravlyovun, S.Vasilyevin ayrı-ayrı məziyyətləri olan poemaları ən çox qafiyələnmiş oçerklərdir.

Lakin ayrı-ayrı müəlliflərin müvəffəqiyyətsizliyi bütünlükdə sovet poeziyasının epik yaradıcılıq sahəsindəki nailiyyətlərinin əhəmiyyətini azaltmır.

Bizim sovet poemasının gələcəyi, mənim fikrimcə, şairlərimizin bu sahədə etdikləri kəşflərin və klassik poeziyanın hələ kifayət qədər öyrənilib mənimsəmədiyimiz gözəl ənənələrinin inkişaf etdirilməsindən ibarət olacaqdır. Biz hələ sosializm realizmi metodunun bütün imkanlarından istifadə etmirik.

Lirik-epik poemalarla bir sırada tam süjetə, kəskin konfliktlərə, dolğun və aydın təsvir edilmiş insan xarakterlərinə malik olan epik-dramatik poemalar da geniş inkişaf etməlidir.

Poeziyamızda insan həyatının və insan münasibətlərinin geniş mənzərəsini verən mənzum romanlar lazımdır. Bu forma, bizim fikrimizcə, məsələn, Y.Kolasın "Yeni torpaq" və "Balıqçının daxması", Y.Uxsayın "Keçid" poemalarında və bir sıra başqa əsərlərdə müvəffəqiyyətlə tətbiq olunmuşdur.

Mənzum roman və böyük epik poemalar formasının bizim zəmanə üçün artıq köhnəliyini, bu formanın yalnız nəsrlə yazılan romanın hələ inkişaf etmədiyi və yaxud yenicə təşəkkül tapdığı dövrlər üçün qanuni olduğunu söyləmək yanlışdır. Məsələn, A.Fadeyev "Gənc qvardiya" romanını yazmışsa, bu o demək deyildir ki, həmin mövzuda mənzum roman yaradıla bilməz. Lirika ilə müqayisə olunsa, görərik ki, epik poeziya sənətkara həm hadisələri geniş surətdə əhatə etmək, ən müxtəlif xarakterlər yaratmaq, həm də lirik və fəlsəfi mühakimələri ifadə etmək üçün imkan verir. Epik poeziya şairin yaradıcılıq imkanlarının, həmçinin onun lirik istedadının bütünlüklə və hərtərəfli meydana çıxmasına xeyli kömək edir.

Bizim lirik poeziya güclü və rəngarəngdir. İnsan hisslərinin, düşüncələrinin, dərin ruhi və mənəvi halların ifadəsi lirik poeziyamızda əsas yeri tutur. şair öz yaradıcı sözü ilə həyatın mahiyyətinə nə qədər dərindən nüfuz edirsə, ətrafında baş verən hadisələri bir o qədər yaxından duyur, onun lirikası insanın arzu və istəklərini bir o qədər dolğun ifadə edir, onun şeri bir o qədər ictimai əhəmiyyət kəsb edir.

İdeya və emosional dolğunluq lirik poeziyanın mahiyyətini təşkil edir. Lirik poeziyanın zənginliyi və müxtəlifliyi şair qəlbinin çoxtərəfli və zəngin olmasından asılıdır. Puşkin yazmışdır: “Şairi, onun canlı və yaradıcı qəlbinin bütün vəziyyətlərində və dəyişmələrində, həm kədər, həm də nəşə içində, həm məftun olub göylərə yüksələrkən, həm də hissləri istirahət edərkən, həm Yuvenal qəzəbi ilə coşarkən, həm də onu darıxdıran qonşuya azacıq təəccüb edərkən görmək bizim üçün xoşdur...”

Müasir həyatımızın bütün kəskin məsələləri sovet şairi üçün şəxsi məsələdir və mövzuları, motivləri “şəxsi” və “ictimai” deyə iki yerə bölmək çox zaman süni bir işdir. Zəhmətkeşlərin beynəlmiləl qardaşlığı mövzusunun, müstəmləkəçilər və imperialistlər əleyhinə mübarizə mövzusunun, xalqlar dostluğu mövzusunun N.Tixonovun lirikasında nə qədər səmimi verildiyini, şairin bilavasitə özünə dəxli olan bir məsələ kimi ifadə edildiyini xatırlayaq; sosialist inqilabının nailiyyətlərini qəhrəmanlıqla müdafiə etmək mövzusu, sıravi döyüşçülərin dönməz möhkəmliyi və mərdliyi mövzusu A.Surkovun ən yaxşı lirik şeirlərində nə qədər kəskinliklə və həyəcanla inkişaf edir; M.Rılskinin vətənpərvər lirikasında nə qədər dərin bir düşüncə və səmimi bir pafos vardır; keçmişdə əzilən millətlərin indiki intibahı və onların sosialist mədəniyyətinin çiçəklənməsi haqqında Sayfi Kudaş, Aalı Tomobayev, Karlo Kaladze, Rəsul Həmzətov, Osman Sarıvəlli, Mustay Kərim, Uyğun, Gevork Emin və başqaları nə qədər təravətli, müxtəlif və rəngarəng əsərlər yazırlar; qadın şairlərimizdən O. Berqqolts, V.Tuşnova, L.Zabaşta, Zülfiyə, D.Vaarandi, S.Kaputikyan, M.Dilbazi və başqaları azad olmuş qadınlarımızın taleyini, sevgi, dostluq, səadət, analıq hissi kimi yüksək insani keyfiyyətləri nə qədər böyük bir ruh yüksəkliyi və əsil lirizm ilə tərənnüm edirlər!

Sovet lirikasının qarşısında heç bir sədd yoxdur. Bu lirika sovet həyəcanlandıran hər şeyə səs verir. Həm də lirik şerin müvəffəqiyyəti təkcə mövzudan yox, eyni zamanda mövzunun həllindən, mənalan-

dırılmasından asılıdır. Bizim sovet şairləri uzun zamandan bəri şairləri həyəcanlandırmış mövzuları yeni şəkildə izah edib mənalandıraraq, həm xalqlarımızın səadəti, həm də sevgililərin xoşbəxtliyi, vətənə məhəbbət, ana məhəbbəti haqqında, milyonların yaradıcılıq fəaliyyəti və sənətkarın özünün yaradıcılıq axtarışları haqqında əsərlər yazırlar.

Sovet məhəbbət lirikasının ən yaxşı cizgiləri – dekadent şikəstliyindən və meşşan xudpəsəndliyindən azad olan təmiz, nəcib və səmimi hisslərdədir.

Mixail İsakovskinin səmimi poeziyası sovet adamlarının xoşuna gəlmiş, ürəyinə yatmışdır. Onun bəzən zarafatyana yazılmış gah kədərli, gah nəşəli, gah həyəcanlı, gah da sakit bir səadətin ifadəsini verən şeirlərində məhəbbət hissinin nə qədər müxtəlif və rəngarəng cizgiləri vardır! M.İsakovskinin şeir və nəğmələrindəki qəhrəmanların sevgisinin özü də zəhmətkeş və vətənpərvər sovet vətəndaşlarının yüksək hissləri ilə nə qədər sıx bağlıdır!

Stepan Şipaçovun möhkəm, məişət bədbəxtliklərinə və imtahanlarına qarşı duran xoşbəxt məhəbbəti təsdiq edən şeirləri də oxucuların çoxunun xoşuna gəlmişdir. lakin arzu etmək lazımdır ki, S.Şipaçov gələcəkdə daha çox müxtəlif mövzulara əl atsın və öz poetik formalarını daha da zənginləşdirsin.

Xalqlar dostluğu ideyasını gözəl ifadə edən "Sən yetim deyilsən" şerinin müəllifi Qafur Qulamın lirikası böyük diqqətə layiqdir.

Konstantin Simonovun "Gözlə məni!" şeri milyonlarla adamı dərindən həyəcanlandırdı. Çox saf və dərin bir səmimiyyətlə aşılanmış olan bu şeir Böyük Vətən müharibəsi iştirakçılarının bir çoxunu düşündürən fikirlərə sanki bir cavab idi. K.Simonovun lirikası çoxtərəflidir, sovet adamlarının hisslərini geniş əhatə edir. Bir şair kimi K.Simonovun ləyaqəti bundadır ki, o, daima irəliyə doğru inkişaf edir, yaradıcılıq axtarışları aparır.

Bir çox səmimi, dərin lirik və əsil müasir, həyat sevgisi və nəşə hissi ilə dolu olan, poetik cəhətdən çox rəvan şeirlərin müəllifi Serger Smirnovun maraqlı və orijinal poeziyası da bizdə hələ az qiymətləndirilmişdir.

Lirika haqqında danışarkən İ.Utkinin, M.Svetlovun, V.Sayanovun, P.Şubinin, A.Nedoqonovun, Qasım Amancalovun, Əhməd Cəmilin və başqalarının yazmış olduqları bir çox müvəffəqiyyətli şeirləri də xatırlamamaq olmaz.

Belinski mahnını lirik poeziyanın ən yüksək forması hesab edirdi. Sovet mahnılarını həm ölkəmizdə, həm də xaricdə milyonlarla adam oxuyur. Mahnı bizim ölkədə poeziya ilə musiqi arasındakı yaradıcılıq birliyi və əməkdaşlığının ən gözəl ifadəsidir.

Qorki yazıçıların Birinci Ümumittifaq qurultayındakı son sözündə demişdir: "Əgər şairlər musiqiçilərlə birlikdə indiyə qədər dünyada olmayan, lakin olması lazım gələn yeni mahnılar yaratmağı təcrübə etsəydilər, bütün dünya onların səsinə çox yaxşı və minnətdarlıqla qulaq asardı".

Qorkinin bu vəsiyyətini yerinə yetirmək üçün Birinci və İkinci qurultaylar arasındakı müddətdə çox iş görülmüşdür. Əlbəttə, xalqın ümumi rəğbətini qazanmış mahnılar bundan əvvəl də yaradılmışdır. N.Aseyevin "Budyonnı marşı", A.Bezımenskinin "Gənc qvardiya", A.Jarovun "Tonqalların alovu ilə parlayın siz, gecələr" buna misal ola bilər. Lakin sovet mahnı poeziyasının əsil çiçəklənmə dövrü yalnız otuzuncu illərin axırlarında, 1940-cı il ərəfəsində başlanmışdır. Bu münasibətlə "Vətən haqqında mahnı" ("Genişdir mənim doğma vətənim..."), "Müqəddəs müharibə" və s. bu kimi bir sıra əla, yüksək vətənpərvər və dərin emosional mahnılar üçün mətn yazmış V.Lebedev-Kumaçı xatırlamaq lazımdır. M.İsakovskinin "Katyuşa" və bir sıra başqa mahnıları, V.Qusevin "Polyuşko-pole", A.Surkovun "Cəsurlar mahnısı", M.Svetlovun "Kaxovka haqqında mahnı", A.Safronovun "Bryanski meşəsi yaman səslənir", Y.Dolmatovskinin "Dnepr haqqında mahnı", L.Oşaninin "Dünya demokratik gənclərinin himni" və s. xalq arasında çox geniş yayılmışdır.

...Bununla belə, xalqımız haqlı olaraq mahnı sahəsində çalışan şairlərimizin qarşısında böyük tələblər qoyur. Müharibədən sonrakı illərdə hələ elə mahnılar yaradılmamışdır ki, onlar bizim həyatımızda hər gün baş verən qəhrəmanlıq hisslərinin hərarəti ilə birləşsin və yaxud, məsələn, "Katyuşa", "Polyuşko" mahnıları kimi xalq tərəfindən sevilsin. Bundan başqa, hələ axır zamanlarda lirik mahnı sahəsində bir növ şablonçuluq yaranmağa başlayır, bu mahnıların həm sözlərində, həm də musiqisində yeknəsəq notlar eşidilir, onlarda qızğın insan hissləri yüngül sentimental hisslərlə əvəz edilir.

Xalq sovet şairlərindən yeni-yeni yaxşı mahnılar gözləyir, belə mahnıları yaratmaq isə biz şairlərin hamısının vəzifəsidir.

Bu yaxın keçmişdə sovet lirikasının diapazonu bir qədər daralmağa başlamışdı. Şairlər sevgi haqqında, təbiət haqqında az yazırdılar. Çox ibrətlidir ki, mövzunun belə süni surətdə məhdudlaşdırılması, bir sıra mövzulardan imtina edilməsi ədəbiyyatımızda çox vacib mövzulardan biri olan zəhmət mövzusunun işlənilməsinə də öz təsirini göstərmişdir. Bəzi şairlər primitiv təsvirçilik yolu ilə getmişlər, onlar istehsalat terminlərini şerə salmağa, bədii dili texnisizm ilə doldurmağa başlamış və beləliklə də ən başlıca məsələdən – yeni dünya yaradan insanın canlı obrazından uzaqlaşmışlar. Lirikanın belə bəsitləşdirilməsi hətta şairlərimizin Volqa-Don, Kaxovka, Mingəçevir, Rustavi və sairə böyük tikintilər haqqında yazdıqları şeirlərə də keçmişdir.

Bəzən bizim lirikada ritorikaçılıq, soyuq mühakimə, ümumi nəzəri mülahizələr hiss olunur. Axı şair gərək öz düşüncələrini və fəlsəfi mühakimələrini poetikləşdirsin, gərək olanları bədii obrazların dili ilə ifadə etsin. Yalnız bu zaman şairin fikirləri bədii təsir gücünə malik ola bilər.

Vera İnber yazmışdır ki, oxuculardan hansı isə şairlərdən birini onda təqsirləndirmiş ki, bu şair həddindən çox düşünür. Vera İnber bundan belə bir nəticə çıxarıb istehsa ilə deyir ki, deməli, "düşünən" və "düşünməyən" şairlər vardır. Görünür, həmin oxucu burada məhz mücərrəd düşüncəli, həqiqi poetik fikirlə heç bir əlaqəsi olmayan soyuq mühakiməçiliyi nəzərdə tutmuşdur.

Çernışevski poetik fikrin mənasını, görün, necə dahiyanə izah etmişdir: "Poetik" əsərdə "fikir" nə deməkdir? Bunu qısa və sadə necə izah edəsən? Yəqin ki, müxtəlif adamların arasındakı söhbətdə olan fərqə hamı nəzər yetirmişdir. Bəzən elə adam olur ki, iki saat oturub onunla danışırsan və hiss edirsən ki, vaxtın hədər getməmişdir. Söhbət qurtarandan sonra hiss edirsən ki, ya təzə bir şey öyrənmisən, ya hər şeyə yeni və aydın bir nəzərlə baxmağa başlamısan, ya səndə yaxşı şeylərə qarşı rəğbət hissi artmışdır, ya da pis şeylərin səni təhqir etdiyini duymaqda daha həssas olmusan, ya da hər hansı bir məsələ haqqında fikirləşib düşünməyə özündə bir ehtiyac əmələ gəldiyini hiss edirsən. Bəzən isə elə bir adamla söhbət edirsən ki, axırda bu hisslərin heç birini keçirmirsən. Görürsən ki, bu adamla da iki saata qədər elə həmin predmetlər haqqında söhbət etmisən, amma bu adam tamamilə özgə biçimdə olduğuna görə hiss edirsən ki, onun danışığından heç nə götürməmisən, bir mətləb hasil olmayıb, sanki onunla söhbət eləməmisən, bir yerdə oturub havaya sabun köpüyü buraxmısınız, elə bil, aranızda

heç yerli-dibli danışıq olmayıb. Bunun nə üçün belə olduğunu izah etməyə ehtiyac varmı? Çünki, görünür, həmin iki müsahibdən biri ya çox savadlıdır, dünya görmüş adamdır, həm də gördüklərindən özü üçün bir nəticə çıxarıbdır, hər hansı bir məsələnin haqqında diqqətini toplayıb düşünməyi bacarır; o biri müsahib isə, necə deyərlər, "boş" adamdır. Danışan adamlar və onların söhbətləri iki yerə bölündüyü kimi, kitabların da beləcə iki yerə ayrıldığını başa düşmək üçün, yəni xüsusi izahat vermək, dəlil və sübutlar gətirməkmi lazımdır? Kitabların da bəziləri "boş", hələ bununla birlikdə, şişirdilmiş olur, bəziləri isə "dolu" olur və içi boş olmayan belə "dolu" kitablar haqqında deyirlər ki, onlarda "fikir" var. Bizə elə gəlir ki, boş adamlara gülmək mümkün olduğu kimi, yəqin boş kitablara da gülmək olar. Əgər biz "boş danışığa qulaq asmaq mənasızdır" deyiriksə, o halda haqqımız var deyək ki: "içi boş kitabları yazmaq və oxumaq da mənasızdır".

Bəzi şairlər belə hesab edirlər ki, günəşin çıxmağı və batmağı haqqında, sevginin müvəffəqiyyətləri və müvəffəqiyyətsizlikləri haqqında poeziyada böyük fikirləri və arzuları ifadə etməkdən xeyli asandır. Bizim poeziyaya şeirlə ifadə olunmuş yüksək ideyalar, fəlsəfi mühakimələrlə aşılanmış əsərlər lazımdır, bunsuz hər hansı bir böyük poeziyanın varlığını ümumiyyətlə təsəvvür etmək mümkün deyildir. Lakin bu o demək deyildir ki, günəşin batmağını və ya çıxmağını, gülü və bülbülü, yaxud qayın ağacını poetik surətdə tərənnüm yolu ilə böyük fikir və düşüncələri ifadə etmək olmaz.

Belinsksinin lirika haqqında yazdıqlarını xatırlayaq:

"Burada predmetin öz-özlüyündə elə bir qiyməti yoxdur... Məsələn, kitabın səhifələri arasından tapılan qurumuş bir çiçək nə böyük şeydir? Lakin həmin bu çiçək Puşkinə özünün ən yaxşı, ən təravətli, ən ahəngdar lirik əsərlərindən birini yaratmaq üçün imkan vermişdir".

Son illərdə lirik poeziyamızda bir qədər canlanma nəzərə çarpır. E.Mejelaytisin, M.Aligerin, A.Nedoqovun, R.Həmzətovun, S.Orlovun, L.Oşaninin, İ.Smuulun, G.Elininin, Zeynal Xəlilin və başqalarının ideya cəhətdən əhəmiyyətli, öz hisslərinin səmimiliyi ilə də oxucuların diqqətini cəlb edən şeirləri meydana çıxır. Lakin bu, ola bilsin ki, lirika sahəsində oxucularımızın gözlədiyi və şairlərin özlərinin də zəruri hesab etdikləri gələcək böyük yüksəlişin yalnız başlanğıcıdır.

Həyatımızın çoxtərəfli və rəngarəng olması lirik formaların da rəngarəngliyi üçün imkan yaradır, lirik şairdən obrazların müxtəlifliyini,

canlılığını və boyaların rəngarəng bolluğunu tələb edir. Sovet lirikası zəmanəmizin ən qabaqcıl ideyalarını təbliğ edərək vəhşi eqoizm əleyhinə, insanı, onun iradəsini və şəxsiyyətini zəiflədən və pozğunlaşdıran bədbinlik əleyhinə, insanı şikəst edən, fəaliyyətsizliyə çəkən hisslər əleyhinə mübarizə aparır.

Lirika öz nəğməsini oxuduqdan sonra o saat uçub gedən gəldi-gedər quşlara bənzəməməlidir... Lirik şer, mahnı insanın qəlbini dilə gətirməli, onun qəlbində yuva salmalı və zümrüd quşu kimi onu isindirməli, zəhmətdə, mübarizədə, kədərli və nəşəli dəqiqələrdə insana yoldaş olmalı, onda nəcib hisslər oyatmalı və beləliklə də insanı yüksəltməli, onu daha güclü, daha ağıllı və mənəvi cəhətdən zəngin etməlidir.

Bizim sovet adamlarının tələblərinə öz yaradıcılığı ilə cavab vermək üçün lirik şairdə, hər şeydən əvvəl, zəngin fikir və hiss olmalıdır. İdeyalılıqla emosional dolğunluğun vəhdəti bizim lirikaya qüvvət gətirir, onun əldə etdiyi və bundan sonra qazanacağı nailiyyətlərin, onun gözəl sabahının əsasını təşkil edir.

İstedadlı gənclərdən ibarət böyük bir dəstənin – Mejirov, Vinokurov, Noneşvili, Jimbiyev, Aqaşina, Qairbekov, Mozuryunas, Reymeris, Sokolov, Stavskaya, Mir Möhsün, Vahabzadə və başqa bu kimi gənc şairlərin bizim sıralarımıza gəlməsi poeziyamızın sabahının fərəhləndirici olacağını vəd edir.

Bununla əlaqədar olaraq, mən bir daha qeyd etmək istəyirəm ki, gənc poetik nəsil ümumiyyətlə poeziyamızın sabahkı günü deməkdir. Mən lirika ilə əlaqədar olaraq bu barədə danışsam da, aydındır ki, gənc şairlərin tərbiyəsi məsələsi bütün poeziyamız üçün, onun bütün növləri və janrları üçün əhəmiyyətlidir.

Yuxarıda adları çəkilən və başqa gənc şairlərin yazdıqları yaxşı şeirlər göstərir ki, bizim gənc şairlər istedadlıdır, xalqımızın rifahı naminə yazıb-yaratmaq əzmindədirlər. Gərək nəşriyyatlarımız və Yazıçılar İttifaqı Qorkinin etdiyi kimi, bu gənc nəslin tərbiyəsi ilə cəsarətlə məşğul olsun. Yazıçılar İttifaqının gənc şairlərlə məşğul olan komissiyasının işini yaxşılaşdırmaq lazımdır. Təəssüf ki, bizim yaşlı nəsildən olan məşhur şairlərimiz gənc şairlərə həmişə eyni dərəcədə həssaslıq və diqqətlə yanaşmırlar. Bu cəhətdən Qorkinin gənclərə münasibəti, onun gənclərlə böyük diqqət və səbrlə işləməsi bizim hamımıza nümunə olmalıdır. Lakin gənclərə qayğıkeşlik gərək ciddi tələbkarlıqla birləşsin. Bizim gənclərin bəziləri təkəbbür və lovğalıq xəstəliyinə tutul-

muşlar. İlk müvəffəqiyyət və tərifdən, dinləyicilərin ilk alqışlarından sonra onların başı gicəllənir və yazdıqları şeirlər üzərində ciddi işləməkdən əl çəkirlər. Bu isə belə bir xoşagəlməz nəticəyə gətirib çıxarır ki, gənclərin bəziləri heç hələ ədəbiyyata daxil olmağa macal tapmamış öz təqsirləri üzündən, ədəbiyyatın sıralarından çıxırlar.

Gənclərin tərbiyəsi məsələsi ilə əlaqədar olaraq onu da qeyd etmək istərdim ki, lirik şeir üzərində işləmək, zənnimcə, gənclər üçün yaxşı bir məktəbdir. Lirika sahəsində çalışmaqla, öz qəlbinə yaxın olan və dərindən duyduğu mövzular üzərində işləməklə gənc şair böyük ictimai mövzuları yaradıcılıqla həll etməyin geniş yoluna da asanlıqla çıxa bilər. Hər halda, bir çox böyük şairlərin yaradıcılıq bioqrafiyası belə müəyyənləşmişdir. Onlar lirikadan başlamış, lirik poeziyada bədii sənətkarlığı öyrənmiş və geniş poetik lövhələr yaratmaq üçün yaradıcılıq təcrübəsi toplamışlar.

Yoldaşlar! Şairin "özünü ifadə etməsi" problemi ətrafında son zamanlar mətbuatımızda böyük mübahisələr başlanmışdır. Mən şəxsən belə düşünürəm ki, bu mübahisələr məsələnin əsil mahiyyətindən çox terminlər üzərində gedir. Lakin demək lazımdır ki, məsələn, "özünü ifadə" nəzəriyyəsi, mümkündür ki, subyektiv idealizm fəlsəfəsi ilə bağlansın, bu halda, mən həmin nəzəriyyənin əleyhinəyəm. Marksist-leninçi idrak nəzəriyyəsi təsdiq edir ki, insan şüurunun bütün formaları, o cümlədən bədii forması da obyektiv varlığı əks etdirir. Qorxuram ki, "özünü ifadə" nəzəriyyəsinin bəzi tərəfdarları poeziyada obyektiv varlığın böyük aləmini şairin öz aləmi ilə əvəz etməyə gəlib çıxırlar. Halbuki məlumdur ki, şairin öz aləmi böyük və mürəkkəb obyektiv aləmin yalnız bir hissəsidir. Biz onun tərəfdarıyıq ki, şair obyektiv həyatın hadisələrini, obraz və xarakterlərini öz şair "mən"inin süzgəcindən keçirsin. Bunsuz heç bir poeziya heç bir incəsənət ola bilməzdi. Lakin bu o demək deyildir ki, şairin şəxsiyyəti, onun xarakteri, qəlbi, onun tərcümeyi-halı, hətta bunlar şairdə ən zəngin olduğu təqdirdə belə, milyonlarla adamların, ən dahi şairlərin iradəsindən asılı olmayaraq yaşayan və tarixi yaradanların xarakterini, obrazını, qəlbini və tərcümeyi-halını bütünlüklə əvəz edə bilər.

Biz bütün yaradıcılıq səyimizi real varlığı bütün rəngarəngliyi, mürəkkəbliyi və ziddiyyətləri ilə birlikdə, geniş poetik lövhələrdə inikas etdirməyə doğru yönəltməliyik. Biz hər bir poetik əsəri nəzərdən keçirərkən, əvvəla, ona diqqət etməliyik ki, görək, şair öz yaradıcılığında

məhz hansı idealları, fikirləri və düşüncələri, hiss və duyğuları ifadə edir, ikincisi, şair bizim həyatın, sovet adamının gözəlliyini nə dərəcədə və nə miqyasda əks etdirir, üçüncüsü, obyektiv varlıq nöqteyi-nəzərindən şair bizim həyatı nə dərəcədə düzgün ifadə və əks etdirir.

"Pervorossiysk" və "Sədaqət" kimi gözəl və cəsarətlə yazılmış əsərlərin müəllifi Olqa Berqqolts səhv olaraq təsdiq edirdi ki, dekadentlərin və simvolistlərin ifadə etməyə bir sözləri yox idi, onların şeirləri hər cür ideya və fikirdən məhrumdur. Bu, əlbəttə, düz deyildir. Əgər belə olsaydı, o zaman dekadentlərin və simvolistlərin heç bir təhlükəsi olmazdı. Xeyr, onlar nikbinlik əvəzinə bədbinliyi, böyük vətəndaşlıq məhəbbəti əvəzinə intim meşşan hisslərini, xalqın böyük gücünə inam hissi əvəzinə xalqa və insana etimadsızlığı, işıqlı və ağıllı gələcəyin qələbəsinə ümid əvəzinə yalqızlığı, ümidsizliyi ifadə edirdilər. Bütün bunların hamısı ilə onlar yeni insanı – inqilabi döyüşlərin qəhrəmanını kapitalizmin məhv edilməsi, sosializmin qurulması uğrundakı fəal mübarizədən ayırmaq, kənara çəkmək istəyirdilər. Bu, əlbəttə, o demək deyildir ki, biz obyektiv aləmi təsdiq edərək, böyük və ya kiçik şairlərin subyektiv aləmini inkar edirik, yaxud qiymətləndirmirik. Lakin obyektiv aləmin düzgün və geniş təsviri nöqteyi-nəzərindən şairin bu şəxsi aləmi necə olmalıdır? Bu münasibətlə mən Belinskinin sözlərini misal çəkmək istəyirəm: "Heç bir şair nə özündən və nə də öz vasitəsilə, nə öz şəxsi iztirablarının, nə də öz şəxsi səadətinin gücünə böyük ola bilməz: hər bir böyük şair ona görə böyükdür ki, onun iztirabları və səadəti cəmiyyətdə və tarixdə dərin kök salmışdır. Deməli, şair özü də cəmiyyətin, zəmanənin və bəşəriyyətin bir üzvü və nümayəndəsidir. Yalnız kiçik şairlər özlərindən və özlərinə görə həm xoşbəxt, həm də bədbəxtdirlər; lakin bunun əvəzinə onlar quşların nəğmələrinə bənzəyən mahnılarını yalnız özləri dinləyirlər, bu mahnıları nə cəmiyyət, nə də bəşəriyyət dinləmək istəmir".

Yoldaşlar! Poeziyamızın məsələlərindən danışarkən, satirik poeziyanı da unutmaq olmaz. Satiranın kəskin və uzaqvuran silahı xalq tərəfindən sevilir və bu silah bizim poetik cəbbəxanamızda mühüm yer tutmalıdır. Bizim satira klassiklərin yaradıcılıq irsinə arxalanır. Krılov, Qriboyedevə, Nekrasov, Şevçenko, Sabir, Abay və Abdulla Tukay kimi şairlərin satirik əsərlərinin əsasını vətənə və xalqa məhəbbət, zülmə və rəzalətə nifrət hissi təşkil edir. Bu böyük ənənələrin yaradıcılıq yolu ilə mənimsənilməsi məsul və mürəkkəb satira janrında yazmağa

girişmiş müasir şairlər üçün də çox səmərəli ola bilər. Lakin sovet dövründə satira yazan müəllifin vəzifələri keçmiş satiriklərin vəzifələrinə görə başqadır. Qüsur və şər bizim cəmiyyyətdəki hakim münasibətləri ifadə etmir. Bizim satiranın vəzifəsi o deyildir ki, dövlətin əsaslarını laxlatsın, əksinə, satiramız gərək dövlətimizin əsaslarını möhkəmləndirsin, bizə düşmən olan köhnə və çürük hər nə varsa onların hamısını heç cür pərdələnməyə qoymasın və çəkib xalqın məhkəməsinə gətirsin. Bizdə satira yazan sənətkarları partiya, xalq və dövlət müdafiə edir. Bizim müasir satiranın həyatı təsdiqedici xüsusiyyəti və nikbinliyi də buradan doğur.

"Zir-zibil haqqında", "İclasbazlar" şerinin, "Komsomolskaya pravda"da çap olunmuş gözəl şeirlərin, teatrlarımızın getdikcə daha cəsarətlə müraciət etdikləri "Taxtabiti" və "Hamam" kimi pyeslərin müəllifi Mayakovskinin kəskin satirası – şən bir qəhqəhə, qalibiyyətdən doğan bir gülüşdür. Mayakovskinin, D.Bednının, S.Marşakın və bir çox başqa sovet şairlərinin yaradıcılığı öz işinin məqsədini bütünlüklə başa düşərək, cəsarətlə və inamla satira silahına müraciət edən yazıçının necə müvəffəqiyyətlər qazana biləcəyini göstərən canlı sübutdur.

Poetik satira sahəsində müvəffəqiyyətlərimiz varmı?

Bizdə S.Marşakın ehtiraslı və kəskin satirik şeirləri, habelə karikaturalar üçün yazdığı satirik sözləri vardır. Şeirlə yazılmış "Güllə" adlı məşhur satirik pyesin müəllifi A.Bezımenskinin satirik şeirləri və epiqramları bu yaxınlarda irihəcmli bir kitabda toplanıb ayrıca nəşr edilmişdir. Bizdə ədəbi parodiya və epiqramın ən yaxşı ustalarından biri S Vasilyevdir. Köhnə təmsil janrında S.Mixalkov böyük müvəffəqiyyətlə çıxış edir, şair S.Oleynik də bu sahədə səmərəli çalışır. Onda xalq yumoru hissi, canlı bir məzah, kəskin süjetlər tapmaq və öz qəhrəmanlarını çox dəqiq səciyyələndirmək bacarığı vardır.

M.Bajan, N.Tixonov, A.Surkov, K.Surkov, M.Tursunzadə, T.Tilvitis, S.Rüstəm, S.Çikovani kimi şairlər də satira janrında müvəffəqiyyətli əsərlər yazırlar, lakin, təəssüf ki, bu şairlər satira sahəsində nadir hallarda çıxış edirlər.

Bütünlükdə satirik poeziyamızın vəziyyəti bizi təmin etmir. Günün zəruri mövzularında yazılmış bir çox satirik əsərlər bəzən qafiyələnmiş qəzet məqalələrini xatırladır. Satiramızda genişliyin olmaması daha çox nəzərə çarpır. Məsələn, V.Dıxoviçni və M.Slobodski tərəfindən yazılmış və Amerika işğalçıları əleyhinə mübarizəyə həsr olunmuş

“Mənsiz” adlı şeir silsiləsini götürək. Həmin silsilə lap bu yaxınlarda çap olunubdur, amma indi adama köhnəlmiş kimi görünür. Niyə belə olmuşdur? Səbəbi odur ki, şairlər həmin şeirlərdə satirik tipikləşdirməyə cəhd etməmişlər, öz əsərləri üzərində kifayət qədər diqqətlə işləməmişlər.

S.Mixalkovun bəzi son şeirlərində də tələsikliyin təsiri özünü göstərir.

Satira yazanlarımızın çoxunda ifşa etmək pafosu zəifdir. Misal üçün təmsilləri götürək. Son zamanlarda təmsil çox çap olunur. Onların arasında kəskinliyə və məqsəd aydınlığına malik olan müvəffəqiyyətli təmsillər də vardır, lakin çoxu sönük və dişsizdir. Gərək Belinskinin dediyi kimi, təmsil – surətlərə və xarakterlərə malik kiçik povest, dram əsəri olsun. Təmsildə ötkəm siyasi ümumiləşdirmələr, dəqiq zərbələr olsun, hər şey sadə alleqoriyaya çevrilməsin.

Bunu da normal vəziyyət hesab etmək olmaz ki, bir çox milli respublikalarda şairlər satira janrı sahəsində işləmirlər. Məsələn, Gürcüstanda, Qazaxıstanda, Azərbaycanda, Qırğızıstanda yazılmış maraqlı satira əsərlərinin adını çəkmək çətindir. Biz satira silahımızı sənətkarlarımızın özlərinə layiq böyük hədəf və məqsədlərə tərəf yönəltməliyik. Məsələn, adamlardan hətta azad düşünmək ixtiyarını da almağa cəhd edən məmurların, feodalların özbaşınalığını və zülmünü, görün, Sabir necə ifşa etmişdir:

– Görmə! – baş üstə, yumaram gözlərim.
– Dinmə! – mütiəm, kəsərəm sözlərim.
– Bir söz eşitmə! – qulağım bağlaram.
– Gülmə! – Pəki, şamü-səhər ağlaram.

Məgər bizdə belə ürəksiz vəzifəpərəst adamlar olmurmu ki, cürətli və yeni fikirlərdən oddan qorxan kimi qorxurlar, hər adamı onların qərarı ilə, istədikləri kimi işləyən və yalnız onların iradəsinə tabe olan kar, lal, kor bir alətə çevirməyə çalışırlar. Biz belə əyanları kəskin ifşa etməliyik, onların vəhşi alətləri sosialist adamının adətlərinə, bizim ictimai quruluşumuzun demokratizminə kökündən ziddir.

Mənə elə gəlir ki, bizim müasir siyasi satiramızda məhz belə kəskinlik və əhatəlilik çatışmır. Təsadüfi deyil ki, bizim dövrümüzdə satirik poemalar yaranmamışdır və şeirlə yazılmış komediyalar çox azdır. Partiya göstərəndə ki, bizə müasir qoqollar, şedrinlər lazımdır; bu o

deməkdir ki, biz ciddi əhəmiyyəti olan satirik əsərlər yaratmalıyıq. Dünya ədəbiyyatında belə əsərlər vardır. Qriboyedovun "Ağıldan bəla", "Şevçenkonun "Yuxu", Heynenin "Almaniya" və Nekrasovun "Müasirlərim" əsərlərini yada salmaq kifayətdir.

Poeziyamızda hələ süründürməçiliyi, mənsəbpərəstliyi, xudpəsəndliyi, qorxaqlığı, meşşanlığı ifşa edən parlaq satirik tiplər yoxdur. Bununla əlaqədar olaraq, yazıçıların Birinci qurultayının tribunasından Qorkinin dediyi bu gözəl sözləri yada salmaq lazımdır:

"Meşşanlıq haqqında biz çox yazmışıq və yazırıq, lakin meşşanlığın bir surətdə, bir obrazda təcəssümü hələ verilməmişdir. Halbuki meşşanlığı da məhz bir surətdə və özü də Faust, Hamlet və başqa dünyəvi tiplərdə edildiyi kimi qabarıq əks etdirmək zəruridir". (*Alqışlar*)

Jdanov yoldaş sovet yazıçılarının Birinci qurultayında demişdir: "Bizim hər iki ayağı ilə materialist əsas üzərində möhkəm dayanmış ədəbiyyatımıza romantika, yeni tipli, inqilabi romantika yad ola bilməz. Biz deyirik ki, sosialist realizmi sovet bədii ədəbiyyatının və ədəbi tənqidinin əsas metodudur, bu isə onu nəzərdə tutur ki, inqilabi romantizm gərək ədəbi yaradıcılığa onun bir tərkib hissəsi kimi daxil olsun, çünki partiyamızın bütün həyatı, fəhlə sinfinin bütün həyatı və mübarizəsi ən sərt, ən ayıq əməli işin böyük qəhrəmanlıqla və nəhəng perspektivlərlə birləşməsindən ibarətdir".

Buradan belə bir nəticə çıxır ki, sosialist realizmi metodu ilə işləyən şair həyatımızın həqiqətini göstərərkən, onun böyük qəhrəmanlıqlarını və böyük gələcəyi göstərməyə bilməz, çünki həyatımızın bütün genişliyini, gələcəyə doğru istiqamətlənən həyat həqiqətimizi bunlarsız təsəvvür etmək olmaz.

Göründüyü kimi, inqilabi romantika bizim bütün poeziyamızın təbiətinə xas olan bir cəhətdir. Lakin bu, poeziyamızda xüsusi romantik formanın ola biləcəyini və olması lazım gəldiyini qətiyyən aradan qaldırmır. Axı sosializm realizminin böyüklüyü və zənginliyi elə ondadır ki, bizim yaradıcılıq imkanlarımızın hərtərəfli və bütün genişliyi ilə meydana çıxması üçün bünövrə yaradır, ədəbiyyatımızda müxtəlif formaların, üslub və meyllərin, o cümlədən romantik formanın da olmasını nəzərdə tutur.

Buna görə də, mənim fikrimcə, poeziyamızda romantik üslub haqqında ciddi söhbət açmağın vaxtı çatmışdır. Bununla bərabər, bizdə elə yoldaşlar vardır ki, hətta "romantika" sözünün özündən də, nə isə,

bir qədər qorxurlar. Onlara elə gəlir ki, romantika haqqındakı söhbət bizi, nə isə, başqa bir aləmə, göylərə çəkib apara bilər və ədəbiyyatdakı realist mövqedən ayırar.

Klassik rus poeziyasının bütün tarixi belə şübhələri bütünlüklə rədd edir. Biz bilirik ki, Puşkin "Tunc atlı" kimi sırf romantik bir poemada I Pyotrun parlaq realist obrazını yaratmışdır. Öz qəhrəmanının ideallarını və arzularını dəbdəbəli-romantik boyalarla tərənnüm edən şair o zaman adamların içində yaşayıb mübarizə apardıqları tarixi hadisələrin də düzgün təsvirini vermişdir. Lermontov özünün "Mtsıri", "Qafqaz əsiri", "İsmayıl bəy" kimi romantik poemalarında parlaq realist xarakterlər yaratmış, böyük insani ehtirasları açıb göstərmiş, tarixi hadisələri, müxtəlif xalqların məişətini və milli ənənələrini doğru təsvir etmişdir. Əgər biz uzaq keçmişdəki sələflərimizin yaradıcılığına müraciət etsək, yenə də görərik ki, poeziyada romantik forma həyat həqiqətini və insanı realistcəsinə göstərməyin xüsusi bir forması olmuşdur.

Nizaminin "Leyli və Məcnun", "Xosrov və Şirin" yaxud Rustavelinin "Pələng dərisi geymiş pəhləvan" kimi dahiyanə poemalarını alaq. Bu poemaların romantik forması sayəsində və insanın nəcib, humanist niyyətlərinə həmin poemalarda bəzən bizə lap fantastik və "fövqəlbəşər" görünəcək dərəcədə romantik bir vüsət verildiyi üçün onların qəhrəmanlarının obrazları parlaq həyat həqiqəti ilə aşılanmış, xüsusi bir mənəvi gözəllik və qüvvə kəsb etmişlər.

Firdovsi, Nizami, Rustaveli, Nəvai kimi sələflərimizin yaradıcılığında onların öz zəmanələrinə görə yeni realist başlanğıc olduğunu görməyən vulqar ədəbiyyatçılar kökündən yanılırlar. Məhz onlar, saray şairlərinin əksinə olaraq, əsil xəlqi və həqiqi poeziya yaratmışlar. Əgər saray şairləri ən çox hakimlərə qəsidə yazıb, işğalçıları və xalq azadlığını boğanları tərif etmişlərsə, mənim yuxarıda göstərdiyim şairlər ədəbiyyata şəhər kustarlarının, sənətkarların, kəndlilərin və kəndli qadınların, şairlərin və bəstəkarların, müdrik alimlərin və qulların, xalq qəhrəmanları və bahadırlarının obrazlarından ibarət tam bir qalereya gətirmişlər. Həm də bu obrazların hamısı böyük bir məhəbbətlə tərənnüm olunmuşdur.

Özü də bu qəhrəmanların iradəsi və humanizmi, qəhrəmanlığı və insanlığı, müdrikliyi və mənəvi qüvvəti özgə torpaqlarını işğal edən, xalqlara zülm edən şahların və sultanların kütbeyinliyinə, məhdudluğuna, rəhmsizliyinə, mənəvi yoxsulluğuna qarşı qoyulmuşdur.

Əgər bizim uzaq keçmişdə yaşamış sələflərimizin yaratdıqları əsərlər tarixin, əsrlərin imtahanından çıxa bilmişsə, bunu, hər şeydən əvvəl, və başlıca olaraq, onunla izah etmək lazımdır ki, onların əsərlərində böyük həyat həqiqəti dahiyanə tərənnüm edilmişdir.

Əlbəttə, həmin klassiklərin realizmi ilə yeni realizm arasında bərabərlik işarəsi qoymaq və onları eyniləşdirmək heç kimin ağlına da gəlməz. Aydındır ki, bizim uzaq və yaxın keçmişdə yaşamış sələflərimizin realist və romantik ənənələrə tarixin müəyyən dövründə təşəkkül etmiş və mexaniki surətdə bizim dövrümüzə köçürülməsi mümkün olmayan ənənələr kimi baxmaq lazımdır.

Burada yeri gəlmişkən, onu da qeyd etmək lazımdır ki, böyük klassiklərdən öyrənmək kimi mühüm məsələdən danışarkən, biz adətən, realist ənənələri nəzərdə tutur və dünya poeziyasının əsrlər boyu yaranıb toplanmış gözəl və böyük romantik ənənələrini isə, bir qayda olaraq, unuduruq.

Keçmiş klassik irsə belə birtərəfli münasibətə son qoymağın da vaxtı gəlib çıxmışdır.

Şərtləşək ki, romantikanı müdafiə edərkən, mən həyatımızın ən çox qəhrəmanlıq və inqilabi təzahürlərinin realistcəsinə göstərilməsini, bizim həyat həqiqətimizin realistcəsinə göstərilməsini müdafiə edirəm.

Bizim şairlər həyatı parlaq, yüksək və dəbdəbəli romantik boyalarla tərənnüm edəndə həyatdan uzaqlaşmırlar. Bizim romantikamızın yüksək vəzifəsi haqqında A.M.Qorki dahiyanə demişdir: "Əgər hər hansı bir ədəbiyyatçı... həyatdakı gözəlliyi daha tez görməyə öz ehtiraslı arzusunu bildirmək üçün varlığa daha parlaq boyalar vurursa, bu, tamamilə təbiidir".

Bizim poeziyamızda romantik əsərlər vardırmı? Bəli, vardır. Vladimir Mayakovskinin şeirləri və poemaları, xüsusən "Bu haqda" və "Var səsimlə", Eduard Baqritskinin ən yaxşı əsərləri, xüsusən "Pioner qızın ölümü", Nikolay Tixonovun ilk balladaları və "Kirov bizimlədir" əsəri, A.Tvardovskinin "Vasili Tyorkin" poemasındakı "Ölüm və döyüşçü" fəsli, Pavel Antokolskinin öz dramatizmi və yüksək üslubu ilə qüvvətli olan "Oğul" poeması, Arkadi Kuleşovun "Briqadanın bayrağı" və "Sinclər", Semyon Kirsanovun "Aleksandr Matrosov" poeması, Nikolay Qribaçovun "Pobeda"da bahar", Maksim Rılskinin, Andrey Malışkonun bir sıra poemaları, Olqa Berqqoltsun "Pervorossiysk" poeması, G.Leonidzenin "Portoxala" poeması, A.Masaşvilinin romantik şeirləri

və poemaları və bir çox başqa əsərlər göstərir ki, bizim poeziyamızda həyatın realist təsviri ilə yaxından bağlanmış və çox aydın ifadə edilmiş inqilabi-romantik poeziya forması vardır.

Əlbəttə, bu əsərlərin hamısından müxtəlif səslər eşidilir, onların hər birində ayrı-ayrı şairlərin özünə məxsus fərdiyyəti, xüsusiyyətləri görünür. Bundan məlum olur ki, romantika haqqında söhbət açarkən biz romantik əsərlər yazan şairlərin hamısı üçün əvvəlcədən müəyyən olunmuş standart formalar təklif etmirik. Lakin bununla birlikdə, romantik əsərləri başqa üslubda yazılmış əsərlərdən fərqləndirən ümumi cəhətlər də vardır.

Birincisi, şair öz əsərinin əsasına real hadisələri, real insan xarakterlərini və obrazlarını qoyur və onları yüksək bir tonda, ən çox parlaq boyalarla tərənnüm edir. Bir sıra romantik əsərlərdə qəhrəmanların keçdiyi həyat yolunun geniş təsviri verilmirsə də, bu, şairin insan xarakterləri yaratmasına və böyük ehtirasları göstərməsinə mane olmur.

İkincisi, romantik şair həyatdakı müsbət keyfiyyətləri şüurlu surətdə kəskinləşdirir, çox zaman "qeyri-adi", bəzən də lap müstəsna xarakterlər, hadisə və faktlar seçir; o, gələcəyi daha tez görməyə, sabaha daha tez qovuşmağa can atır. Bizim bütün ədəbiyyatımız üçün səciyyəvi olan bu xüsusiyyət romantik şairin qələmində özünün daha parlaq və emosional ifadəsini tapır. Mayakovskinin "Bu haqda" poemasının dahiyanə yazılmış finalını, gələcəyin adamları ilə, yəni elə bizimlə öz səmimiliyi və lirik qüvvəsi ilə sarsıdıcı təsir qüvvəsinə malik söhbətini xatırlayaq:

İstərəm günlərimiz
Kədər, dua içində
Qocaltmasın heç kəsi,
İstərəm ki, bir dəfə
Yoldaş deyib çağırsaq
Çevrilsin yer kürəsi.

Bəzən yoldaşlar deyirlər ki, bizim həyatımız o qədər gözəl və adamlarımız da o qədər yaxşıdırlar ki, bunların poetik idealizəyə ehtiyacları yoxdur. Bu, doğru deyildir. Bizim həyatımız və adamlarımız doğrudan da gözəldir – bu mübahisəsizdir, lakin insan adına layiq olan adam, xüsusən sosialist cəmiyyətinin adamı onunla böyükdür ki, onun idealları və irəliyə doğru arzusu, onun parlaq xəyalları və fantaziyası həmişə onun öz real mövcudiyyətini qabaqlayır. Böyük, işıqlı və gözəl

olan hər şeyə daim meyl göstərmək bütün bəşəriyyətə aid olan böyük bir xüsusiyyətdir.

Buna görə də biz gərək adamların xarakterlərindəki, onların arzu və meyllərindəki müsbət cəhətləri qabarıq surətdə göstərməkdən qorxmayaraq və beləliklə də bizim həyatın inqilabi inkişafına təsir edək, həyatımızın bəşər fikrinin və mədəniyyətinin zirvələrinə doğru hərəkətini göstərək.

Üçüncüsü, romantik şair fəal surətdə öz müsbət yaxud ideal qəhrəmanının fikirlərinə və qəlbinə, onun mənəvi aləminə qarışır. O bu qəhrəmanın vasitəsilə öz xüsusi ideallarını, özünün tarixə və gələcəyə olan baxışını tərənnüm edir.

Biz dünya poeziyasında heç bir elə müsbət qəhrəman təsəvvür edə bilmərik ki, bu və ya digər dərəcədə həmin qəhrəmanı yaradan adamın – şairin özünün ən yaxşı ideallarını və baxışlarını ifadə etməsin; lakin bu xüsusiyyətlər ən çox romantik şairlərin yaradıcılığı üçün xarakterdir.

Biz yüksək ideyalar, parlaq və şirin xəyallarla gözəlləşmiş böyük realizm naminə poeziyamızda gözəl romantik elementləri mümkün qədər genişləndirməli və müdafiə etməliyik. Belinski yazmışdır: "Romantizmin mahiyyəti zahiri formanın özbaşına təzahürlərində deyil, onun ideyasındadır.

Romantizm ancaq incəsənətdə, təkcə poeziyada özünü göstərmir; onun da mənbəyi incəsənət və poeziyanın mənbəyi kimi həyatdadır. İnsan haradadırsa, həyat da oradadır, insan isə haradadırsa, orada romantizm də vardır. Romantizmin ən əsas mənası insan qəlbinin daxili aləmindən, insan qəlbinin ən gizli həyatından başqa bir şey deyildir. Romantizmin əsrarlı mənbəyi insanın köksündə və qəlbindədir...".

İnqilabi romantizm realizmdə məişətçiliyə, naturalizmə, realizmin vəziyyətini aşağı salan, onu güclü sıçrayışlardan məhrum edən cəhətlərə gedib çıxmaqdan qoruyan ən əsas vasitələrdən biridir.

A.M.Qorki demişdir: "Bizim incəsənətimiz varlıqdan yüksəkdə dayanmalı və insanı da varlıqdan ayırmayaraq ondan yüksəyə qaldırmalıdır. Bu, romantizmi təbliğ etməkdirmi? Bəli, əgər ictimai qəhrəmanlıq, əgər yeni həyat şəraitinin doğurduğu mədəni-inqilabi yaradıcılıq coşqunluğu bizdə təzahür etdiyi formalarda meydana çıxırsa, – o, romantizm adlandırıla bilər".

Biz öz poeziyamızda məhz belə romantizm uğrunda mübarizə aparmalıyıq. Mənim dediklərim bütün şairlər üçün zəruri deyildir, bu o

şairlər üçün zəruridir ki, onların yaradıcılıq təbiətində romantik element vardır, – bu qiymətli elementi hər vasitə ilə inkişaf etdirmək lazımdır.

Qeyd edim ki, mənim yuxarıda misal çəkdiyim romantik əsərlər, zənnimcə, poeziyamızın böyük romantik baharının ilk qaranquşlarıdır.

Bunu da qeyd edək ki, romantika sahəsindəki yaradıcılıq axtarışları həmişə müvəffəqiyyətlə nəticələnmir, bu sahədə bəzən müvəffəqiyyətsizlik də olur. Mən burada eyni bir şairin – Semyon Kirsanovun iki romantik poemasını – "Aleksandr Matrosov" və "Vətən göyləri" əsərlərini misal çəkəcəyəm. Birinci poemada müəllif yüksək romantik formada Matrosovun insanı həyəcanlandıran obrazını yaratmağa müvəffəq olmuşdur. Mənim fikrimcə, şair burada Matrosovun xarakterindəki qəhrəmanlıq rüşeymini, yer üzərində gözəl bir həyatın yaranması naminə fədakarlıqla ölməsini qüvvətli tərənnüm etmişdir. Bu əsərdə qəhrəman fəxr ilə, öz igidliyinin dərin mənasını anlayaraq deyir ki:

Razı qalmayımmı mən öz taleyimdən belə,
Bir anda yoxlayır o, bütün ömrümü mənim?
Qalxan olmaq istərdim mən bu xalqa, bu elə,
İndi budur, ona bax, qalxan olmuş bədənim.

Təəssüf ki, həmin bu poemada çox ifadəli və pafosla dolu bəndlər, nədənsə, yüngül yumoristik formada yazılmış müvəffəqiyyətsiz parçalar arasında verilmişdir. Bu isə obrazın təəccüblü surətdə ikitərəfli bir şəklə düşməsinə gətirib çıxartmışdır.

"Vətən göyləri" poemasında qəhrəman göydə, buludlar arasında, planetlər aləmindədir. Burada qəhrəmanın əvəzinə buludlar və planetlər, dumanlar və yağışlar, hətta təyyarələrin motorları patetik surətdə mühakimə yürüdürlər. Müəllif burada öz qəhrəmanını həqiqətən yüksəltməyə müvəffəq olmamışdır, çünki insan yalnız öz insanlığı daxilində yüksələ bilər və heç bir quş dili, hətta lap qartal danışığı da canlı insan nitqini əvəz edə bilməz, onun gözəlliyini və qüvvəsini ifadə edə bilməz.

M.Tursunzadənin "Hindistan balladası" poeziyamızın əhəmiyyətli əsərlərindəndir. Şair Hindistan xalqının vəziyyətini qüvvətli romantik boyalarla, böyük həyəcan və rəğbət hissilə təsvir edir, müstəmləkəçilərin törətdikləri cinayətləri damğalayır. Bütün bunlar İngiltərə – Amerika imperializminin özbaşınalığı əleyhinə oxucuda qəzəb hissi oyadır.

Eyni zamanda poemada, mənim fikrimcə, hind xalqının şüurunda və həyatındakı zəruri fəal başlanğıc – xalqın öz azadlığı və istiqlaliyyəti

uğrunda bir çox illər apardığı qəhrəman mübarizəsi nəzərdən qaçırılmışdır.

Müstəmləkəçilərin Hindistanda yaratmış olduqları zülmət səltənətini təsvir etməklə bərabər, şair hind xalqının öz istiqlaliyyəti uğrundakı mübarizəsini də göstərməli, bu xalqın qara qüvvələr, imperializm qüvvələri üzərindəki qələbəsinin doğmaqda olan günəşini göstərməli idi.

Mən romantik poeziya haqqında bu dediklərimə ideal qəhrəman haqqında da bir neçə kəlmə əlavə etmək istəyirəm. Son zamanlarda bu məsələnin ətrafında qızğın mübahisələr törəmişdir. Bizə ideal qəhrəman lazımdır ya yox?

Mənim fikrimcə, özü də mən bunu inamla deyirəm, ideal qəhrəman bizə lazımdır. Şübhəsiz ki, bütün müsbət qəhrəmanların hamısı ideal qəhrəman ola bilməz və olmamalıdır, çünki ideal qəhrəman, mənim fikrimcə, ən yüksək insani, mənəvi keyfiyyətləri özündə təcəssüm etdirən müsbət qəhrəmanın sintetik obrazıdır. İdeal qəhrəman ədəbiyyatda nadir hadisə ola bilər, çünki ideal qəhrəman bütün bir nəslin və ya tam bir dövrün ən yüksək ideya – əxlaqi keyfiyyətlərini, insanda olan ən yüksək və humanist sifətləri özündə təcəssüm etdirir.

Elə zənn etməyin ki, mən burada yalnız seçilmiş adamları, yaxud böyük şəxsiyyətləri nəzərdə tuturam. Bir halda ki, sosialist realizmi ədəbiyyatının əsas müsbət qəhrəmanı zəhmətkeş xalqdır, milyonlarla sadə adamlardır, o zaman təbiidir ki, ideal qəhrəmanın obrazında da biz öz simasında zəhmətkeş xalqı təcəssüm etdirən sıravi sovet adamının böyük və parlaq həyatını təsvir etməliyik. Bizim yaxın və uzaq sələflərimiz bunu etməyi bacarırdılar. Bunu Nikolay Ostrovski də bacarırdı.

Bəzi yoldaşlar Pavel Korçaginin obrazını ideal hesab etmirlər, ona görə ki, Korçaginin həyatında elə an olmuşdur ki, o özünü öldürmək istəmişdir. Mən, bu fikirdə olan yoldaşlarla şərik deyiləm. Bu fikirdə olan yoldaşlar unudurlar ki, Pavel Korçagin, ən nəhayət, həyat naminə ölümə qalib gəldi, bizim nəslin fəxri və şöhrəti oldu.

Ədəbiyyatda ideal qəhrəmanın əleyhdarları hücuma keçməzdən əvvəl bu qəhrəmanı şüurlu surətdə tərksilah edirlər ki, sonra ona silahsız qalib gəlmək asan olsun. Onlar təsdiq edirlər ki, ideal qəhrəman bizim hamımızın adət edib tanıdığımız real adam deyil, o bizim bildiyimiz yeyən, içən, yaşayan, mübarizə aparan, kədərlənən sevinən, həyatında eniş və yoxuşlar olan, həyatda təkmilləşmə prosesindən keçən, çətinliklərlə qarşılaşan adam deyildir. Əlbəttə, əgər ideal qəhrəmanın

obrazını belə vulqar şəkildə izah etsək, daha doğrusu, qabaqcadan bilə-bilə bu obrazı hər bir canlı insana xas olan bütün real keyfiyyətlərdən məhrum etsək, o zaman ideal qəhrəman doğrudan da "müqəddəs təsvirə", cansız sxemə, həyatda lazım və mümkün olmayan kölgəyə çevrilər.

İdeal qəhrəmana, məsələn, K.M.Simonov belə yanaşır və ideal qəhrəmanın obrazını şirniyyat məmulatı ilə müqayisə edir. Əlbəttə, belə müqayisə bəzən ayrı-ayrı ədəbiyyatçıları hüsn-rəğbətlə gülümsədə bilər. Lakin mən qorxuram ki, bu gülüş onlarda sonrakı peşmançılıqdan doğan göz yaşlarına çevrilməsin.

İdeal qəhrəman – məhz özündə ən yüksək real və həyati keyfiyyətləri təcəssüm etdirən qəhrəmandır.

İdeal qəhrəman bütün ziddiyyətli və mürəkkəb adamların hamısından daha ziddiyyətli və daha mürəkkəb ola bilər. İdeal qəhrəmanın habelə özünəməxsus zəif tərəfləri də ola bilər, lakin onun qüvvəsi bundadır ki, biz onun şəxsində baş hərflə yazılan əsil İnsanı görürük. İdeal qəhrəmanın gücü tam bir nəslin yaxud tam bir xalqın gücüdür. Buna görə də ideal qəhrəmanın obrazına dünyəvi bir tip kimi baxmaq lazımdır.

Əlbəttə, belə bir bədii abidəni yalnız həyati və zəmanəni bədii cəhətdən duyub dərk etməyin ən ali pilləsinə çatmış dahi şairlər yarada bilərlər. İdeal qəhrəmanın obrazını insanı idealizə yolu ilə yox, insanı və onun ləyaqətini böyük bir qüvvə ilə yüksəltmək yolu ilə yaratmaq olar.

Kapitalizm bütünlükdə insanı həm həyatda, həm də ədəbiyyatda alçaldırdı, sosializm isə, əksinə, insanın yaradıcı qüvvələrini açmış, azad etmişdir, insanın ləyaqətini görünməmiş bir yüksəkliyə qaldırmışdır. Sosializm cəmiyyəti şairinin vəzifəsi də bilavasitə buradan doğur – yəni gərək sosializmdə insanın yüksək mövqeyini düzgün göstərməklə bərabər, onun böyük real obrazını da cəsarətlə yüksəldəsən, onu bir çox nəsillər üçün nümunə, adamların müəllimi və tərbiyəçisi kimi də göstərəsən.

Dünya poeziyası tarixində xeyir və şər qüvvələrini təmsil edən klassik obrazları dolğun dramatik mübarizədə verən romantik formalı poemalar az yazılmamışdır.

Mən ideal qəhrəmanın tərəfdarı olsam da, yenə də onu bizim poeziyamızın əsas probleminə çevirmək istəmirəm. Ədəbiyyat ideal qəhrəmansız da yaşaya bilər, lakin ədəbiyyatı idealsız təsəvvür etmək olmaz. Buna görə də, həmişə olduğu kimi, bu gün də xalqımızın və bütün mütərəqqi bəşəriyyətin işıqlı ideallarını tərənnüm etmək poezi-

yamızın mərkəzi məsələsidir. Buradan belə bir nəticə çıxır: ədəbiyyatda ideal məsələsini ideal qəhrəman məsələsi ilə eyniləşdirmək olmaz.

Əgər mən romantizm məsələsindən danışarkən bir qədər tendensiyaçılığa yol verdimsə, ümid edirəm ki, dinləyicilər hətta bu halda da məni müdafiə edərlər, çünki əgər biz həyatımızda və ədəbiyyatımızdakı bütün gözəl keyfiyyətləri həqiqətən müdafiə etmək istəyiriksə, o halda biz bu işdə ən ehtiraslı tendensiyaçılıq da göstərməliyik.

Yoldaşlar! Poeziyamızın inkişafının indiki mərhələsində yüksək poetik sənətkarlıq məsələsi mərkəzi problemdir. Sovet şairlərinin yüksək ideya və fikirləri müvafiq gözəl formada təcəssüm etməlidir. Məlumdur ki, bədii təfəkkür obrazlı təfəkkürdür. Müəllif obrazlı təfəkkürdən məhrumdursa, onun əsəri nəinki bədii formadan kənarda qalır, habelə onun əsərinin məzmunu da naqis olur, çünki sənət əsərinin məzmunu yalnız özünə uyğun bədii formada açılır.

Nahaq yerə bəzi tənqidçilər, həmçinin müəlliflərin özləri əsərin formasının yoxsulluğunu və ya solğunluğunu “mövzunun aktuallığı” ilə pərdələmək istəyirlər. Əgər bu və ya digər bir mövzu həyatda doğrudan da aktualdırsa, belə mövzu obrazlılıqdan məhrum və solğun bir formada yazılmış əsərdə öz aktuallığını da itirir.

Mən bununla demək istəyirəm ki, bədii əsəri təhlil edərkən biz mövzunun aktuallığı haqqında ümumiyyətlə, mücərrəd şəkildə yox, konkret bir əsərdə mövzunun konkret bədii həlli haqqında danışmalıyıq. Biz hamımız Nekrasovun vəsiyyətini xatırlayırıq:

Formaya geniş yer ver,
Lakin unutma sən heç zaman:
Gərək poemada mövzuya
Cavab verən üslub olsun.
Şeri zərgər kimi incəliklə
Aydın, parlaq yarat sən.
Elə et ki, hər sətrində
Sözün yeri dar olsun,
Fikirlərinki geniş.

Biz Nekrasovun bu vəsiyyətinə həmişə əməl edirikmi? Yəni biz “mövzuya cavab verən üslubun” qeydinə qalırıqmı? Budur, məsələn, bu yaxınlarda “Literaturnaya qazeta”da Sergey Mixalkovun bir şeri çap olunmuşdur. Bu şeir sovet hidrogen bombasının sınaqdan çıxarılması münasibətilə yazılmışdır:

Müdafiə şərəfdir,
Şandır bizim vətəndə,
Vardır atom bombamız
İndi var hidrogen də.

Yaxud həmin müəllifin dünyada atom enerjisi ilə işləyən ilk elektrik stansiyasının işə salınmasına həsr olunmuş başqa zəif bir şerini alaq:

Sovet alimləri də
Elmə verib hədiyyə,
Beş min kilovat gücdə
Stansiya düşüb işə,
Güclüdür, qüdrətlidir,
Atomla işləyir o,
Onunçün qüdrətlidir.

Hərçənd ki, bu misralar doğrudan da aktual mövzuya həsr olunubdur, lakin forma cəhətdən o qədər kobud bir şəkildə qarışdırılıb ki, heç müəllifinə yaraşmır.

Bu şeirlərin altında bizim parlaq poetik istedad sahibi və bir çox yaxşı şeirlərin müəllifi olan Sergey Mixalkovun imzasını görmək çox ağırdır.

Təəssüf ki, müvəffəqiyyətsiz şeirlərə bizim başqa böyük yazıçılarımızın yaradıcılığında da rast gəlirik. Misal üçün, K.Simonovun "Əxlaq dərsi deyən cənablara" adlı şerini göstərmək olar:

Ədalətlə deyək biz:
Sizinki –
Sizinkidir!
Ancaq siz də bilin ki,
Bizimki də
Bizimdir!
Biz öz əxlaqımızı
dəyişmərik
heç zaman,
Sərsəmləyib nə qədər
Hay-küy salsanız da
siz!
Bilirik ki, namuslu
adamlar var
dünyada.
Belələrindən vardır
Bilin
Amerikada da...

Şerin ardı da elə bu cürdür.

Burada Mayakovskinin yolu ilə getməkdən çox, ona təqlid edildiyi açıq görünür. Mayakovskini zahirən təqlid etmək şair Rəsul Rzanı belə bir vəziyyətə gətirib çıxarmışdır ki, onun bir sıra əsərləri orijinallıqdan məhrumdur, bunların müstəqil bədii əhəmiyyəti yoxdur. Yaxud, məsələn, M.İsakovskinin "Yola" ("Səfərə") şerini alaq:

Çoxdur mənim vətənimin
Oğlu, qızı, gəlini,
Hər yerdən səs verirlər
Çağırışına vətənin.
Nə qədər arzu, istək
Bu səsdə birləşibdir,
Nə qədər oğlun, qızın
Bax, yollara çıxıbdır.
Minirik qatarlara
Səfərə gedirik biz...

Şeir axıra qədər belə bəsit bir şəkildə davam edir. Yaxud, İlya Selvinskinin "Gecə şumu" şerində oxuyuruq:

Qaranlıq səhrada bax,
Mayak tək gəzir onlar,
Ustalıqla cızırlar
Təzə mərzin xəttini.
Gah gözdən itir, uzaqlaşır,
Gah da yaxın döngədən
Çıxıb görünür yenə.
Torpağın sinəsini
Yarıb şırımlayır o,
Düz aparır xətləri,
Gurultu da qoparır,
Durmadan hey şumlayır...

Şeiri axıra qədər oxumamaq da olar, çünki sonrasında da yenə həmin "gurultudan" və "şumdan" danışılır.

Budur, A.Surkovun "Sülh naminə" adlı şeri də soyuq mühakiməçiliyin və ritorikanın nümunəsidir:

Səadətə tərəf biz
İri addımlarla, bax,

Gedirik, ölkəmizdə
Şən mahnılar yüksəlir,
Şəhərdə, kəndimizdə.
Hamı bircə ağızdan
Sülh nəğməsi oxuyur.
Yaxşı bilirik ki, biz,
Sovetlərin qələbə
Çaldığı o günlərdə
Adamlar həyəcanla oxuyurdu
Sülh haqqında qanunu
Qanunlar arasında.

Mövzunun aktuallığı hələ əsərin aktuallığı haqqında deməli, bədii əsərin təsir gücü haqqında danışmağa haqq vermir.

Marksist-leninçi estetika bədii əsərin təsir gücünü xüsusilə qeyd edir və yüksək qiymətləndirir. V.İ.Lenin A.V.Lunaçarski ilə söhbətlərindən birində Anri Barbüsün "Od" əsəri haqqında danışaraq demişdir ki, indi müharibələrin və inqilabların baş verdiyi bizim bu həlledici zəmanəmizdə əsil yazıçı elə gərək "döyüş meydanından xəbərlər" yazsın, bunların bədii qüvvəsi isə ondan ibarət olmalıdır ki, həmin "xəbərlər" sarsıdıcı təsirə malik olsun. Əsil sənətkarlığın gücü bədii ümumiləşdirmənin gücündən ibarətdir. Yalnız əsil sənətkar öz əsərində böyük və bitkin insan xarakterlərini bütün mürəkkəbliyi, yaranması və inkişafı ilə birlikdə göstərə bilər. İdeya, fikir və hisslərin əsil zənginliyini də həqiqi sənətkar bədii əsərdə verə bilər.

Lakin həyatı bütün genişliyi ilə əhatə etmək həyatda olan bir çox faktların və xırdalıqların bədii əsərə salınması demək deyildir.

Həyatdakı, insandakı əsas cəhətləri görmək, seçmək və təsvir etmək bacarığı tipik şəraitdə tipik xarakterlər yaratmaq işində sənətkara kömək edir. Bu da sənətkarlığın əsas tələblərindən biridir.

Bizim poeziyamızın canı onun demokratizmində və xəlqiliyindədir.

Sovet poeziyasının xəlqiliyi, hər şeydən əvvəl, bundadır ki, bu poeziya milyonlarla adamın həyat mənafeyi ilə əlaqədar olan problemlərlə məşğul olur. P.Pavlenko öz "Qeyd dəftərçəsi"ndə çox ağıllı yazmışdır: "Əlli və yüz min nəfəri maraqlandıran problem hələ incəsənət üçün yetişməmişdir. Yalnız milyonları düşündürən və həyəcanlandıran məsələ əsər yazmaq üçün əsas ola bilər".

Bizim poeziyamızın xəlqiliyi həm də ondadır ki, o, geniş xalq kütlələrinin bədii zövqünü və estetik baxışlarını inkişaf etdirir və zən-

ginləşdirir. Bizim poeziyanın üslubu, forması, dili – bütün bədii vasitələri seçilmiş adamların deyil, milyonların zövqünə xidmət edir.

Sovet poeziyasının demokratizmi və xəlqiliyi Puşkin, Lermontov, Çavçavadze, Sereteli, Akop Akopyan, Vaqif, Sabir, Abay, Tukay, Şevçenko, Lesya Ukrainka, Franko, Qrabovski, Kreypvald, Raynis və bir çox başqa klassiklərimizin realist poeziyasındakı demokratizm və xəlqiliklə əlaqədardır.

Bizim poeziyamızın demokratizm və xəlqiliyi simvolizm, akmeizm, futurizm, imajinizm və xalqa, realizmə zidd olan hər cürə başqa cərəyanlarla mübarizədə qalib gəlmişdir.

Bədii əsərin forması onun ideyası və sənətkarın dünyagörüşü ilə bağlıdır. İdeya aydınlığı olmayan yerdə forma aydınlığı da olmur. Məsələn, Boris Pasternakın yaradıcılığını götürək. Biz hamımız onu şerin ustası hesab edirik, onun "Leytenant Şmidt", "Doqquz yüz beşinci il" və s. bu kimi şeirlərini də sevirik. Lakin ədalətlə desək, B.Pasternakın yaradıcılığı xalqın ümumi məhəbbətini qazanmamışdır. Bu nə ilə izah olunur? Birinci növbədə, onunla ki, şair bizim zəmanənin qabaqcıl ideyaları səviyyəsinə qalxa bilməmişdir, onun əsərlərinin forması da bunu göstərir.

B.Pasternakın əsərlərini oxuyanda adamda belə bir təsir əmələ gəlir ki, mürəkkəb və son dərəcə subyektiv təsəvvürlərin dolaşıq yollarında hərlənirsən.

Bu barədə A.M.Qorki vaxtı ilə Boris Pasternaka haqlı olaraq yazmışdır: "Sizə "yaxşı" şeylər arzulayımmı, Boris Leonidoviç? Qorxuram ki, sizin acığınıza gələr, çünki sizin poeziyada yaxşı şeylərin nə qədər çox olduğunu bildiyim halda, mən sizin poeziyanızda yalnız sadəliyin çoxalmasını arzu edə bilərəm. Çox zaman mənə elə gəlir ki, sizin şerinizdə təəssüratla obraz arasındakı əlaqə həddindən çox incədir, lap duyulmayacaq dərəcədədir. Xəyala qapılmaq – formanı, obrazı hərc-mərcliyə salmaq deməkdir. Bəzən mən hiss edir və çox acıyıram ki, dünyadakı hərc-mərclik sizin yaradıcılıq gücünüzə qalib gəlir və əsərlərinizdə ancaq hərc-mərclik şəklində, pozulmuş bir ahənglə inikas edir. Bəlkə mən yanılıram, əgər belədirsə, o halda mənim bu səhvimi bağışlayın.

Sizə hər cəhətdən yaxşılıq arzu edən A.Peşkov".

Əlbəttə, sadəlik var, sadəlik var! Bəziləri belə düşünürlər ki, poeziyada xəlqiliyin tam dolğun ifadəsi xalq mahnıları tərzinə, xalqın

şifahi yaradıcılığına yaxınlıqdan ibarətdir. Əlbəttə, xalqdan öyrənmədən böyük poeziya yaratmaq olmaz, lakin xalqa, onun bədii təfəkkürünə yaxınlıq xalq mahnılarını və nağıllarını sadəcə təkrar etmək deyildir. Hətta klassik əsərləri götürsək, məsələn, mən belə düşünürəm ki, Puşkinin "Çar Soltan haqqında nağıl" əsərinə nisbətən "Tunc atlı"sında daha çox xəlqilik vardır.

Şerin forması onun məzmunundan doğur. Bununla əlaqədar olaraq, məsələn, Bajanın və Antokolskinin bəzi şeirlərində olduğu kimi, şerin özündəki mürəkkəbliyə də bəraət qazandırıla bilər. Bəzən şeirdəki forma məzmuna müvafiq gəlməyə də bilər, belə hallarda şerin duyulması çox çətinləşir.

S.Kirsanovda biz bəzən hətta tamamilə yüngül, söz oynatmaq xatirinə yazılmış şeirlərə təsadüf edirik:

Kuban çayı sahilində,
Atların yuyulan yerində,
Çoban durub tütək çalır.
Budur, axır yenə Kuban,
Sahilində vardır qaban,
Çapıram mən sağa-sola,
Altımdakı atım kombayn...

Məgər fikirləri və hissləri, bəzən ən aydın fikirləri də açıq, formalist söz oyununa qurban verən belə şeirlər oxucuların, sadə sovet adamlarının rəğbətini qazana bilərmi?

Ədalət tələb edir deyəsən ki, S.Kirsanov özünün son şeirlərində formalizm qalıqlarından ayrılmağa meyl göstərir.

Biz poeziyamızda əsil demokratizm uğrunda, xəlqilik uğrunda, obrazların, formaların, üslubun, dilin və bütün başqa bədii vasitələrin aydınlığı uğrunda mübarizə aparmalıyıq. Biz yalnız bu yolla sovet poeziyasına ümumxalq məhəbbəti qazandıra bilərik. Doğrudan da, poetik əsər şairin yazı stolu üzərində yaranıb doğulur, xalqın xatirinə isə yaşamağa başlayır. Bədii əsərin ömrü onun xalq tərəfindən bəyənilməsindən asılıdır. Lakin şairlərimiz bəzən bu zəruri və nəcib həqiqəti lazımınca qiymətləndirmirlər.

Poetik əsərin dilinin aydınlığı uğrunda gedən mübarizəni bəsitləşdirmək olmaz. Bizim bir sıra poetik əsərlərimizin dilinin solğunluğu, yoxsulluğu və bədii cəhətdən ifadəli olmaması haqqında haqlı olaraq

mətbuatımızda dəfələrlə qeyd edilmişdir. Bu məsələnin sadəlik və aydınlıqla heç bir əlaqəsi yoxdur. İçində yaşadığımız həyatın zənginliyini parlaq, yüksək emosiyalı və ifadəli bir dillə, tam dolğunluğu ilə göstərmək lazımdır.

Bu cəhətdən bizim poeziyamız şirin və ifadəli, bədii dilin gözəl klassik ənənələrinə malikdir. Puşkinin əsərindəki Tatyananın öz dayəsi ilə söhbətini xatırlayaq. Bu söhbətdə nə qədər poeziya, səmimi və təmiz hisslər, fikir və duyğular vardır! Bütün bunlar isə səmimi və canlı rus dilində çox təbii və sadə verilmişdir. O şair xoşbəxtdir ki, onun dili təbiidir və bununla birlikdə milyonlarla oxucunun dəruni fikir və hisslərini ifadə edən bədii bir dildir.

Puşkin yazmışdır:

Yoldaş, inan buna deyirəm sənə:
Bir gün səadətin cazib ulduzu
Doğacaq, Rusiya ayılacaqdır,
Onda mütləqiyyət xərabəsinin
Üstündə adımız yazılacaqdır!

Bu beş xətdə xalqın mütləqiyyət əleyhinə qəzəbi, azadlıq uğrunda mübarizlərə məhəbbəti, böyük şairin iftixar hissi, işığın qaranlıq üzərindəki qələbəsinə parlaq inamı, dekabristlərin taleyini dərin bir həyəcanla düşünməsi, xalqın cəlladlarına şairin bəslədiyi şəxsi kin inandırıcı ifadə olunmuşdur. Ümumiləşmiş poetik dilin təsir qüvvəsi belədir! Hələ bu şerdə nə qədər poeziya və musiqi, necə gözəl, ahəngdar və canlı poetik bir dil vardır!

Poeziyada böyük emosional qüvvə canlı insan nitqinin təbiiliyi ilə birləşməlidir.

Lakin təəssüf ki, bizdə hələ də pozğun və solğun dildə yazılmış əsərlər meydana çıxır. Elə şeirlərə də təsadüf olunur ki, onlarda heç bir parlaqlıq, heç bir şair fərdiyyəti görünmür və buna görə də oxucunun diqqətini cəlb edə biləcək vəziyyətdə deyildir.

Biz indiyə qədər şairlərin öz poetik dili haqqında danışdıq, bəs poetik əsərlərdəki qəhrəmanların dili nə vəziyyətdədir?

Poetik əsərlərdəki qəhrəmanların dili haqqında mətbuatımızda qızğın mübahisələr olmuşdur. Mən "Böyük sənət məsələləri" və "Şairin hüquqları" adlı məqalələrimdə yazmışdım ki, əgər biz qəhrəmanlarımızın monumental obrazlarını yaratmaq istəyiriksə, onları özlərinə

müvafiq təsirli bədii dildə danışdırmalıyıq. Mən klassik poeziyanın qəhrəmanları olan Fərhadı və Şirini, Dezdemonanı və Tatyananı misal gətirir və soruşurdum ki, nə üçün onlar bu qədər zəngin və rəngarəng bir dildə danışırlar? Amma bizim əsərlərimizdəki qəhrəmanların dili isə çox zaman solğun və yoxsul olur?

Bəzi yoldaşlar mənim bu fikrimi səhv başa düşmüşdülər. Onlar belə anlamışdılar ki, guya, mən Tatyananın və Şirinin, Fərhadın və Hamletin dilini mexaniki surətdə bu gün bizim yazdığımız əsərlərə köçürməyi təbliğ edirəm. Əlbəttə, aydındır ki, hətta mən bunu istəsəm də mümkün olan iş deyildir və lüzumsuz söhbətdir, çünki dil öz-özlüyündə abstrakt bir anlayış deyildir, dil həmişə insanla, konkret tarixi şəraitlə əlaqədardır. İnsanın həyat tərzi, ruhi aləmi, xarakteri və bütün obrazı dəyişdiyi kimi, dili də dəyişir.

Lakin mən başqa şeyi deyirəm – mən deyirəm ki, bizim qəhrəmanlar Nizami, Puşkin, yaxud Şekspir dövrünün dili ilə yox, öz zəmanələrinin yüksək, emosional və ifadəli dili ilə danışsınlar.

Ayrı-ayrı qəhrəmanların dili də müxtəlif olmalı, onların xarakterlərinə və həyat tərzinə uyğun gəlməlidir. Hər hansı bir qəhrəmanın dili başqa qəhrəmanın dilindən fərqlənməlidir. Tipikləşdirmə problemi dil sahəsində də həll olunmalıdır. Şairlərimiz öz qəhrəmanlarının mənəvi aləminin zənginliyi və gözəlliyi haqqında çox tez-tez danışırlar, lakin bu zənginlik onların əsərlərində göstərilmir. Əksinə, həmin əsərlərdən belə bir təəssürat alınır ki, bu qəhrəmanlar öz fikirlərini parlaq surətdə, ən başlıcası isə – müstəqil surətdə ifadə etməyi bacarmayan kiçik adamlardır.

Bizim qəhrəmanların, sadə sovet adamlarının dili poetik səslənməli və bu cəhətdən seçilməlidir. Axı həyatımızda bu adamlar diqqətəlayiq insanlardır: onlar gözəl həyat qururlar, yeni tarix, poeziya, romantika və gözəlliklə dolu yeni cəmiyyət yaradırlar.

Realizm şüarı altında gizlənərək bədii əsərdəki qəhrəmanların dili ilə adi, gündəlik danışıq dili arasında bərabərlik işarəsi qoyub, onları eyniləşdirən yoldaşlar səhv edirlər. Onlar belə suallar verirlər ki, nə üçün şairin qəhrəmanı yüksək bədii sözlər və fəlsəfi ifadələr işlədir, halbuki insanlar həyatda çox az hallarda belə danışırlar. Məncə, belə suallar verərmək olmaz.

Ədəbi əsərin qəhrəmanının dili xalqın real surətdə mövcud olan dilindən ayrılmamalıdır, lakin bu dil parlaq olmalıdır, xalqın dilini

yüksəltməli və zənginləşdirməlidir. Əgər bədii ədəbiyyatın dili həyatda mövcud olan dili zənginləşdirməsəydi, qəhrəmanların dili üzərində işləmək üçün şair ilhamı yox, danışıq dilini sadəcə stenoqrafik yazısı lazım olardı.

Şair öz əsərlərinin poetik dilinin bütün zənginliyini tükənməz bir mənbədən alır ki, bu da xalqın hərtərəfli, şirin və obrazlı dilidir, şifahi ədəbiyyatın dilidir.

Yoldaşlar! Mən forma və sənətkarlıq problemləri haqqında danışarkən poeziyada milli forma problemi üzərində xüsusi dayanmaq istəyirəm. Zənnimcə, hələ bu məsələdə aydın olmayan cəhətlər vardır.

Bizim bütün ədəbiyyatımız üçün vahid metod olan sosializm realizmi metodu müxtəlif millətlərdən olan bütün sovet yazıçılarını qətiyyən məcbur etmir ki, həyatımızdakı prosesləri və hadisələri bütün milli ədəbiyyatlar üçün ümumi olan hər hansı təkcə bir forma daxilində bədii cəhətdən açıb göstərsinlər və ümumiləşdirsinlər. Sosializm realizmi metodunun mahiyyətini bu cür anlamaq həmin metodu ehkamlaşdırmaq, dar mənada başa düşmək və həyat həqiqəti ilə tam ziddiyyətə girmək deməkdir. Axı həyat özü müxtəlif və rəngarəng şəkillərdə təzahür edir və beləliklə, incəsənət əsərlərinin, o cümlədən, onların milli növlərinin də forma müxtəlifliyini şərtləndirir. Hər bir millətin öz tarixi, inkişaf yolu, öz məişət tərzi, əsrlər boyunca yaranmış öz ənənələri, öz dili, öz adətləri və vərdişləri, öz təfəkkür tərzi və mənəvi aləmi vardır.

Azərbaycanlı Süleyman Rüstəm və belorus Arkadi Kuleşov kimi şairlərin, rus şairi Mixail İsakovski və gürcü şairi Georgi Leonidzenin bir-birinə bənzəməyən istedadları yalnız milli zəmində meydana çıxıb ərsəyə çata bilmişdir.

Hamıya məlum olan bu həqiqətləri ona görə təkrar etmək lazım gəlir ki, hər bir milli ədəbiyyatın ayrılıqda, öz milli formasının orijinal xüsusiyyətləri sayəsində bütün sovet ədəbiyyatının inkişafı işinə verdiyi hədiyyəni kifayət qədər qiymətləndirməyən adamlara hələ indi də təsadüf edilir.

Ədəbiyyatçıların və tənqidçilərin bir qismi arasında sovet xalqlarının ədəbiyyatlarındakı milli formaların fərqini yalnız dil fərqindən ibarət bilən və milli formanın bütün digər ənənələrinin, ünsürlərinin xüsusiyyətini inkar edən sadəlövh və zərərli "nəzəriyyə"yə tərəfdar olan adamlar vardır. Beləliklə, onlar əslində sosialist millətlərin orijinal cəhətlərini, milli xarakterin zəngin xüsusiyyətlərini inkar edirlər.

Bu “nəzəriyyə”nin tərəfdarları nəyi əsas götürürlər? Onlar təsdiq edirlər ki, indiki SSRİ xalqlarının hamısı bütün ölkəmiz üçün ümumi olan arzu və fikirlərlə yaşayırlar, daha onlar arasındakı fərqlər haqqında danışmağa da ehtiyac yoxdur. Azərbaycanlı da sovet adamıdır, ukraynalı da sovet adamıdır. Onlar yalnız dillərinə görə bir-birindən fərqlənirlər.

Bu doğrudur ki, biz hamımız sovet adamlarıyıq. Sosialist mədəniyyəti isə yalnız milli formada inkişaf edə bilər. Gələcəyə gedən yol – millətlərin, milli dillərin və milli mədəniyyətlərin çiçəklənməsi yoludur. Bu, həmçinin bütün sosialist millətlərə də aiddir.

Öz-özlüyündə məlumdur ki, bugünkü milli forma dünənki şəkildə deyildir. O, daima dialektik inkişafdadır, milli formaya dəyişməyən, donmuş, ədəbi bir şey kimi baxmaq olmaz. Onun bəzi keyfiyyətləri ölüb gedir, bəziləri isə yaranır; milli forma arasıkəsilmədən, xüsusilə indi, daha coşqun surətdə yeni keyfiyyətlərlə zənginləşir.

Bu və ya digər millətdən olan sovet adamının xarakterini təsvir edən yazıçı, məsələn, nəzərə almaya bilməz ki, onun qəhrəmanının milli xarakteri kökündən dəyişmişdir və bu xarakterin ayrılmaz, milli xüsusiyyətlərindən biri proletar beynəlmiləlçiliyidir. İnsanın milli xüsusiyyətlərini təsdiq edən beynəlmiləlçilik eyni zamanda, insanı milli varlığın elə bir yüksəkliyinə qaldırır ki, bunu burjua cəmiyyəti görməmişdir və görə də bilməz.

Əgər yazıçı öz xalqının digər xalqlarla qardaşlıq birliyində təzahür edən inqilabi coşqunluğunu yeni bədii vasitələrin köməyi ilə əks etdirməsə, xalqın irəliyə doğru hərəkətini göstərməsə, öz vəzifəsini yerinə yetirə bilməz. Lakin əgər yazıçı öz xalqının həyatına möhkəm daxil olmuş yeniliyin təzahür etdiyi formaların xüsusiyyətini nəzərdən qaçırsa, yenə də müvəffəqiyyətsizliyə uğrayar. Əgər yazıçı hamıya və hər şeyə aid olan ümumi, universal, mücərrəd formalar axtarmağa başlasa, səhv edər.

Milli formaların zənginləşməsinin mənbəyi həyatın özündədir, müxtəlif ədəbiyyatların bir-biri ilə yaradıcılıq əlaqəsində və qarşılıqlı təsirindədir.

Yoldaşlar! Məruzəmi qurtararkən demək istəyirəm ki, bütün sovet ədəbiyyatı qarşısında olduğu kimi, poeziyamız qarşısında da böyük yaradıcılıq problemləri dayanmışdır. Mütərəqqi bəşəriyyətin qabaqcıl arzu və istəklərinin ifadəçisi olmaq vəzifəsini tarix bizim öhdəmizə vermişdir. Dövrümüzün pafosu, xalqımızın pafosu poeziyamızın da

pafosunu təşkil etməlidir. Mütərəqqi bəşəriyyətin sülh, demokratiya və sosializm uğrunda apardığı və romantika ilə dolu olan qəhrəmanlıq mübarizəsi zəmanəmizin qəhrəmanlarının dünyəvi tiplərini və obrazlarını yaratmaq üçün şairlərimizi ilhama gətirməlidir.

Yeni tarixin yaradıcısı olan sosialist adamının əzəmətli obrazı, onun hərtərəfli əmək və yaradıcılıq fəaliyyətinin bütün zənginliyi ilə birlikdə, onun bütün yüksək idealları və əxlaqi keyfiyyətləri ilə birlikdə bizim poetik fikrimizin mərkəzində dayanmalıdır.

İndi bizə həmişəkindən daha çox, poetik fikrin qüdrətli yüksəlişi, bizim bugünkü gözəl həyatımızın və əzəmətli sabahımızın geniş əhatəsi lazımdır. Salamat "qızıl orta" fəlsəfəsi ümumiyyətlə və xüsusən bədii yaradıcılıq sahələrində qəbul edilə bilməz.

Biz sosializmin əzəmətli poeziyasını yaratmalıyıq, bu isə bizdən əsaslı surətdə və cəsarətlə geniş və əhatəli formalara keçməyi tələb edir. Bu formalar olmadan, həyatın dolğun, bədii təsvirini vermək olmaz, bunlarsız poeziyada böyük məzmunun ifadə edilməsini, bitkin, müxtəlif və parlaq insan xarakterlərinin yaradılmasını təsəvvür etmək olmaz, bizim ümumdünya tarixi əhəmiyyətli nailiyyətlərimizin ehtiraslı tərənnümü, zəmanəmizin geniş əhatəsi mümkün olmaz.

Şairin bu vəzifəsini Pavel Antokolski çox gözəl ifadə etmişdir:

Dünən keçmiş, sabah gəlir!
Bəzən mənə elə gəlir ki,
Zəmanə özü də qələm yoldaşımdır!
Yaratdığım əsərin lap baş qəhrəmanıdır!

Mən inanıram ki, bu böyük vəzifəni biz yalnız inadlı zəhmətlə, əsərlərimizdə tələsikliyə yol vermədən, xalqımızın qarşısında məsuliyyətimizi dərk etmək yolu ilə yerinə yetirə bilərik. Hər bir əhəmiyyətli sənət əsəri gərgin və cəsarətli yaradıcılıq zəhmətinin məhsuludur. Yaradıcılıq zəhmətimizin qalib gəlməsini istəyiriksə, biz onu yüksək mədəniyyət və böyük sənətkarlıqla birləşdirməliyik. Buna görə də şairlərimiz gərək zəmanəmizin elmi və bədii fikrinin zirvələrinə yiyələnsinlər. Bunsuz biz bəşəriyyətin ən qabaqcıl estetik və bədii baxışlarının ifadəçiləri ola bilmərik. Bu keyfiyyətlərə yiyələnən şair isə cəsarətli yaradıcılıq axtarışlarına girişə bilər və girişməlidir, çünki yaradıcılıq cəsarəti olmayan yerdə heç bir bədii kəşf və nailiyyət də yoxdur.

Yoldaşlar, mənə elə gəlir ki, poeziyamızın bugünkü vəziyyəti uçuşa hazırlaşan qartalın vəziyyətini xatırladır: o, ətrafa baxıb öz uçuşu üçün geniş üfüqlər axtarır və qüvvə toplayır. Biz möhkəm inanırıq ki, bu uçuş baş tutacaqdır. Bunun üçün bizdə qüdrətli qartal vardır – bu bizim böyük sovet poeziyamızdır. Qarşımızda geniş üfüqlər də vardır – bu bizim geniş həyatımız, sosialist varlığımızdır. Yüksək uçuş üçün yüksək fəza da vardır – bu bizim ideallarımızın yüksəkliyidir.

Yaşasın poeziya! (*Sürəkli alqışlar*)

*1954*

## NƏCƏFBƏY VƏZİROVUN UNUDULMAZ XATİRƏSİ

1920-ci ildə, hələ yeniyetmə ikən əyalət şəhəri Qazaxda klubda həvəskarlardan ibarət kiçik bir dəstənin ifasında ilk dəfə "Müsibəti-Fəxrəddin" tamaşasını görmüşdüm. O vaxtdan 35 il keçmişdir. Həmin illər ərzində mən bu diqqətəlayiq əsərin müəllifini böyük mənəvi razılıq və təşəkkür hissi ilə çox tez-tez xatırlamışam. Əlbəttə, mən o zaman hələ yazıçı deyildim və bir çox əsərlərlə, xüsusilə dramaturgiya əsərlərilə tanışlığım yox idi. Sonralar bir çox əsərləri oxumağıma və teatrlarımızın səhnəsində görməyimə baxmayaraq, mən indi də "Müsibəti-Fəxrəddin" əsərini 35 il bundan əvvəl keçirdiyim güclü bir hiss ilə xatırlayıram. Görünür, bütün güclü və orijinal əsərlər öz mənəvi gözəlliyi və təsir qüvvəsini heç bir zaman itirmir.

Pyesin baş qəhrəmanı Fəxrəddinin obrazı mənim hafizəmdə böyük insani nəcibliyin, humanizm və məhəbbətin nurlu obrazı kimi qalmışdır. Ədəbiyyatımızda ilk maarifçi-demokrat, patriarxal-feodal Azərbaycanının tutqun şəraitində öz istedadını və zəkasını bütünlüklə xalqın xidmətinə vermiş yazıçının yaratdığı bu obraz, bir növ, öz müəllifini, Azərbaycan xalqının şanlı oğlu, böyük dramaturq – adı bizim üçün həmişə əziz olan Nəcəfbəy Vəzirovun özünü təcəssüm etdirir.

Lakin məqaləmizin əvvəlində biz namusla və açıqca deyək: bir var sevəsən, bir də var ki, sevdiyinin qeydinə qalasan. Belə hallar olur ki, bəzən bir adamı güclü məhəbbətlə sevirik, lakin sevdiyimiz həmin adamın çox az qeydinə qalırıq. Bu gün də, Nəcəfbəy Vəzirovun ana-

dan olmasının 100 illiyini qeyd edərkən etiraf etməliyik ki, biz onun böyük və nəcib yaradıcılıq irsinə az qayğı göstərmişik. Mən bu məzəmməti, hər şeydən əvvəl, Vəzirovun bilavasitə varisləri olan dram teatrlarımızın ünvanına deyirəm, çünki Vəzirov nəinki dramaturqlarımızdan biridir, o, həmçinin, bizim ilk aktyorumuzdur, dramatik teatr sənətimizin ilk yaradıcılarından biridir.

Vəzirovun lirizm və qəhrəmanlıqla, humanizm və insanpərvərliklə aşılanmış diqqətəlayiq pyeslərini, nədənsə, son illərdə teatrlarımız öz səhnələrində tamaşaya qoymurlar, halbuki, mənim fikrimcə, həmin pyeslər nəinki öz idrak əhəmiyyətini, habelə öz tərbiyəvi əhəmiyyətini də itirməmişdir və heç bir zaman da itirməyəcəkdir.

Bizim sosialist mədəniyyətimizin isə böyüklüyü həm də ondadır ki, o, keçmişdə bütün xalqların bütün dillərdə yaratmış olduqları mütərəqqi mədəniyyətin ən yaxşı və qabaqcıl ənənələrini, ideya-bədii nailiyyətlərini özündə təcəssüm etdirir.

* * *

Vəzirov Azərbaycan ədəbiyyatında tənqidi realizmin banilərindən biridir, o, dahi mütəfəkkir-dramaturqumuz M.F.Axundovun ən yaxşı davamçısı olmuşdur. M.F.Axundovun ən yaxşı realist ənənələrini davam etdirərək, Vəzirov özünün "Müsibəti-Fəxrəddin", "Yağışdan çıxdıq – yağmura düşdük", "Pəhləvanani-zəmanə", "Daldan atılan daş topuğa dəyər", "Sonrakı peşmançılıq fayda verməz", "Adı var, özü yox" və digər bu kimi orijinal pyeslərində parlaq, canlı, bitkin xarakter və obrazların tam bir qalereyasını yaratmışdır.

Azərbaycanda Sovet hakimiyyəti illərində Vəzirov "Təzə əsrin ibtidası" (1922) pyesini yazmışdır. Bu pyesin hətta adı da göstərir ki, böyük realist və humanist öz xalqının həyatındakı yeni sosializm dövrünü böyük bir heyranlıq hissi ilə qarşılamış və təbrik etmişdir. Bu həmin illər idi ki, müsavatçıların və pantürkistlərin cəbhəsindən olan və xalq köklərindən, zəmanənin işıqlı ideallarından ayrılmış mürtəce və mühafizəkar burjua yazıçıları dekadentçilik və bədbinlik, insanın yaradıcı qüvvələrinə, doğmaqda olan sosializmin hər şeyə qalib gələn ideyalarına inamsızlıq bataqlığında sürünürdülər.

Yuxarıda göstərdiyimiz əsərlərin hamısında Vəzirov şirin, hamının başa düşdüyü xalq dilində inqilabdan əvvəlki Azərbaycandakı burjua

münasibətlərini ("Pəhləvanani-zəmanə", "Dələduz") feodal-patriarxal məişəti, fanatizmi və mövhumatı, zülmü və istismarı, hakim siniflərin alçaq əxlaqını ehtirasla qamçılayıb ifşa edirdi. Bununla da o öz bədii sözünün gücü ilə "zülmət səltənəti" əleyhinə, ictimai ədalətsizlik əleyhinə, əqidəli və düzgün, namuslu və insanpərvər olan hər şeyin təntənəsi uğrunda xalq kütlələrinin şüurunun oyanmasına kömək edirdi.

Onu da qeyd edək ki, burjua münasibətləri və əxlaqının bədii əsərdə ifşası işində M.F.Axundovun ənənələrini davam etdirən Vəzirov özü də yeni tarixi şəraitində irəliyə doğru addım atmışdır.

1913-cü ildə dahi Azərbaycan bəstəkarı Üzeyir Hacıbəyovun Azərbaycanın musiqi və teatr incəsənətinin görkəmli xadimləri Maqomayev və Sarabski ilə birlikdə Nəcəfbəy Vəzirovun ünvanına göndərdikləri məktub Vəzirovun inqilabdan əvvəlki Azərbaycan ictimai və mədəni fikri tarixindəki böyük rolunu parlaq surətdə sübut edir. Həmin məktubda deyilir:

"Çox hörmətli və izzətli yazıçımız Nəcəfbəy Vəzirov! Taleyin əmrilə biz müsəlmanlar geri qalmış xalqıq və bütün dünyaya da məlumdur ki, biz hələ cəhalət içində yatıb qalmışıq. Bunun səbəbinin nə olduğuna toxunmaq istəmirik. Bir neçə il bundan qabaq müsəlman gənclərindən uzaqgörənləri gələcək haqqında fikirləşərək üzərlərinə müəyyən vəzifələr götürdülər, özlərini xalqa xidmət işinə həsr etdilər: onlardan bəziləri müəllimlik etməyə başladı, bəziləri qəzetlərdə iştirak etdilər, bəziləri də öz gözəl natiqlik sənətləri ilə xidmət edirdilər. Müxtəsər, hərə öz bacarığı daxilində, xeyirxah nailiyyətlərlə müsəlman xalqına nicat əlini uzatdı və onu cəhalətin qaranlıq quyusundan çıxarmağa başladı.

Hörmətli Nəcəfbəy Vəzirov! Qırx il bundan əvvəl Siz də həmin gənclər sırasında nəcib bir məqsəd seçərək özünüzü səmimi-qəlbdən dramaturgiyaya həsr etdiniz və müsəlman teatrının inkişafına kömək göstərdiniz. Bu yola qədəm qoyanda Siz düşünürdünüz ki, əgər indi bu yolda məni təhqirlər, döyüb-söyülmək və hətta məhv olmaq gözləyirsə də, gələcəkdə həmin bu xalqın uşaqları mənə xeyir-dua verəcəklər. Bu gözəl fikir və nəcib nailiyyətlərinizə görə sizə afərinlər olsun. O adam xoşbəxtdir ki, xalq yolunda çalışıb xeyli əziyyətlərə dözür və axırda da xalq özü ona əhsən deyir!

Hörmətli Nəcəb bəy Vəzir! Siz əbədi yaşayacaqsınız! Sizin əkdiyiniz ağacın meyvələrinin toxumlarını zəmanənin küləyi müsəlman

dünyasının geniş düzlərinə aparıb salacaq və onlardan da minlərlə sizin kimi nəcəfbəylər yetişəcəkdir ki, onlar da eyni məqsədə doğru gedərək, daha parlaq nəticəyə çatacaqlar. Sizin adınız tarixin səhifələrinə daxil olacaq və dildən-dilə düşəcəkdir.

Sənə eşq olsun, ey xalqın xidmətçisi! Sənə eşq olsun, ey bizim atamız! Sənə eşq olsun, ey bizim hökmdarımız, izzətli Nəcəfbəy Vəzirov!"

* * *

Mən böyük bir minnətdarlıq hissi ilə qeyd etmək istəyirəm ki, Vəzirovun dünyagörüşünün və bədii istedadının formalaşması işində böyük demokratik rus mədəniyyəti mühüm rol oynamışdır. Peterburqda tələbəlik illərində və Moskvada Petrovski-Razumovski Kənd Təsərrüfatı Akademiyasında oxuyarkən o öz taleyini rus mədəniyyətinin ən yaxşı nailiyyətləri ilə üzvi surətdə bağlamış, o zamankı qabaqcıl rus yazıçıları və dramaturqları ilə dostluq etmişdir. Bu gün biz sevinclə öyrənirik ki, məşhur rus yazıçısı Vladimir Korolenko Vəzirovla dostluq etmiş, onun tələbəlik yoldaşı olmuş və Vəzirovun yaradıcılıq fəaliyyətinin 40 illik yubileyi münasibəti ilə ona belə bir səmimi teleqram da göndərmişdir:

"Köhnə dostdan salam, Sizə uzun müddətli yaradıcılıq arzu edirəm".

Vəzirovun komediya əsərləri aydın və parlaq surətdə göstərir ki, böyük rus dramaturqu Aleksandr Nikolayeviç Ostrovski onun yaradıcılığına böyük və səmərəli təsir etmişdir. Təsadüfi deyildir ki, o zamankı Azərbaycanın qabaqcıl adamları bir çox sənədlərdə, məktublarında və məqalələrində Vəzirovu "müsəlman aləminin Ostrovskisi" adlandırırlar.

Çar polisinin və yerli cəhalətpərəstlərin təqib və hədələrinə baxmayaraq, Vəzirov qabaqcıl maarifçi və demokratik ideyaları Azərbaycanda mərdliklə və ardıcıl surətdə yayırdı.

Vəzirov hətta, Petrovski-Razumovski Akademiyası məzunlarından olduğuna görə, hökumətin nəzərində etimadını itirmiş bir adam kimi taqçırlandırılıb Dilican qəzasında meşəbəyi vəzifəsindən çıxarılanda da ruhdan düşməmişdi. Vəzirov bu barədə yazmışdı: "Petrovçu olmağımla mən həmişə fəxr etmişəm, mənə ədalətsiz zülm edirlər və bunun da səbəbi odur ki, xalq məni sevir və mən xalq arasında məşhuram. Məni təqib edənlərə minnətdaram, çünki işdən çıxarılandan sonra mən milli ədəbiyyatımızın yolunda yaradıcılıq fəaliyyəti ilə məşğul oldum. Gücüm çatdığı qədər yazdım. Ölməyib sağ qalsam, yenə yazacağam".

Vəzirov humanist olduğu üçün hər cür milli məhdudluq hissindən və millətçilik zehniyyətindən uzaq idi. O, milli və dini mənsubiyyətindən asılı olmayaraq insanı qızğın sevir və onun yaradıcı qüvvəsinə inanırdı. Bununla da o təkcə Azərbaycan xalqının deyil, ölkəmizdəki digər qardaş xalqların da məhəbbətini qazanmışdır...

Onu da qeyd edək ki, Vəzirovun dramaturgiyası yalnız Azərbaycanda deyil, habelə digər xalqların, xüsusilə Orta Asiya xalqlarının arasında da çox məşhur olmuş və həmin xalqlarda dramaturgiya və teatr mədəniyyətinin yaranmasına vaxtı ilə səmərəli təsir göstərmişdir. Buna görə də onun yaradıcılığı ciddi elmi tədqiqə layiqdir və bu işi yerinə yetirmək bizim ədəbiyyatşünasların və sənətşünasların şərəfli vəzifəsidir. Feyzulla Qasımzadənin Nəcəfbəy Vəzirovun həyat və yaradıcılığı haqqında istedadla yazılmış monoqrafiyasını istisna etməklə, ədəbiyyatşünaslıq elmimizdə bu görkəmli yazıçı və mədəniyyət xadimimizin yaradıcılığı haqqında başqa elmi əsərlər yoxdur. Arzu olunur ki, Vəzirov haqqındakı ən yaxşı elmi-monoqrafik əsərlər onun yaradıcılığını Vətənimizin bütün xalqları arasında tanıtmaq üçün rus dilinə tərcümə edilsin.

İstər tipik obrazlar, parlaq və tam insan xarakteri yaratmaq cəhətdən, istərsə də həyatı düzgün əks etdirmək, canlı xalq dilini dərindən bilmək və onun hədsiz imkanlarından bacarıqla istifadə etmək cəhətdən, habelə həyati konfliktlər qurmaq, qüvvətli dramatik hadisələr və dialoqlar vermək mənasında bizim sovet dramaturqları Vəzirovun dramaturgiyasından çox şey öyrənə bilərlər və öyrənməlidirlər.

* * *

Vəzirovun dünyagörüşünün tarixən müəyyən məhdudluğu onu proletar inqilablarının və sosialist inqilabına doğru aparan kəskin sinfi vuruşmaların böyük mənasını dərindən dərk etmək imkanından məhrum etmişdi. Lakin bu humanist yazıçı istismarçı siniflərə bütün qəlbi ilə nifrət edir və onları yazıçının özünün işlətdiyi sözlə desək, "müftəxor" adlandırırdı. O öz parlaq və saf qəlbi ilə cəmiyyətdə bütün maddi və mənəvi nemətləri yaradan zəhmətkeş insanın tərəfində idi, onun dərdini çəkirdi, istismarçılara, müftəxorlara və cəhalətpərəstlərə isə nifrət edirdi.

Vəzirovun yaradıcılığı Azərbaycan xalqının M.F.Axundov, N.Nərimanov, Ə.Haqverdiyev, C.Məmmədquluzadə və digər böyük sənət-

karları tərəfindən yaradılmış demokratik ədəbiyyatın qızıl xəzinəsinə həmişəlik daxil olmuşdur. Buna görə də biz, yeni sosialist mədəniyyətinin yaradıcıları, Azərbaycanda realist dramaturgiyanın ilk bünövrəsini qoyanlardan biri olan Vəzirovu özümüzün şanlı sələflərimizdən biri hesab edir və onun parlaq orijinal yaradıcılıq irsini yüksək qiymətləndiririk.

Biz Vəzirovu ona görə çox sevirik ki, o bizi güclü bir məhəbbətlə sevmiş, yer üzərində humanizmin və ictimai ədalətin təntənəsinə möhkəm inanmışdır.

Nəcəfbəy Vəzirovun nurlu obrazı Azərbaycan xalqının xatirində əbədi yaşayacaq, nəsillərdən nəsillərə keçəcəkdir.

*1955*

## RESPUBLİKADA İCTİMAİ ELMLƏRİN İNKİŞAFI VƏ VƏZİFƏLƏRİ

Xalqımızın həyatında baş verən əlamətdar hadisədən – Azərbaycan SSR Elmlər Akademiyasının yaradılmasından keçən 10 il ərzində Akademiyamızın elmi kollektivi, o cümlədən ictimai elmlər bölməsinin əməkdaşları tərəfindən Azərbaycanın tarixi, mədəniyyəti, ədəbiyyatı, dili, ictimai-siyasi və fəlsəfi fikrinin öyrənilməsi sahəsində mühüm işlər görülmüşdür.

Akademiyamızın humanitar elmlər sahəsindəki elmi fəaliyyətində Sovet İttifaqının bir çox alimləri, ilk növbədə Moskva və Leninqradın, qardaş respublikaların alimləri, Azərbaycan Dövlət Universitetinin, Pedaqoji İnstitutun alim və müəllimləri, respublikanın digər elmi-tədqiqat müəssisələrinin əməkdaşları yaxından iştirak etmişlər.

Elmlər Akademiyamızın 10 illiyi günündə biz onlara öz hədsiz təşəkkürümüzü bildiririk.

Hər şeydən əvvəl, tarixçilərimizin hazırladığı və maketi keçən il müzakirə üçün nəşr edilən Azərbaycan tarixi dərsliyini qeyd etmək lazımdır. Şübhəsiz, dərsliyin hazırlanması ancaq respublikanın tam bir qrup tarixçisinin uzun illər boyu apardıqları böyük tədqiqat işi nəticəsində mümkün olmuşdur.

Maketdə ilk dəfə olaraq Azərbaycanda məhsuldar qüvvələrin və ardıcıl olaraq dəyişən istehsal münasibətlərinin inkişaf tarixi öz əksini

tapmış, xalq kütlələrinin tarixin həqiqi yaradıcısı kimi rolu geniş göstərilmiş, Azərbaycan xalqının istismarçılara qarşı apardığı sinfi mübarizə, onun əsrlər boyu xarici işğalçılara qarşı azadlıq mübarizəsi və s. tarixi prosesdə işıqlandırılmışdır. Bu mənada dərslik çox böyük tarixi materialı ümumiləşdirir.

Lakin maketdə bir sıra qüsurlar və dəqiq olmayan cəhətlər də vardır. Qabaqda maketin yenidən işlənməsi və dərsliyin çapa hazırlanması kimi ciddi işlər durur.

Tarixçilərimiz və filosoflarımız, o cümlədən prof. A.O.Makovelski, tarix elmləri namizədləri İ.M.Dyakov, İ.Əliyev və başqaları ən qədim və qədim Azərbaycan tarixinin yazılı abidələrdə əks olunmuş bütün dövrlərini xronoloji cəhətdən əhatə edən bir sıra problemlərini işləyib hazırlamışlar.

Tarixçilər müəyyən etmişlər ki, Azərbaycan xalqının təşəkkülündə başlıca etnik zəmin ən qədim zamanlardan Midiya ərazisində yaşayan qəbilələr olmuşlar.

Orta əsrlər Azərbaycan tarixinin öyrənilməsi sahəsində də müəyyən müvəffəqiyyətlər əldə edilmişdir. Tarix elmləri doktoru Ə.Əlizadənin "XIII–XIV əsrlərdə Azərbaycanın ictimai-iqtisadi və siyasi tarixi" əsərində monqol istilası ərəfəsində Azərbaycan həyatı və monqol xanlarının hökmdarlığı dövründə ölkənin ağır vəziyyəti müfəssəl xarakterizə olunur.

Q.B.Abdullayev, V.N.Leviatov və başqalarının XVIII əsr Azərbaycan həyatının müxtəlif sahələrini işıqlandıran bir sıra monoqrafik əsərləri yazılmışdır.

Azərbaycanın Rusiya ilə birləşdirilməsi və onun mütərəqqi əhəmiyyətli məsələlərinin öyrənilməsi ilə tarixçilərdən Ə.S.Sumbatzadə, M.A.İsmayılov, M.M.Əfəndiyev və başqaları məşğul olurlar. Hazırda bu məsələyə həsr olunmuş məcmuə çapa verilmişdir.

Bakı proletariatının formalaşması, Azərbaycan fəhlə və kəndlilərinin çarizmə, mülkədar və kapitalistlər hakimiyyətinə qarşı inqilabi mübarizə tarixi problemi sahəsində müəyyən irəliləmə əldə edilmişdir. Bu məsələlərdə M.A.Qazıyev, Ə.N.Quliyev, İ.V.Striqunov və başqaları məşğul olurlar.

Sovet dövrü tarixi problemlərinə xüsusi diqqət yetirilir. Bu sahədə son zamanlarda bir sıra monoqrafik tədqiqlər aparılmaqdadır (tarix elmləri namizədi E.A.Tokarjevski, Azərb.SSR EA müxbir üzvü İ.A.Hüseynov və başqaları).

Bu yaxınlarda Xarici Şərqin yeni və ən yeni tarixinə dair problemlərin işlənməsinə başlanmışdır. Bu sahədə M.X.Şərifli, Z.Z.Abdullayev, Ş.A.Tağıyeva və başqaları çalışırlar.

İlk mənbələrin öyrənilməsi, tərcümə və nəşr edilməsi sahəsində də iş aparılır. Bunların içərisində Musa Kalankatuylunun "Qədim Ağvan" (VII əsr), Rəşidəddinin "Cami-ət-Təvarix" (III cild) (VIII–XIV əsrlər), Həmdüllah Qəzvinin "Nüsxətül-külub" (XVIII–XIX əsrlər), A.Bakıxanovun "Gülüstani-İrəm" əsərlərini (XIX əsr) və başqalarını qeyd etmək lazımdır.

Etnoqraflarımız əsaslı işlər görmüşlər. Onlar qiymətli materiallar toplamış, "Azərbaycan" monoqrafiyasını SSRİ Elmlər Akademiyasının Etnoqrafiya İnstitutunda "Dünya xalqları" seriyasından nəşr etdirmək üçün yenidən işləyib hazırlamışlar.

Arxeoloqlarımız da mühüm işlər görmüşlər. Elmlər Akademiyası tərəfindən bir sıra arxeoloji ekspedisiyalar təşkil edilmişdir ki, bunun sayəsində xalqımızın tarixi keçmişini öyrənmək üçün son dərəcə mühüm əhəmiyyətə malik qiymətli arxeoloji material toplanmışdır.

1946-cı ilin aprelindən 1953-cü ilin avqustuna qədər davam edən Mingəçevir arxeoloji ekspedisiyası xüsusi yer tutur. Bu ekspedisiyada arxeoloqlarımızdan S.M.Qazıyev, Q.İ.İone, R.M.Vahidov, Q.M.Aslanov və başqaları fəal iştirak etmişlər. Görülən işin həcminə görə Mingəçevir arxeoloji ekspedisiyası müharibədən sonrakı illərdə SSRİ-də həyata keçirilən ən böyük ekspedisiyalardan biri idi.

Saysız-hesabsız qədim qəbirlərdən, şəhərlərin xərabəliklərindən, məbəd və ictimai tikililərdən, qədim yaşayış yerlərindən və s. yerli əhalinin məişət, mədəniyyət və incəsənətinə aid hədsiz miqdarda (20000) əşya tapılmışdır. Bu tapıntılar qədim xalq ustalarının yüksək ixtisasa sahib olduqlarına və yerli xammaldan bacarıqla istifadə etdiklərinə sübutdur.

Mingəçevir arxeoloji ekspedisiyası sayəsində müəyyən edilmişdir ki, Mingəçevir ərazisində insan cəmiyyəti hələ 4 min il bundan qabaq mövcud olmuşdur. Qədim Mingəçevirin əhalisi uzun əsrlik yaradıcı əmək nəticəsində təşəkkül tapan və o zamana görə yüksək inkişaf etmiş orijinal mədəniyyətə malik olmuşdur.

Mingəçevir ətrafında aparılan arxeoloji tədqiqatın materialları əsasında bir sıra məqalə çap olunmuş və monoqrafiyalar hazıranmaqdadır.

1947-ci ildən Qobustanda (Duvannı rayonu) meydana çıxarılmış qayaüstü təsvirlərin öyrənilməsinə başlanmışdır. Keçən müddət ərzində tarix elmləri namizədi İ.M.Cəfərzadənin rəhbərliyi altında Qobustana altı arxeoloji ekspedisiya göndərilmişdir. Burada qayaların səthində olduqca qədim zamanlarda zərbə üsulu ilə yaradılmış insan və heyvan təsvirləri saxlanmışdır.

1948-ci ildə Böyükdaş dağının dibində zahirə çıxarılmış qədim latın yazısı böyük maraq kəsb edir. Bu yazı Azərbaycan xalqının qədim tarixinin az öyrənilmiş yeni bir səhifəsini – onun Roma işğalçılarına qarşı qəhrəman mübarizəsini işıqlandırır.

Nəticə etibarilə demək lazımdır ki, Qobustanda tapılmış qaya təsvirləri kompleksi Azərbaycan xalqının qədim tarixi və mədəniyyətinə dair qiymətli abidədir.

Akademiyamız SSRİ və Azərbaycan SSR Elmlər Akademiyalarının son üç il ərzində müvəffəqiyyətlə davam edən Örənqala kompleksli ekspedisiyasına (rəisi A.A.İessendir) böyük əhəmiyyət verir.

Arxeoloqlarımız bundan başqa qədim Gəncə, Xanlar, Kültəpə, Xocalı – Gədəbəy və s. ərazilərdə də arxeoloji tədqiqat işləri aparmışlar. Bunun nəticəsində Akademiyamızın nəzdindəki Azərbaycan tarixi Muzeyində Azərbaycan tarixinə dair 49100-ə qədər eksponat toplanmışdır ki, bunların da əsas hissəsi muzeyin sərgisində nümayiş etdirilmişdir.

Azərbaycan Tarixi Muzeyinin keçən ildən yeni geniş binaya köçməsilə əlaqədar olaraq qarşımızda ən qədim zamanlardan başlayaraq bu günə qədər mükəmməl elmi Azərbaycan Tarixi Muzeyi yaratmaq kimi məsul və mühüm bir vəzifə dayanmışdır. Bu məqsədlə artıq mühüm hazırlıq işləri görmüşük. Hazırda kollektiv ekspozisiya planlarını hazırlamaq, eksponatları seçmək və köməkçi materialları (şəkil, panno, xəritə, sxem, diaqram, maket və s.) düzəltməklə məşğuldur.

Lakin Azərbaycanın bir çox, xüsusilə orta əsrlərə aid etnoqrafik və arxeoloji abidələri alimlərimiz tərəfindən hələ tapılmamış və toplanmamışdır. Unutmamalıdır ki, zaman keçdikcə nəinki qədim yazılar silinir, həm də sərt daşlar köhnəlir və aşılanır. Möhtəşəm qayalar dağılır.

Zəmanəmizdə texnika yer səthini tez və güclü surətdə dəyişir; yer üzündəki bir çox şeylər, əksər hallarda əbədi olaraq torpağın dərinliklərinə gedir; yeni məişət əşyaları köhnələrini sürətlə əvəz edir; insanların həyat tərzi, maddi mədəniyyət xəritəsi tanınmaz dərəcədə dəyişir.

Bax, buna görə də arxeoloqlar və etnoqraflarımız, təbir caizsə, hərbi cəldliklə işləməlidirlər. Respublikanın elmi ictimaiyyəti kənd və şəhərlərimizdə keçmişin qiymətli abidələrinin qorunub saxlanmasına cinayətkarcasına laqeydlik göstərən ayrı-ayrı nadanlarla sistematik olaraq qəti mübarizə aparmalıdır.

Qətiyyən belə yolverilməz hallar da baş verir ki, bizim bəzi inşaatçılarımız üzərində əsrlərdən bəri qədim yazıları, məişət səhnələrinin bədii təsvirini, uzaq əcdadlarımızın həyatı və tarixini qoruyub saxlayan, onların adət, mərasim ənənələrini, bir çox nəsillərin və müxtəlif zamanların əmək həyatının rəngarəngliyi və xüsusiyyətlərini əks etdirən qaya və daşları qırıb-dağıdırlar.

Üstündə tarixi yazı, yaxud təsvir olan hər bir qədim daş vaxtilə yaşamış canlı bir insanın, tarixin od və alovları içərisində bizim gözəl torpağımızı, tariximizi hifz edən, əsrlər boyu elm, mədəniyyət və incəsənətin inkişafı üçün, üzərində doğulduğumuz, yaşadığımız və bizi bu mədəniyyətin ən mütərəqqi ənənələrini yeni tarixi şəraitdə inkişaf etdirəcək nəsillərin simasında yaşadacaq əzəmətli və gözəl zəmin yaradan qurucu insanın daşlaşmış ürəyidir.

Fəlsəfə sahəsində elmi tədqiqat işi əsasən iki problemi əhatə etmişdir: fəlsəfə tarixi, dialektik və tarixi materializm.

1946-cı ildə prof. A.O.Makovelskinin "Qədim Yunan atomistləri" adlı böyük monoqrafiyası çapdan çıxmışdır.

1949-cu ildə prof. H.N.Hüseynovun Azərbaycan xalqının fəlsəfə tarixinə dair əsaslı tədqiqatı nəşr edilmişdir. Onun kitabında XIX əsrdə Azərbaycanın əsas fəlsəfi və ictimai-siyasi fikir nümayəndələrinin dünyagörüşlərinin müxtəlif məsələləri araşdırılmışdır. Müəllifin müridizm və Şamil hərəkatına düzgün qiymət verməməsinə və faktik xarakter daşıyan bir sıra qeyri-dəqiq cəhətlərinə baxmayaraq prof. H.N.Hüseynovun kitabı Azərbaycanın fəlsəfə tarixinə dair əhəmiyyətli vəsaitdir. Fəlsəfə tarixi sahəsindəki başqa tədqiqatlar Nizami, Füzuli və Azərbaycan xalqının digər mütəfəkkirlərinin dünyagörüşlərinin öyrənilməsinə həsr olunmuşdur (müəlliflər: prof. A.O.Makovelski, tarix elmləri namizədi M.M.Qasımov və b.).

Fəlsəfə tarixi ilə yanaşı, dialektik və tarixi materializm məsələləri də işlənilmişdir.

1952-ci ildə V.Y.Səmədovun "Marksizm-leninizmin yaradıcı xarakteri haqqında oçerklər" əsəri çapdan çıxmışdır.

Əməkdaşlarımız tərəfindən marksist-leninçi fəlsəfənin müxtəlif məsələlərini işıqlandıran əsərlər hazırlanır və nəşr olunur (prof. A.O.Makovelski, fəlsəfə elmləri namizədləri Ə.S.Şakirzadə, Ş.Ş.Mirzəyeva, A.S.Nəcəfov və b.).

Ədəbiyyatşünaslarımız bir sıra maraqlı və məzmunlu işlər görmüşlər. Onlardan biri filoloji elmlər doktoru M.A.Dadaşzadənin "Cəfər Cabbarlının yaradıcılıq yolu" monoqrafiyasıdır. Bu tədqiqat Cəfər Cabbarlının yaradıcılığının əhəmiyyətini geniş tarixi-ədəbi fonda açan böyük ədəbiyyatşünaslıq əsəridir.

Ə.Mirəhmədovun böyük Azərbaycan inqilabçı satiriki M.Ə.Sabirin həyat və fəaliyyətinə həsr olunmuş monoqrafiyasında şairin yaradıcılığı və dünyagörüşü ilə bağlı olan mühüm məsələlərə toxunulmuş, onun yalnız Azərbaycanda deyil, eləcə də başqa Şərq ölkələrində demokratik ədəbiyyatın inkişafındakı rolu işıqlandırılmışdır.

K.A.Talıbzadənin şair və tərcüməçi Abbas Səhhətin həyat və yaradıcılığına və F.Qasımzadənin görkəmli dramaturq N.Vəzirova həsr etdikləri monoqrafiyalar da diqqətəlayiqdir.

H.Araslının monoqrafiyasında XVII–XVIII əsrlər Azərbaycan ədəbiyyatı ilk dəfə olaraq əsaslı surətdə tədqiq edilmiş, o dövrün ədəbi prosesinə dair əsas problemlər işıqlandırılmış, haqlarında indiyə qədər son dərəcə az məlumat olan Saib Təbrizi, Məsihi, Qövsi Təbrizi kimi şairlər səciyyələndirilmişlər. Bu əsərdə həm də ilk dəfə olaraq XVIII əsrin bədii nəsri məsələsi də işıqlandırılır.

Alimlərimiz tərəfindən Nizami Gəncəvinin həyat və yaradıcılığı haqqında bir sıra monoqrafik tədqiqlər aparılmışdır. Prof. Y.E.Bertelsin, prof. A.O.Makovelskinin, H.Araslının və başqalarının əsərlərində Nizami yaradıcılığının dərin ictimai fəlsəfi məzmunu açılmış, böyük şairin doğma Azərbaycan xalqının zəngin mənəvi mahiyyəti, şifahi poeziyası ilə ayrılmaz əlaqəsi göstərilmiş, Nizaminin Azərbaycan və dünya ədəbiyyatının gələcək inkişafına təsiri öyrənilmişdir.

1954-cü ilin ikinci yarısında Ədəbiyyat və Dil İnstitutu üçcildlik "Azərbaycan ədəbiyyatı tarixi" üzərində işə başlamışdır. Bu işə respublikanın ən yaxşı ədəbiyyatşünasları cəlb edilmişdir.

Nəşr olunmuş "Puşkin və Azərbaycan ədəbiyyatı" (1949), "Qoqol və Azərbaycan ədəbiyyatı" (1952) məqalələr məcmuələri və filoloji elmlər namizədi M.Seyidovun "Sayat-Nova" (1954) monoqrafiyası da qeyd edilməyə layiqdir.

Ədəbi əlaqələr məsələsinə xüsusi diqqət yetirilir. Filoloji elmlər namizədi M.C.Cəfərov "Rus realist ədəbiyyatının XIX əsr Azərbaycan ədəbiyyatına təsiri" adlı əsərini başa çatdırmışdır. Filoloji elmlər namizədi K.A.Talıbzadə "Qorki və Azərbaycan ədəbiyyatı" monoqrafiyası üzərində işləyir. Bundan başqa, rus və qardaş xalqlar ədəbiyyatı haqqında bir sıra kitab və məqalələr çap edilmişdir.

Azərbaycan klassik ədəbiyyatının əsərlərini nəşr etmək qarşımızda duran əsas vəzifələrdən biri sayılmalıdır. Bu sahədə bəzi işlər görülmüş, Nizaminin "İskəndərnamə"si rus dilində nəşr edilmişdir.

Böyük Nizami Gəncəvinin anadan olmasının 800 illiyi münasibətilə görkəmli sovet şərqşünası Y.E.Bertelsin rəhbərliyi, tarix elmləri doktoru Ə.Ə.Əlizadənin fəal və yaxından iştirakı ilə şairin ölməz əsəri "Şərəfnamə"nin dünyanın müxtəlif kitabxanalarında saxlanılan 10 əsas əlyazması əsasında elmi-tənqidi mətninin tərtib edilməsi sahəsində mühüm işlər görülmüşdür.

XVI əsrin böyük Azərbaycan şairi Füzulinin əsərlərinin öyrənilməsi və nəşri sahəsində də xeyli iş görülmüşdür. Beşcildlik Füzuli əsərlərinin I və II cildləri çapdan çıxmış, III və IV cildləri isə çapa hazırlanır. M.F.Axundovun, Vaqifin, Sabirin, C.Məmmədquluzadənin və b. əsərlərinin nəşr olunması sahəsində də xeyli iş görülmüşdür.

Bu yaxınlarda Nizami adına Ədəbiyyat və Dil İnstitutunda yeni mətnşünaslıq şöbəsi açılmışdır. Bu şöbənin üzərinə məsul vəzifə qoyulmuşdur: Azərbaycan ədəbiyyatı klassiklərinin elmi-tənqidi akademik nəşrini həyata keçirmək, klassik irsin oxunmasındakı müxtəlifliyə son qoymaq.

Dilçilik, xüsusilə müasir Azərbaycan dili sahəsində aparılmış işlər nəticəsində 1951-ci ildə "Azərbaycan dilinin qrammatikası" (I hissə, morfologiya) başa çatdırılaraq nəşr edilmişdir. "Azərbaycan dilinin qrammatikası"nın II hissəsi – sintaksis də hazırlanmışdır.

Filoloji elmlər namizədi M.Hüseynzadənin "Azərbaycan dilində təyini söz birləşmələri" işi də başa çatdırılmaq üzrədir.

"Azərbaycan dilinin orfoqrafiyası"nın hazırlanması dilçilərimizin mühüm işlərindən biri sayılmalıdır. Burada Azərbaycan orfoqrafiyasına dair bir sıra prinsipial dəqiqləşdirmələr və düzəlişlər edilmişdir.

Azərbaycan dilinin şərq qrupu dialektlərinin öyrənilməsi sahəsində xeyli iş görülmüşdür. "Bakı dialekti" (prof. M.Şirəliyev), "Quba dialekti" (R.Rüstəmov), "Abşeron yarımadasının cənub rayonları şivələri" (A.Vəliyev), "Mərəzə rayonu şivələri" (B.İbrahimov) kimi monoqrafik təd-

qiqatlar aparılmışdır. Salyan və Lənkəran şivələri haqqında elmi iş yazılmaqdadır.

Muğan qrupu şivələrinin öyrənilməsi nəticəsində bir neçə məqalə yazılmış və monoqrafik tədqiqat hazırlanmışdır.

Qərb qrupu dialektlərinə dair prof. M.Şirəliyevin "Qazax dialekti" əsəri çap olunmuşdur. Qarabağ dialekti və Tovuz şivələri haqqında əsərlər yazılmışdır.

Lakin bütün bunlar hələ kifayət deyildir. Bir sıra dialekt və şivələr əhatə olunmamışdır.

1946-cı ildə dördcildlik və "Rusca-azərbaycanca lüğət"in hazırlanması başa çatdırıldı. Bu lüğət SSRİ-nin milli respublikalarda böyük rus – milli lüğətin yaradılması işində ilk təcrübə idi.

Hazırda leksikoqraflarımız yuxarıda göstərilən lüğət əsasında 80000-ə qədər söz və ifadəni əhatə edən ikicildlik "Rusca-azərbaycanca" lüğət hazırlayırlar. Həmin lüğətin birinci cildi yaxın günlərdə çapdan çıxmalı, ikinci cildi isə bu ilin sonunda istehsalata verilməlidir.

Bundan başqa, 1951-ci ildə "Rusca-azərbaycanca" və "Azərbaycanca-rusca" iki məktəb lüğəti hazırlanmış və çapdan çıxmışdır. İndi onların ikinci, yenidən işlənmiş nəşri hazırlanır.

Leksikoqraflarımız filoloji elmlər namizədi Ə.Orucovun rəhbərliyi altında "Azərbaycan dilinin izahlı lüğəti" üzərində işləyirlər.

Azərbaycan ədəbi dilinin izahlı lüğəti geniş oxucu kütlələri üçün nəzərdə tutulmuşdur. O, beş cilddən ibarət olub, təxminən 50 minə yaxın baş sözü əhatə edəcəkdir. Lüğətin tərtibi işini 1960-cı ildə başa çatdırmaq nəzərdə tutulur.

Milli ədəbi dilimizin inkişafı ilə bilavasitə bağlı olan vacib və aktual məsələlərdən biri Azərbaycan dilində terminlər məsələsidir.

Azərbaycan SSR Elmlər Akademiyası yanında daimi Terminologiya Komitəsi yaradılmışdır.

Keçən dövr ərzində komitə bir sıra bilik sahələrinə aid terminologiyanı müzakirə və təsdiq etmişdir. O cümlədən ədəbiyyatşünaslıq, dilçilik, riyaziyyat və coğrafiya terminləri geniş müzakirə üçün əlyazması hüququnda çapdan çıxmışdır.

Dilçilərimizin qarşısında Azərbaycan dili tarixinin öyrənilməsi sahəsində mühüm vəzifələr durur.

Lakin bu sahədə indiyə qədər görülən işlər bizi heç cür təmin edə bilməz. Bu məsələyə həsr olunmuş tək-tək məqalələr onun ayrı-ayrı cəhətlərinə toxunmaqla məsələni tam şəkildə həll etmək məqsədi

izləmir və həll etmir, dilin mənbələri və inkişaf mərhələlərinin dərin elmi təhlilini vermirlər. Alimlərimiz, əsas etibarilə, ədəbiyyatımızın ayrı-ayrı klassiklərinin dilini öyrənməklə məhdudlaşır və XIX əsrdən o tərəfə nadir hallarda nəzər salırlar. Ona görə də Azərbaycan dilinin əmələ gəlməsi və inkişafı məsələsi birinci növbədə həll edilməli olan ən mühüm elmi problemlərdən sayılmalıdır.

Elmlər Akademiyamızda zəngin, ilbəil artan qiymətli tarixi sənədlər və əlyazmalarının saxlandığı Respublika əlyazmaları fondu vardır. İndi buradakı əlyazmalarının sayı 20 minə çatır.

Fonda Azərbaycan xalqının, qardaş respublikaların xalqlarının – rus, tacik, özbək, türkmən, gürcü və b. xalqların bədii və elmi fikrinin ən gözəl tarixi abidələri toplanmışdır. Fondda fars, ərəb və türk dillərində külli miqdarda əlyazması da saxlanılır.

Respublika əlyazmaları fondunda nadir əlyazmalarından başqa Azərbaycan yazıçı, şair və bəstəkarların zəngin və rəngarəng arxivləri də toplanmışdır.

Ədəbiyyatşünaslıq sahəsindəki işlərimizi Nizami adına Ədəbiyyat muzeyi tamamlayır. Əvvəllər Muzey böyük Nizaminin yaradıcılığına həsr olunmuşdu. Muzey özünün bu rolunu 1947-ci ildə Nizaminin anadan olmasının 800 illiyi münasibətilə keçirilən ümumxalq təntənələri günlərində çox gözəl doğrultdu. 10 illik fəaliyyəti dövründə muzey Nizami yaradıcılığının yalnız respublikamız və ya bütünlüklə ittifaq miqyasında deyil, hətta onun hüdudları xaricində də yayılması işində qiymətli xidmətlər göstərmişdir. Bu müddət ərzində muzeyə yarım milyondan artıq adam baxmışdır.

Lakin indi muzeyin Nizaminin əsərlərini yaymaq sahəsindəki işini – bu iş nə qədər nəcib və qiymətli olsa belə, kafi hesab etmək olmaz. Ona görə də indi bizim qarşımızda daha geniş və vacib vəzifə durur: Muzeyi ən qədim dövrlərdən başlamış bu günə qədər əsaslı Azərbaycan ədəbiyyatı tarixi muzeyinə çevirmək.

Azərbaycanda mühafizə edilmiş memarlıq abidələri xalqımızın ən mühüm mədəni irslərindən biridir.

Elmlər Akademiyası tərəfindən müxtəlif tipli abidələr, Azərbaycan memarlığının ayrı-ayrı inkişaf mərhələləri sistematik olaraq elmi şəkildə öyrənilir.

Bu işə Azərbaycan SSR EA-nın mərhum akademiki S.A.Dadaşov və Azərbaycan SSR EA akademiki M.A.Hüseynov tərəfindən elmi rəhbərlik edilmişdir.

Alimlərimiz memarlıq tarixinə, o cümlədən Bakı, Naxçıvan, Nuxa və b. şəhərlərin abidələri, XII–XV və XVI–XIX əsrlərə aid sərdabələr, ibadət yerləri, orta əsrlər xalq memarlığı məktəbləri və s. haqqında bir sıra tədqiqat əsərləri nəşr etdirmişlər.

Azərbaycan sovet memarlığının inkişaf tarixinin öyrənilməsi sahəsində müəyyən işlər görülmüşdür.

İkicildlik Azərbaycan memarlığı tarixinin yazılması memarlıq tariximizin öyrənilməsinin mühüm yekunudur. Bu işin ən qədim zamanlardan başlayaraq XIX əsrə qədərki dövrü əhatə edən birinci cildi yaxın vaxtlarda çapa verilməlidir. Bu işin müəllifləri prof. M.Ə.Hüseynov, memarlıq elmləri namizədləri Ə.V.Salamzadə və L.S.Bretanitskidir.

Memarlıq elmləri namizədi Q.Əlizadənin "XIX-XX əsrlər Azərbaycan xalq memarlığı" monoqrafiyası başa çatdırılmaq üzrədir.

Azərbaycanın təsviri və dekorativ tətbiqi incəsənəti öz rəngarəngliyi ilə seçilir. Miniatür, naqqaşlıq, divar yazıları (rospisi), kəsmənin müxtəlif növləri, bədii işləmə məmulatı, xalçaçılıq sənəti, XIX əsrdə yaranan realist naqqaşlıq, sovet dövründə yaradılmış təsviri incəsənət əsərləri – bunlar hamısı elmi tədqiqat obyektləridir.

Azərbaycan incəsənətinin bu sahələrinin tədqiq edilməsi nəticəsində oçerklər nəşr olunmuşdur. Nəşr olunmuş əsərlər içərisində texnika elmləri namizədi A.Qaziyevin xalq rəssamı Ə.Əzimzadə haqqındakı monoqrafiyasını qeyd etmək lazımdır. İncəsənət elmləri namizədi L.Q.Kərimov, birinci cildi çapa verilmiş ikicildlik "Azərbaycan xalçası" monoqrafiyası üzərində işi qurtarmaq üzrədir.

Bu illər ərzində musiqi və teatr mədəniyyətimiz sahəsində müəyyən işlər aparılmışdır. Görkəmli kompozitor, musiqişünas və dramaturq Üzeyir Hacıbəyovun rəhbərliyi və bilavasitə iştirakı ilə musiqi və teatr şöbəsinin kollektivi xeyli faktiki material toplamış, işləmiş və bir sıra elmi, elmi-kütləvi əsərlər meydana çıxarmışdır. Onların içərisində Üzeyir Hacıbəyovun öz əsərləri əsas yer tutur. Onun Azərbaycan və rus dillərində nəşr olunmuş "Azərbaycan xalq musiqisinin əsasları" adlı musiqi traktatını xüsusilə qeyd etmək lazımdır. Hazırda bu görkəmli əsərin üçüncü nəşri buraxılır.

1951-ci ildə "Azərbaycan incəsənəti"nin bütövlükdə peşəkar Azərbaycan teatrının yaranması və inkişafına həsr olunmuş üçüncü cildi nəşr edilmişdir.

İncəsənət elmləri namizədi Qasımovun XII əsr Azərbaycanın musiqi mədəniyyəti tarixinə dair oçerkləri və b. əsərlər nəşr olunmuşdur.

Lakin, təəssüflə qeyd etməliyik ki, bu əhəmiyyətli iş musiqi və teatr şöbəsinin bağlanması nəticəsində müvəqqəti olaraq dayandırılmışdı. Azərbaycan SSR Elmlər Akademiyasının rəyasət heyətinin qərarı ilə İnstitutda musiqi və teatr şöbəsi yenidən bərpa olunmuş və onun elmi işçilərlə komplektləşdirilməsinə başlanmışdır.

İqtisadiyyat sahəsində aparılan tədqiqatlar İctimai elmlər bölməsinin elmi-tədqiqat işinin mühüm hissələrindən birini təşkil edir.

Elmi-tədqiqat işlərinin planlaşdırılması və təşkilində iqtisadçılarımız ən əvvəl ağır sənaye sahələrinin maksimum inkişaf sürətini təmin etmək, habelə kənd təsərrüfatının gələcək yüksəlişi tələblərindən çıxış edirlər.

Neft yataqlarının lay təzyiqi vasitəsilə istismarının iqtisadiyyatı ən vacib problemlərdən biridir.

Bu sahədəki tədqiqatların ümumi yekunu texnoloji proseslərin iqtisadi təhlilinin elmi metodikasını işləyib hazırlamaqdan ibarətdir.

Yeni metodun əksər elmi obyektlərə tətbiq edilməsindən keçən dörd il ərzində (1951-54) neft hasilatı əlavə olaraq 50% artmış, əmək məhsuldarlığı iki dəfəyə yaxın yüksəlmiş, məhsulun maya dəyəri 40% aşağı salınmışdır.

1954-cü ildə iqtisad elmləri namizədi İ.V.Korşunovun "Əlavə neft istehsalı üsulunun iqtisadi effektivliyinin təyin edilməsi metodikası" monoqrafiyası nəşr olunmuş, iqtisad elmləri namizədi A.A.Ağayevanın "Neft quyularının qurulmasında ehtiyat qüvvələr" monoqrafiyası çapa verilmişdir. Hazırda 22,5 çap vərəqi həcmində "Neft yataqlarının istifadə edilməsi iqtisadiyyatı" mövzusunda monoqrafiya çapa hazırlanır. Bu yekunlaşdırıcı kapital əsərdə neft istehsalının təşkilinin elmi əsasları şərh edilir.

İndi bizim qüvvətli iqtisadçı-neftçi alimlər dəstəmiz vardır. Onların əksəriyyətini gənc alimlər təşkil edir. Bu dəstə neft yataqlarının istismar edilməsinin planlaşdırılması və iqtisadi effektivliyinin təhlili metodikasının hazırlanmasında dəyərli işlər görmüşdür.

Beləliklə, Azərbaycan SSR Elmlər Akademiyasında iqtisadçı-neftçilər elmi məktəbinin yaranması üçün zəmin yaradılmışdır – deməyə hər cür əsas vardır.

İqtisadçılarımız bu ildən Azərbaycanın dağ rayonlarının iqtisadiyyatını öyrənməyə başlamışlar. Bu məsələnin ilk öyrənilməsi göstərir ki, dağlıq rayonların iqtisadiyyatı bütün əsas göstəriciləri üzrə aran rayonlarından xeyli dərəcədə geri qalırlar.

Dağ rayonlarının təbii-iqtisadi şəraiti həmin rayonlarda kənd təsərrüfatı bitkilərini düzgün yerləşdirmək nöqteyi-nəzərindən lazımi dərəcədə öyrənilməmişdir.

İqtisadi fikir tarixi sahəsində professorlar A.S.Fərəcov, B.İ.Axundov orta əsrlərə, habelə XIX əsrin sonu XX əsrin əvvəllərinə aid bir sıra əsərlər çap etdirmişlər.

Xalq təsərrüfatının tarixi üzrə prof. B.İ.Axundovun Azərbaycanın inqilabdan əvvəlki neft sənayesində inhisarçı kapitalın rolundan bəhs edən böyük əsəri çapa hazırlanmışdır.

Ölkəmizdə ictimai əməyin məhsuldarlığı, istər sənaye, istərsə də kənd təsərrüfatı sahəsində, qabaqcıl texnikamız və insan qüvvələrimizin real imkanlarına müvafiq deyildir. Buna görə də ictimai əməyin məhsuldarlığının əsaslı yüksəlişini və maya dəyərinin aşağı salınması məsələlərini işləyib hazırlamaq iqtisadçılarımızın əsas və başlıca vəzifəsi olmalıdır.

Elmi idarələrimiz və İctimai elmlər bölməsinin bürosu tərəfindən müxtəlif elmi problemlərə, tarixi hadisələrə, keçmişin və sovet dövrünün görkəmli mədəniyyət xadimlərinə həsr edilmiş çoxlu elmi sessiya və konfranslar keçirilmişdir.

Keçən ilin mart-aprel aylarında Zaqafqaziya və SSRİ Elmlər Akademiyalarının ictimai elmlərin mühüm məsələlərinə həsr olunmuş birgə sessiyasını xüsusilə qeyd etmək lazımdır. Bu sessiyanın faydası şübhəsiz və göz qabağındadır. Buna görə də belə sessiyaları gələcəkdə də keçirmək nəzərdə tutulmuşdur. Bu ilin axırında Tbilisi şəhərində birinci rus inqilabının tarixi hadisələrinə həsr olunmuş ikinci birləşmiş sessiya keçiriləcəkdir.

Yuxarıda göstərildiyi kimi, alimlərimiz tərəfindən bir sıra əhəmiyyətli monoqrafik tədqiqat əsərləri yaradılmışdır. Buna baxmayaraq, onların monoqrafik tədqiqat sahəsində apardıqları işlərin xüsusi çəkisi qabaqcıl sovet elminin tələblərinə cavab vermir.

Əsaslı monoqrafik tədqiqat əsərlərinin yaradılması, şübhəsiz ki, çoxillik elmi tədqiqat işinin başlıca göstəricilərindən biridir. Bunsuz həqiqi böyük elm haqqında danışmaq çətindir.

Monoqrafik tədqiqat, əvvəlki nəsillərin əsrlərdən bəri topladığı elmi nailiyyətləri, elmin bu və ya digər sahəsi haqqında əldə edilmiş fərziyyələri ümumiləşdirir, digər tərəfdən, hazırkı tarixi dövrdə elmin bu və ya digər tarixi və müasir elmi problemə münasibətini ifadə edir; üçüncü tərəfdən, elmin bu və ya digər konkret sahəsinin gələcək pers-

pektivini bir mayak kimi işıqlandıraraq onun daha da inkişaf etdirilməsinə, yeni elmi kəşflərlə zənginləşməsinə yol açır. Bununla yanaşı, monoqrafik tədqiqatlar tarixi inkişafın bir çox xarakter fakt və hadisələrini cəsarətlə və hərtərəfli ümumiləşdirməli, elmi fikrin inkişafını nəzəri cəhətdən yekunlaşdırmalı, müxtəlif fikirlərin, dünyagörüşlərin, estetik və bədii zövqlərin çoxəsrlik mübarizəsini göstərməli, həm də həqiqi elmin təbiətinə ümumiyyətlə, marksist-leninçi elmə isə xüsusən yabançı olan, həqiqəti hər cür bəzəməkdən uzaq, cəsarətlə və doğru düzgün göstərməlidir...

Hər hansı bir sahədə aparılan hər hansı mübarizənin təsvirini yüngülləşdirmək həyat həqiqətinin simasız və ölgünləşdirilməsinə gətirib çıxarır, nəinki irticanın, eyni zamanda mütərəqqi və inqilabi qüvvələrin də göstərilməsini zəiflədir ki, bu, xüsusilə təəssüf doğurur.

Belə elmi əsərlər indi bərk tənqid etdiyimiz bir çox müasir dramaturqlarımızın yazdıqları konfliktsiz dram əsərlərini xatırladır.

Tarixçilərimiz bundan sonra da tarix və mədəniyyətin ümumi problemlərinə, həmçinin görkəmli tarixi şəxsiyyətlərin fəaliyyətlərinə həsr etdikləri monoqrafik əsərlərində xalq kütlələrinin tarixdə, cəmiyyətin maddi və mənəvi nemətlərinin yaradılmasında böyük və həlledici rolunu qırmızı xətlə göstərməlidirlər. Bunu tarixi həqiqət özü tələb edir. Bizim əsərlərimizdə marksist-leninizm və partiyamız tərəfindən ittiham edilən şəxsiyyətə pərəstişə yer verilməməlidir.

Azərbaycan xalqının mədəniyyət tarixini izah edərkən tarixçilərimiz, filosoflarımız və ədəbiyyatşünaslarımız, hər şeydən əvvəl və başlıca olaraq, həmin milli mədəniyyəti doğuran daxili səbəblərə, amillərə, tarixi şəraitə istinad etməlidirlər.

Mən bunu ona görə deyirəm ki, bizim bəzi alimlərimiz mədəniyyət tariximizdə bir sıra görkəmli şəxsiyyətlərin və böyük tarixi-mədəni hadisələrin elmi izahı işində metodoloji səhvlərə yol verirlər. Bu metodoloji səhv, məsələn, özünü onda göstərir ki, bəzi alimlərimiz, hər hansı milli dühanın yaranmasının, hər şeydən əvvəl və başlıca olaraq, tarixi şəraitlə, bu və ya digər xalqın həyatının iqtisadi və mədəni amilləri ilə bağlı olduğunu unudaraq, M.F.Axundov kimi böyük filosof, mütəfəkkir və yazıçının meydana gəlməsini əsasən xarici təsirlərlə izah edirlər.

Aydındır ki, heç bir milli tarix və ya mədəniyyətə dünyadan ayrı, üfüqlərin arxasında qalmış bir ada kimi baxmaq olmaz, çünki hər hansı böyük və ya kiçik milli mədəniyyət başqa xalqların mədəniyyətləri ilə qarşılıqlı əlaqə və təsirdə olmuş və olmaqdadır.

Bu cəhətə də ciddi diqqət verilməlidir. Çünki bu və ya digər xalqın tarixində mədəni, ictimai-siyasi, elmi-fəlsəfi əlaqələrin qiymətləndirilməsi milli məhdudluğa, bu və ya digər milli mədəniyyətin ümumbəşəri əhəmiyyətinin kiçildilməsinə gətirib çıxarır.

Azərbaycan ədəbiyyatının üçcildlik elmi tarixinin yaradılması yaxın illər üçün Nizami adına Ədəbiyyat və Dil İnstitutu qarşısında duran başlıca vəzifədir. Bu il sovet dövrü cildi üzərində iş başa çatdırılmalıdır. Bu cildin müəllifləri qarşısında mürəkkəb və məsul vəzifə durur. 35 illik ədəbi prosesin inkişaf qanunauyğunluğunun öyrənilməsi ədəbiyyatşünaslarımızın bu cild üzərindəki işinin əsasını təşkil etməlidir. Sovet dövrü ədəbiyyatı tarixinin dövrləşdirilməsi, mənim fikrimcə, yaradıcılıq prosesinin ən xarakter mərhələlərini, yalnız tədqiq olunan dövrün tipik ictimai və ictimai-iqtisadi dəyişikliklərini deyil, həm də və başlıca olaraq bədii ədəbiyyatın özünün inkişafının daxili qanunauyğunluğu üçün tipik olan mərhələləri ifadə etməlidir. Bax, buna görə də alimlərimiz düzgün həll etmək işində ümumi tarixin dövrləşdirilməsindən geniş istifadə etmək, onu əsas götürməklə yanaşı, həmin dövrləşdirmənin mexaniki olaraq bədii ədəbiyyat tarixinə köçürülməsindən çəkinməlidirlər.

Təkrar edirəm, ədəbiyyat tarixinin dövrləşdirilməsi, öyrənilən dövrün yaradıcılıq prosesinin daxili qanunauyğunluqlarının, ədəbiyyatın başlıca ideya-bədii mərhələlərinin nəzəri cəhətdən ümumiləşdirilməsinə, onun keyfiyyət təkamülünün, sosializm quruculuğu şəraitində qazanılmış əsas ideya-bədii nailiyyətlərinin tam şəkildə açılması ideyasına xidmət etməlidir.

Elmi-tədqiqat işində empirizmdən, çoxfaktlılıqdan hədsiz və faktların passiv-seyrçi, əksərən olduqca yorucu və əhəmiyyətsiz təkrarından qaçmaq lazımdır.

Tipik və xarakter həyat və ədəbiyyat hadisələri arasındakı qarşılıqlı münasibət, təsir və qarşılıqlı zənginləşdirmənin elmi-bədii izahı diqqət mərkəzində dayanmalıdır.

Lenin demişdir ki, ictimai elmlər məsələsində ən etibarlı, həm də bu məsələyə düzgün yanaşmaq vərdişi qazanmaq, xırdalıqlar kütləvi və ya mübarizə edən fikirlərin nəhəng müxtəlifliyində itib-qalmamaq üçün zəruri və ən başlıcası, bu məsələyə elmi nöqteyi-nəzərdən yanaşmaq üçün vacib olan şey əsas tarixi əlaqəni, hər bir məsələyə məlum hadisənin tarixdə necə əmələ gəlməsi, öz inkişafında hansı başlıca mərhələləri keçirməsi nöqteyi-nəzərdən yanaşmaq, onun indisinə bu inkişaf nöqteyi-nəzərindən baxmağı unutmamaqdır.

Elmi-tədqiqat işində doqmatizm və sxolastikaya, problemlərin riyazi şəkildə həll edilməsinə yol verilməməlidir. Canlı yaradıcılıq prosesinin bütün ziddiyyət və məğlubiyyətlərini, güclü və zəif cəhətlərini, yeni və köhnəlmiş keyfiyyətlərini cəsarətlə açmaq lazımdır.

Elmi kriteriya və əsaslar sahəsində ayrıca götürülmüş canlı yaradıcılıq prosesindən, elmi, ədəbiyyat və incəsənətin ideyalarından təcrid olunmuş çılpaq və cansız "nəzəriyyələşdirmə" ilə əsil elmi nəzəriyyə arasında ümumi heç nə ola bilməz.

Biz bu cilddə ölkəmizdə gedən kəskin sinfi mübarizənin xalqlarımızın ictimai-iqtisadi və mədəni həyatının sosialist əsasları üzrə yenidən qurulmasının bədii ədəbiyyatda necə inikas olunduğunu göstərməliyik. Xüsusilə bizim əsas yaradıcılıq metodumuz – sosialist realizmi metodunun bütünlüklə, həm də ayrı-ayrı görkəmli yazıçıların yaradıcılığında yaranması, möhkəmlənməsi və qələbəsi prosesini göstərmək və nəzəri cəhətdən ümumiləşdirmək lazım gələcəkdir.

Sosializm realizmi metodunun bədii ədəbiyyat sahəsində hər cür qeyri-xəlqi cərəyanlar və baxışlara qarşı apardığı uzun illik mübarizənin bütün gərginlik və dramatizmini cəsarətlə və geniş şəkildə açmaq lazımdır. Ədəbiyyatımız pantürkizm və panislamizm, dekadentizm və simvolizm, milli nihilizm və kosmopolitizm kimi xalqa zidd cərəyanlara qarşı böyük, şərəfli mübarizə və qələbə yolu keçmişdir. Göstərmək lazımdır ki, bu mübarizədə qalib gələn ancaq sosialist realizminin ideya-bədii prinsipləri deyildir. Onunla bərabər əsrlər boyu bütün varlığı ilə xalq həyatı, onun qabaqcıl fikir və arzuları, işıqlı ideal və meyllərinə bağlı olan böyük Azərbaycan ədəbiyyatının ən yaxşı realist və həqiqi xəlqçilik ənənələri də qalib gəlmişdir.

Sovet ədəbiyyatının əsil yenilikçi təbiətini açmaq üçün onun Azərbaycan poeziyasında bu gün belə özünü göstərməkdə olan psevdonovatorluq və formalizmə qarşı mübarizəsini də göstərmək lazımdır. "Novatorluq" kimi yüksək sözün arxasında, əslində isə fırıldaqçılıq, fokus və uydurmalarla məşğul olan, ədəbiyyatı yalnız özlərinin və ailə üzvlərinin başa düşdüyü, geniş oxucu kütlələrinə aydın olmayan süni obrazlar, istiarə, təşbih və mənasız ibarələrlə dolduran yazıçıların yaradıcılığının xalqa zidd mahiyyətini açmaq zəruridir...

Ədəbiyyatşünaslarımız marksist-leninçi estetikanın prinsip və qanunlarına yiyələnərək, bədii yaradıcılıq hadisələrinə vulqar-sosiologiya nöqteyi-nəzərindən yanaşma hallarına son qoymalıdırlar. Birdəfəlik başa düşmək lazımdır ki, bədii ədəbiyyatın varlığı dərk etməyin xüsusi

– bədii forması olduğunu aydın dərk etmədən onun ideya əsasları haqqında danışmaq mümkün deyildir. Buna görə də ədəbiyyatın və onun ayrı-ayrı əsərlərinin bədii təhlili elmi-tədqiqat işinin diqqət mərkəzində durmalıdır.

Bu və ya digər əsərin ideya aktuallığı, onun ictimai-fəlsəfi əhəmiyyəti haqqında ancaq forma və məzmunun vəhdəti, əsərdə yaradılmış tiplərin, xarakterlərin, obrazların bədii təhlili fonunda danışmaq mümkündür və lazımdır. Ən aktual mövzu və ya ideya müvafiq bədii formada bədii şəkildə həll edilmədən, öz-özlüyündə ədəbi hadisə ola bilməz.

Demək istəyirəm ki, ədəbiyyatın bütün bədii ünsürlərinin, xüsusiyyət və keyfiyyətlərinin elmi-sintetik təhlili onun daxili ideya-bədii aləmi haqqında tam təsəvvür verə bilər. Qısa demiş olsaq, əsərin ideya istiqaməti, məzmunu və bədii ləyaqəti ancaq forma vasitəsilə dərk edilir.

Bədii əsərlərdə formanı qiymətləndirməmək hallarına son qoymaq vaxtı çatmışdır.

Alimlərimiz üçün marksist-leninçi estetikanın problem məsələləri ilə ciddi məşğul olmaq vaxtıdır. Marksist-leninçi estetikanın materialist fəlsəfə əsasında işlənib hazırlanmış prinsip və kriteriyalarının nəzəri cəhətdən işıqlandırılması, onun yaradıcı şəkildə daha da inkişaf etdirilməsi indiki inkişaf mərhələsində elmimizi yeni bədii-estetik müddəalarla zənginləşdirər.

İncəsənətdə ideyalılıq, gözəllik, yüksəklik saflıq və humanizm məsələləri estetik və tənqidçilərimizin yaradıcı fəaliyyətlərinin diqqət mərkəzində durmalıdır. Belə nəzəri əsərlər ədəbiyyat və incəsənətin zəmanəmizin mütərəqqi ideal və arzuları zirvəsinə qaldırılmasına kömək etməlidir.

Bir çox ədəbiyyat və incəsənət əsərlərimiz ona görə zəif çıxır ki, bəzən biz onların ideya cəhətini, sənətdə gözəllik, yüksəklik, saflığı unuduruq, unuduruq ki, bizim sənətimiz adamlarımızın qəlbində ən yüksək və gözəl hisslər, zəmanəmizin ən humanist və qabaqcıl meyllərini, yeni sosializm cəmiyyəti insanının ən yüksək əxlaqi keyfiyyətlərini tərənnüm etməlidir. Estetik fikrin incəsənətimizin bədii təcrübəsi ilə belə vəhdəti olmadan bədii yaradıcılıq təcrübəmizdə özünü göstərən mübarizəni lazımi səviyyəyə qaldırmaq mümkün deyildir.

Yazıçıların İkinci Ümumittifaq qurultayı ölkənin yazıçı ictimaiyyəti qarşısında, zəmanəmizin müsbət qəhrəmanı, ədəbiyyatda ideal və ideal qəhrəman, inqilabi romantizm (mənim fikrimcə, onun ədəbiyyatımızda xüsusi üslub və ya istiqamət kimi yaşamağa hər cür haqqı vardır), lirik

və epik poeziya, dramatik konfliktlər, sosializm realizmində forma, üslub və yaradıcılıq istiqaməti müxtəlifliyi, milli forma və incəsənətin milli xarakteri kimi yaradıcılıq problemlərini çox kəskin şəkildə qoymuşdur.

Bütün bu problem məsələləri qurultayda canlı mübahisələrə səbəb oldu. Bizim nəzəriyyəçi-ədəbiyyatçılarımız özlərini bu vacib məsələlərdən demək olar ki, kənara çəkmişlər. Qəzet və jurnallarımız öz səhifələrində ədəbiyyat və incəsənətimizin bu həyati əhəmiyyətə malik problemlərinə dair yaradıcılıq və nəzəri diskussiyalar açmır.

Musiqişünaslıq və teatrşünaslıq sahəsində indiyə qədər az iş görmüşük.

Yuxarıda ədəbiyyatşünaslıq haqqında dediklərim (spesifik formada) musiqişünaslıq və teatrşünaslığımıza da aiddir. Memarlıq və İncəsənət İnstitutu son zamanlara qədər bu məsələlərlə məşğul olmamışdır.

Bu yaxınlarda yaradılmış musiqi və teatr şöbəsinin qarşısında respublikanın teatr və musiqi sənəti sahəsində ən yaxşı elmi qüvvələri (nəzəriyyəçi və praktikləri) öz işinə cəlb etmək, Azərbaycan xalqının teatr və musiqi mədəniyyəti tarixinə aid iri elmi-tədqiqat əsərləri yaratmaq kimi şərəfli bir vəzifə durur. Bu sahədə yazılan elmi-nəzəri əsərlərdə teatr və musiqi mədəniyyətimizin uzunillik yaradıcılıq yolu, müxtəlif istiqamət və üslubların mübarizəsi ümumiləşdirilməli, yalnız keçilmiş deyil, həm də, başlıca olaraq, teatr və musiqi mədəniyyətimizin ən yaxşı xəlqi və realist ənənələrinin gələcək inkişaf yolları işıqlandırılmalıdır.

Qeyd etmək lazımdır ki, son illərdə bəstəkarlarımız yeni opera, balet, simfonik əsərlər və mahnılar yaratmaq işində irəliyə doğru nəhəng addım atmışlar. Biz bir də ona görə sevinirik ki, müasir bəstəkarlarımız arasında parlaq, orijinal, bir-birinə bənzəməyən, öz yaradıcılıq istiqaməti və siması olan son dərəcə istedadlı adamlar vardır.

Sənətşünaslarımız toplanmış yaradıcılıq ənənələrini ümumiləşdirməli, musiqi və teatr aləmində mövcud olan yaradıcılıq istiqamətlərini göstərməli, yeni və gözəl olan hər şeyi müdafiə etməklə bərabər, musiqi, rəssamlıq və teatr tamaşaları sahəsində formalizm, naturalizm qalıqlarına və psevdonovatorluğa qarşı mübarizə aparmalıdırlar.

Teatrşünas və musiqişünaslarımız öz elmi fəaliyyətləri ilə çoxjanrlı incəsənətimizin: dramaturgiyanın, operanın, naqqaşlığın, arxitekturanın, təsviri incəsənətin və s. inkişafına kömək etməlidirlər.

Öz şəxsi fikrimi ifadə edərək, mən belə bir qeyri-normal şəraitin üzərindən sükutla keçə bilmərəm ki, bizim son illərdə yaradılmış bəzi

opera, simfonik əsərlərimizdə və mahnılarımızda Azərbaycan musiqisinin əsil xəlqi ənənələrindən və milli xüsusiyyətlərindən uzaqlaşmaq halları duyulmaqdadır. Bəzən belə olur ki, bəstəkarın adı çəkilmədikdə dinlənilən əsərin kimə və hansı xalqa məxsus olduğunu başa düşmək olmur.

Doğrudur, Azərbaycan musiqisi hər hansı bir planetdə doğulmamışdır. O, həmişə başqa xalqların musiqi mədəniyyətləri ilə qarşılıqlı münasibət və əlaqədə olmuş, böyük klassik rus musiqisinin realist ənənələri onun inkişafına böyük təsir göstərmişdir. Milli cəhətdən ən orijinal və görkəmli bəstəkarımız Üzeyir Hacıbəyovun yaradıcılığı buna parlaq sübutdur. Rus musiqi incəsənəti onun üçün böyük və səmərəli məktəb olmuşdur. Lakin Üzeyir Hacıbəyov Azərbaycan musiqisinin milli xüsusiyyətlərinə həmişə sadiq qalmış, onları yaradıcı şəkildə inkişaf etdirərək yeni keyfiyyətlərlə zənginləşdirmişdir. Onun böyük rus klassik bəstəkarlarından öyrənməsi heç də bizim bir sıra gənc bəstəkarlarımızın yaradıcılığında özünü göstərən passiv təqlid, simasızlıq və rəngsizlik xarakteri daşımamışdır.

Mənə belə gəlir ki, Üzeyir Hacıbəyovun həyat və yaradıcılığı bu mənada gənc bəstəkarlarımız üçün ibrətli nümunə olmalıdır.

Musiqişünaslarımız bitkin musiqi obrazları, sözün həqiqi mənasında, realist xarakterlər yaratmaq, musiqi incəsənətimizi rəngarəng və dolğun ahəngdarlıq, dərin emosionallıq, təsirlilik və xəlqiliklə zənginləşdirmək işində bəstəkarlarımıza kömək etməlidirlər.

Azərbaycan musiqisinin təbiiliyi və saflığı uğrunda mübarizə bütün elmi-musiqi ictimaiyyətimizin diqqət mərkəzində durmalıdır. Ancaq buna istinad etmək, milli musiqimizin ən yaxşı xəlqi ənənələrindən ayrılmamaq və onları yaradıcı şəkildə inkişaf etdirməklə dünya musiqi mədəniyyətinin ən yaxşı nailiyyətlərinə qovuşmaq olar və lazımdır.

İncəsənətin bütün sahələrinin xalqların tarixində əsrlər boyu sübut edilmiş təbii inkişaf yolu belədir.

Bəzi yoldaşlara xatırlatmağı lazım bilirəm ki, həqiqi milli incəsənət, eyni zamanda, sözün tam və əsil mənasında ümumbəşəri incəsənətdir.

İşimizin geri qalan sahələrindən biri də şərqşünaslıqdır. Məlumdur ki, rus və sovet şərqşünaslığı Şərq xalqlarının maddi və mənəvi tarixinin öyrənilməsi, izah edilməsi və elmi cəhətdən ümumiləşdirilməsi sahəsində xeyli iş görmüşdür. Qeyd etmək lazımdır ki, son illərdə sovet şərqşünaslığı, xüsusi Azərbaycan şərqşünaslığı öz fəaliyyətini zəiflətmişdir.

Bizim alimlərimiz – tarixçilər, filosoflar, ədəbiyyatşünaslar, dilçilər və başqaları şərqşünaslığa dair bir sıra yeni problem məsələləri qaldırmalıdırlar. Bu münasibətlə müasir burjua sosiologiyasının və fəlsəfəsinin ümumiyyətlə bəşər mədəniyyəti tarixini, xüsusən Şərq xalqlarının tarixini dini görüşlər, kultlar, idealist mövhumat nöqteyi-nəzərindən izah etmək cəhdləri haqqında bir neçə söz demək istərdim. Onlar çoxəsrlik Şərq xalqları mədəniyyətinin materialist əsaslarını, Şərq xalqlarının milli mədəniyyətlərindəki bütün demokratik və sosialist ünsürləri utanmadan və elmə zidd mövqedən inkar edir, həmin mədəniyyətlərin tarixini islamizm, buddizm və başqa dini etiqadların tarixi kimi qələmə verməyə çalışırlar.

Biz marksistlər hər bir xalqın tarixində dinin müəyyən yer tutduğunu inkar etmir və bilirik ki, o, insanın təbiət qüvvələrinə qarşı hələ zəif olduğu dövrlərdə əmələ gəlmişdir. Lakin biz təsdiq edirik ki, dinlər və dini ayinlər heç vaxt xalqların mədəni inkişafının pafosunu təşkil etməmiş, hər bir milli mədəniyyətdə xalqın materialist görüşləri və həyati mənafeləri hakim amillər olmuşlar.

Tarixçi və filosoflarımızın tədqiqatları sovet tarix və fəlsəfə elmində layiqli yer tutmalı, müasir burjua sosiologiyasının mürtəce, qeyri-elmi mahiyyətini ifşa etməli, xalqın real həyati mənafeyini, onun gələcəyə bəslədiyi arzu və ümidlərini bu və ya digər dərəcədə əks etdirən əfsanə, xalq dastanları və qədim mifologiya daxil olmaqla, Şərq xalqları mədəniyyətinin materialist əsaslarını üzə çıxarmalıdırlar. Çünki xalqın materialist dünyabaxışı bunlarda ifadə olunmuşdur.

Bu Azərbaycan SSR Elmlər Akademiyası respublikanın bütün elmi qüvvələrinin iştirakı ilə şərqşünaslıq məsələlərinə həsr olunmuş xüsusi elmi konfrans keçirməli və Azərbaycanda şərqşünaslığın gələcək perspektiv inkişafını təmin etmək məqsədilə bir sıra əhəmiyyətli problemlər qaldırmalıdır.

Alimlərimiz "Voprosı filosofii", "Voprosı istorii" və s. kimi mərkəzi jurnallarda zəif iştirak edirlər. Alimlərimiz qarşısında öz nəzəri əsərləri ilə Ümumittifaq səhnəsinə çıxmaq kimi şərəfli vəzifə durur. Bunun üçün onlar sovet və dünya elmi fikrinin diqqət mərkəzində duran elmi problemlər üzərində işləməlidirlər.

Yoldaşlar, biz sosializm epoxasında, mübariz inqilabi ideyaların təntənəsi epoxasında yaşayırıq.

Humanitar elmlər sahəsində çalışan ziyalılarımız bəşəriyyətin həyatına indi həmişəkindən daha artıq bir şəkildə nüfuz etməli, dünyada baş

verən ictimai-tarixi hadisələr və dəyişiklikləri dərindən və hərtərəfli dərk etməli, xalqımızın və bütün mütərəqqi bəşəriyyətin yırtıcılaşmış dünya imperializminə qarşı şərəfli mübarizəsinə kömək etməli, xalqların demokratiya, sosializm uğrunda, romantika və poeziya, sosializmin qələbəsinə işıqlı ümidlərlə dolu olan mübarizəsinin zəngin təcrübəsini və əhəmiyyətli nəticələrini elmi şəkildə ümumiləşdirməlidirlər.

Ziyalılarımız bundan sonra da sovet elminin novatorçu, inqilabi təbiətinə sadiq qalmalı, elm və mədəniyyətimizi yeni-yeni kəşflər və fəthlərlə zənginləşdirməlidirlər.

İllər qaçağan atlar kimi səyirdib keçir. Gözlərimiz önündə nəsillər bir-birini əvəz edir. Planetimizin xəritəsi tanınmaz dərəcədə dəyişir. Coşqun çaylar öz məcrasını, qədim şəhərlər, kəndlər öz simasını dəyişir. Əsrlərcə insana həsrət qalaraq sükunət içərisində mürgüləyən ucsuz-bucaqsız çöllər, səhralar çiçək açır. Şüur və hisslər yeniləşir. Bəşəriyyətin baxışları, çoxəsrlik ənənələri, estetik və bədii zövqü dəyişir. Köhnə, mühafizəkar, mürtəce olan hər şey yoxluğa varır. Yeni və işıqlı, mütərəqqi və inqilabi cəhətlər durmadan təntənə çalırlar. Ən alçaq qeyri-insani xasiyyətlər, ən yırtıcı qanun və adətlər doğuran, zülm, ehtiyac, insanın, bütöv xalqların təhqir edilməsi və alçaldılması kimi qeyri-insani amil və məfhumların əbədiləşdirilməsinə sərf edən dünya imperializminin sütunları kökündən sarsılır.

Lakin kainatın iftixarı insan getdikcə daha əzəmətli və qüdrətli, xeyirxah və humanist, güclü və barışmaz olur.

Bəşəriyyətin idealları və arzuları mədəniyyətin nəhəng inkişafının, xalqların və qəbilələrin yaradıcılıq və quruculuq qüvvələrinin azadlığa çıxmasının əzəmətli amilinə çevrilir. Əsrlər boyu parçalanan bəşəriyyət indi vahid bir ailəyə can atır. Elə bir ailəyə ki, orada ideal və mənafelərin birliyi təntənə çalacaq, heç bir məhdudluq və eqoizmə yer olmayacaq, humanizm və həqiqət hökm sürəcək, bütün insanlar və xalqlar sərbəst və azad yaşayacaqlar. O zaman bizim əzabkeş planetimiz nəhayət bizim hər birimizin vətəni olduğu üçün şad və xoşbəxt olacaqdır. Xalqları və ölkələri bir-birindən ayıran dəmir pərdələr yerə sərilir və keçmişə atılır.

Bəli! Zəmanəmizdə bütün bəşəriyyət zülmdən, istismardan, ictimai bərabərsizlikdən, eqoizmdən və yırtıcılıqdan azad sabaha can atır. Elə bir sabaha ki, orada torpağın yeganə hakimi azad zəhmət, yaradıcı, qurucu insan, axtarıb-arayan və təbiəti dəyişən insan olacaqdır. Əsrimizin pafosu – tarixi inkişafın obyektiv qanunauyğunluğunun pafosu belədir.

# MÜNDƏRİCAT

**SƏMƏD VURĞUN**

# SEÇİLMİŞ ƏSƏRLƏRİ

BEŞ CİLDDƏ

V CİLD

"ŞƏRQ-QƏRB"

BAKI-2005

